*Bu kitab* ***“Məhəmmədhüseyn Şəhriyar.*** *Seçilmiş əsərləri”(Bakı, Elm, 2000) nəşri əsasında tərtib olunmuş və təkrar nəşrə hazırlanmışdır.*


Tərtib edənlər: **Nazim Rizvan**
**Xuraman Quliyeva**
**İslam Qəribov**

Ön sözün müəllifi: **Bəkir Nəbiyev**



**894.3611-dc21**
**AZE**
**Şəhriyar Məhəmmədhüseyn.**
**Seçilmiş əsərləri.** Bakı, "AVRASİYA PRESS", 2005, 480 səh.


Məhəmmədhüseyn Şəhriyar o taylı bu taylı Azərbaycanın XX əsrdə yetirmiş olduğu ən görkəmli şairlərdən biri, Azərbaycan və İran ədəbiyyatlarının fəxridir. Zamana sığmayan, nəhəng bir ümmanı xatırladan müdrik və məğrur təbiətli sənətkar füsünkar əsərləri ilə hələ öz sağlığında klassiklər səviyyəsinə yüksəlmiş, Yaxın Şərq ədəbiyyatını bədii möcüzələrlə, təravətli obraz və ifadə vasitələri ilə zənginləşdirmiş, xüsusən anadilli poeziyamıza "Heydərbabaya salam" kimi son dərəcə xəlqi və sənətkarlıq baxımından nadir əsərlərdən birini töhfə vermişdir.

Şəhriyar yalnız həqiqətləri deyən, düşünüb-duyduqlarını sadə, anlaşıqlı və şirin el dilində tərənnüm edən, "təpədən dırnağadək ürəkdən ibarət" olan əyilməz, hünərli bir şairdir. Şəhriyar milli olduğu qədər bəşəri, bəşəri olduğu qədər də milli şairdir.

"Seçilmiş əsərələri"nə bitməz-tükənməz aləmli qüdrətli sənətkarın ana dilində şeirləri ilə yanaşı farsca yazdığı əsərələri daxil edilmişdir.

**ISBN 9952-421-11-5**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## KƏLAMIN VÜSƏTİ

Məhəmmədhüseyn Şəhriyar İranda XX əsrdə ərsəyə gəlmiş ən görkəmli şairlərdən biri, Azərbaycan və İran ədəbiyyatlarının fəxridir. Ana dilində və farsca yazılmış əsərləri ilə o, hələ öz sağlığında klassiklər səviyyəsinə qalxmış, Yaxın Şərq ədəbiyyatını bədii möcüzələrlə, təravətli obraz və ifadə vasitələri ilə zənginləşdirmiş, xüsusən dünya poeziyasına "Heydərbabaya salam" kimi yüksək dərəcədə xəlqi və sənətkarlıq baxımından nadir əsərlərdən birini töhfə vermişdir.

### 1

Haqqında yazılmış kitab və məqalələrdən məlum olur ki, Seyid Məhəmmədhüseyn Şəhriyar 1907-ci ildə Təbriz şəhərinin Bağmeşə bölgəsində, o zamanın tanınmış hüquqşünaslarından Hacı Mirağa Xoşginabininin ailəsində dünyaya gəlmişdir. Məhkəmədə vəkillik etməklə ailəsini dolandıran atası şeri və musiqini çox sevən bir ziyalı idi. Oğlunun təhsili ilə əvvəllər şəxsən özü məşğul olmuş, öz kitabxanasındakı qiymətli əsərləri oxumağa balaca Şəhriyarı o həvəsləndirmişdir. Anası Kövkəb xanımın da sinəsi dolu imiş. Onun Azərbaycan şifahi xalq yaradıcılığından və klassik irsimizdən, xüsusən S.Ə.Şirvaninin qəzəllərindən oxuduğu bəzi nümunələri Şəhriyar yetkin çağlarında belə xatırlamış, Seyid Əzimin "Gəlim" rədifli qəzəlinə gözəl bir nəzirə də yazmışdır... Gələcək şair ilk mədrəsə təhsilinə Təbrizdə başlamış, yay tətillərini Xoşginabda məşhur Heydərbaba dağının ətəklərində keçirmiş, tanınmış müəllimlərdən Molla İbrahimin yanında biliklərini təkmilləşdirmişdi. Sədinin "Gülüstan"ı, Hafizin qəzəlləri, Qurani-Kərim, bəzi ərəb-fars lüğətləri Şəhriyarın hələ uşaq yaşlarında öyrəndiyi əsərlərdən olmuşdur. Düşdüyü ecazkar Heydərbaba mühitinin, atasından eşitdiklərinin, nəhayət, böyük həvəslə oxuduğu kitabların təsiri ilə Şəhriyar yeniyetməlik illərində ilk qələm təcrübələri olan şeirlərini yazmağa başlayır. Əlinə düşən hər

təzə kitabı acgözlüklə oxuyan ərəb və fransız dillərini mükəmməl öyrənmək üçün əlavə məşğələlərini davam etdirən Şəhriyar Təbrizdə orta təhsilini başa vurub 1922-ci ildə Tehran Universitetinin tibb fakültəsinə qəbul olunmuşdur. 20-ci illərin ortalarından etibarən artıq istedadlı bir şair kimi tanınmağa başlayan Şəhriyar Sürəyya adlı bir qıza aşiq olmuş və bu məhəbbəti ilə əlaqədar onun başı bir çox bəlalar çəkmişdir. Sürəyyanın varlı-hallı qohumları bu izdivaca etiraz əlaməti olaraq Şəhriyara təzyiq göstərir, onun Tehrandan Nişabura sürgün edilməsinə müvəffəq olurlar. Beləliklə də şair ali təhsilini yarımçıq qoymağa məcbur olur. O, bir müddət İranın müxtəlif şəhərlərində o cümlədən də Məşhəddə yerli idarələrdə məmurluq edir. 30-cu illərin ortalarında Tehrana qayıdıb banklardan birinə işə düzəlir. Çox sevdiyi atası 1934-cü ildə vəfat etmiş, şair bu münasibətlə xüsusi bir şeir yazmışdır. Sonralar anasının vəfatından doğan kədər duyğularını isə Şəhriyar "Eyvay madərim!" şerində dərin səmimiyyət duyğusu ilə əks etdirmişdir. 1950-ci illərin əvvəllərində Təbrizə gələn şair 1953-cü ildə ibtidai məktəbdə dərs deyən Əzizə xanımla evlənmişdir.

1954-cü ildə Şəhriyar Xoşginaba gedib Heydərbabanın ətəklərində öz uşaqlıq təəssüratlarını yenidən yaşamış, doğma el-obasından aldığı təzə intbahlar əsasında məşhur "Heydərbabaya salam" poemasını yazmışdır. Şəhriyar yaxşı tar çalar, bu qədim musiqi alətində muğamları və xalq mahnılarını ifa etməyi xoşlardı. Şairin çox gözəl xətti varmış. İmkan düşəndə Quran ayələrini və sevdiyi şairlərin əsərlərindən kiçik parçaları böyük məhəbbətlə və özünəməxsus bir incəliklə köçürüb dostlarına bağışlarmış.

Şəhriyar və ailəsi uzun illər boyu maddi sıxıntılar içində yaşamışdır. Yaradıcılığının tədqiqatçılarından şairə Hökumə xanım Billuri öz monoqrafiyasında onun 1976-cı ildə Tehran qəzetlərinin birinə verdiyi müsahibənin mətnini dərc etmişdir. Həmin müsahibə zamanı şair demişdir: "Mən illərdir ki, yalnız çox vacib olduqda evdən çıxıram. Mənim hər şeyim bu bir otaqda yerləşmişdir. Gördüyünüz kimi, onun bəzəyi ancaq sadəlikdir... Üç uşağımla burada yaşayıram. Qazancım vaxtilə işlədiyim, Fəxri ustad adı aldığım yerdəndir. 16 aydır ki, maaşımın bir az artırlması üçün qərar çıxarıblar. Qərar var, ancaq pul yoxdur. Bilmirəm qənaət falı niyə elə şairin bəxtinə düşmüşdür?.. 22 il bundan əvvəl aldığım paltarı hələ də

təzələməmişəm... Pul mənim üçün bəlkə də əl çirkidir. Lakin başqaları üçün ki, belə deyil! Bu məsələlər mənim daxili rahatlığımı pozur. Kimsədən gileyim yoxdur, ancaq dərvişliyi uşaqlarıma aşılaya bilmirəm..."

İranda şahlıq rejimi devrildikdən sonra hökumət orqanları Şəhriyarın güzəranını yaxşılaşdırmaq üçün tədbirlər görmüş, ona abad mənzil vermiş və müvafiq təqaüd təyin etmişdir. Çox təəssüf ki, artıq gec idi. Gənclik çağlarından başlayaraq həyatı maddi məhrumiyyətlər içərisində keçən şair xüsusən, sürgün illərində çəkdiyi ağır fiziki və mənəvi əzablar nəticəsində dəfələrlə bərk xəstələnmiş, inqilabdan sonra da xeyli vaxt öz evində və xəstəxanalarda müalicə olunmuşdur. Şəhriyar 1988-ci ildə sentyabr ayının 18-də Tehranın "Mehr" xəstəxanasında ağ ciyər iltihabından və ürək çatışmamazlığından vəfat etmişdir.

Öz vəsiyyətinə əsasən şairin cənazəsi Təbrizə gətirilmiş və Surxabdakı məşhur "Şairlər qəbristanı"nda dəfn edilmişdir. Həmin gün bütün Təbrizdə dükan-bazar bağlanmış, şairin dəfn mərasimi ümumxalq matəminə çevrilmişdir. Şəhriyarın qəbri böyük məhəbbətlə abad edilmişdir. Qəbrinin üstündə tikilən məqbərənin mərkəzində qızılı şirmayini xatırladan zərif mərmər sənduqədə şair əbədi yuxuya dalmışdır. Burada İran xalqlarının mədəniyyət tarixini nümayiş etdirən gözəl bir muzey də yaradılmışdır. Məqbərənin önündə qonaqlar Şəhriyarın öz abidəsi ilə yanaşı Azərbycan Respublikası hökumətinin Bakıdan hədiyyə göndərdiyi Nizami Gəncəvinin heykəlini də ehtiramla seyr edirdilər.

**2**

Şəhriyar doğulub boya-başa çatdığı ölkədə mövcud olan poetik ənənələrə və aldığı təhsilə uyğun olaraq əsərlərinin çoxunu fars dilində yazmışdır. Böyük alim və şairlərin, Şəhriyar irsi araşdırıcılarının dönə-dönə etiraf etdikləri kimi bu əsərlərində o, elə yüksək sənətkarlıq nümayiş etdirmiş və şeirləri elə geniş yayılmışdır ki, əsrimizin İran ədəbiyyatı tarixi onun yaradıcılığı olmadan natamam görünərdi. Şairin 90-cı illərdə Tehranda buraxılmış dördcildlik əsərləri külliyyatının hərəsi təqribən 750 səhifədən ibarət olan üç cildi məhz bu əsərlərindən tərtib edilmişdir.

Hansı dildə yazmasından asılı olmayaraq, Şəhriyar həmişə vicdanının səsinə qulaq asan, qəlbində tüğyan edən duyğuları, başından keçən fikirləri səmimiyyətlə əks etdirən bir sənətkar idi. Özü bu barədə çox gözəl demişdir:

Dedim: Azər elimin bir yaralı nisgiliyəm mən;
Nisgil olsam da gülüm, bir əbədi sevgiliyəm mən.
El məni atsa da öz gülşənimin bülbülüyəm mən.
Elimin farsca da dərdini söylər diliyəm mən.
Haqqa doğru nə qaranlıq isə, el məşəliyəm mən.
Əbədiyyət gülüyəm mən!

O, klassik şerin demək olar ki, bütün şəkillərində yazmış, ədəbiyyatı yüksək məzmunlu mükəmməl qəzəl, qəsidə, məsnəvi, qitə və rübailərlə zənginləşdirmişdir. Şairin lirikası qəzəl dahisi hesab olunan Hafiz Şirazidən sonra keçən 600 il ərzində İranda lirikanın ən yüksək pilləsi hesab edilir. Şəhriyarın dərin fikirlə zəngin olub incə duyğular tərənnüm edilən qəzəlləri İranda xalq arasında geniş yayılmışdır. Mən ölkənin Tehran, Təbriz, Ərdəbil, Marağa, Məşhəd, Astara və digər şəhərlərində keçirilən ədəbi, elmi məclislərdə Şəhriyarın ana dilli əsərləri ilə yanaşı, farsca qəzəllərinin də uşaqdan-böyüyə çoxlarının dilində əzbər olduğunun, həm də incə zövqlə ifadə edildiyinin dəfələrlə şahidi olmuşam. Məlum olduğu kimi, ilk məhəbbət oxunun daşa dəyməsi şairi uzun müddət sızlatmış, onun bir sıra qəzəllərinə dərin kədər aşılamışdır:

Sızlayır əhvalıma sübhə qədər tarım mənim,
Təkcə tarımdır qara günlərdə dildarım mənim.
... Ey, bu qəmli könlümün tabi-qərarı, söylə bir,
Əhdi-peymanın nə oldu, noldu ilqarım mənim?
... Şəhriyaram, gərçi mən öz mülkümün sultanıyam,
Göz yaşımdan qeyri yoxdur dürri-şəhvarım mənim.

*(Tərcümə Mübariz Əlizadənindir)*

Şəhriyarın əsərlərində ictimai motivlər geniş yer tutur. Şairin od-alov saçan beytlərində İranda şahlıq rejiminin rəzalətləri göstərilir, ölkənin taleyinin o zaman əslində yad əllərdə qaldığı ifşa olunurdu.

O zamankı İranda zülm və ədalətsizliyin baş alıb getməsi, bir çox məmurların oğrularla əlbir olub xalqı talaması, cəmiyyətin həyatındakı ətalət və fanatizm, məktəblərin düşdüyü dözülməz dərəcədə ağır vəziyyət onun yana-yana bəhs etdiyi ictimai bəlalardır. Bir qəzəlində şair özgələr əlində oyuncaq olmuş şahın yaman günlərə qoyduğu İranın həyatından ürəklərə yol salan canlı bir lövhə çəkmişdir:

Gedər bədbəxtliyin ardınca hər iranlı sərgərdan,
Bu bədbəxt millət istiqbal edər bədbəxtliyi hər an.
Baxın, fəqir bir rəmmal bir bədbəxtə açmış fal,
Dolub bədbəxt ilə bu ölkədə həm küçə, həm meydan.
Dilənçi söykənib divara, sanki bir nəfər rəssam
Çəkib bədbəxtliyin timsalını, divara vermiş can.
Satar İranı xainlər, xiridar əcnəbilərdir,
Neçin əqli-vətən tutmaz vətən dəllalına divan?!

Şəhriyarın yaradıcılığında məsnəvi geniş yer tutur. "Elm və Hikmət", "Kəmalülmülkün ziyarəti" məsnəvilərində o, yaradıcı ziyalıların, istedadlı rəssam, şair və alimlərin acınacaqlı taleyindən bəhs etmiş, xalqa baş ucalığı gətirə bilən özü kimi böyük zəka sahiblərinin yaddaqalan canlı obrazlarını yaratmışdır. "Gecənin əfsanəsi", "Qardaşım oğlu Hüşəngə", "Eynşteynə müraciət" əsərləri fəlsəfi səciyyə daşıyır. Miniatür poema təsiri bağışlayan sonuncu əsərlərində şair təkcə öz elinin-obasının, vətəninin və xalqının yox, bütün dünyanın taleyi üçün mənəvi məsuliyyət daşıyan qüdrətli bir sənətkar kimi çıxış edir. O, 20-ci əsrin ən böyük elmi kəşflərindən biri olan atom enerjisindən insanların rifahı üçün deyil, iradəsini başqalarına qəbul etdirmək vasitəsi kimi istifadə edən təcavüzkar imperialist dairələrini tutarlı vasitələrlə ifşa edir, xalqları ayıq-sayıq olmağa, öz taleyini odla oynayanlara tapşırmamağa çağırır".

* * *

Şəhriyarın doğma ana dilində yazdığı əsərlər onun yaradıcılığının bizim üçün xüsusilə qiymətli olan tərkib hissələrindən biridir. Hələ müəllifin sağlığında klassik bir əsər kimi etiraf edilib şərəfləndirilən

"Heydərbabaya salam" poeması da buraya daxil olmaqla, həmin əsərlər müəllifinə təkcə Azərbaycanda və İranda yox, həm də Türkiyədə, İraqda, Orta Asiyada, ümumiyyətlə dilimizin anlaşıldığı bütün ölkələrdə haqlı şöhrət qazandırmışdır. Bunun birinci səbəbi, əlbəttə, "Türkin dilitək sevgili, istəkli dil olmaz" deyən şairin ana dilinə sonsuz məhəbbəti və dilimizin zənginliklərinə dərindən bələd olmasıdır.

"Türkin dili" adlı şerində Şəhriyarı belə bir kəlamı da var: "Şair ola bilməzsən, anan doğmasa şair!". Bununla o, şair üçün həyat təcrübəsinin və təhsilin məna və əhəmiyyətini azaltmadan demək istəyir ki, şairlik hər şeydən əvvəl istedadın bəhrəsi, istedad isə Allahın vergisidir. İstedadsız isə şair olmaq əsla mümkün deyl. Öz böyük istedadını reallaşdırmaq üçün doğma Azərbaycan dilinin əsrarəngiz axar-baxarı Şəhriyar üçün vüsətli bir hünər və yaradıcılıq meydanı açmışdır.

Şəhriyarın ana dilli şeirləri arasında Bakıdakı qələm dostlarına yazdığı mənzum məktublar geniş yer tutur. Xalq şairləri Suleyman Rüstəm və Məmməd Rahimə, şərqşünas alim, professor Rüstəm Əliyevə ünvanlanmış şeirlərində, habelə "El bülbülü", "Döyünmə söyünmə", "Qafqazlı qardaşlar ilə görüş" və "Gözüm aydın" əsərlərində Bakı həsrəti, Şimali Azərbaycandakı qardaşları ilə görüşüb onları bağrına basmaq arzusu özünün çox güclü ifadəsini tapmışdır. Şahlıq rejiminin İranda, sovet rejiminin Azərbaycanda tüğyan etdiyi bir vaxtda yazılmış bu misraları heç bir Azərbaycan övladı həyəcansız oxuya bilməmişdir:

Bizi yandırır yaman ayrılıq,
Bu darıxdıran duman ayrılıq,
Başa sovurur saman ayrılıq,
Aman ayrılıq, aman ayrılıq.
... Qan dəryasına cuman ayrılıq,
... Qəddimi edib kaman ayrılıq.

Şəhriyar uzun illər boyu Şimali Azərbaycan və Bakı həsrəti ilə qovrulsa da, keçmiş Sovetlər İttifaqı ilə keçmiş şahlıq İranı arasındakı sərhədlər, tanınmış xalq xadimləri üçün qoyulmuş qadağanların sərtlyi, maddi çətinliklər, nəhayət, hər iki tərəfdə tədriclə qarşılıqlı

münasibətlərin buzu əridikdən sonra isə xəstəlik, qocalıq ona bu arzusunu gerçəkləşdirməyə imkan verməmişdir. Hətta bir dəfə Bakı səfəri haqqında Şəhriyara konkret vəd verilmiş, vaxtında ünvanına gedib çatmayan bir dəvətnamə də göndərilmiş, şair öz şimal qardaşları qarşısında oxumaq üçün irəlicədən iki şeir də yazmışdır. Lakin dərin təəssüflər olsun ki, səfər baş tutmamış, böyük şairin arzusu gözündə qalmışdır. Aşağıda bir parçası verilən "Qafqazlı qardaşlar ilə görüş" şeri məhz bu münasibətlə yazılmışdır.

Sacımın qəmli simlərində mənim,
Bakının başqa bir təranəsi var.
Sinəmin dar xərabəsində dərin
Bu cəvahirlərin xəzanəsi var.

Mən sizin şanlı qəhrəmanlarızı
Sözlərimdə həmişə yad edərəm.
Zülmə qarşı qılınc sözüm kəskin,
Qəhrəmanlar kimi cahad edərəm.

Sən kimi qardaş öz qarındaşını
Atmayıb, özgə kimsə tutmayacaq.
Qoca Təbriz də yüz min il keçsə
Bakı qardaşların unutmayacaq!

Gəlmişik doğma yurdumuz Bakıya,
Qoy bu, tarixdə iftixar olsun.
Şəhriyardan da bu üfqlərə
Bir sınıq nəğmə yadigar qalsın...

Şəhriyar klassik şərq bədii təfəkkürü ilə ayrılmaz vəhdət təşkil edən həqiqətən də qüdrətli bir şairdir. Onun sənətinin bu məqama yüksəlib, qısa bir müddətdə nəinki təkcə fars dilli poeziyanın, nəinki təkcə ümumtürk bədii fikrinin, bütünlükdə ümumşərq mədəniyyətinin hadisəsinə çevrilməsi bir sıra digər keyfiyyətləri ilə yanaşı, bir də bununla şərtlənir ki, şair şerə, söz möcüzəsinə tapınıb özünü bir sənətkar kimi dərk etdikdən etibarən poeziyanın yalnız ayrı-ayrı fərdlərin, görkəmli söz ustalarının deyil, bütün xalqın, insanlığın mənəvi dünyasının ən qiymətli tərkib hissələrindən biri kimi

qavramış, bu meyarla da istər öz əsərlərinin, istərsə də başqa istedadların özündən əvvəl yaratmış olduğu əsərləri dəyərləndirmişdir:

Şersiz insanlar yaşaya bilməz,
Şerə kəm baxana insan deyiləz.
Ey şeir, həyatım, ömrüm sənindir,
Gözümün işığı sətirlərindir.
Sənsən başım üstə acılan səhər,
Sənsiz gözümüz də gecəyə bənzər,
Şersiz bu dünya kədər, qəm kimi,
Şersiz cənnət də cəhənnəm kimi...

El arasında deyildiyi kimi "Niyyətin hara, mənzilin də ora". Şəhriyarın əsərləri hər şeydın əvvəl, kədəri, dərdi, fəlakətləri, yer üzündə insanların öz əli ilə süni surətdə bərqərar edilən cəhənnəmin dünyadan uzaqlaşdırmaq, hər kəsə özü haqqında, varlığı, qayəsi, insanlıq vəzifəsi barəsində düşündürmək, aşıladığı nəcib, xeyirxah, zərif duyğularla, öz adına, şərəfinə layiq ömür sürməyə dəvət etmək, dünyanı gülzara, bolluq, gözəllik, firavanlıq mənbəyinə çevirmək, bir sözlə, cənnəti yer üzündə bərqərar etmək kimi böyük məqsəd izləmişdir. Bu gün biz inamla deyirik: Şəhriyarın idrak və zövq mənbəyi olan əsərləri, eləcə də onun dönə-dönə yüksək qiymətləndirdiyi sənət bahadırlarının təkrarsız irsi olmasaydı, dünya nə qədər solğun, insanlar mənən nə qədər yoxsul və miskin görünərdi!

Bu ümumbəşəri dəyərlər cərgəsində öz layiqli yerini tutan Şəhriyar irsinin Azərbaycan ədəbiyyatı üçün məna və əhəmiyyəti xüsusilə böyükdür. Şəhriyarın irsi, o cümlədən də xüsusən ana dilində yazılmış əsərləri, Azərbaycan poeziyasının xalq həyatı ilə qaynayıb qarışmasında, şeir dilimizin mənəvi sərvətlərimizdən, ədəbi dilimizin şəhdindən-şəkərindən gözü dolusu barınıb-bəhrələnməsində müqayisəyəgəlməz dərəcədə böyük xidmətlər göstərmişdir.

Şah dağım, çal papağım, el dayağım, şanlı Səhəndim!
Başı tufanlı Səhəndim!
Başda Heydərbaba tək qarla, qırovla qarışıbsan,
Sən ipək telli buludlarla üfüqdə sarışıbsan.
Savaşarkən barışıbsan.

Bircə bəndini nümunə kimi verdiyimiz "Səhəndiyyə" şeri dərin xəlqi məzmunu zəngin, obrazlı ifadə vasitələrilə və bu dərəcədə ahəngdar əks etdirməyin bariz nümunəsi kimi S.Vurğunun, R.Rzanın və B.Vahabzadənin ən yaxşı əsərlərilə, Şəhriyarın özünün "Heydərbabaya salam" poeması ilə yanaşı durur. Ədəbiyyatımızın ənənəvi janrı olan qəzəli də ana dilimizdə sadə, aydın və yenə də ahəngdar səsləndirmək baxımından bu beytlər nadir nümunələrdir:

Çoxlar incikdi ki, sən onlara naz eyləmisən;
Mən də incik ki, mənim nazımı az eyləmisən.

...Hər baxışda çalısan kirpiyi mizrab kimi,
Bir qulaq ver bu sınıq könlü nə saz eyləmisən!

Bir halda ki, söhbət obrazlılıqdan və ahəngdarlıqdan düşdü, Şəhriyarın "Aman ayrılıq" şerinin bu bəndinin üstündən qətiyyən sükutla keçmək olmaz:

Ayrılıq gələ bir kərəm qıla:
Bir neçə gün də bizdən ayrıla.
Qəm də bir biz tək saralıb-sola;
Hanı bir belə güman, ayrılıq?
Aman ayrılıq, aman ayrılıq!

Yüz illər boyu Şərq, o cümlədən də Azərbaycan şerində ayrılıqdan (hicrandan) dönə-dönə, acı-acı şikayətlər edilmiş, vətən həsrətindən də az yazılmamışdır. Lakin bu şeirdə ayrılıq ilk dəfə olaraq geniş miqyaslı ictimai anlam səviyyəsinə qaldırılmışdır. Şair ayrılığı müşəxxəsləşdirib ondan xalqa kərəm qılmağı diləyir, həmişəlik olmasa da, barı bir neçə günlüyə ayrılığın bizdən uzaqlaşması təmənnası ilə az qala ona yalvarır ki, xalqın bir çayın iki sahilində yaşayan, dəmir pərdə ilə ayrı salınmış iki parçası qısa bir müddətdə, bir neçə günlüyə də olsa bir-biri ilə görüşə, qovuşa bilsin, qohum-qardaş bir-birinin ölüb-qalanından xəbər tutsun...

Şəhriyar ayrılığı bir növ qarğış obyektinə çevirmişdir; həm də misraların birində bənzəyənlə bənzədilən arasındakı münasibətlər çox ustalıqla səciyyələndirilmişdir: "qəm də bir biz tək saralıb sola".

1990-cı ildə hər iki tərəfdən qohum-qardaşın dəstə-dəstə sərhəd xəttini yarıb bir-birilə görüşməsi epizodları yəqiri ki, çoxlarının yadındadır. Sərhədçilər o zaman adamlara niyə atəş aça bilmədilər? Çünki onları Şəhriyarın, onun xalqının ahı tutmuşdu; qəm də ahın təsirindən saralıb-solmuş, aylıq qısa bir müddətə də olsa bizdən üz döndərmişdi...

Mənim qənaətimə görə, indi sərhədlərimizdə gediş-gəlişin səhmana düşüb vüsətlənməsində "Heydərbabaya salam" və "Aman ayrılıq!" müəllifi Şəhriyarın tarixi xidmətləri heç bir diplomatın, əlbəttə, heç bir silahlı qüvvənin xidmətləri ilə müqayisədə ölçüyə-gəlməz dərəcədə böyükdür.

Tamamilə təbiidir ki, bu gün Şəhriyarın həyat və yaradıcılığı onun sənətinin qaynaqları, poeziyada sələfləri, şerinin məna və mətləb dərinliyi, kəlamının vüsəti, incəliyi, poetikasının sirləri, əsərlərinin bütün hüceyrələrinə hopub onların mahiyyətinə çevrilmiş xəlqiliyin üfüqləri Təbrizdə də, Bakıda da, Ankarada da, İstanbulda da, Berlində də bir sıra digər Asiya və Avropa elmi dairələrində də alimlərin diqqət mərkəzindədir.

Mən isə gələcəkdə hərtərəfli işlənməsini vacib hesab etdiyim bir-iki məsələyə dair mülahizələrimi oxuculara çatdırmaq istərdim. Bu vacib məsələlərdən biri Şəhriyar yaradıcılığının və Azərbaycan poeziyasının irs-varis münasibətlərinin araşdırılması ilə bağlıdır.

**3**

Şəhriyarın yaradıcılığını alimlər haqlı olaraq Şərqin Xaqani, Nizami, Sədi, Hafiz kimi dahi söz və fikir bahadırlarının irsi ilə üzvi əlaqədə tədqiq edirlər. Lakin onun ana dilində yazmış sənətkarlarla əlaqələrindən nadir halları çıxmaq şərtilə demək olar ki, bəhs edilmir. Halbuki, Şəhriyarın əsərlərində bilavasitə Füzulidən də, XVIII-XX əsrlərdə inkişaf etmiş "bu taylı" poeziyadan da nə isə bir duz var. Başqa cür desək, Şəhriyarın mövzu və mənaca zəngin, şəkilcə, təsvir və ifadə vasitələri etibarilə əlvan sənət bağçasında klassik Azərbaycan dilli şerin ətrini verən çiçəklər də az deyil. Tipoloji baxımdan bu keyfiyyətlərin araşdırılması Şəhriyar irsinin məktəblərimizdə öyrədilməsi baxımından da çox maraqlıdır.

Elə Molla Pənah Vaqifdən başlayaq. Onun ən geniş yayılmış şeirlərindən birini - "Bayram oldu..." qoşmasını yadımıza salaq:

Bayram oldu, heç bilmirəm neyləyim,
Bizim evdə dolu çuval da yoxdu.
Düyilə yağ hamı çoxdan tükənmiş,
Ət heç ələ düşməz, motal da yoxdur.

Allaha bizmişik naşükür bəndə,
Bir söz desəm dəxi qoymazlar kəndə.
Xalq batıb noğula, şəkərə, qəndə,
Bizim evdə axta zoğal da yoxdur.

Bizim bu dünyada nə malımız var,
Nə də evdə sahibcamalımız var.
Vaqif, öyünmə ki, kamalumız var.
Allaha şükür ki, kamal da yoxdur

İndi də tanınmış şairəmiz Hökumə xanım Billurinin tərcüməsində Şəhriyarın "Yoxdur" rədifli qəzəlindəki bəzi beytlərə fikir verək:

Bizim ki, süfrəmizdə yavan çörək də yoxdur,
Toxa nə var, yoxsula isti xörək də yoxdur,
Qış günü pambıqdan ağ, üzüm kömürdən qara
Ocaqda yandırmağa quru təzək də yoxdu.
... Nə camaldan, nə də ki, kamaldan pay almışam
Həsrətinə yanmağa bir şux mələk də yoxdur!

Biri Azərbaycan dilində, aşıq şeri ahəngində, qoşma janrında, digəri isə fars dilində, klassik Şərq şeri ruhunda, qəzəl janrında təqribən 150 illik zaman fərqində yazılmış bu iki orijinal əsərdə biri-biri ilə səsləşən ümumi cəhətlər vardır! Şeirlərin ikisi də üzü qara yoxsulluqdan acı-acı şikayət notları ilə aşılanmışdır. Bu əsərlərin ikisində də yoxsulluq istedad, hünər sahibi olan sənətkarların dərdi kimi ümumiləşdirilmişdir. Lakin bir vacib poetik detal "Bayram oldu..." qoşması ilə "Yoxdur" rədifli qəzəli xüsusi bir ortaq məxrəcə gətirir ki, onu ayrıca qeyd etmək vacibdir. Həmin ortaq məxrəc hər iki

müəllifin təbiətindəki səmimiyyətin, şuxluğun lirik təzahüründən ibarətdir. Diqqət edilərsə, Vaqifin də, Şəhriyarın da qəhrəmanlar evində başına dolanmalı sahib camalın (mələyin) yoxluğundan şikayət edirlər. Hər iki şeirdə sahibcamalın yoxluğu ilə bu lirik qəhrəmanlar kamal payından da "məğmun" qaldıqları barədə yalnız şairlərə məxsus bir səmimiyyətlə gileylənirlər.

İndi də M.Ə.Sabirin "Ey dərbədər gəzib ürəyi qan olan cocuq" misrası ilə başlayan satirasını və Şəhriyarın "Yetim" şerini götürək:

Ey dərbədər gəzib ürəyi qan olan cocuq!
Bir löqmə nan üçün gözü giryan olan cocuq!

*(M.Ə.Sabir)*

Öz yurdunda sən nələr cəkdin, nələr, ey yetim!
Ayaqyalın, başaçıq, sən dərbədər, ey yetim!

*(M.Şəhriyar)*

Məsələ təkcə onda deyil ki, gətirilən və gətirilməyən beytlərdə iki böyük şairin bu və ya digər sözü, ifadəsi üst-üstə düşür. Məsələ hətta onda deyil ki, hər iki sənətkar eyni mövzuda yazmış, ikisi də müraciət şəklini seçmiş, hər ikisinin də xitab obyekti kimsəsiz, ac-yalavac, dərbədər, yetim bir uşaqdır. Bu əsərlərdə diqqəti cəlb edən daha çox onların kompozisiyasındakı, süjet dönümündəki səsləşmə və məzmun uyarlığıdır.

Hər iki şerin əvvəlində yetim bir uşağın ürəkləri parçalayan ağır bir vəziyyəti təsvir edilir; sonra isə hər iki müəllif bu vəziyyəti doğuran səbəblər üzərində düşünür və ikisi də təqsiri cəmiyyətdə, onun öz gələcəyi olan övladlarına ədalətsiz münasibətində də görür:

İnsan kimi bilinsə idi qədrü-qiymətin,
Açmış olurdu məktəbi-milli cəmiyyətin.
Həqlı deyil o kim, sənə der: var qəbahətin;
Məncə qəbahət isə olur halı millətin.
Etsəydi tərbiyət səni əhli vilayətin,

Sailliyə qalırdımı hərgiz də rəğbətin?!
Başsız qalıb ayaqlara üftan olan cocuq.
Ey dərbədər gəzib, ürəyi qan olan cocuq!

*(M.Ə.Sabir)*

Xalq düşünə bilsəydi sənin səadətini,
Dünya bilsəydi elmə tükənməz rəğbətini,
Əl acıb dilənməzdin bu böyük hümmətinlə,
Yandırmazdın məni də kövrək təbiətinlə.
Sən bağbansız, baxımsız qalan bir körpə ağac;
Ömür sürən dərbədər, ac-yalavac, ey yetim!
Məktəb sənin dərdinə qılar əlac, ey yetim!

*(M.Şəhriyar)*

Qoyulan məsələ ilə əlaqədar bircə nümunə də gətirməklə fikrimi yekunlaşdırıram. S.Ə.Şirvani keçən əsrin ortalarında yazıb:

Getmə, tərsa balası, mən də sənə sayə gəlim,
Damənindən yapışıb səhni kəlisayə gəlim.

Bu da M.Şəhriyarın kəlamı:

Getmə, tərsa balası, mən də sənə sayə gəlim,
Əl qatanda sənə məşşatə təmaşayə gəlim.

(Bu sonuncu səsləşməyə prof. Həmid Məmmədzadə diqqəti cəlb etmişdir).

Bütün bu müxtəsər xatırlamalardan, beləcə kiçik ekskursiyalardan sonra kim deyə bilər ki, M.Şəhriyar M.P.Vaqifin və S.Ə.Şirvaninin lirikasından, yaxud M.Ə.Sabirin satirasından təsirlənməmiş, yeri gələndə onlardan əsil böyük sənətkarlara məxsus bir tərzdə yaradıcılıq yolu ilə bəhrələnməmişdir? Buradaca Səhəndə məktubunu yada salmaq yerinə düşərdi. Səmimi etirafından belə məlum olur ki, Şəhriyar bir şair olaraq fəaliyyətə başlayandan özünü ruhən, mənən Sabirə borclu bilmişdir...

Ümumiyyətlə, Şəhriyarın həyat və yaradıcılığı ətrafında araşdırmalar apaılmalı məsələlər hələ çoxdur. Sadə bir məsələni, şairin tərcümeyihalını, daha konkret desək, təvəllüd tarixini götürək. Şəhriyarın doğulduğu il son vaxtlarda nəzərdən keçirdiyim mənbələrdə ən azı beş cür yazılıb:

1904 (Y.Gədikli. "Şəhriyar və bütün türkcə şerləri" kitabı, səh. 18, İstanbul, 1990);

1905 (H.Billuri. "Məhəmmədhüseyn Şəhriyar" kitabı, səh. 19, Bakı, Elm, 1984);

1906 (Azərbaycan Sovet Ensiklopediyası. 10-cu cild, səh. 25, Bakı, 1987; Prof. H.Məmmədzadə də "Xalqın sevimli şairi" adlı müqəddiməsində Şəhriyarın təvəllüd tarixini 1906-cı il kimi qeyd etmişdir. Bax. M.Şəhriyar. "Aman ayrılıq". Bakı, 1981, səh 4);

1906-1907 (Q.Beqdeli. "Məhəmmədhüseyn Şəhriyar" kitabçası, səh. 5, Bakı, Azərnəşr, 1963);

1907-1908 (Əhməd Ataş. "Şəhriyar və Heydərbabaya salam" kitabı, səh.7, Ankara, 1964).

Bunları oxuyur və düşünürəm: axı, Şəhriyar qədim, yaxud erkən orta əsrlərin qaranlıqları içərisində uzun müddət naməlum qalıb təzəcə aşkara çıxarılan şairlərdən biri deyil. O bizim çağdaşımız, cəmisi on yeddi il bundan əvvəl səhhətini diqqətlə izləyən minlərlə şeir pərəstişkarlarının gözü önündəcə dünyasını dəyişmiş böyük və nadir istedad sahibi, çox məşhur bir sənətkardır. Onun bu dünyanı, insanları, xüsusilə də şeirsevənləri fərəhləndirən təvəllüd günü niyə müxtəlif mənbələrdə bu dərəcədə fərqli olan 5 variantda yazılır? Özlərindən asılı olmayaraq bir-biri ilə mübahisəyə girişən, bəlkə də bir-biri ilə öcəşən bu rəqəmləri dəqiqləşdirməyin vaxtı çatmamışdırmı? Şairin doğum tarixi barədə bu fərqli rəqəmləri götürdüyümüz kitabları yazanların hamısı tanınmış şəhriyarşünas alimlərdir və onun həyatını, yaradıcılıq yolunu öyrənmək, təbliğ etmək, əsərlərini nəşr etmək sahəsində onların hər birinin, eləcə də Əsgər Fərdinin təqdirəlayiq xidmətləri var. Mən inanıram ki, həmin alimlər də, şəhriyarşünaslığın yeni nəslini təmsil edən tədqiqatçılar da ümumi obyektiv bir qənaətə gələcək və ədəbi ictimaiyyəti şairin doğulduğu il barədə elmin son sözü ilə tanış edəcəklər.

**4**

Şəhriyarın boyük həyati problemlər qaldıran irsi məhdud, məhəlli səciyyə daşımayıb, vüsətli, yaşan mahiyyətdədir. Onun əsərlərində özünün kəskin və amansız ifşasını tapan sosial eybəcərliklər, mənəvi qüsurlar təkcə vaxtilə Rza şah rejimi altında inləyən İrana deyil, elə Stalin rejimi altında yaman günlərə qalmış keçmis Sovetlər İttifaqına da aid idi.

Mərkəzin zəhhakları zülmü səmayə qaldırır,
Ta ki, baş qaldıra bir gün Azəristan Gavəsi.

- deyən Şəhriyar hər iki ölkənin, bütünlükdə isə geniş miqyaslı regionun insan azadlığına qənim kəsilmiş ədalətsiz qanunlarını ayaqlayaraq yüksəlir, oxucu və dinləyiciləri pak və ülvi duyğular, bəşəri ideallar uğrunda öz zəhhaklarımıza qarşı çarpışmağa səsləyirdi, Bu bir həqiqətdir ki, "Heydərbabaya salam" əsəri ədəbiyyatımızın şedevrlərindən biri olmaqla qalmayıb, bütünlüklə Azərbaycan bədii təfəkkürü sahəsində yeni bir mərhələnin başlanğıcını qoymuşdur. Bu poema İranda şahlıq rejiminin, Azərbaycanda şəxsiyyətə pərəstiş əhvaliruhiyyəsinin tilsiminə düşmüş şeir üçün bir növ "İsrafilin suru" rolunu oynamışdır.

Heç kəsə sirr deyil ki, Şəhriyarın özü də bura daxil olmaqla Cənubi Azərbaycan şairləri əksər hallarda öz əsərlərini fars dilində yazırdılar. Bu, əlbəttə, ölkədə bütün savadlı oxucuların, hər halda onların böyük çoxluğunun yaxşı bildiyi dil olduğu üçün həmin şairlərin şərəfinə, şöhrətinə kəsr gətirmirdi. Bundan fərqli olaraq Şimali Azərbaycanda şeir ana dilimizdə yazılırdısa da, yenə nadir istisnaları çıxmaq şərtilə, xalqın dərdi-odu onda özünün köklü inikasını tapa bilmirdi. Kommunist rejimini, onun bədnam liderlərinin tərənnümü şeirdə geniş yer tuturdu. Günahsız insanların kütləvi qırğınları ilə əlamətdar olan oktyabr (1917) çevrilişinə, ilk Azərbaycan Demokratik Cümhuriyyətini zorakı yolla devirən 28 Aprel (1920) çevrilişinə, öz müdhiş fikir və əməlləri ilə Rusiya imperiyasının, burada məskun olan bütün xalqların tarixinə sinfi çaxnaşmalar, qırğınlar gətirmiş Leninə, xalqımızın ən ağıllı, qeyrətli oğullarını

müntəzəm surətdə qırmış Stalinə, milli fəlakətlərimizə "qanun" donu geydirən sosializm quruluşuna, təqvimlərdə qırmızı rənglə verilən cürbəcür qondarma "bayram" günlərinə minlərcə şeir həsr olunmuşdu. İş o yerə çatmışdı ki, böyük söz ustası Mirzə Əli Möcüz Şəbüstəri də bu cəhətdən özünü saxlaya bilməmiş, şimallı qardaşlarını təsiri ilə "Tutaq Lenin ətəyindən, ona pənah aparaq, Zəmanəmizdəki həllali-müşkülat odur" misraları da daxil olmaqla Vladimir İliçə xüsusi əsər həsr etmişdir. Sovet Azərbaycanı şairlərinin tamamilə başqa mövzularda yazılmış bir cox şeirləri isə əksər hallarda Stalinin adı ilə yekunlaşdırılır və bu xalqlar cəlladı "bəşəriyyətin xilaskarı", "bütün zamanların əvəzolunmaz dövlət xadimi", "sərkərdələr sərkərdəsi" kimi təriflənirdi.

50-ci illərin ortalarından etibarən "Heydərbabaya salam"nı müxtəlif yollarla Bakıya gəlib çıxması, dönə-dönə nəşr edilib yayılması, heç şübhəsiz, ölkədə əmələ gələn ciddi ictimai təbəddülat şəraitində, doğrudan da, köhnə, konyunktur, kommunist partiyalı şerin iflasını sürətləndirdi. Onun öz təbii axarına düşməsi prosesinə elə qüvvətli bir təkan verdi ki, həmin təkanın nəcib təsirindən şerimiz öz varlığında, xalqın çağdaş həyatına, tarixinə münasibətində, bədiilik axtarışlarının istiqamətində bu gün də məmnun-məmnun barınmaqdadır.

Şəhriyarın həyat və yaradıcılıq yolu haqqında az yazılmayıb. Lakin deyilənlərdən də göründüyü kimi, onun sənətinin bəzi problemləri bizdə hələ də şairin adına layiq yüksək səviyyədə öyrənilməyibdir. 21 il əvvəl tanınmış şair və şərqşünas alim Hökumə Büllurinin yazdığı kitabı və 42 il əvvəl klassik irsin görkəmli tədqiqatçılarından prof. Q.Beqdelinin çap etdirdiyi kitabçanı nəzərə almasaq, Şəhriyar haqqında bizim nə geniş və hərtərəfli, sanballı monoqrafiyamız, nə də elmi-kütləvi səciyyə daşıyan kitabçamız var. Halbuki onun irsini dönə-dönə, əsaslı şəkildə öyrənməyin bir çox cəhətdən ciddi əhəmiyyətə malik olması danılmaz həqiqətdir. Şəhriyarın həm farsca, həm də ana dilində, həm klassik üslubda, həm də bir novator kimi yeni səpkidə yazdığı əsərlərin, onlarda qaldırılan milli və bəşəri problemlərin araşdırılıb təhlil edilməsinin yaşadığımız bu millətlər yarışı zamanında bir çox xalqların öz müqəddəratlarını təyin etmək yoluna düşmək üçün çarpışdığı indiki vəziyyətdə milli özünüdərk baxımından böyük əhəmiyyəti vardır.

**5**

"Heydərbabaya salam" poeması şairin göz açıb gördüyü doğma ellər, Cənubi Azərbaycan haqqında, milli həyatımız, məişətimiz, psixologiyamız haqqında vüsətli bir şairanə ensiklopediyadır. On illər boyu doğma yerlərdən, əziz adamlarından ayrı düşmüş Şəhriyar Heydərbaba mühiti barəsində ürəyinin başında gəzdirdiyi, düşünüb daşındığı mətləbləri bu əsərində yüksək dərəcədə təbii və zərif boyalarla tərənnüm etmişdir.

Başdan-başa Azərbaycan şifahi xalq ədəbiyyatının ruhu ilə aşılanmış "Heydərbabaya salam" axar-baxarlı, zəngin Azərbaycan dilinin özünəməxsus orijinal ahəngi olan cənub dialektində yazılmışdır. Əsər bilavasitə təbiətin ən böyük, əzəmətli, ən yaşarı tərkib hissəsi olan dağa (Heydərbabaya) muraciət şəklində qurulmuşdur. Bunun özü də onun xəlqilik ruhunu qüvvətləndirən bir əlamətdir. Azərbaycan folklorunda, aşıq ədəbiyyatında, klassik və cağdaş poeziyamızda dağlara müraciətlə deyilmiş və yazılmış yüzlərlə poetik nümunə mövcuddur. Heydərbaba dağına canlı xüsusiyyətlər verən şair özü bu əsərini nə üçün məhz dağa müraciətlə yazmasının səbəbini belə izah etmişdir: "Dağ göylərə yaxındır. O, təbiətin şah əsərlərindən biridir. Dağ tarixin əbədi olaraq görən açıq gözüdür. O, vətəndə baş verən hadisələri seyr edərək öz sinə dəftərinə yazır. Şairin göylərə qalxan nalələrini əks etdirib bütün yer üzünə yayaraq hamının qulağına çatdırmağı təkcə o bacarır".

"Heydərbabaya salam" poeması iki hissədən ibarətdir. Onun birinci hissəsində 77, ikinci hissəsində isə 48 bənd var. Bəndlərin hər biri 5 misradan hörülmüşdür. İlk üç misra aaa, dördüncü, beşinci misralar isə bb şəklində qafiyələniblər. Hamısı birlikdə kamil bir əsər kimi poemanın vəhdətini təmin edən bəndlər, eyni zamanda, hərəsi ayrılıqda, bir lövhəni, hadisəni, obrazı, yaxud xatirəni əks etdirən bitkin bədii vahid təsiri bağışlayır,

Diqqətli oxucu əsərdə ilin bir-birindən gözəl olan fəsillərini, bu fəsillərin yer üzünə gətirdiyi əlvan lövhələri görür, dağətəyi yamaclarda əkinin-biçinin, bağın-bostanın gözəlliyinə tamaşa edir, burada bir parça çorək üçün əlləşib-vuruşan insanların təkrarsız mənəvi aləminə dalır, elin-obanın toy-bayramında, dərdli-matəmli

günlərində qiyabi də olsa iştirak edir. Xalq həyatının təsviri o qədər təbii və səciyyəvi təfərrüatları ilə verilir ki, oxucu əsərin personajları ilə birlikdə az qala həmin həyatı yaşayan adamlardan birinə çevrilir.

Səhər tezdən naxırçılar gələrdi,
Qoyun-quzu dam-bacada mələrdi,
Əmməcanım körpələrin bələrdi,
Təndirlərin qavzanardı tüstüsü,
Çörəklərin gözəl iyi, istisi.

Bununla belə "Heydərbabaya salam"ın əhəmiyyəti təkcə adət-ənənələri, mərasimləri, təbiət hadisələrini zəngin boyalarla canlandırmasından ibarət deyil. Xalqın tarixi taleyi, Azərbaycanın başına gələn böyük faciələr, sarsıdıcı ictimai hadisələr də şairin diqqətindən yayınmamışdır.

Heydərbaba, göylər bütün dumandı,
Günlərimiz bir-birindən yamandı.
Bir-birizdən ayrılmayın, amandı!
Yaxşılığı əlimizdən alıblar,
Yaxşı bizi yaman günə salıblar.

Bu misralar artıq bir kəndin, bir obanın dərdləri çərçivəsini aşır və ikiyə parçalarımış Azərbaycanın böyük faciəsi haqqında şair naləsi təsiri bağışlayır. Şəhriyar bilirdi ki, onun şimaldakı qardaşları, məktəb, mədəniyyət, elm sahəsində müəyyən nailiyyətlər əldə ediblərsə də, sovet imperiyasının təqiblər, həbslər, sürgünlər, edamlar məngənəsində sıxılırlar. Şair Arazın üstündən bu taydakı qardaşlarına əl uzadıb onlarla ağlaşmaq, bu yolla da dərdlərinə şərik olmaq istəyir:

Bir uçeydim bu çırpınan yelinən,
Bağlaşeydim dağdan aşan selinən,
Ağlaşeydim uzaq düşən elinən,
Bir göreydim ayrılığı kim saldı,
Ölkəmizdə kim qırıldı, kim qaldı.

Poemada şairin bir sıra əziz adamları xatırladılsa da, əsərin mərkəzində Şəhriyarın özünün bədii obrazı canlanır. Ümumiyyətlə, poemalarda lirik qəhrəman və müəllif arasında tam eyniyyət olmasa da yaxınlıqlar, səsləşmələr, uyarlıqlar geniş müşahidə edilir. "Heydərbabaya salam"da bu cəhət daha qabarıq şəkildə nəzərə çarpır. Çünki şair uzun illərin hicranından sonra səyahət məqsədilə hər hansı bir əsrarəngiz ölkəyə, yaxud istirahət üçün yaylağa yox, əzizləri ilə görüşmək, onların ruhundan mənəvi halallıq almaq üçün elinə-obasına gəlmişdir. Kövrəkliyi doğuran digər başlıca səbəb isə budur ki, bu qəhrəmanın ən əziz və ən doğma adamları olan atası, anası, nənəsi, ömür-gün yoldaşı, bir çox qohumları və qonşuları, uşaqlıq və gənclik illərinin yaxın dostları artıq həyatda yoxdur. Onların hər biri ilə əlaqədar şairin qəlbində zaman-zaman şirinli-acılı xatirələr oyanır. Bu xatirələr həyati və əziz olduğu qədər də həzin və kədərlidir. Şəhriyarın insanpərvərliyi və vətənpərvərliyi də ilk növbədə bu yaxm adamlarına, əzizlərinə bu dünyanı tərk etmiş bütöv bir nəslin taleyinə münasibətində canlanır.

Poemada Xoşginabın dağətəyi kəndlərinin təbiəti çox əlvan və zəngin boyalarla təqdim edilmişdir. Onun ayrı-ayrı bəndlərində təbiət rəngdən-rəngə düşüb cilvələnir. Burada təsvirlər o qədər təbii və oynaqdır ki, oxucu özünü ildırımların gurultusunu, sel-suların şaqqıltısını eşidər kimi, bundan sonra yeni bir nizamla boy göstərən təzə-tər çiçəklərin, otların ətrini qoxulamış kimi təsəvvür edir. Azərbaycanın təsərrüfat həyatı, xalqın adət və ənənələri, toyu-yası, məişətinin növ-növ lövhələri, ayin və mərasimlər elə incəliklə təqdim olunur ki, onların əsasında cənub ellərində yasayan soydaşlarımızın gün-güzəranı, etnoqrafik xüsusiyyətləri haqqında çox zəngin bədii məlumat əldə etmək mümkündür.

Əsərdə yalnız təbiət lövhələrinin və etnoqrafik məqamların yox, psixoloji anların da təsvirində şair böyük ustalıq nümayiş etdirmişdir.

Qarı nənə gecə nağıl deyəndə,
Külək qalxıb qap-bacanı döyəndə,
Qurd keçinin şəngülüsün yeyəndə
Mən qayıdıb bir də uşaq olaydım,
Bir gül açıb ondan sonra solaydım.

Bu misraların ayrılıqda hər birində və bütünlükdə onların əmələ gətirdiyi bənddə insan əhval-ruhiyyəsinin elə anları verilmişdir ki, yaşından asılı olmayaraq onu oxuyanların hər birində həyatın həmin anlarını yenidən yaşamaq arzusu baş qaldırır. Poemanın mühüm məziyyətlərindən biri xalqın gələcəyinə inam duyğusunun yüksək poetik ifadəsilə bağlıdır. Heydərbaba dağının timsalında bütün Azərbaycanı ümumiləşdirən şair xalqın öz səadətini sədəqə şəkilndə yox, mürtəce qüvvələrə (qurdlara) qarşı igid oğullarının mübarizəsi sayəsində əldə edəcəyinə inanır, o gözəl əyyamı qəlbinin ən dərin guşəsindən gələn böyük səmimiyyət duyğusu ilə tərənnüm edir:

Heydərbaba, mərd oğullar doğginən,
Namərdlərin burunların ovginən,
Gədiklərdə qurdları tut, boğginən,
Qoy quzular ayın-şayın otlasın...

**6**

Əsil söz sənətkarının böyuklüyü həm də bununla ölçülür ki, onun istər sağlığında, istərsə də dünyasını dəyişməsindən on illər, qərinələr keçəndən sonra əsərlərini oxuyan hər kəs, ilk növbədə isə sözə qarşı həssas olan yüksək səviyyəli bədii zövq sahibləri, şeirsevənlər dərindən təsirlənir, həmin sənətkarla, onun kəlamı ilə özü və öz zəmanəsi arasında, mənsub olduğu ölkə, qövm və cəmiyyətin taleyi arasında, fikir və duyğuları arasında nə isə bir uyarlıq, yaxınlıq, doğmalıq, səsləşmə, tipologiya görür. Önündə kəlmə-kəlmə, beyt-beyt, vərəq-vərəq açılan şair kəlamı işığında oxucu tam səmimiyyətlə öz daxili aləmini, qəlbini, şüurunu ona etibar edir; özünü həyəcanlandıran, narahat edən çox vacib, taleyüklü mətləblər barəsində ondan məsləhət alır, öz fikir və duyğular axarını şair kəlamının yüksək mona pərdəsinə kökləyir.

Belə mötəbər şairin misraları hər oxunuşda diqqətli oxucunun şüurunda, qəlbində əks-səda verir. Onu hala-həyəcana gətirir, həyatın neçə-neçə müşküllərini həll etmək işində nəsillərin əlindən tutur. Dahi sənətkarlardan Firdovsi Tusinin "Şahnamə"si, Nizami Gəncəvinin

"Xəmsə"si, Füzulinin "Leyli və Məcnun" məsnəvisi məhz belə mötəbər, təkrarsız ədəbi qaynaqlardır. Sədinin "Gülüstan"ı və "Bustan"ı, Hafiz Şirazinin, Kəmali Xocəndinin, Hacı Seyid Əzim Şirvaninin, məliküşüəra Baharın ən yaxşı qəzəlləri, Molla Pənah Vaqif Qarabağinin zərif qoşmaları, M.Ə.Sabirin satiraları da qədirşünas oxucuya məhz belə təsir bağışlayır. Əsərlərindəki mötəbər fikirlərin, əlvan duyğuların, incə mətləblərin təqribən son yarım əsrdə yetişən yeni-yeni nəsillərə güclü təsir göstərməsi, onların mənəviyyatında böyük intibahlar oyatması baxımından Seyid Məhəmmədhüseyn Şəhriyar da bu cür nadir sənətkarlardan biridir.

Bu, əlbəttə, bəzi digər məqamları da nəzər almaq şərtilə, Şəhriyar irsinin iki çox mühüm keyfiyyətilə bağlıdır. Həmin keyfiyyətlərdən birincisi budur ki, şairin həm fars, həm də Azərbaycan dilində yazmış olduğu müxtəlif mövzulu əsərlərin bir çoxu bütün zamanlar, ölkələr və insanlar üçün gərəkli, maraqlı olan dərin və ali fikirlərlə, incə və zərif bəşəri duyğularla zəngindir. İkinci vacib keyfiyyət isə bu fikir və duyğuların bir söz ustadı kimi müəllif tərəfindən yüksək dərəcəli sənətkarlıqla, təzə, təravətli, orijinal, bədii ifadə vasitələrilə, ürəyə yatan ahəng və cazibədarlıqla, ən yüksək bədiilik tələblərinə cavab verən səviyyədə təsbit olunmasıdır.

Şəhriyarın yaradıcılığında xalqın maddi və mənəvi həyatının bütün cəhətləri, insan taleyinin bütün yönləri üçün görməli, götürməli, öyrənməli, faydalanmalı məqamlar istənilən qədərdir. Bu misralar əsasən Qurban bayramı münasibətilə xalqa ünvanlanmış mübarəkabadlıq sözlərindən ibarətdir.

Başdan, candan keçən millət,
Bayramın mübarək olsun!
Küfrü kəsib biçən millət,
İslamın mübarək olsun.
Ay atalar, ay analar,
Ehsansız qəbul olubdur.
Kuyi-Minada kəsilən
Qurbanız qəbul olubdur.
Cihada bel bağlayandan
İmanız qəbul olubdıır.

Səflər içrə san verdin sən,
Cəbhələrdə can verdin sən.
Millətüvə kömək çıxdın,
Qansızlara qan verdin sən.

O pak qana qanlar qurban, bayramın mübarək olsun!
O pak cana canlar qurban, bayramın mübarək oisun!
... Dünyadan vaz keçən oğul, bayramın mübarək olsun!
Şəhid camın içən oğlu, bayramın mübarək olsun!

*("Bayramın mübarək olsun")*

Şəhriyarın bu sözləri məşhur "Hədiqətüs-süəda" əsərində Kərbəla faciəsinin ürəkləri yandıran məqamlarını təsvir etmiş böyük Azərbaycan şairi Məhəmməd Füzuli Bağdadinin kəlamı ilə çox gözəl səsləşir:

Zillət ilə ləzzəti olmaz həyatın, dustlar,
Nəqdi-can sərf eyləyib, dünyada kam almaq gərək!
İcz ilə dönmək ədudən səhlidir, himmət tutub
Ya şəhid olmaq gərək, ya intiqam almaq gərək!

Hər iki əsri oxuyarkən bəzən adama elə gəlir ki, Şəhriyar da, Füzuli də bu misraları yazanda öz qələmlərini mürəkkəbə yox, ürəklərinin qanına batırmışdır. Odur ki, Füzulinin İmam Hüseyn faciəsini əks etdirən məşhur məqtəlini müqəddəs Kərbəlada qələmə almasından 450 il, Şəhriyarın isə Təbrizdə camaatta bayramlaşmasının nəticəsində doğulmuş "Bayramın mübarək olsun" şerinin yazılmasından isə təqribən 30 il keçdiyinə baxmayaraq, həmin əsərlər dərin ümumiləşdirmə keyfiyyətinə malik olduqları üçün bir çox digər ölkələrdə, o cümlədən də bizim tərəflərdə hər kəsi düşündürür. Qəlbində Allah nuru olan bu şairlər oxucu və dinləyicilərinə təlqin edirlər ki, azadlıq, istiqlaliyyət, müqəddəs dinimiz yalnız xəyal bəsləməklə əldə edilən nemətlər deyildk. Dini mübarəkimizi, azadlıq və istiqlaliyyətimizi, vətən sərhədlərinin toxunulmazlığının əldə silah cəbhələrə gedən qeyrətli vətən balaları öz qanı və canı ilə qazanmalıdırlar. İranın qeyrətli övladları Yaxın Şərqin ən güclü

orduya, hərbi texnikaya malik olan şahlıq səltənətinə qarşı şanlı mücadiləsində, beynəlxalq imperializmin fitnələrindən doğmuş "Körfəz müharibəsi" zamanı yadellilərə qarşı apardığı qəhrəmanlıq mübarizəsində bunu dönə-dönə sübut etmişdir.

Şəhriyarın azadlıq və istiqlaliyyətin tərənnümünə həsr olunmuş bu ruhlu əsərləri İranın şimal qonşusu olan Azərbaycan cümhuriyyətindəki bugünkü durumu, xalqımızın düçar olduğu ağır müşkülləri və təcavüzə qarşı mübarizəsini də müvəffəqiyyətlə ehtiva etməkdədir. On beş ildən artıqdır ki, Azərbaycan öz nankor qonşusu Ermənistanın silahlı təcavüzünə məruz qalmışdır. "Arxalı köpək qurd basar" demişlər. Rusiya cəbhəxanalarından gah gizlin, gah aşkar yollarla alınan, bahası hər dəfə milyard dollarla hesablanan ağır silahlarla təchiz olunmuş düşmən torpaqlarımızın iyirmi faizini işğal etmiş, o ərazidə ələ düşən, dişə dəyən nə varsa, hamısını soyub aparmışdır. Məscidlər, məktəblər, səhiyyə ocaqları, ictimai iaşə binaları dağıdılmışdır. On minlərlə Azərbaycan vətəndaşı həlak olmuş, hesabı dəqiq bilinməyən soydaşımız yaralanmış, bir milyondan artıq müsəlman öz doğma ev-eşiyindən, od-ocağından qaçqın düşmüşdür. Çadırlarda acınacaqlı güzəran keçirən bu zavallı həmvətənlərimizin bir qisminə kömək əli uzatdığı üçün əlinə düşmüş bu fürsətdən istifadə edərək, İran İslam Cümhuriyyətinin dövlətinə, bu ölkədəki öz din qardaşlarımıza dərin minnətdarlığımı bildirirəm.

Ədalət nazilər, amma üzülməz deyiblər. Əlbəttə, belə qalmayacaq. Ya beynəlxalq dairələrin nəzarəti altında sülh yolu ilə və yaxud da Şəhriyar şerinin qəhrəmanları kimi qanımız, canımız, başımız bahasına torpaqlarımızı təcavüzkardan təmizləyəcəyik və o zaman, el arasında deyildiyi kimi, bizim də küçəmizdə bayram olacaqdır, inşallah!

Mən buna bütün varlığımla inanıram və oxucuları da inandırıram ki, həmin bayramda məsud vətəndaşlarımızın oxuyacaqları mahnılar, şeirlər arasında Şəhriyarın bu misraları da özünə yer alacaqdır:

İnqilabdan kam almışıq,
Nəngi verib, nam almışıq,
Küfrdən islam almışıq,
Taza ilə taza girdik,
Qışdan çıxıb, yaza girdik.

Çox maraqlıdır ki, ustadın hansı şerini diqqətlə oxuyuruqsa qəlbimizdə bu baxımdan aydın intibahlar oyadır, inam hissimizi qüvvətləndirir. Şəhriyarın bu qəbildən olan əsərləri 1970-ci iliərin sonlarında İranda, 1980-cı illərin sonlarında Qafqazda, Orta Asiyada və Qazaxıstanda avtoritarizmin süqutu üçün adamları ruhən hazırlayırdı. Şəhriyar öz ölkəsindəki rejimin eybəcərliklərini, Savak başkəsənlərini öz amansız taziyanələrinə hədəf edəndə dünyanın bir sıra digər ölkələrində hökm sürən qeyri-insani rejimləri, o cümlədən də yaxın qonşuluqdakı dindaşlarını əsarət altında saxlayan bolşevik-daşnak qaragüruhunu da biabırçılıq sütununa mıxlamış olurdu. Bu nöqteyi-nəzərdən yanaşdıqda Şəhriyarın demək olar ki, bütün şeirləri güclü düşündürmə, duyğulandırma imkanlarına malikdir:

Barilaha! Sən bizə ver bu şəyatindən nicat,
İnsanın nəslin kəsib, ver insə bu cindən nicat.

... Şurəvidən də nicat umduq ki, bir xeyir olmadı,
Olmasa çay sandığında, qoy gələ Çindən nicat.

*("İnsü cin")*

Məsəl var, deyərlər: "İmanım bir yerə, gümanım bir yerə". Şair gümanım, səyyar xəyalının, simurqu da min dəfələrdən birində dolana-dolana, dolaşa-dolaşa gedib Şurəvi üstünə qonmuşdur. Fəqət dərhal hiss edib, başa düşmüşdür ki, ondan heç bir xeyir gözləmək olmaz. Doğrudan da axı, Şurəvi milyonların başına bəla kəsilən öz dövlətində məskun qövmlərə bir gün vermədiyi halda, İrana necə nicat verə bilərdi? Yəqin məhz bu qənaətdə olduğu üçün şair sözünə davam edərək demişdir:

Şəhriyarın da əzizim, bir tutarlı ahı var,
Düşməni Əhrimən olsun, tapmaz ahımdan nicat!

Dərgahi-alidə peyğəmbərlərdən sonra ikinci yerdə şərəflənən əsil şairlərin ahı isə həqiqətən də çox tutarlı olur. Hələ XII əsrdə Şəhriyarın sənətdə ulu babalarından olan Əfzələddin Xaqani əbəs yerə deməmişdi ki,

Hər səhər qalxar göyə ah ilə əfqanım mənim,
Qərq olar qanda şəfəq tək çeşmi-giryanım mənim.

...Ah odumla hər dəfə aldım hədəf, etdim şikar,
Ol qoca qurdu ayaqdan saldı peykanım mənim.
Pas kimi sardı məni dövran ki, yandırsın, həmən
Ah odunda yandı, his oldu o dövranım mənim!

*("Həbsiyyə")*

Bəli, mürtəce şah mütləqiyyətinin və kommunst Əhrimənінin çöküb darmadağın olması hər iki ölkədə ilk növbədə ictimai-siyasi proseslərin nəticəsidir. Lakin bu işdə Allahın sevdiyi, böyük istedad və daşı deşən ah əta etdiyi, dualarının müstəcəb qıldığı Xaqani, Füzuli, Şəhriyar kimi, habelə Şurəvi zindanlarnnda qətlə yetirilmiş Seyid Hüseyn, Əhməd Cavad, Mikayıl Müşfiq kimi böyük ədəbi simaların ah-naləsinin də labüd rolu vardır. Şəhriyarın aşağıdakı beyti də fəqət bu kontekstdə düzgün başa düşülə bilər:

Küfrü gördüz necə çiy-çiy yedi islam cigərin?
Siz də Küfrün cigərin indi kabab etməlisiz!

*("Qeyrət vəqtidir")*

Ustad Şəhriyarın "Allah bayrağı" şerində də çox dərin mənalı, ibrətamiz beytlərlə qarşılaşırıq. İrandakı İslam inqilabı ərəfəsinin və o gərgin günlərin bəzi dəhşətli məqamlarını yada salan bu əsərlərində şair sonsuz bir iftixar duyğusu ilə deyirdi ki, uzun müddət şeytanın yuxuya verdiyi və oyanışına bütün vasitələrlə mane olduğu xalqı bu qəflət yuxusundan islam oyatdı. Ona görə də dünyagörmüş şair Qurani-Kərimin "Baqara" surəsindəki 138-ci ayəni ("Allahın rənginə bəyan; kimin rəngi onunkundan gözəldir?") əsas götürüb öz həmvətənlərinə müraciət edərək onları ağı qaradan seçməyə, zahiri parıltılara uymayıb mahiyyətə varmağa, islami dəyərlərə sadiq qalmağa təkidlə dəvət edirdi:

Hər rəngi at, fəqət boyan Allah boyağına,
Hər aldadan boyaqlara qəlbin boyanmasın!
Xəlqin gözün oyardı şahın mərqəzəbləri,
Qoy bir oyulsun öz gözü, ta göz oyammasın!

Dinimizdən, onun fəaliyyətindən cin-bismillahdan qorxan kimi qorxub vahiməyə düşən bolşevik hökmranlığı xalqımızı öz dini - mübarəki olan İslamdan, şair demiş, Allah boyağından ayrı salmaq üçün çox hoqqalardan çıxdı, çox ağır cinayətlər törətdi, çox məscidləri bağlayıb, xarabazara çevirdi. Məscidlərin bir qismindən fabrik, zavod, anbar, idarə, kino klubu kimi istifadə etdilər, bəsirət əhlini göz görə-görə gözsüz qoydular. Ağzı dualı minlərcə din xadimini minbərlərdən düşürdüb səhhətinə və yaşına baxmadan həbs etdilər, Sibirə, Uzaq Şərqə sürgün etdilər, qətlə yetirditər. Keçmişdə Bakıda qazi olub Qurani-Kərimi Azərbaycan dilində şərh etmiş Mir Məhəmməd Kərim ağa milisin zirzəmisində güllələnəndə onun 84 yaşı var idi...

Bu işdə çox canfəşanlıq eləyən o zamankı rəhbərliyin başçısı Mircəfər Bağırov olub ki, xalq arasında gizlində deyilən ikinci adı bir an əvvəl Şəhriyardan gətirdiyim birinci beytdə nifrətlə yad olunan Mirqəzəb idi. Mirqəzəb Bağırov bədnam Stalinin Bakıda heç bir məhdudiyyət bilməyən buyruqçusu idi. O öz iradəsi və şəxsən öz əllərilə çox xalqsevər ziyalını o cümlədən də nüfuzlu din xadimlərini qanına qəltan etmiş, ocaqları söndürmüş, qapıları bağlı qoymuşdu.

Fəqət yenə də şair demiş, şeytan bu mənfur əməllərini çox davam etdirə bilmədi, haqq öz yerini aldı, öz istiqlaliyyətinə qovuşandan sonra xalqın ilk nəcib, vacib kütləvi tədbirlərindən biri bu oldu ki, Azərbaycanda məscidlər bərpa edildi, yeni, daha vüsətli Allah evləri tikildi, Bayıl qəsəbəsində vaxtilə partladılmış Səkinə xanım məscidinin yerində ucaldılan gözəl bir Allah evinin bünövrəsinə isə ilk daşı Qafqaz Müsəlmanları İdarəsinin rəisi Şeyxülislam Hacı Allahşükür Pasazadə ilə birlikdə müstəqil Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyev cənabları özləri qoydular!

Azərbaycan Prezidenti Heydər Əliyev İslam konfransının VIII zirvə toplantısı münasibətilə Tehranda olarkən İranın Ali dini rəhbəri Ayətullah Seyid Əli Xamneyi cənabları ilə görüşəndə ona demişdir: "Xalqımızı 70 il ərzində İslam dinindən ayırmağa çalışıblar. Bilirsiniz ki, biz Sovetlər İttifaqının tərkibində ateist tərbiyəsi, təbliğatı altında yaşamışıq. Ancaq buna baxmayaraq, xalqımız öz dinindən heç vaxt ayrılmayıbdır, onu qəlbində, ürəyində saxlayıb və imkan olan kimi hər şey açılıbdır. Bu da dinimizin - İslam dininin nə qədər qüdrətə, gücə malik olduğunu göstərir. Bir daha bəyan edirəm ki,

Azərbaycan öz müstəqilliyini bundan sonra heç vaxt əldən verməyəcək və öz dinindən də ayırılmayacaqdır" ("Azərbaycan" qəzeti, 16 dekabr 1997).

Biz müəyyən edə bilmədik ki, ustad Şəhriyar muğamat dəstgahlarının əla şairanə təsnifatını verən "Sazlı şairimiz Xazinin ruhuna təqdim" əsərini nə vaxt yazıb... Lakin onun həmin şeirlə Azərbaycan xalqının Qarabağ yarasına mənəvi bir məlhəm qoyduğu göz qabağındadır.

Sızıldar sinəmin sazı, "Dəraməd" eylərəm "Şuri",
"Çobanım" sən də "Səlmək"lə sızıldat taru-tənburi.
"Qarabağım" çıxıb əldən, “Segahm” qoy yetim olsun;
İgidlər yurdusa bir gün ucalsın təblü-şeypuri!

Ustadın bu fikirlərini davam etdirmək caiz olsaydı, deyərdim ki, əgər Qarabağ soydaşlarımız, bütün xalqımız öz qəhrəmanlıq ənənəsinə sadiqdirlərsə, onlar artıq "Yetim segah" oxumaqla dərdə dərman edə bilməzlər; indi təblü-şeypur "Cəngi" üstündə vurulmalı, Qarabağda "Qarabağ şikəstəsi" də öz əsil sahiblərinə qaytarılmalıdır!

Ümumiyyətlə, Şəhriyarın yaradıcılığında əsər tapmaq çətindir ki, onda ümumbəşəri qayələr, insanlığa xas olan uca keyfiyyətlər, bütün ölkələr və bütün zamanlar üçün müqəddəs olan mənəvi mətləblər yüksək sənətkarlıqla ifadə edilməsin. 16 bənddən ibarət "Eyvay madərim!" şerində Şəhriyarla Kövkəb xanım arasındakı zərif və kövrək ana-övlad münasibətləri yadda qalan çox incə təfərrüatları ilə öz bədii inkişafını tapmışdrr. Lakin eyni zamanda ustad dünya ədəbiyyatının bədii qaynaqlarından biri olan ana mövzusuna elə bir fikri-bədii vüsət vermiş, bu münasibətləri elə səciyyəvi məqamları ilə və elə məntiqi bir ardıcıllıqla nəzmə çəkmişdir ki, onun əsəri, dünyanın hansı qitəsində yaşamasından asılı olmayaraq, hər bir ləyaqətli insan üçün ardınca qoşulmalı örnək səviyyəsinə qalxmışdır:

Bilirsən mənə bir vaxt nələr, nələr demiş o?
Həqiqətlər söyləmiş, əfsanələr demiş o.

Onun nağıllanyla qanadlanmış xəyalım,
Bayatılar, laylalar, təranələr demiş o.

Beşiyimin başında gah gülmüş, gah ağlamış,
Qundağımın bağını nəğmələrlə bağlamış.

Mənim eşqim, ilhamım, hər nəyim var, onundur,
Bu qəmlər, bu ələmlər, bu misralar onundur.

Mən yazmıram, bəlkə də yazır indi bu şeri,
Onun qızıl şüa tək könül titrəyişləri.

Mən onun sayəsində boya-başa çatmışam,
Anam məni doğubdıır, mən aləm yaratmışam.

Bu fikir aliliyi, bu şairanəlik və bədii vüsət Şəhriyarın "Heydərbabaya salam" və başqa poemalarına, bir sıra qəsidə və qitələrinə, "Aşiqin gileyi", "Həzin nalələr", "Yanıqlı saz", "İnsan ol!", "Tarım mənim" kimi yüzlərcə qəzəlinə də yaşarılıq bəxş edən ən səciyyəvi əlamət və keyfiyyətlərdir.

Beləcə mühüm bəşəri problemləri diqqət mərkəzinə çəkib öz qənaətlərini ifadə edən Şəhriyar bəzən klassik irsdən, bir şairin bir misrasından, hətta müəyyən təbii təbəddülata uğratmış olsa da, tək bircə qafiyəsindən belə öz İlhamına qanad taxır, təbini cuşa gətirir. Məsələn, "İman müştərisi" şerini alaq. Bu əsərdə təkanverici poetik məqam Hacı Seyid Əzimin "Aparır" rədifli qəzəlinin bu beytidir:

Ey kaman qaşlı, məni yarələdi qəmzən oxu,
Zülfünü bas yarama, qoyma məni qan aparır.

İncə ruhlu qəzəlxan Seyid Əzim məhəbbətin tərənnümünə həsr olunmuş bu qəzəlinin Şəhriyarı xüsusilə mütəəssir etmiş beytində bir-birindən doğan hadisələrin təbii ardıcıllığı yolu ilə qəribə bir psixoloji vəziyyət, poetik məqam yaratmış, bununla da əsərinə məntiqi və estetik bütövlük aşılamışdır. Hələ sağlığında, yəni keçən əsrin ortalarında Qafqazda və Yaxın Şərqdə tanınmış bu görkəmli şairin ənənəvi məhəbbət mövzusuna həsr edilən qəzəlindəki bircə ünsürdən faydalanan Şəhriyar isə doğma vətəninin ictimai bəlalarını

göstərməyə, ürəyində qövr eləyən böyük dərdləri dilinə gətirməyə imkan verən tamamilə yeni, yüksək mənalı bir qəzəl yazmışdır:

Aman Allah, yenə şeytan gəlib iman apara,
Qoruyun, qoymayın imanızı şeytan apara!
Qanlı dırnaqlarılan ingilis əl qatdı bizə,
Baxısan, rus da Arazdan keçir, İran apara.
Anama söyləyin: oğlun yıxılıb səngərdə,
Tellərin bas yarama, qoyma, məni qan apara.

Şəhriyar şerinin təsir qüvvəsi ilk növbədə izlədiyi qayənin böyüklüyündə, fikir və duyğuların yaşarılığındadır. Onun əsərlərini dönə-dönə oxuduqca, biz ən müxtəlif, aşkar və gizli yollarla İrana rəxnə salmaq istəyən şər kabusunu, iman aparmağa gələn şeytanları, "Parçala, hökm sür‶" deyib öz qanlı pəncələri ilə ölkəni təhdid edən imperializmin mənfi obrazını görmüş kimi oluruq. Ölkəsinin ərazi bütövlüyü uğrunda, mənəviyyatının, dininin, dilinin, imanının təhlükəsizliyi uğrunda can nisar edən məğrur oğullarla, belə oğulları yetişdirən ağ saçlı qəhrəman analarla görüşmüş, onların mübarək əllərindən öpmüş kimi oluruq. Xəyallarmzda bu mərd İran anaları ilə Qarabağ davasında qoşa-qoşa şəhid vermiş vətənpərvər analar arasında uzanıb gedən ilahi bir nur zolağı görür və bu nur zolağını bundan sonra daha böyük qüvvətlə bərq vuracağına iman gətiririk.

Beləliklə də, qətiyyətlə təsbit etmək üçün əlimizdə kifayət qədər fakt, elmi bədii sənəd və əsaslar mövcuddur ki, rişələri, hüceyrələri ilə əsil xalq şairi olan Şəhriyarın irsi İranzəmin hüdudlarından kənarda da hüsn-rəğbətlə qarşılanan, başa düşülən, təkcə ustadın vətəni, xalqı üçün deyil, bir çox digər ölkələrin xalqları üçün də həm dünən, həm də bu gün vacib əhəmiyyətini qoruyub saxlayan regional və qlobal bəşəri problem və motivlərlə çox zəngindir. Bu problem və motivlərin yalnız bir qismindən, bu yazının verdiyi imkanlar çərçivəsində bəhs edə bildim. Lakin bu fikirdəyəm ki, onun adını çəkmədiyimiz bir sıra digər əsərləri də bu baxımdan araşdırılıb tədqiq edilməyə, haqqında xüsusi kitab və məqalələr yazılmağa möhtacdır. Qənaətimiz bundan ibarətdir ki, ustad Seyid Məhəmmədhüseyn Şəhriyar irsinin bu cəhətlərini işıqlandıran sanballı kitabı onun istedadlı pərəstişkarları, inşallah, çox gözləməli olamayacaqlar.

* * *

Şəhriyarın həm farsca, həm də ana dilində, həm klassik üslubda, həm də yeni formada yazdığı əsərlərində çox sanballı milli və bəşəri problemlər qaldırılmışdır. Onların bir çox xalqların öz müqəddəratını əlinə alıb dövlət müstəqilliyini qorumaq uğrunda çarpışdığı indiki vəziyyətdə milli özünüdərk baxımından böyük əhəmiyyəti vardır.

60-cı illərdə, xüsusən, "Heydərbabaya salam" poeması Bakıda tam halda nəsr edildikdən sonra Şimali Azərbaycanda Şəhriyarın yaradıcılığına maraq xeyli artmış, şairin əsərləri yurdumuzun istisnasız olaraq bütün bölgələrində geniş yayılmışdır. Bu taylı şairlərin Şəhriyarın əsərlərində vaxtaşırı anılması, onun da mübarək adının və məşhur poemasının bu taylı şairlərimizin əsərlərində dönə-dönə tərənnüm edilməsi, güney və quzey Azərbaycanın şairləri arasında yazışmalar, "Heydərbabaya salam"ın bu tayda mavi ekranda görünməsi, radio dalğalarında səslənməsi, bu əsərin motivləri əsasında tamaşalar göstərilməsi, Şəhriyar irsinin Bakıda, onun böyük sələfi Nizami Gəncəvinin adını daşıyan Azərbaycan ədəbiyyatı tarixi muzeyində xüsusi bir guşədə layiqincə canlandırılması xalqımızın öz tarixinə, ənənələrinə qovuşması, öz dövlət müstəqilliyini əldə etməsi prosesində çox böyük mənəvi kömək etmişdir. Şairin vəfatından illər keçdikcə onun ədəbi irsinə oxucu marağı daha da artır. Hər iki tayda adamlar xoş gündə də, iş müşkülə düşəndə də ilk növbədə, özünün say-seçmə şairlərindən biri kimi Şəhriyarın sənət kəhkəşanına müraciət edir, onun fikir və duyğular xəzinəsindən qəni-qəni faydalanırlar. Bu zəngin və universal xəzinədə insan həyatının bütün məqamlarını, xalq psixologiyasının ovqat qammasını əks etdirən əsərlərlə qarşılaşırlar. Şəhriyar on illər bundan əvvəl doğulmuş bu misralarını elə bil ki, xalqımızın erməni təcavüzünə məruz qaldığı məhz bu fəlakətli günləri haqqında demişdir:

Behiştimiz cəhənnəm olmaqdadır,
Zilhiccəmiz məhərrəm olmaqdadır.

Lakin xoşbəxtlikdən Şəhriyarın həsbi-hal səciyyəsi daşıyan belə optimist misraları da vardır:

Dedim: - Məhəbbətdən özgə nə varsa,
Çəkdim, qələm çəkdim, hamısına mən.
- İnsana, vətənə, borcun var, dedi,
Heç vaxt qələm çəkmə bu borcuna sən.
Dedim: - Nə gözəldir səma, ay, günəş,
Ey cahan, günəşə öz qapını aç!
Dedi: - Ey gözəllik padşahı şair,
Dünyaya ədalət bayrağını sanc!

Yaman günün ömrü az olar demişlər. Haqq öz yerini tutacaq, xalqımızın istiqlal amalı tam qalib gələcək, gözəl Qarabağın bütün guşələri də buraya daxil olmaqla, doğma torpaqlarımız dinc nəfəs alacaqdır. Azərbaycanın üçrəngli, aylı-ulduzlu dövlət bayrağı ilə yanaşı, xalq mənəviyyatının parlaq rəmzi kimi qüdrətli şairimiz Şəhriyarın sənət və gözəllik bayrağı da qədim Azərbaycan torpağı üzərində əbədi dalğalanacaqdır.

***Bəkir Nəbiyev***
*akademik*

# HEYDƏRBABAYA SALAM

## BİRİNCİ HİSSƏ

Heydərbaba, ildırımlar çaxanda,
Sellər, sular şaqqıldayıb axanda,
Qızlar ona səf bağlayıb baxanda,
Salam olsun şövkətüzə, elüzə,
Mənim də bir adım gəlsin dilüzə.

Heydərbaba, kəhliklərin uçanda,
Kol dibindən dovşan qalxıb qaçanda,
Baxçaların çiçəklənib acanda,
Bizdən də bir mümkün olsa yad elə,
Açılmayan ürəkləri şad elə.

Bayram yeli çardaxları yıxanda,
Novruzgülü, qar çiçəyi çıxanda,
Ağ buludlar köynəklərin sıxanda,
Bizdən də bir yad eləyen sağ olsun,
Dərdlərimiz qoy dikəlsin, dağ olsun.

Heydərbaba, gün dalıvı dağlasın,
Üzün gülsün, bulaqların ağlasın,
Uşaqların bir dəstə gül bağlasın,
Yel gələndə, ver gətirsin bu yana,
Bəlkə mənim yatmış bəxtim oyana.

Heydərbaba, sənin üzün ağ olsun,
Dörd bir yanın bulaq olsun, bağ olsun,
Bizdən sora sənin başın sağ olsun,
Dünya qəzəv-qədər, ölüm-itimdi,
Dünya boyu oğulsuzdu, yetimdi.

Heydərbaba, yolum sənnən kəc oldu,
Ömrüm keçdi, gələmmədim, gec oldu,
Heç bilmədirn gözəllərin nec oldu,
Bilməz idim döngələr var, dönüm var,
İtginlik var, ayrılıq var, ölüm var.

Heydərbaba, igid əmək itirməz,
Ömür keçər, əfsus bərə bitirməz,
Namərd olan ömrü başa yetirməz,
Biz də, vallah, unutmarıq sizləri,
Görəmməsək, halal edin bizləri.

Heydərbaba, Mirəjdər səslənəndə,
Kənd içinə səsdən-küydən düşəndə,
Aşıq Rüstəm sazın dilləndəndə,
Yadmdadı nə hövləsək qaçardım?
Quşlar təkin qanad çalıb uçardım.

Şəngülava yurdu, aşıq alması,
Gah da gedib orda qonaq qalması,
Daş atması, alma-heyva salması
Qalıb şirin yuxu kimi yadımda,
Əsər qoyub ruhumda, hər zadımda.

Heydərbaba, Quru gölün qazları,
Gədiklərin sazax çalan sazları,
Kənd-kövşənin payızları, yazları,
Bir sinema pərdəsidir gözümdə,
Tək oturub, seyr edirəm özüm də.

Heydərbaba, Qaraçəmən caddası,
Çovuşların gələr səsi, sədası,
Kərbəlaya gedənlərin qadası
Düşsün bu ac, yolsuzların gözünə,
Təməddünün uyduq yalan sözünə.

Heydərbaba, şeytan bizi azdırıb,
Məhəbbəti ürəklərdən qazdırıb,

Qara günün sərneviştin yazdırıb,
Salıb xalqı bir-birnin canına,
Barışığı bələşdirib qanına.

Göz yaşına baxan olsa, qan axmaz,
İnsan olan, xəncər belinə taxmaz,
Amma heyif, kor tutduğun buraxmaz,
Behiştimiz cəhənnəm olmaqdadır,
Zilhiccəmiz məhərrəm olmaqdadır.

Xəzan yeli yarpaqları tökəndə,
Bulud dağdan yenib kəndə çökəndə,
Şeyxülislam gözəl səsin çəkəndə,
Nisgilli söz ürəklərə dəyərdi,
Ağaclar da Allaha baş əyərdi.

Daşlı bulaq daş-qumunan dolmasın,
Baxçaları saralmasın, solmasın,
Ordan keçən atlı susuz olmasın,
Deynə, bulaq, xeyrin olsun, axarsan,
Üfuqlərə xumar-xumar baxarsan.

Heydərbaba, dağın, daşın sərəsi,
Kəhlik oxur, dahlısında fərəsi,
Quzuların ağı, bozu, qərəsi,
Bir gedəydim dağ-dərələr uzunu,
Oxuyaydım: "Çoban, qaytar quzunu".

Heydərbaba, Sulu yerin düzündə,
Bulaq qaynar çay-çəmənin gözündə,
Bulaqotu üzər suyun üzündə,
Gözəl quşlar ordan gəlib keçərlər,
Xəlvətləyib bulaqdan su içərlər.

Biçin üsrü sünbül biçən oraqlar,
Elə bil ki, zülfü darar daraqlar,
Şikarçılar bildirçini soraqlar,
Biçincilər ayranların içərlər,

Bir huşlanıb, sondan durub biçərlər.
Heydərbaba, kəndin günü batanda,
Uşaqların şamın yeyib yatanda,
Ay buluddan çıxıb qaş-göz atanda
Bizdən də bir sən onlara qissə de,
Qissəmizdə çoxlu qəmü qüssə de.

Qarı nənə gecə nağıl deyəndə,
Külək qalxıb qap-bacanı döyəndə,
Qurd keçinin Şəngülüsün yeyəndə
Mən qayıdıb bir də uşaq olaydım,
Bir gül açıb ondan sora solaydım.

Əmməcanın bal bəlləsin yeyərdim,
Sondan durub üs donumu geyərdim,
Baxçalarda tiringəni deyərdim,
Ay özümü o əzdirən günlərim,
Ağac minib, at gəzdirən günlərim.

Həçi xala çayda paltar yuyardı,
Məmmədsadıq damlarını suvardı,
Heç bilməzdik dağdı, daşdı, duvardı,
Hər yan gəldi, şıllaq atıb aşardıq,
Allah, nə xoş, qəmsiz-qəmsiz yaşardıq!

Şeyxülislam münacatı deyərdi,
Məşəd Rəhim ləbbadəni geyərdi,
Məşd Hacəli bozbaşları yeyərdi,
Biz xoş idik, xeyrat olsun, toy olsun,
Fərq eyləməz, hər nolacaq, qoy olsun.

Məlik Niyaz vərəndilin salardı,
Atın çapıb, qıyqacıdan çalardı,
Qırğı təkin gədik başın alardı.
Dolayıya qızlar açıb pəncərə,
Pəncərələrdə nə gözəl mənzərə!

Heydərbaba, kəndin toyun tutanda,
Qız-gəlinlər həna, piltə satanda,

Bəy gəlinə damnan alma atanda,
Mənim də o qızlarında gözüm var,
Aşıqların sazlarıda sözüm var.

Heydərbaba, bulaqların yarpızı,
Bostanların gülbəsri, qarpızı,
Çərçilərin ağ nabatı, saqqızı
İndi də var damağımda, dad verər,
İtgin gedən günlərimdən yad verər.

Bayram idi, gecəquşu oxurdu,
Adaxlı qız bəy corabın toxurdu,
Hər kəs şalın bir bacadan soxurdu,
Ay nə gözəl qaydadı şal sallamaq,
Bəy şalına bayramlığın bağlamaq.

Şal istədim mən də evdə ağladım,
Bir şal alıb tez belimə bağladım,
Qulamgilə qaşdım, şalı salladım,
Fatma xala mənə corab bağladı,
Xan nənəmi yada salıb ağladı.

Heydərbaba, Mirzəmmədin baxçası,
Baxçaların turşaşirin alçası,
Gəlinlərin düzmələri, taxçası,
Hey düzülər gözlərimin rəfində,
Xeymə vurar xatirələr səfində.

Bayram olub, qızıl palçıq əzərlər,
Naxış vurub, otaqları bəzərlər,
Taxçalarda düzmələri düzərlər,
Qız-gəlinin fındıqçası, hənası,
Həvəslənər anası, qaynanası.

Bakıçının sözü-sovu, kağızı,
İnəklərin bulaması, ağızı,
Çərşənbənin girdəkanı, mövizi,
Qızlar deyər: "Atıl-matıl, çərşənbə,
Ayna təkin bəxtim açıl, çərşənbə".

Yumurtanı göyçək, güllü boyardıq,
Çaqqışdırıb sınanların soyardıq,
Oynamaqdan bircə məgər doyardıq?
Əli mənə yaşıl aşıq verərdi,
İrza mənə novruzgülü dərərdi.

Novruzəli xərməndə vəl sürərdi,
Gahdan enib küləşlərin kürərdi.
Dağdan da bir çoban iti hürərdi,
Onda gördün ulaq ayaq saxladı,
Dağa baxıb qulaqların şaxladı.

Axşam başı naxırçılar gələndə,
Qoduqları çəkib vurardıq bəndə,
Naxır keçib gedib yetəndə kəndə
Heyvanları çılpaq minib qovardıq,
Söz çıxsaydı, sinə gərib sovardıq.

Yaz gecəsi çayda sular şarıldar,
Daş-qayalar seldə aşıb xarıldar,
Qaranlıqda qurdun gözü parıldar,
İtlər, gördün, qurdu seçib ulaşdı,
Qurd da, gördün, qalxıb gədikdən aşdı

Qış gecəsi tövlələrin otağı,
Kətillərin oturağı, yatağı,
Buxanda yanar odun yanağı,
Şəbçörəsi, girdəkanı, iydəsi,
Kəndi basar gülüb-danışmaq səsi.

Şüca xaloğlunun Bakı sovqəti,
Damda quran samavarı, söhbəti,
Yadımdadı şəsli qəddi, qaməti,
Cünəmməyin toyu donüb yas oldu,
Nənəqızın bəxt aynası kas oldu.

Heydərbaba, Nənəqızın gözləri,
Rəxşəndənin şirin-şirin sözləri,

Türki dedim, oxusunlar özləri,
Bilsinlər ki, adam gedər, ad qalar,
Yaxşı-pisdən ağızda bir dad qalar.

Yaz qabağı gün güneyi döəndə,
Kənd uşağı qar güllərin sövəndə,
Kürəkçilər dağda kürək züvəndə,
Mənim ruhum elə bilin ordadır,
Kəhlik kimi batıb qalıb, qardadır.

Qan nənə uzadanda işini,
Gün buludda əyirərdi teşini,
Qurd qocalıb çəkdirəndə dişini,
Sürü qalxıb dolayıdan aşardı,
Baydaların südü aşıb-daşardı.

Xəccəsultan əmmə dişin qısardı,
Molla Bağır əmoğlu tez mısardı,
Təndir yanıb, tüstü evi basardı,
Çaydanımız ərsin üstə qaynardı,
Qovurğamız sac içində oynardı.

Bostan pozub gətirərdik aşağı,
Doldurardıq evdə taxta-tabağı,
Təndirlərdə bişirərdik qabağı,
Özün yeyib, toxumların çırtdardıq,
Çox yeməkdən lap az qala çatdardıq.

Vərzəğandan armudsatan gələndə,
Uşaqların səsi düşərdi kəndə,
Biz də bu yandan eşidib biləndə,
Şıllaq atıb bir qışqırıq salardıq,
Buğda verib armudlardan alardıq.

Mirzə Tağıynan gecə getdik çaya,
Mən baxıram seldə boğulmuş aya,
Birdən işıq düşdü o tay baxçaya,
"Eyvay, - dedik, - qurddu". Qayıtdıq qaşdıq.
Heç bilmədik nə vaxt gədikdən aşdıq

Heydərbaba, ağacların ucaldı,
Amma heyif cavanların qocaldı,
Toğluların arıqtayıb acaldı,
Kölgə döndü, gün batdı, qaş qərəldi,
Qurdun gözü qaranlıqda bərəldi.

Eşitmişəm yanır Allah cırağı,
Dair olub məscidüzün bulağı,
Rahat olub kəndin evi, uşağı,
Mənsur xanın əli-qolu var olsun,
Harda qalsa, Allah ona yar olsun.

Heydərbaba, Molla İbrahim var, ya yox?
Məktəb açar, oxur uşaqlar, ya yox?
Xərmən üstü məktəbi bağlar, ya yox?
Məndən axunda yetirərsən salam,
Ədəbli bir salami-malakəlam.

Xəccəsultan əmmə gedib Təbrizə,
Amma nə Təbriz ki, gələmmir bizə,
Balam, durun, qoyaq gedək əmmizə,
Ağa öldü, tifağımız dağıldı,
Qoyun olan yad gedibən sağıldı.

Heydərbaba, dünya yalan dünyadı,
Süleymandan, Nuhdan qalan dünyadı,
Oğul doğan, dərdə salan dünyadı,
Hər kimsəyə hər nə verib alıbdı,
Əflatundan bir quru ad qalıbdı.

Heydərbaba, yar-yoldaşlar döndülər,
Bir-bir məni çöldə qoyub çöndülər,
Çeşmələrim, çıraqlaım söndülər,
Yaman yerdə gün döndü, axşam oldu,
Dünya mənə xərabəyi-Şam oldu.

Əmoğluynan gedən gecə Qıpçağa,
Ay ki çıxdı, atlar gəldi oynağa,

Dırmaşırdıq, dağdan aşırdıq dağa,
Məş Məmixan göy atını oynatdı,
Tüfəngini aşırdı şaqqıldatdı.

Heydərbaba, Qara gölün dərəsi,
Xoşginabın yolu, bəndi, bərəsi,
Orda düşər çil kəhliyin fərəsi,
Ordan keçər yurdumuzun özünə,
Biz də keçək yurdumuzun sözünə.

Xoşginabı yaman günə kim salıb?
Seyidlərdən kim qırılıb, kim qalıb?
A Mirqafar dam-daşını kim alıb?
Bulaq genə gəlib gölü doldurur?
Ya quruyub, baxçaları soldurur?

A Mirqafar seyidlərin tacıydı,
Şahlar şikar etməsi qıyqacıydı,
Mərdə şirin, namərdə çox acıydı,
Məzlumların həqqi üstə əsərdi,
Zalimləri qılıc təkin kəsərdi.

Mirmustafa dayı, ucaboy baba,
Heykəlli, saqqallı, Tolstoy baba,
Eylərdi yas məclisini toy baba,
Xoşginabın abrusu, ərdəmi,
Məscidlərin, məclislərin görkəmi.

Məcdüssadat gülərdi bağlar kimi,
Guruldardı buludlu dağlar kimi,
Söz ağzında ərirdi yağlar kimi,
Alnı açıq, yaxsı, dərin qanardı,
Yaşıl gözlər çıraq təkin yanardı.

Mənim atam süfrəli bir kişiydi,
El əlindən tutmaq onun işiydi,
Gözəllərin axıra qalmışıydı,
Ondan sonra dönərgələr döndülər,
Məhəbbətin çıraqları söndülər.

Mirsalehin dəlisovluq etməsi,
Mirəzizin şirin şaxsey getməsi,
Mirməmmədin qurulması, bitməsi,
İndi desək, əhvalatdı, nağıldı,
Keçdi-getdi, itdi-batdı, dağıldı.

Mirəbdülün aynada qaş yaxması,
Cövcülərindən qaşının axması,
Boylanması, dam-divardan baxması,
Şah Abbasın dürbünü, yadəş bəxeyr,
Xoşginabın xoş günü, yadəş bəxeyr.

Sitarəmmə nəzikləri yapardı,
Mirqadir də hərdəm birin qapardı,
Qapıb, yeyib, dayça təkin çapardı,
Gülməliydi onun nəzik qappası,
Əmmənin də ərsininin şappası.

Heydərbaba, A Mirheydər neynəyir?
Yəqin genə samavarı qeynəyir.
Day qocalıb, alt əngiynən çeynəyir,
Qulaq batıb, gözü girib qaşına,
Yazıq əmmə, hava gəlib başına.

Xanım əmmə Mirəbdülün sözünü
Eşidəndə əyər ağız, gözünü,
Məlkamıda verər onun özünü,
Davaların şuxluğınan qatallar,
Əti yeyib, başı atıb yatallar.

Fizzə xanım Xoşginabın gülüydü,
A Miryəhya əmqızının quluydu,
Rüxsarə artist idi, sevgiliydi,
Seyidhüseyn Mirsalehi yamsılar,
A Mircəfər qeyrətlidir, qan salar.

Səhər tezdən naxırçılar gələrdi,
Qoyun-quzu dam-bacada mələrdi,

Əmməcanım körpələrin bələrdi,
Təndirlərin qovzanardı tüstüsü,
Çörəklərin gözəl iyi, istisi.

Göyərçinlər dəstə qalxıb uçallar,
Gün saçanda qızıl pərdə açallar,
Qızıl pərdə açıb, yığıb qaçallar,
Gün ucalıb, artar dağın cəlalı,
Təbiətin cavanlanar cəmalı.

Heydərbaba, qarlı dağlar aşanda,
Gecə karvan yolun azıb, çaşanda,
Mən hardasam, Tehranda, ya Kaşanda,
Uzaqlardan gözüm seçər onları,
Xəyal gəlib, aşıb keçər onları.

Bir çıxaydım Damqayanın daşına,
Bir baxaydım keçmişinə, yaşına,
Bir görəydim nələr gəlib başına,
Mən də onun qarlarıylan ağlardım,
Qış donduran ürəkləri dağlardım.

Heydərbaba, gül qönçəsi xəndandı,
Amma heyif, ürək qəzası qandı,
Zindəganlıq bir qaranlıq zindandı,
Bu zindanın dərbəçəsin açan yox,
Bu darlıqdan bir qurtulub qaçan yox.

Heydərbaba, göylər bütün dumandı,
Günlərimiz bir-birindən yamandı,
Bir-birizdən ayrılmayın, amandı,
Yaxşılığı əlimizdən alıblar,
Yaxşı bizi yaman günə salıblar!

Bir soruşun bu qarğınmış fələkdən,
Nə istəyir bu qurduğu kələkdən?
Deynə, keçirt ulduzları ələkdən,
Qoy tökülsün, bu yer üzü dağılsın,
Bu şeytanlıq qurğusu bir yığılsın!

Bir uçaydım bu çirpınan yelinən,
Bağlaşaydım dağdan aşan selinən,
Ağlaşaydım uzaq düşən elinən,
Bir görəydim ayrılığı kim saldı?
Ölkəmizdə kim qırıldı, kim qaldı?

Mən sənintək dağa saldım nəfəsi,
Sən də qeytər, göylərə sal bu səsi,
Bayquşun da dar olmasın qəfəsi,
Burda bir şir darda qalıb bağırır,
Mürüvvətsiz insanları çağırır.

Heydərbaba, qeyrət qanın qaynarkən,
Qaraquşlar sənnən qopub qalxarkən,
O sıldırım daşlarınan oynarkən,
Qovzan, mənim himmətimi orda gör,
Ordan əyil, qamətimi darda gör.

Heydərbaba, gecə durna keçəndə,
Koroğlunun gözü qara seçəndə,
Qıratını minib, kəsib-biçəndə,
Mən də burdan tez mətləbə çatmaram,
Eyvaz gətib çatmayınca yatmaram.

Heydərbaba, mərd oğullar döğginən,
Namərdlərin burunların ovginən,
Gədiklərdə qurdları tut boğginən,
Qoy quzular ayın-şayın otlasın,
Qoyunların quyruqların qatlasın.

Heydərbaba, sənin köylün şad olsun.,
Dünya varkən ağzın dolu dad olsun,
Səndən keçən tanış olsun, yad olsun,
Deynə: mənim şair oğlum Şəhriyar,
Bir ömürdür qəm üstünə qəm qalar.

## İKİNCİ HİSSƏ

Heydərbaba, gəldim səni yoxluyam,

Bir də yatam, qucağında yuxluyam,
Ömrü qovam, bəlkə burda haxlıyam,
Uşaqlığa deyəm: bizə gəlsən bir,
Aydın günlər, ağlar yüzə gülsən bir!

Heydərbaba, çəkdin məni gətirdin,
Yurdumuza, yuvamıza yetirdin,
Yusifivi uşaq ikən itirdin,
Qoca Yəqub, itmişsəm də tapıbsan,
Qavalıyıb qurd ağzından qapıbsan.

Mən gördüyüm karvan çatıb köçübdü,
Ayrılığm şərbətini içibdi,
Ömrümüzün köçü burdan keçibdi,
Keçib gedib gedər-gəlməz yollara,
Tozu qonub bu daşlara, kollara.

Burda şirin xatirələr yatıblar,
Daşlarıylan başı başa çatıblar,
Aşnalığın daşın bizdən atıblar,
Mən baxanda qavzanıllar, baxıllar,
Bir də yatıb yandırıllar, yaxıllar.

Gedənlərin yeri burda görünür,
Xanım nənəm ağ kəfənin bürünür,
Dalımcadır, hara gedim sürünür:
- Bala, gəldin? Niyə belə gec gəldin?
Səbrim sənnən güləşdi, sən güc gəldin.

Qəbiləmiz burda qurub ocağı,
İndi olmuş qurd-quşların yatağı,
Gün batanda sönər bütün çırağı,
"Və bəldətin leysə ləha ənisu
İlləl yəafirə və iltəl-isu".

Zaman keçir, üfüqlərdə toz qalır,
Karvan kimi uzaqlarda toz salır,
Duman gəlir, yürəkləri çulğalır,
Ürək deyir: Zaman, keçmə, amandur,

Keçənlərdə gözüm var, bir dayan, dur!

Ruzigarın dəyirmanı firlanır,
Məxluq onun dişlərinə tullanır,
Bax ki, bəşər yenə necə allanır,
Həmişəlik şadlıq umur özünə,
Qəbri görür, toz qondurmur üzünə.

Köhnələrin sür-sümüyü dartılıb,
Qurtulanın çul-çuxası yırtılıb,
Molla İbrahim lap əriyib, qurtulub,
Şeyxülislam səhman qalıb, qıvraxdı,
Novruzəli qaçaq keçib, qoçaxdı.

Ahılları yetmiş kəfən çürüdüb,
Cahılları dünya qəmi kiridib,
Qız-gəlinlər ət-canların əridib,
Rəxşəndənin nəvə tutur əlini,
Nənəqızın kürəkəni, gəlini.

Çox şükrü var, yenə gəldux, görüşdux,
İtənlərdən, bitənlərdən soruşdux,
Küsmüşdux, Allah qoysa, barışdux,
Bir də görüş qismət ola, olmaya,
Ömürlərdə fürsət ola, olmaya.

Burda xəyal meydanları genişdi,
Dağlar, daşlar bütün mənlə tanışdı,
Görcək məni Heydərbaba danışdı:
- Bu nə səsdi, sən aləmə salıbsan,
Gəl bir görək özün harda qalıbsan?

Kəcavəylə bu çaydan çox keçmişik,
Bu çeşmələrdən nə sular içmişik,
Bu yoncalıqlarda kəsib biçmişik,
Çəpişləri qıdıxlayan günlərim,
Çəpiş kimi oynaxlayan günlərim.

Bu xırmanda "Aradanxır" oynardıq,

Comalaşıb qarışqatək qaynardıq,
Yavaş-yavaş baxçalarda ağnardıq,
Ağaclardan çilik-ağac kəsərdik,
Qoruqçunun qorxusundan əsərdik.

Bu tövlədə sarı inək doğardı,
Xanım nənəm inəkləri sağardı,
Ana iysi dam-divardan yağardı,
Mən buzovu qucaqlardım qaşmasın,
Deyərdi: - Bax, bayda dolsun daşmasın.

Bu damlarda çoxlu cızıq atmışam,
Uşaqların aşıqların udmuşam,
Qurquşunlu saqqa alıb satmışam,
Uşaq necə heç zadınan şad olar,
İndi bizim qəmi tutmur dünyalar.

Məktəb qalır, uşaqlar dərs alırlar,
Hey yazırlar, hey pozurlar, yalırlar,
Molla İbrahim özü, evi qalırlar,
Amma bizim yoldaşlardan qalan yox,
Bunlardan bir bizi yada salan yox.

Bir vaxtında bu məktəb pərgar idi,
Bir Müseyyib, bir Məmdəsən var idi,
Biri xəlfə, biri vərzişkar idi,
Axund bizlə oynamağa gedərdi,
Özü bizə oynamaq öyrədərdi.

Dedim, balam, o Məmdəsən nolubdu?
Məlum oldu tifil bala ölübdü,
Nə var, nə var, burnundan qan gəlibdi,
Bir yel əsir, baxırsan Məmdəsən yox,
Bu kənddə bir burun qanı kəsən yox.

Dedim, deyin Müseyyibə nə gəldi?
Qulam, gördüm, ağlar göz ilə gəldi,
Dedi: o da bahalıq düşdü, öldü,
Dedim, yazıq bizlə hasıl bölənlər,

Bitməyəndə aclarından ötənlər.

Bu məktəbdə şerin şəhdin dadmışam,
Axundun ağzından qapıb udmuşam,
Gahdan da bir axundu allatmışam,
- Başım ağrır, - deyib, qaçıb getmişəm,
Baxçalarda gedib gözdən itmişəm.

Azad olanda məkəobdən çıxardıq,
Hücum çəkib biri-birin sıxardıq,
Yolda hər nə gəldi, vurub yıxardıq,
Uşaq demə, ipin qırmış dana de,
Bir dana da demə, əlli dana de.

Məlikniyaz itkin gedib yox olub,
Mir Aslan xan səktə il yıxılıb,
Hərə qaçıb bir dərədə sıxılıb,
Çörək qəmi çıxıb xalqın ayına,
Hər kəs qalıb öz canının hayına.

Kəndli yazıq çıraq tapmır yandıra,
Görüm sizin bərqiz qalsın andıra,
Kim bu sözü ərbablara qandıra:
Nədir axır bu millətin günahı?
Tutsun sizi, görüm, məzlumlar ahı!

Hər nə alır baha verir qiyməti,
Ucuz fəqət əkinçinin zəhməti,
Bitənindən artıq biçən ücrəti,
Kənd uşağı gedir yolda işləyə,
Orda bəlkə qəndi tapa dişləyə.
Kəndli gəlin kimi dünyanı bəzər,
Öz övrəti yamaq-yamağa düzər,
İynə bəzər xalqı, özü lüt gəzər,
İndi də var çarsablar albaxdı,
Uşaqların qıç-paçası çılpaxdı.

Bu baxçada aş tərəsi əkərdik,
Hey su açıb kərdiyə göz dikərdik,

Çıxmaq həmin dərib asa tökərdik,
Fınqılışlar qaşıqlardan aslanı,
Yağlı desəm, quru ağzın islanı.

Bu döşlərdə quzuları yayardıq,
Axmasmlar, ulduz təkin sayardıq,
Quşqovanı çəkib daşa dayardıq,
Quşqovan da elə bil ki, qabandı,
Qurd uzaqdan deyr bəs ki, çobandı.

Xanım nənəm naxoş olan il idi,
Qış var ikən külək idi, yel idi,
Qış da çıxdı, yağış idi, sel idi,
Yük-yapını hey çatırdıq ki, gedax,
Sel küşgüdü, məcbur olduq qeyidax.

Neysan düşdü, biz də düşdük yağışa,
Kim bacarar sellər ilə boğuşa?
Hey deyirdik, bəlkə yağış yığışa,
Balakişi faytonçumuz gəlmişdi,
İmamiyyə qəhvəsində qalmışdı.

Bu zəmidə gedib gözdən itərdik,
Tonqal qurub sütülləri ütərdik,
Deyib, gülmək muradına yetərdik,
El də gülsün, muradına yetişsin,
Ürəklərin yaraları bitişsin.

Xəlvərçilər burda xəlvər daşırdı,
Bu küllükdən ulaqlar dırmaşırdı,
Sellər kimi nemət aşıb-daşırdı,
Hər iş dedin hər kimsəyə görərdi,
Can dərmam istəsəydin verərdi.

İndi bəşər ac qurd kimi uduxub,
Çömbələnti göz qıcırdıb duruxub,
Baxırlar ki, görsünlər kim sınıxıb,
Tökülsünlər onun leşin yırtsınlar,
Hərə bir diş ənsəsindən qırtsınlar.

Heydərbaba, səndə dəfinələr var,
Dağlar vədiəsi xəzinələr var,
Amma sənə bənzər də sinələr var,
Bu sinələr dağlar ilə danışır,
Dağlar kimi göylər ilə qonuşur.

Gör hardan mən sənə saldım nəfəsi,
Dedim qaytar sal aləmə bu səsi,
Sən də yaxşı simurq etdin məgəsi,
Sanki qanad verdin yelə, nəsimə,
Hər tərəfdən səs verdilər səsimə.

Heydərbaba, səni vətən bilmişdim,
Vətən deyib, baş götürüb gəlmişdim,
Səni görüb göz yaşımı silmişdim,
Halbuki, lap qəmli qürbət səndəymiş,
Qara zindan, acı şərbət səndəymiş.

Kim qaldı ki, bizə buğun burmadı,
Altdan-altdan bizə kələk qurmadı,
Bir mərd oğul bizə havar durmadı,
Şeytanları qucaqlayıb gəzdiz siz,
İnsanları ayaqlayıb, əzdiz siz.

Divar ucaldı, gün bizə düşmədi,
Zindan qaraldı, göz-gözü seşmədi,
Gündüz gözü mənim lampam keşmədi,

Sel də basdı, əmmiz dolub göl oldu,
Çox yazığın evi çönüb çöl oldu.

Əvvəl başı məndən istiqbal etdiz,
Sondan çönüb işimdə ixlal etdiz,
Öz zənnizcə ustadı iğfal etdiz,
Eybi yoxdur, keçər gedər ömürdür,
Qış da çıxar, üzüqara kömürdür.

Mənim yolum məhəbbət caddəsiydi,

Son sözlərim haqqın iradəsiydi,
Məhəbbətin risalət vədəsiydi,
Yoxsa məndə bir kəs ilə qərəz yox,
Siyasət adlı məndə bir mərəz yox.

Haqq nə deyir? Küfrə qarşı getməyiz,
Nurdan çıxıb zühnət içrə itməyiz,
Fırıldağa fırfıratək bitməyiz,
Gördüz də ki, olmadı küfrün dibi,
Pul da versə, almağa tikmiş cibi.

Şeytan bizim qəlbimizi çöndərib,
Allah deyən yoldan bizi döndərib,
İlanlı çeşməyə bizi göndərib,
Minnət qoyur ki, arxınız nəhr olub,
Biz görürük sular bizə zəhr olub.

Heydərbaba, gileylikdən nə çıxar?
Zülmün evin səbrli təhəmmül yıxar,
Dərviş olan səbrin əlin bərk sıxar,
Gəl qayıdaq, çıxaq Ağa düzünə,
Keçək yenə məhəbbətin sözünə.

Deynə uşaq bir-birilə saz olsun,
Bəlkə bu qış bir də çönüb yaz olsun,
Çay, çəmənlər ördək olsun, qaz olsun,
Biz də baxıb fərəhlənib bir uçaq,
Sınıq-salxaq qanadları bir açaq.
Bu baxçadan alçaları dərərdik,
Qış adına çıxıb damda sərərdik,
Hey də çıxıb yalandan çöndərərdik,
Qış zumarın yayda yeyib doyardıq,
Bir külli də minnət xalqa qoyardıq.

Evlər qalır, ev sahibi yox özü,
Ocaqların ancaq işıldar közü,
Gedənlərin az-çox qalıbdır sözü,
Bizdən də bir söz qalacaq, ay aman!
Kimlər bizdən söz salacaq, ay aman!

Bizdən sonra kürsülərin tovunda,
Kəndin nağıllarında, söz-sovunda,
Qan nənənin çaxmağında, qovunda,
Heydərbaba özün qatar sözlərə,
İçki kimi xumar verər gözlərə.

Aşıq deyər: Bir nazlı yar var imiş,
Eşqindən odlanıb yanar var imiş,
Bir sazlı, sözlü Şəhriyar var imiş,
Odlar sönüb, onun odu sönməyib,
Fələk çönüb, onun çarxı çönməyib.

Heydərbaba, alçaqların köşk olsun,
Bizdən sonra qalanlara eşq olsun,
Keçmişlərin gələnlərə məşq olsun,
Övladımız məzhəbini danmasın,
Hər içiboş sözlərə aldanmasın!

**BEHCƏTABAD XATİRƏSİ**

Ulduz sayaraq gözləmişəm hər gecə yarı,
Gec gəlmədədir yar, yenə olmuş gecə yarı.
Gözlər asılı, yox nə qaraltı, nə də bir səs,
Batmış qulağım, gör nə döşürməkdədi darı.
Bir quş: "Ayığam!"- söyləyərək, gahdan inildər,
Gahdan onu da, yel deyə laylay, huş aparı.
Yatmış hamı, bir Allah oyaqdı, daha bir mən,
Məndən aşağı kimsə yox, ondan da yuxarı.
Qorxum budu, yar gəlməyə, birdən yarıla sübh,
Bağrım yarılır, sübhüm, açılma, səni tarı!
Dan ulduzu istər çıxa, göz yalvarı çıxma!..
O çıxmasa da ulduzumun yoxdu çıxan.
Gəlməz, tanıram bəxtimi, indi ağarar sübh,
Qaş böylə ağardıqca, daha baş da ağarı.
Eşqin ki qərarında vəfa olmayacaqmış,
Bilməm ki təbiət niyə qoymuş bu qərarı?
Sanki xoruzun son banı xəncərdi, soxuldu,
Sinəmdə ürək varsa, kəsib qırdı damarı.
Rişxəndilə qırcandı səhər, söylədi durma,
Can qorxusu var eşqin, uduzdun bu qumarı,
Oldum qaragün ayrılalı o sarı teldən,
Bunca qara günlərdi edən rəngimi sarı.
Göz yaşları hər yerdən axarsa, məni tuşlar,
Dəryaya baxar, bəllidi, çayların axarı.
Əzbəs məni yapraq kimi hicranla saraldıb,
Baxsan üzünə, sanki qızılgüldi qızarı.
Mehrabi-şəfəqdə özümü səcdədə gördüm,
Qan içrə qəmim yox, üzüm olsun sənə sarı.
Eşqi var idi Şəhriyarın güllü-çiçəkli,
Əfsus ki,qəza vurdu, xəzan oldu baharı.

## QARANLIQ GECƏLƏR

Aman Allah, yənə şeytan gəlib iman apara,
Qoruyun, qoymuyun imanuzu şeytan apara.

Mənim insanlığımın gör nə hasan yavadır,
Ki günüz quli-biyaban gəlir insan apara.

Çörək almış əlinə, ac necə taqət gətisin?
Elə bil yaz gecəsi qız gəlib oğlan apara.

Qanlı dırnaqlarılan ingilis əl qatdı bizə,
Baxısan ras da Arazdan keçir İran apara.

Qəm aşıb-daşdı daha, xəlqilə şuxluq eləməz,
Sel gərək el dağıda, ev yıxa, eyvan apara.

Xərməni saqqıza verdik, nə yaman çərçidi bu?
Hey gəlir kəndə, bizə dərd verə, dərman apara.

Bu qaranlıq gecələrdə qapımız pis döyülür,
Nə bilim, bəlkə əcəldir, dayanıb can apara.

Anama söyləyin: oğlu yıxılıb səngərdə,
“Tellərin bas yarama, qoyma məni qan apara”.

Aradan bir də bizi bölsələr ərbablarımız,
Qorxuram qoymıyalar Təbrizi Tehran apara.

Qara tufan ki, dəxi xəlqə şuluxluq eləməz,
Sel gərək el dağıda, ev yıxa, eyvan apara.

Səliqəli oğru vilayətdə çoxalmış olsa,
Şəhriyardan da gərək bir dolu divan apara.

## BAYATILAR

Xəzan gəldi, gül apardı,
Bir şeyda bülbül apardı,
Yanmışdım mən, kül olmuşdum,
Yel də gəldi kül apardı.

Üzdüm əl bir nazlı yardan,
Gözəl üzlü gülüzardan.
Sevgilimtək bir cəvahir
Bir də doğmaz ruzigardan.

Yar hər yerə mənnən getdi,
Əcəl gəlcək onnan getdi.
Dayan, gəlim yola salım,
Xoş günüm də sənnən getdi.

Elim getdi, ölüm qaldı,
Alovlandım, kulüm qaldı.
Uçurdu bülbülüm bağdan,
Deyəydi bir gülüm qaldı.

Üzüyüm qaşsız qaldı,
Çəmənim quşsuz qaldı,
Ay aman, İqbal getdi,
Təbrizim başsız qaldı.

Yarı kaş görmiyəydim,
Vəsli xoş görmiyəydim,
Öləydim yardan qabaq,
Yerin boş görmiyəydim.

Şah Əlinin al quşuydu,
Hakimlərin tay-tuşuydu,
İncəsənət toy tutanda
Toybəyinin sağduşuydu.

Eylə səs, eylə münacat,
Eylə təsxiri-səmavat,
Eylə tovfiq, eylə dövran,
Bir də heyhat, bir də heyhat...

Ürəyimin həmdəmiydin,
Hər sirrimin məhrəmiydin,
Özün yara almamışkən
Hər yaranın məlhəmiydin.

Navarın kisin tutduq,
İqbalın səsin tutduq,
Navarda toy tutmamış
İqbalın yasın tutduq.

Yükümü çatdım mən də,
Qoy gedim itim mən də,
İqbaltək atam ölüb,
Qalmışam yetim mən də.

Gül budağım dolmıyaydı,
Dolurdu da solmıyaydı,
Ya bən-adəm ölmiyəydi,
Ya təkindən olmıyaydı.

Sənlə getdi xoş həyatım,
Altmış iliik xatiratım.
Sanki ağzımda dad öldü,
Zəhr olub qəndim-nabatım.

Baxdım qələm qaşına,
Yazdım qəbir daşına:
Səndən sonra kül olsun
Bu dünyanın başına.

**NECƏ KEÇDİ ÖMRÜN**

Bir uşaqlıqda xoş oldum, o da yer-göy qaçaraq,
Quş kimi dağlar uçub, yel kimi bağlar keçdi.

Sonra birdən qatar altında qalıb, üstümdən
Deyə bilməm nə qədər sel kimi dağlar keçdi.

Ürəyimdən xəbər alsan necə keçdi ömrüm,
Göz yaşımla yazacaq: mən günüm ağlar keçdi.

## YATA BİLMƏYİRƏM

Bu gecə mən ki, yata bilməyirəm,
Başı başlara qata bilməyirəm.
Yuxusuzluq məni qatlaşdırdı,
Mən bu namərdə bata bilməyirəm.
Oğru qaldırdı qazan-qablamanı,
Kim əl atsın hacata, bilməyirəm.
Oğrunun kim yetişib ombasına
Zıxlaya bir zopa, ta bilməyirəm.
Aylıq aldıq, kim verdik getdi,
Nə yeyək, ey vay, ata, bilməyirəm.
Dədəmiz yox, kimə çəkmək baratı,
Kimi salmaq barata, bilməyirəm.
Cibdə qalmışsa da bir beş manatım,
Nə alım beş manata, bilməyirəm.
Dəli şeytan da deyir yorğanı sat,
Qışdı, yorğandı, sata bilməyirəm.
Qar deyir, gəl, kişisən, pambıq ataq,
Kişi, mən pambıq ata bilməyirəm.
Hey gəlib məndən alırlar şətəli,
Kim salıb mazı mata bilməyirəm.
Zindəganlıq xorata bir şey olub,
Nəyə lazım xorata, bilməyirəm.
Bir sümükdür ki, boğazlarda qalıb
Kim ata, ya kim uta, bilməyirəm.
Qar-yağışda bu nə qondum-köçdüm,
Niyə düşdük bu ota, bilməyirəm.
Bu kitablar azı bir at yüküdür,
Bunu kim çatsın ata, bilməyirəm.
Hey soyuqdan quruyub bəy dururam,
Kimdi yengə-muşata, bilməyirəm.
Əl ki, tutmur yazam, əl tapmaqda
Qələmə, ya davata, bilməyirəm.
Gecəmiz sübh olacaq, ya hələ var,
Baxıram hey saata bilməyirəm.
Quş uçar, amma nə dərman eləmək

Daş dəyən qol-qanata, bilməyirəm.
Ay qadaşlar, mənə bir əl yetirin,
Yüküm ağırdı, çata bilməyirəm.
Təbi-şerim dayanıb soncuq atır,
Mən də ki, soncuq ata bilməyirəm.

## SƏHƏNDİM

Şah dağım, çal papağım, el dayağım, şanlı Səhəndim!
Başı tufanlı Səhəndim!
Başda Heydərbabatək qarla, qırovla qanşıbsan,
Sən ipək telli buludlarla üfüqdə sarışıbsan,
Savaşırkən barışıbsan.
Göydən ilham alalı sirri səmavata deyərsən,
Hələ ağ kürkü bürün, yazda yaşıl don da geyərsən,
Qoradan halva yeyərsən.
Döşlərində sonalar sinəsitək şux məmələrdə
Nə şirin çeşmələrin var.
O yaşıl telləri yel hörmədə aynalı səhərdə,
İşvəli eşmələrin var.
Qoy yağış yağsa da yağsın, sel olub axsa da axsın,
Yanlarında dərələr var.
Qoy qələm qaşların uçsun fərələrlə, hamı baxsın,
Başlarında hərələr var, sıldırımlar, sərələr var.
O ətəklərdə nə qızlar yanağı lalələrin var,
Quzular otlayaraq, nəydə nə xoş nalələrin var,
Ay kimi halələrin var.
Gül-çiçəkdən bəzənənd nə gəlinlər kimi nazın,
Yel əsəndə o sularda nə dərin razü niyazın,
Oynayar güllü qotazın.
Titrəyər saz telitək şaxələrin çayda, çəməndə,
Yel o tellərdə gəzəndə nə Koroğlu çalı sazın.
Ördəyin xəlvət edib göldə pərilərlə çiməndə,
Qol-qanaddan ona ağ hövlə açar qəmzəli qazın,
Qış gedir, qoy gələ yazın.
Hələ novruzgülü var, qarçiçəyin var, gələcəklər,

Yel-yağışda yuyunub gün səpiləndə güləcəklər,
Üzlərin tez siləcəklər.
Qışda kəhlik həvəsilə çölə qaçdıqda cavanlar,
Qarda qaqqıldayaraq nazlı qələm qaşların olsun.
Yaz o döşlərdə nahar məndəsin açdıqda çobanlar,
Bollu, südlü sürülər, dadlı qovurtmacların olsun!
Ad alıb səndən o şair ki, sən ondan ad alarsan,
Ona hər dad verəsən, yüz o müqabil dad alarsan,
Tarıdan hər zad alarsan.
Adaş olduqda sən onla daha artıq ucalırsan,
Baş ucaldıqda Dəmavənd dağından bac alırsan,
Şir əlindən tac alırsan.
O da şerin, ədəbin Şah dağıdrr, şanlı Səhəndi,
O da səntək atar ulduzlara şeir ilə kəməndi,
O da Simurqdan almaqdadı fəndi.
O nə şair ki dağın vəsfinə misdaq onu gördüm,
Mən sənintək ucalıq məşqinə məşşaq onu gördüm,
Eşqə, eşq əhlinə müştaq onu gördüm.
Şeir yazanda qələmindən baxasan dürr səpələndi,
Sanki ulduzlar ələndi.
Söz deyəndə görəsən qatdı gülü, püstəni, qəndi,
Yaşasın şair əfəndi!
O nə şair ki, xəyal mərkəbinə şov şığıyanda,
O nəhəng at ayağın tozlu buludlarda qoyanda,
Lülələnməkdədi yer-göy, neçə tumar sarıyanda,
Görəcəksən o zamanda:
Nə zaman varsa, məkan varsa kəsib biçdi bir anda,
Keçəcəklər, gələcəklər, nə bu yanda, nə o yanda,
Nə bilim qaldı hayanda?
Bax nə hörmət var onun öz demişi, tük papağında,
Şəhriyarın tacı əymiş başı durmuş qabağında,
Başına sovrulan inci, çarıq olmuş ayağında,
Vəhydir şeri, mələklərdi pıçıldar qulağında,
Şəhdi var bal dodağında.
O da dağlar kimi şanında nə yazsam yaraşandır,
O da zalım qoparan qarla, küləklə duruşandır,
Quduza, zalimə qarşı sinə gərmiş, vuruşandır,

Quduzun kürkünə zalım birələrtək daraşandır,
Amma vəchində fağır xalqı əyilmiş soruşandır,
Qara millətdə hünər bulsa, hünərlə araşandır,
Qaralarla qarışandır, sarışandır!
Gecə həqqin gözüdür,Tur törətmiş ocağında,
Əriyib yağtək ürəklərdi yanırlar çırağında,
Mey, məhəbbətdən içib, lalə bitibdir yanağında,
O bir oğlan ki, pərilər su içərlər çanağında,
İnci qaynar bulağında.
Təbi bir sevgili bülbül ki, oxur gül budağında,
Sarı sünbül qucağında.
Sular əfsanədi söylər onun əfsunlu bağında,
Səhərin çənli çağında.
Şairin zövqü nə əfsunlu, nə əfsanəli bağlar,
Ay nə bağlar ki, "Əlif leyli" də əfsanədə bağlar.
Od yaxıb, dağları dağlar,
Gül gülərsə, bulaq ağlar.
Şairin aləmi ölməz, ona aləmdə zəval yox,
Arzular orda nə xatırlaya imkandi, məhal yox,
Baği-cənnət kimi orda, "Bu haramdır, bu halal" yox.
O məhəbbətdə mətal yox,
Orda haldır, daha qal yox!
Gecələr orda gümüşdəndi, qızıldan nə günüzər,
Nə zümürrüd kimi dağlardı, nə mərmor kimi düzlər,
Nə qızıl telli inəklər, nə ala gözlü öküzlər,
Nə gözəl, ay kimi üzlər!
Gül ağaclar nə tavus kimi çətrin açıb əlvan,
Hillə karvanıdı çöllər, bəzənər sürsə bu karvan,
Dəvə karvanı da dağlar, yükü atlasdı bu heyvan,
Sabirin şəhrinə doğru qatarn çəkmədə sərvan,
O xəyalımdakı Şirvan!
Orda qar da yağar, amma daha güllər sola bilməz,
Bu təbiət o təravətdə, məhaldır, ola bilməz,
Əmr peymanəsi orda dola bilməz.
O üfüqlərdə baxarsan nə dənizlər, nə boğazlar,
Nə pərilər kimi qu quşları uçmaqda nə qazlar,
Göldə çimməkdə nə qızlar.

Balıq ulduz kimi göllərdə, dənizlərdə parıldar,
Abşar mirvarısın sel kimi tökdükdə xarıldar,
Yel küşüldər, su şırıldar.
Qəsrlər vardı qızıldan, qalalar vardı əqiqdən,
Rəfayel tablosutək səhnələri Əhdi-ətiqdən,
Doymasan köhnə rəfiqdən.
Cənnətin bağlarıtək bağlarının hurü qüsuri,
Düzülüb qürfədə, eyvanda cəvahir kimi huri,
Əldə hurilərinin cami-biluri,
Tüngünün gül kimi səhbayi-təhuri.
Nə maraqlar ki, ayıq gözlərə röyadı deyərsən,
Nə şəfəqlər ki, dərin baxmada dəryadı deyərsən,
Uyduran cənnəti-məvadı deyərsən!

Zöhrənin qəsri brilyan, hasarı incidi, yaqut,
Qəsri cadudu, mühəndisləri Harut ilə Marut,
Orda Mani dayanıb qalmış o surətlərə məbhut.
Qapı qulluqçusu Harut!
Orda şerin, muzikin mənbəyi sərçeşmədi qaynar,
Nə pərilər kimi fəvvarədən əfşan olub oynar,
Şair ancaq onu anlar!
Dolu məhtab kimi istəxrdi fəvvarələr ilə,
Mələkə orda çimir ay kimi mehparələr ilə,
Güllü güşvarələr ilə,
Şerü musiqi şabaş olmada əfşandı, pərişan,
Sanki ağ şahıdır olmaqda gəlin başına əfşan,
Nə gəlinlər ki, nə ənnik üzə sürtüllə, nə kirşan,
Yaxa nə tülkü, nə dovşan!
Ağ pərilər sarı köynəkli buludlardan enirlər,
Süd göləündə mələkə ilə çimərkən sevinirlər,
Sevmirlər, öyünürlər.
Qavzananda hərə əldə dolu bir cam aparırlar,
Sanki cəngilərə, şairlərə ilham aparırlar,
Dərya qızlarına peyğam aparırlar.
Dənizin örtüyü mavi, üfüqün səqfi səmavi,
Aynadı hər nə baxırsan; Yer olub göylə müsavi,
Qərq onun şerinə ravi.

Qürfələr ay bulud altında olartək görünürlər,
Göz açıb-yumma, çıraqlar kimi, yandıqda sönüllər.
Səhnələr çərxi-fələktək burulub gah da çönüllər,
Kölgəliklər sürünüllər.
Zöhrə eyvanda ilahə libasında görünərkən,
Baxasan, Hafizi də orda cəlalətlə görərsən,
Nə sevərsən!
Gah görən Hafizi-Şiraz ilə eyvanda durublar,
Gah görən ortada şətrənc qurarkən oturublar.
Gah görən saz ilə, avaz ilə əyləncə qurublar,
Sanki sağər də vurublar.
Xacə əlhan oxuyanda, hamı işdən dayanırlar,
O nəvalərlə pərilər gah uyub, gah oyanırlar,
Lalələr şöləsi əlvan şişə rəngi boyanırlar,
Nə xumar gözlə yanırlar.
Qanad istər bu fəza, qoy qala tərlanlı Səhəndim,
Eşit öz qissəmi, dastanımı, dastanlı Səhəndim:
Səni Heydərbaba ol nərələrilə çağıranda,
O səfil, darda qalan, tülkü qovan şir bağıranda,
Şeytanın şıllağa qalxan qatırı noxta qıranda.
"Dədə Qorqud" səsin aldım, dedim arxamdı, inandım,
Arxa durduqda Səhəndim, Savalantək havalandım,
Selə qarşı qavalandım.
Coşqunun da qanı coşdu, mənə bir haylı səs oldu,
Hər səsiz bir nəfəs oldu.
Bakı dağları da hay verdi səsə, qıyha ucaldı,
O tayın nərələri sanki bu taydan da bac aldı,
Qurd acaldıqda qocaldı.
Rahimin nərəsi qovzandı, deyən toplar atıldı,
Sel gəlib nəhrə qatıldı.
Rüstəmin topları səsləndi, deyən bomlar açıldı,
Bizə gül-qonça saçıldı.
"Qorxma, gəldim!" - deyə, səslərdə mənə can dedi qardaş,
Mənə "can-can" deyərək düşmənə "qan-qan" dedi qardaş,
Mənə sultan dedi qardaş.
Mən də canım çığırıb: Can sənə qurban dedi, qardaş.
Yaşa oğlan! Sizə dağdan dəli ceyran dedi, qardaş,

El sizə qaplan dedi, qardaş!
Dağ sizə aslan dedi, qardaş!
Dağlı Heydərbabanın arxası hər yerdə dağ otdu,
Dağa dağlar dayaq oldu,
Arazım ayna çıraq qoymada, aydın şəfəq oldu,
O tayın nərəsi qovzandı, ürəklər qulaq oldu,
Yenə qardaş deyərək qaçmada başlar ayaq oldu,
Qaçdıq, üzləşdik Arazda, yenə gözlər bulaq oldu,
Yenə qəmlər qalaq oldu.
Yenə qardaşsayağı sözlərimiz birsayaq oldu,
Vəsl iyin almada, əl çatmadı, eşqim damaq oldu,
Hələlik qəm saralarkən qaralar döndü ağ oldu,
Arazın sud gölü daşdı, qayalıqlar da bağ oldu,
Sarı sünbüllərə zülf içrə oraqlar daraq oldu,
Yoncalıqlar yenə bildirçinə yay-yaz yataq oldu.
Gözdə yaşlar çıraq oldu,
Lalə bitdi yanaq oldu,
Qonça güldü dodaq oldu,
Nə sol oldu, nə sağ oldu,
Hamısı birsayaq oldu!
Elimi, arxamı gördükdə zalım ovçu qısıldı,
Sel kimi zülmü basıldı, zinə arx, oldu, kəsildi.
Gül gözündən yaşı sildi,
Tor quran ovçu atın qovmada sındı, geri qaldı,
Özü getdi, yeri qaldı.
Amma Heydərbaba da bildi ki, biztək hamı dağlar,
Bağlanıb qol-qola zəncirdə, buludlar odur ağlar,
Nə bilim, bəlkə təbiət özü namərdə gün ağlar,
Əyri yolları açarkən, düz olan qolları bağlar,
Saf olan sinəni dağlar!
Dağların hər nə qoçu, tərlanı, ceyranı, maralı,
Hamı düşgün, hamı yorğun, sinələr dağlı, yaralı,
Gül açan yerdə saralı!
Amma zənn etmə ki, dağlar yenə qalxan olacaqdır,
Məhşər olmaqdadı, bunlar hamı vulkan olacaqdır.
Zülm dünyası yanarkən də tilit qan olacaqdır,
Vay!.. Nə tufan olacaqdır!

Dedin: Azər elinin bir yaralı nisgiliyəm mən,
Nisgil olsam da, gülüm!
Bir əbədi sevgiliyəm mən,
Yad məni atsa da, öz gülşənimin bülbülüyəm mən,
Elimin farsıca da dərdini söylər diliyəm mən,
Həqqə doğru nə qaranlıq isə el məşəliyəm mən,
Əbədiyyət gülüyəm mən.
Nisgil ol çərçiyə qalsın ki, cəvahir nədi, qanmır,
Mədəniyyət dəbin eylir bədəviyyət, bir usanmır,
Gün gedr, az qala batsın, gecəsindən bir oyanmır,
Bir öz əhvalına yanmır!
Atar insanlığı, amma yalan ənsabı atammaz,
Fitnə qavzanmasa bir gün, gecə asudə yatammaz,
Başı başlara qatammaz.
Amma məndən sarı, sən arxaymın ol, şanlı Səhəndim,
Dəli ceyranlı Səhəndim.
Mən daha ərşi-əla kölgəsitək başda tacım var,
Əldə Musa kimi Firona qənim bir ağacım var,
Hərəcim yox, fərəcim var,
Mən Əli oğluyam, azadələrin mərdi, muradı,
O qaranlıqlara məşəl, o işıqlıqlara hadi,
Həqqə, imana münadi.
Başda sınmaz sipərim, əldə kütəlməz qılıcım var.

## AĞA MİRSADIĞIN XEYRATI

Atamız yurdudu, gahdan gəlib ehsan veririk,
Can çətin vermərik, inşalla ki, asan veririk.
Əzan olcaq qaçaraq səfdə durub san veririk,
Mirəbülfəzl edib ehsan-bizi kəndə gətirib,
Şəhriyar kəndi tapıb, kəndlisin amma itirib.

Özü kəsmiş şişəki, həm bişirib, həm düşürüb,
Pilovun da dadaşı Möhsün əmoğlu bişirib.
Süfrədə quştək uşaqlar dəni bir-bir döşürüb,
Qıtlıq olmaz, daha burda qəbul olsun ehsan,
Çıx müsəllayə, çağır Allahı, gəlsin neysan.

Mənim ilhamilə burda qonuşub dil-dodağım,
Qurana, Hafizə burda açılıb göz-qulağım.
Mən də Musa kimi, Heydərbabadır Tur dağım,
Burda kəşf oldu ki, həqdən nə kəramət olacaq,
Necə şətrənc ki, şahlar hamısı mat olacaq.

Bu bizim kənd ola bilsə, hanı bəs əmmələrim?
Əmmə də dursa, deyir bəs hanı övladım, ərim?
Növhələrdən de qalan olsa, haçan var xəbərim?
Dagılıb, kim nə bilim, öldü ya qaldı nərədə,
Cam çıxmış uşağın hər birisi bir dərədə.

Bir Zivər əmqızının oğlu Hacı Müctəba var,
Hac Sadıqlı deyilən bir Hacəlu Əliağa var,
Bir də Mirzəmmədin oğlu hələlik baxçada var,
Qocalıb, amma yenə bir "Qarabağı" oxudu,
Qarılartək teşisin bir əyirib, bir toxudu.

Hanı Moll İbrahimin dərsi, hanı tay-tuşlar?
Şeyxülislam hanı, yurdunda oxur bayquşlar!
Kim deyirdi ki, müsəlman qavi-yer alqışlar?
Babiyə, bolşevikə gör nə giriftar olduq,
Bələşib hər nəcisə, gör nece murdar olduq!

Qələlər darbadağın, sərbaz ölüb, səngəri boş,
Dirilərdən də dəxi yağ əriyibdir, dəri boş.
Şəhriyar kəndə gəlib, kənd uşağının yeri boş,
Biz görənlər hamı getmiş, hamı itmiş-batmış,
Hamısı işləyib, axırda yorulmuş, yatmış.

Kimdi məntək bağıranlar səsinə səs versin,
Dünya bizlə atışır, kimdi atış bəs versin?
Gərək Allah verə, olmaz bunu hər kəs versin.
Hamı getmiş, dəxi ol qafilədən bir kəs yox,
Zınqırovlar da düşüb vəlvələdən, bir səs yox.

Hanı ol mərd atalar, mərdi becərdən analar?
Hanı ol nazlı gəlinlər, o həyalı sonalar?
Hanı ol südlü inəklər, alagözlü danalar?

"Çun şəvəd əsr Ququş zanhəmə qismət nəbovəd,
Nəbovəd xeyr dəran xanə ke esmət nəbovəd".

Onda hər kəs bizə baxsaydı deyərdi gavurux,
Gavurun şərrini indi başımızdan savırıx,
Qovururdu o bizi, biz onu ancaq qavırıx,
Belə getsə, edəcək Mehdiyi-mövud zühur,
Din gərək qalibü qahir ola, kafir məqhur.

Məclisin ehsanı Amir Sadığın xeyratıdır,
Bu mahalın çırağı Xoşginabın sadatıdır,
İndi meydanda qalan təkcə Hüseynin atıdır,
Müstəcab oldu bizim qərndə şeytan duvası,
Xoşginabı dağıdıb eylədi bayquş yuvası.

Arzıgöz qalmış idim öz ata yurdum vətənə,
Yandı-qındı verir indi ata yurdum da mənə,
Heyvanat qissəsidir dünya "Kəlilə-Dimnə",
Ta ki axırda bir az qovzanıb insan olacaq,
Azı insan da olursa, çoxu heyvan olacaq.

İndi qəm-qüssənin ağzını da gərək bağlayasan,
Qəm ağız açsa gərək oxşayasan, ağlayasan.
Nəyə lazım bu qədər xalq ürəyin dağlayasan,
Bir dua eylə ki, xəlqin ürəyi şad olsun,
Dünya məxrubədisə, axirət abad olsun.

## ƏMİOĞLUM MİRƏBÜLFƏZLƏ

Maşının xumsuna, Heydərbabanın tənzilinə,
Mirəbülfəzl gətirmiş məni öz mənzilinə,

Təslim oldum sözünə, çarə nədir? Taksiçidir,
Gördüm artıq danışım, ət atacaq həndilinə.

Bir məsəl var ki, qonaq-qardaşa dəstur verilib:
"Bir təarüflə düş atdan, atı bağla dilinə".

Məni qoymuş maşına, yol uzunu sürdü gecə,
Hey alıb dən-düşü artıq qalayıb zənbilinə.

Xoşginab seyyidinin əmri qonaqsız keçməz,
Qonağın burda gərək qarnı yeməkdən dəlinə.

Bir qonaq da gətirib, çox da əziz, öz bacısı
Cəlilə əmqızı, dən düşmüş onun da telinə.

Cəlilə əmqızı da qardaşının lap tayıdır,
Mehriban, sanki bir alma, yandan düz bölünə.

Yaxşı bir mənzili var, səhni gözəl, yurdu da bol,
Bax ağaclarına, bax quşlarına, bax gülünə.

Xanımı tazə gəlindir, adı Məryəm xanım,
Toy tutub kətsayağı, alma da atmış gəlinə.

Tazə ev, tazə gəlinlə bir işıqlanmalıdır,
Çilçıraqdır ki, verib zinət evin qəndilinə.

Vardı əvvəl xanımandan iki nazlı uşağı,
Bax Pəri, Pərvizi tək sarı gülünə, bülbülünə.

Biri Pərvindi ki, danişgahı var, aylığı var,
Yəni bir qız, mütəccəddid, əli vurmuş belinə.

Biri Pərviz ki, dəbiristanı nisfə yetirib,
O da inşaalla gərək cövhəri-zatı bilinə.

Bu əmoğlu, şükür Allaha, halaldır çörəyi,
Müxlisəm mən də bunun sadə qubul-mənqəlinə.

Zəhmətilə qazanıb, taksisi var, şəxsisi var,
Düz yola sərf eləyib hər nə ki gəlmiş əlinə.

Dünbələndüz bir adamdır, iki dünyası da var,
Gəlməyib əyri-yalan söz bu cavanın dilinə.

Şəhriyar şeridi bu, yaz ürəyə qoy qalsın,
Ürəyində yazılan söz, da gərəkməz silinə.

## BƏLALIBAŞ

Yar günümü göy əskiyə tutdu ki, dur, məni boşa,
Cütcü görübsən öküzə, öküz qoyub buzov qoşa?
Sən əllini keçib yaşun, mən bir otuz yaşında qız,
Söylə görüm otuz yaşın nə nisbəti əlli yaşa?
Sən yerə qoydun başuvu, mən başıma nə daş salım?
Bəlkə mən artıq yaşadım, neyləməli? Dedim: yaşa.
Bir də bəlalı baş neçin yanına süpürgə bağlasın?
Börkü başa qoyan gərək börkünə də bir yaraşa.
Bir də kəbin kəsilməmiş, sən mənə bir söz demədin,
Yoxsa cəhazımda gərək gələydi bir hoqqa-maşa.
Dedim: qəza gəlib tapıb, bir iş idi olub keçib,
Qurbanam ol ala gözə, heyranam ol qələm qaşa.
Mənki özümdə bir günah görməyirəm, çarə nədir?
Pis bəşərin qaydasıdır, yaxşını tapsa dolaşa.
Dostla mürüvvət etməli, düşmən ilə keçinməli,
Qayda budur, heyif deyil bəşər yolun azıb, çaşa?
Mən də sənin dayoğluvam, sən də mənim bibim qızı,
Könül baxırsa günəşə, göz də gərəkdir qamaşa.
İndi bizim maral kimi üç balamız vardı, gərək.
Ata-ana savaşsa da, bunlara xatir barışa.
Hər kişiyə əyalı da öz canıtək hörüklənib,
Hədyə də olmaz eləsin arvadı qardaş-qardaşa.
Bu dünya bir yol kimidir, biz axirət müsafiri,
Kəcavədə hamaş gərək öz hamaşilən yanaşa.
Axirəti olanların dünyası qəmsiz olmayıb,
Seldi, gələr, axar, keçər, amma gərək aşıb-daşa.
Məsəldi: "Yer ki, bərk olur, öküz öküzdən inciyir".
Hey dartılır ipin qıra, yoldaşıyla bərk savaşa.

Bizim də ruziyarımız yamandı, bizdə eyb yox,
Bəlkə vəzifədir: başər qonşular ilən qonuşa.
Həqqi-həyat yox daha bizlərə, çox böyük başı
Zindanımızda həqqimiz, bir baca tapsaq, tamaşa.
Amma onun şəmatəti, Allaha xoş gəlməyibən –
Getdi, mənim həyatımı vurdu daşa, çıxdı başa!

## NAZ EYLƏMİSƏN

Çoxlar incikdi ki, sən onlara naz eyləmisən,
Mən də incik ki, mənim nazımı az eyləmisən.

Etmisən bu nazı viranə könüldə sultan,
Evin abad ola - dərvişə niyaz eyləmisən.

Hər baxışda çalısan kipriyi mizrab kimi,
Bir qulaq ver, bu sınıq könlü nə saz eyləmisən.

Başdan aç yaylığı, əfşan elə susən-sünbül,
Sən bizim bayramımızsan, qışı yaz eyləmisən.

Kakili başda vurub eyləmisən tac kimi,
O qızıl teldən onu güllü qotaz eyləmisən.

Sən Gün ol, qoy qəmimiz dağda qar olsun, ərisin,
Mənim ancaq işimi suzü güdaz eyləmisən.

Sinə bir dəşti-Muğandır, quzu yan-yanə yatub,
Mənim ağlar gözümü orda Araz eyləmisən.

Xəttü xalından alıb məşqimi "Quran" yazaram,
Bu həqiqətdə məni əhli-məcaz eyləmisən.

Dəstəmaz eyiədiyin çeşmə müsəlman qanıdır,
Bilmirəm hansı kəlisada nəmaz eyləmisən.

Bu gözəllik ki, cahanda sənə vermiş tanrı,
Hər qədər naz eləsən eylə ki, az eyləmisən.

Mən "Əşiran" oxusam, pəncə "İraq" üstə gəzər,
Gözəlim, türk olalı tərki-"Hicaz" eyləmisən.

Mən bu mənada qəzəl yazmağa halım yox idi,
Sən mənimtək qocanı fırfirabaz eyləmisən.

Məni bu suz ilə atdın, aralandın, bilirəm,
Aranı bir para namərd ilə saz eyləmisən,

Ey dan ulduz, məni sən yaxşı tanırsan ki, səhər
Üfüqü xəlvət edib razü niyaz eyləmisən.

Şəhriyar darda qalıb, dağda daşa daldalanıb,
Özün insaf elə, Məhmudi Ayaz eyləmisən.

## MƏMMƏD RAHİM HƏZRƏTLƏRİNƏ CAVAB

Ağ göyərçin, ağ qanadın açarsan,
Dam-divardan bir qovzanıb uçarsan,
Ulduzlanıb, Bakı deyə, qaçarsan,
Öpüşləri Rahim beyə səpərsən,
Qardaşımın bal dodağın öpərsən.

Deynə: Qardaş, məktub gəldi yetişdi,
Sevincimiz qalxıb qəmlə atışdı.
Atışdıqca yaralarım bitişdi,
Qara baxım yenə üzü ağ olsun,
Yar da bizdən yad eyləyib, sağ olsun!

Heç kimsəyə belə sovqat gəlməyib,
Heç bir üzə belə bir gül gülməyib.
Göz yaşımı anam belə silməyib,
Belə meyvə görməz bizim qanalar,
Qocalmasın sizi doğan analar!

Bakıdan çox sovqat gəlib Təbrizə,
Sabiq zaman biz çox gələrdik sizə,

Siz də nolaydı bir gələydiz bizə,
Ayrılığın daşın birdən ataydıq,
Canı-cana, malı-mala qataydıq.

Uca dağlar bir-birlərin görərlər,
Görüşlərin baxışla göndərərlər,
Səba ilə pəyam alıb verərlər,
Şair olur bir-birini görməsin?
Saz, söz ilə pəyam alıb verməsin?

Qurban olum mən o şirin dillərə,
Uzaq düşdük, həsrət qaldıq ellərə,
Səhər-axşam yalvarıram yellərə,
Qardaşıma məndən salam yetirsin,
Ondan da bir xəbər-ətər gətirsin.

O taydadı Şəki, Şirvan, Qarabağ,
Bu tayda da Meşgin, Əhər, Qaradağ,
Bir-birini Arazdan alrmş soraq,
Araz bizi ayırmadan dağlayıb,
Son özü də gecə-gündüz ağlayıb.

Bu təqsimat bundan artıq olanmaz,
Atom əsri ixtilaflar qalanmaz,
Bir qanım olmasa, dünya dolanmaz,
İndi dünya yüz də desən sağ-soldu,
Muşək üçün iki saatlıq yoldu.

İnsanlarıq, insanlığı xoşlayın,
Bir millətik birləşməyə başlayın,
Bu xan-xanlıq hökumətin boşlayın,
Bu gün bəşər gərək olsun bir millət,
Bir miliətə olarmı yüz hökumət?

Bizlər ki, lap bir dil, bir qan qardaşıq,
Qardaş qalsın, insanlarıq, yoldaşıq,

Ayaqlara pis sarışıb sarmaşıq,
Pasport ilə, deyir, getsən sözüm yox,
Pasport deyir: Adım vardı, özüm yox.

Hardan gəlim, rəsmilikdə dəvət yox,
Olsa da, mən qocalmışam, qüvvət yox,
Uşaqlıyam, ayrılmağa qüdrət yox,
İndilikdə olduq ürək qonağı,
Ürək olsun qonağının yatağı.

"Köşki balabanlar Araza baxar,
Araz suyu hənuz gözlərdən axar",
El nisgili pis yandırar, pis yaxar.
Qəm var ikən qardaş deyib qaynardıq,
"Yoldaş, məni qurd apardı" oynardıq.

Araz deyər: Ulduz kimi axaram,
Gözaltıyla sağa-sola baxaram,
Qəhərlənib ildırımtək çaxaram,
Kəsməliyəm iki qardaş arasın,
Ağladıram, bağlamadan yarasın.

Neyçün bizdən rəsmi dəvət etmisiz?
Qonşuluqda artıq gəlib getmisiz?
Yadımıztək dadumza yetmisiz?
Sizin əliz bizdən artıq açıqdı,
Mənim ağzım açılmaqdan uçuqdu.

İndi bizim dövlətlər də yanlaşır,
Getbegetdə çətinlər asanlaşır,
Sülhün yeli əsməyə səhmanlaşır,
Biz də xoruz vəzifəsin banlıyaq,
Son görüşmək səhmini səhmanlıyaq.

Bax Xəzərə, hənuz qəmi dərin gör,
Qış çıxmayıb, ruzigarı sərin gör,
İlk baharın ancaq sözün şirin gör,

Ümidplov bişsə gözəl bir şeydir,
Ümid ki var, demək, yeməkdən yeydir.

Bir vaxt olur bu sözlər də sovuşi,
Bəşər hamı qardaş kimi qovuşi,
Onda biz də qalxızarıq çovuşi,
Ziyarətə gəllik sizin ellərə,
İndilikdə qoy yalvaraq yellərə.

Savalana salamını yetirdim,
Ondan sənə ilham alıb gətirdim,
Bir neçəsin yolda salıb itirdim,
Ağır hümmət, qan qiyməti, sədaqət,
Qalsın hələ, yoxdur dilimdə taqət.

Üfüqlərə röya rəngin yaxıram,
Eynalıdan, Ərk üstündən baxıram,
Timsaluvi dağlar üstə taxıram,
Sən də hünər atın minib çaparsan,
Dumanlı dağlarda məni taparsan.

Harda çatdın göy çeşmənin başına,
Bulaq otu vəsmə çəkmiş qaşına,
Əylən yerə, bir dirsəklən daşına,
Duman keçsin, göz yaşını sonda gör,
Qardaşının səfasını onda gör.

Çox "Bakıdan fanar gəlir" oxurduq,
Son "Oduma yanar gəlir", oxurduq,
Gör "Başıma nələr gelir", oxurduq,
İndi duydum onda gəlirmiş fanar,
Son gələcəymiş oduma bir yanar.

Eşq əhlisən, yaxşı məni qanarsan,
Çox kipləmə, od tutub odlanarsan,
Gözlər yağış yağdırmasa, yanarsan,
Mənim qaynar çeşmə kimi gözüm var,
Odur məndə hər cür oda dözüm var.

Böylə ki, sən alqışlayırsan məni,
Gedənlərə nisgil edim qoy səni.
Dur! Ey gülün xəzan olan xərməni,
Gör bizim də dərdimizi qanan var,
Bizlərə də bir ürəkdən yanan var.

Yaxınlarım qoydu məni qıraqda,
Yananlarım qaldı məndən uzaqda,
El yaylaqda, özüm qaldım qışlaqda.
İtirdilər xidmətimin əməyin,
Qədrin bilin el-arxanın, köməyin.

"Təməddünün" gözü görüm kor olsun,
Ağzmdakı şirin şərbət şor olsun,
Bal da yesə zəhər olsun, çor olsun,
Ağzımızın dadın qapıb apardı,
Ürəkləri çəkib kökdən qopardı,

Gah ərəbi, gah əcəmi kişləsin,
Hey bu onu, hey o bunu dişləsin,
Ərbabların karxanası işləsin.
İndi dəxi millətlər də ayılıb,
Ağızların dişləri də sayılıb.

Biz millətlər çox qanqallar biçmişik,
Acı-acı içkiləri içmişik,
Amma dəxi bürküləri keçmişik,
İndi nisbət üfüq açıq işıqdır,
Mənimsə də qiblə səmtim açıqdır.

Getbegetdə artıq dünya ayılır,
Gizlin qalmır, səs-sədalar yayılır,
Sayılmayan kimsələr də sayılır,
Məni, səni az-çox təhvil alan var,
Sənin kimi məni yada salan var.

"Təməddünün" qanunları qoxuyub,
Dəxi hamı onun əlin oxuyub,
Sərhədləri tor atantək toxuyub,

Salıb xalqı kor quş kimi qəfəsə,
Sinələrdə yer qalmayıb nəfesə.
Heydərbaba üz Bakıya çöndərir,
Hey gül görür, dərib sizə göndərir,
Sözlərini hey əndərir, döndərir,
Sənlə Süleyman Rüstəmi yad edir,
Bu şivəylə Şəhriyarı şad edir.

*Azər ayı, 1346*

## MƏMMƏD RAHİMİN
## İKİNCİ MƏKTUBUNA CAVAB

İgidlər yurdu Qafqazım, sənə məndən salam olsun,
Sənin eşqindən İranda, hənuz səbri talan vardır.
Anam Təbriz mənə gəhvarədə söylərdi: Yavrum, bil!
Sənin qalmış o tayda, xallı-telli bir xalan vardır.
Bu dünyadə oğul, eşq əhlinə küfr əhli düşmandır,
Bir Allah can verərsə, min də bizdən can alan vardır.
Onu bizdən ayırdı ruzigarın sazü nasazı,
Onunçun sızlaram, hər yerdə görsəm saz çalan vardır.
Araz düşman əlində bir qılıc tək ortanı kəsdi,
Onun övladı varsa, bil səni yada salan vardır.
Məni başdan çıxarmaqçın, yaramazlar da söylərdi:
Sözə çox etibar etmə ki, düz vardır, yalan vardır.
Boy atdım, axtarıb tapdım, nə hasil getməgə, gördüm.
Aramızda yolu bağlı, qaranlıq bir dalan vardır.
Bizi küfr əhli istərsə, yükün çatmaq üçün istər,
Bizə bunlardan artıq qalsa, bir yırtıq palan vardır.
O gün ki, Rahimin məktubi gəldi çatdı, baxdım ki,
Anam qanilə qəlbi çırpmanlardan qalan vardır.
Daha Heydərbabanın nərəsin qaytarmadan, gördüm
O tayda sinələrdə sanki minlər Savalan vardır.
Ürək qanilə mən də yazdım: ay nazlı anam Qafqaz,
Sənin də Şəhriyarın tək bu tayda bir balan vardır.

# EL BÜLBÜLÜ

*Şair Əbülfəzl Hüseyniyə*

El bülbülü, sən mənim öz balamsan,
Yaman gündə hasarımsan, qalamsan,
Bir Allaha sən də mən tək qulamsan,
Ondan sonra heç bir kəsdən azın yox,
Naz balasan, bir kəsə də nazın yox.

Kənd uşağı, cumalaşdıq, çoxuduq,
Təndir aşın içmiş idik, toxuduq,
Sözlərivi kəlmə-kəlmə oxuduq,
Qəm sazının yenə simin bağladıq,
Bir oxuduq, bir çaldıq, bir ağladıq.

Nisgüli sözlərin məni otdadı,
Ağrın alım, mənim bağrım çatdadı,
Arzum bu dağ-daşı qatıb-qatdadı,
Gəldim sənin başun qoydum diz üstə,
Naz balamı öpdüm, qoydum göz üstə.

Gedənlərdən dedik, yandıq, yaxıldıq,
Dedik: Necə durmuşuduq, yıxıldıq!
Sıxıntılar çəkdik, yaman sıxıldıq.
Dedik, amma xanlar qəmi yekəydi,
Səndən sarı ürəklər bir tikəydi.

Nənəqız əmiqızı dedi: Can bala!
Anan səni görmədi, heyvan bala!
Həsrət qaldı sənə Əmirxan bala!
Demə, sənin başsağlığın unutduq,
Əmirxana biz təzədən yas tutduq!

Heç darıxma, sən mənzilə çatıbsan,
Maşın alıb, at-qatırı satıbsan,
Qarğıları, qər-qəmişi atıbsan.
Bülbül olub qonubsan güllər üstə,
Güllər kimi dayan sünbüllər üstə.

Siz qədimdən adlı-sanlı xanlarsız,
Hər biri min cana dəyən canlarsız,
Sirri-həyatı oxuyub anlarsız,
Bilirsiz ki, dünya qəzov-qədərdi,
Qəzov-qədər qəmin yemək hədərdi.

Dünya "bu şahdı", "bu gəda" qanmayıb,
İndiyətək bir kəsə aldanmayıb,
Heç bir çıraq sübhə qədər yanmayıb.
Baş altımız gah alçaqdır, gah uca,
Ölüm baxmır bu cavandır, bu qoca.

Sənin atan bir şux, zərif kişiydi,
Xəlqi ayıq salmaq onun işiydi,
Şuxluqları ağızlar kişmişiydi,
Hamı onu həsrətilən yad edir,
Əzizləyib rəhmətinən şad edir.

Məlik Niyaz xanzadalar başıydı,
At belində üzüklərin qaşıydı,
Əfsanə tək pərilər oynaşıydı,
Qəm günündə bir kəndi mat edibdi,
Qeyrətə bax! Baş götürüb gedibdi.

Kamil özünsən ki, kamal əhlisən,
Şerin nişan verir ki, hal əhlisən,
İncə, zərif zövqü xəyal əhlisən,
Gündən-günə hünərdə çağlaşarsan,
Bir gün olar Sabirlə bağlaşarsan.

Yaman günlər keçib-gedib itəndi,
Bir yaxşılıq muradına yetəndi,
O tay-bu tay fərqi yoxdu, vətəndi,
Orda burdan, yüz il sənət qabaqdı,
Kənd, gördüyün həman taxta-tabaqdı.

Ora bizim qızıl Kəbə Bakıdı,
Şanlı bakıçılar xaki-pakıdı,
İncəsənətlərin abü-xakıdı,

Orda hünər mədənlərtək qazılıb,
"Məşədi-İbad", "Arşın malçı" yazılıb.

Cahıllıqda tora düşən çox olar,
Qış yaxınlar, tor atanlar yox olar,
Məzlumların ahı bir gün ox olar,
Zülmün dəyər ürəyinin başına,
Avçı qoyar baş yəhərin qaşına.

Yazıq cavan şeytanı görcək çaşar,
Yoldan çıxıb buludlu dağlar aşar,
Həqqi tapan Xızr olu, minlər yaşar,
Nə yaxşıdı Allah sözün inanmaq,
Bəlalara səbr eləyib dayanmaq.

İgid qürbət çəkməmişkən ayılmaz,
Şöhrəti dünyanı tutub yayılmaz,
Enişdə-yoxuşda əskik sayılmaz,
İgid bir vəqt qansızlara qan verər,
Bir vəqt özü qansızlıqdan can verər.

Mən də illər uzaq düşdüm elimdən,
Ata öldü, fələk vurdu belimdən,
İndi düşməz "ata" adı dilimdən,
Bəli, oğul, bizlər hamı həmdərdik,
Güllər əkdik, amma tikanlar dənlik.

Bir kəsə nə ata qalar, nə əmi,
Biçilməyə əkilibdi bu zəmi,
Sənin kimi oğul vardı, nə qəmi?
Əmirxanın sönməz daha ocağı,
Məktəb imiş sənin ana qucağı.[1]

Bu dünyada bizdən qalan bir səsdi,
Bu karvanın zəngi qalırsa, bəsdi,
Unutsa hər kəs atasın nakəsdi,
Unutmasan, sən atanı yad elə,
Ehsan ilə onun ruhun şad elə.

---

[1] Əbülfəzl Hüseynin anasının adı "Məktəb" idi.

Şanlı Rüstəm şeri gəlib çatıbdı,
İçki kimi əhvalımı qatıbdı,
Sanma təbim bəxtim kimi yatıbdı,
İstəmirəm gözləri yaşlandırım,
Közmələnən yaranı aşlandırım.

Yazıb, ölsəm., nə xalqı zar istərəm,
Nə qəbrimin üstə gülzar istərəm,
Araz qırağında məzar istərəm,
Açıq qoyun, gözüm o yarı görsün,
O sazlı, sözlü Şəhriyarı görsün.

Deynə; Şair, sən körpünü keçmisən,
Əbədiyyət qaraltısın seçmisən,
Xızra çatıb, abi-həyat içmisən,
Sənin təbin Xızr axtaran çeşmədi,
Dərya kimi mövcü eşmə-eşmədi.

Sən ölümün yazısı pozubsan,
Üstündə bir əbədiyyət yazıbsan,
Məzarını ürklərdə qazıbsan,
Sən kiminə bir də daha ölmək yox,
Adamları badam kimi bölmək yox.

İstədiyin ürək sözü məndədi,
Arxayın ol, mən də gözüm səndədi,
Farslar deyir "cuyəndə yabəndə"di,
Bir gün olar bu dağları çaparlar,
İstəklilər bir-birini taparlar.

Onda sən də atı minib çaparsan,
Öz haqquvu qurd ağzından qaparsan,
İtmişləri axtararsan, taparsan,
Alnımıza yazıblar axır vəsli,
Qayıdalım, tapalım axır əsli.

*1348, Bəhmən ayı, 1971*

**QARDAŞIM**
**SÜLEYMAN RÜSTƏMƏ İTHAF**

Bizi yandırır yaman ayrılıq,
Bu darıxdıran duman ayrılıq.
Gözə sovurur saman ayrılıq,
Aman ayrılıq, aman ayrılıq!

Bir gözün açar, bir gözün yumar,
Arazı sərin gördükdə umar,
Xəzəri dərin gördükcə cumar,
Qəm dəryasına cuman ayrılıq.
Aman ayrılıq, aman ayrılıq!

Arazım vursun baş daşdan-daşa,
Göz yaşı gərək başlardan aşa,
Necə yad olsun qardaş qardaşa,
Nə din qanır, nə iman ayrılıq,
Aman ayrılıq, aman ayrılıq!

Göylərin Günün, Ayın gizlədir,
Ulduz axtarır, sayın gizlədir,
Oxunu atır, yayın gizlədir,
Qəddimi edib kaman ayrılıq,
Aman ayrılıq, aman ayrılıq!

Ayrılıq gələ bir kərəm qıla,
Bir neçə gün də bizdən ayrıla,
Qəm də bir biztək suya sovrula,
Hanı bir belə güman, ayrılıq,
Aman ayrılıq, aman ayrılıq!

Dedim: Ayrılıq, qınama məni,
Səni görmüşəm ellər düşməni,
Yüz min kərə de sınasam səni,
Haman ayrılıq, haman ayrılıq,
Aman ayrılıq, aman ayrılıq!

Amansız gözün yuman ayrılıq,
Can cızlığından uman ayrılıq,
Nə qəmli yazar roman ayrılıq,
Dillərə salan duman ayrılıq,
Aman ayrılıq, aman ayrılıq!

Sən unutsan da, Süleyman, məni,
Unutmayacaq Şəhriyar səni,
Yaz gələr, bülbül qapsar çəməni,
İndilik sevsin zaman ayrılıq,
Aman ayrılıq, aman ayrılıq!

## SÜLEYMAN RÜSTƏMƏ

Hökmdir hakimə, ta hökm edə fərraş arasında,
Bölələr yağ-balı fərraş ilə ağbaş arasında.

Aş içəndə üləma az qalır udsun qaşığın da,
Neyləsin, şəkk eləyib qaşıq ilə aş arasında.

Tapsa millət yavan aş, özləri bozbaşı yesinlər,
Yenə bir nisbət olar aş ilə bozbaş arasında.

Göz yaşımsan, ay Araz, qoyma gözüm baxsa da görsün,
Nə yaman pərdə çəkibsən iki qardaş arasında!

Demə dağ-daşdı, Süleyman, səni məndən ayıran şey,
Bir çibandır ki, çıxıbdır göz ilən qaş arasında.

Ağ göyərçin, nə rəvadır ki, işıqlıq quşu səntək,
Yata bayquş yuvasında, qala xəffaş arasında.

Gör necə qızları, övrətləri saillik edirlər,
Millətin namusudur, fırlanır övbaş arasında.

Xalqı dartıbla dəyirman daşıtək, dağları ilə,
Bizi dartanda qalaydı əli bir daş arasında.

Şəhriyar, sən yazan əşarı uzaqdan tanıram mən,
Bir uyuşmaq dəxi var nəqş ilə nəqqaş arasında.

## QARDAŞIM
## SÜLEYMAN RÜSTƏMƏ

Gün çırtadı, göz qamaşdı,
Araz mənlə xosunlaşdı,
Eşqim ayaqyalın qaşdı,
Səsin gəldi, Süleymanım!
Sənə qurban mənim canım!

Mən ölmüşəm, ağlayan yox,
Gözlərimi bağlayan yox,
Bir od yaxıb dağlayan yox,
Soyuq bizi kiridibdi,
Şaxta bizi qurudubdu.

Neftimizi basdırırlar,
Millətə qan qusdururlar,
Bir iddəyə qısdırırlar,
Qalan qalır acbəsusuz,
Cavandısa acdı, quduz.

Qırx ildi ki, dustağam mən,
Qaralar içrə ağam mən,
Deyirsən bəs ki, sağam mən?
Bağırmaqdan iş qurtulub,
Boğaz-bağırsaq yırtılıb.

Biz millətin var harası?
Hardan sağalsın yarası?
Öz şeytanı, öz barası,
Buna deyir: "Qaç çapan",
Ona deyir: "Vur şikarı!".

Bir əl silah, bir el yalın,
Biri tünük, bir qalın,
Deyir ki, haqqızı alın!
Amma hansı kömək ilə?
Yemək olur demək ilə?

Millət yıxan - öz qalası,
Sərbaz kimdir? - Öz balası.
Öz qanıdır, öz colası,
Necə deyim: Çal çatlasın,
Qovuq kimi vur patlasın!

Böyükbaşlardı təqsirkar,
Kiçikbaşda nə təqsir var?
Yenə ərteş dura havar,
Millətin də işi işdir,
Yoxsa dava mərgümüşdür.

Millətə varmı faydası?
Hər qab sınır - öz baydası!
Bu şeytanın öz qaydası:
"Dəedəm mənə kor deyibdi,
Hər gələni vur deyibdi".

Qorxum budur, oyun ola,
Millət yenə qoyun ola.
Kimdir bizə boyun ola?
Ki, qurdu biz qova bilək,
Qurdun şərrin sova bilək.

Amma bizim mücahidlər,
Hər biri min cana dəyər,
Topa, tanka baxar məyər?
Qan-qan deyir hayxırması,
Acıqlı bir şir balası.

Köməkləşən gedir maha,
Bizə kömək yoxdur daha,
Bizimki qalmış Allaha.
Şeytan quluymuş şahımız,
Bizim də var Allahımız.

Biz bir dərya qan vermişik,
Zindanlarda can vermişik,
Qırx nəsil qurban vermişik,

Şəriətitək insanlar,
Təxti kimi pəhləvanlar.

Biz etisab etdik tamam,
Əliyalın etdik qiyam.
Qoyun, gəlir nayib-imam!
Cəhad desə, dartılarıq,
Qırılsaq da qurtularıq.

Başlara sovrulur saman,
Gözləri doldurub duman,
Ya Əli! Ya imam-zaman,
Dada çatın, ki dardayıq,
Qurddu, küləkdi, qardayıq.

Səsin mənə nəfəs oldu,
Qəbir genə qəfəs oldu,
Bir balaca həvəs oldu,
Dedim, genə durum yazım,
Özümə bir qəbir qazım.

Hərdən belə səsin gəlsin,
Gözümüzün yaşın silsin,
Mənim də bir üzüm gülsün.
Haçan səni görə billəm?
Qol boynuva hörə billəm?

Qardaşların gözündən öp,
Bəxtiyarın üzündən öp,
Səmədin də sözündən öp,
Mən də təkəm, sizə qurban,
Tək canım hammuza qurban!

*Təbriz, Deh ayı, 1357*

## ŞATIR OĞLAN

Şatır oğlan, görüm Allah sənə versin bərəkət,
Qoy unun yaxşı ələnsin, xəmirin əllənsin.
Çox bişir, yaxşı bişir, göydə fırıldat kürəyi,
Minbər üstə çörəyin qoy qalanıb təllənsin.
Təndirin Tur təkin ərşdən alsın işığı,
Ərsinin beyrəqi-əhrar təkin millənsin.
Kasıbın qisməti yox bağlı plov döşləməyə,
Bu yavan səngəyi bir qoy sahalıb sellənsin.
Qeyrətin qurbanı, sən müştərini tez yola sal,
El içində yaramaz arvad-uşaq vellənsin.
İki riyallığı satsın xozeyin bir tümənə,
Dişi düşmüş qocanın ağzı nədir dillənsin?
Ey mənim şərimə çox mail olan vərdəstə,
Deynə: Şair çörəyi qoy qurusun, güllənsin.
Mən lığırsa yeyə bilsəm də, fülus lazım olar,
Bu susuz bağça nə lazım bu qədər bellənsin?
Sarı yazlıqdan olan güllü, qızarmış səngək,
Gərək ağzında əriktək əzilib həllənsin.
Tehranın qeyrəti yox Şəhriyarı saxlamağa,
Qaçmışam Təbrizə, qoy yaxşı-yaman bəllənsin.
Bağçamız fasid olub, hər gül əkərsən açmaz,
Yeri daşlıqdı, gərək torpağı qərbillənsin.
İddiası çox olan boş təbilə bənzəyəcək,
Neyləmək, zurnaçının burnu gərək yellənsin.
Bu gicəllənmədən, ey çərxi-fələk, sən də yorul!
Bu həyasız günə gözlər nə qədər zillənsin?
Sədinin baği-Gülüstanı gərək həşrə qədər,
Alması selləlçnib, xurması zənbillənsin.
Lənət ol badi-xəzanə ki, Nizami bağının
Bir yava gülbəsərin qoymadı kakillənsin.
Arizu cəlgələrində biz əkən tum-dənələr,
Deyəsən, sağələnib, qoy hələ sünbüllənsin.
Qissə yox, qafiyə yox, axtarıram, tapmayıram,
Yeridir Şəhriyarın təbi də tənbəllənsin.

*Təbriz, Tir ayı 37*

## QAÇAQ NƏBİ

Dur qəfəs qapısın bir açaq, Nəbi,
Bu sınıq qanadla bir uçaq, Nəbi,
Ay qoçaq Nəbi!

Qazamat istidi, yata bilmisən,
Analar beşiyin sata bilmisən,
Öz ata yurdunu ata bilmisən,
Qeyrətin qurbanı, ay qaçaq Nəbi,
Ay qoçaq Nəbi!

On beş il gavurun zülmünə dözdün,
O nəqşə çəkdikcə, nəqşəsin pozdun,
Şimdi ki, obadan-eldən of üzdün,
Qəm yükün çatmışam, dur köçək,
Nəbi, Ay qoçaq Nəbi!

Dördbir dövrəmizi saldatlar aldı,
Qələlər ucaldı, qaranlıq saldı,
Zindanın işıqsız, günəşsiz qaldı,
Hümmətin ucadır, dam alçaq,
Nəbi, Ay qoçaq Nəbi!

Bir kəsin qalmayıb yarü yoldaşdan,
Qalsa da, fayşadır, doymaz oynaşdan,
Gecən qoy aşaq bu dağdan, daşdan,
Zindanı qazmışam, dur qaçaq,
Nəbi, Ay qoçaq Nəbi!

Dedin bəs vətən də sabiq vətəndir?
Gördün ki, dostum yox, hamı düşməndir,
Vətəndən qafan bir quru kövşəndir,
Ondan da əl çəkib vaz keçək,
Nəbi? Ay qoçaq Nəbi!

Çöllərdə çəkmişdim vətən zillətin,
Görəymiş özüm də çəkim qürbətin,

Qırıram vətənin ipin, ülfətin,
Cigərdən ayrılmır bir pıçaq, Nəbi,
Ay qoçaq Nəbi!

Vətəndən doymuşam, məni qınama,
Dur gedək, bu xəlqi artıq sınama,
Dur görüm! Bu ağac bənzir anama,
Telindən qoy qırım bir saçaq,
Nəbi, Ay qoçaq Nəbi!

Haralı olmalı? Bilə bilmədik,
Ləkəsin bu qanın silə bilmədik,
Bir də biz bu yana gələ bilmədik,
Arazın suyundan bir içək, Nəbi,
Qeyrətün qurbanı, ay qoçaq Nəbi

## KƏRƏC XATİRƏSİ

Sən Əli, yaxşı bu dağda oturaq eyləmisən,
Şəhri, dünyanı Əlitək setalaq eyləmisən.
Ürəyində əkilib yaxşı təvəkkül toxumu,
Yaxşı bitdikcə də sən yaxşı alaq eyləmisən.
Əl-qolun var ki, təkəlli, bu dağın böyründə
Bu sayaq bir avadanlıq əl-ayaq eyləmisən.
Qeyrətin dağ kimidi, dağ-dağa əlbət dayanar,
Sən də dağlar kimi dağları dayaq eyləmisən.
Açılıb burda üfüq, dağdı, ağacdı, bağdı,
Dağa dirsəklənib, o mənzəri bağ eyləmisən.
Bir qürur var bu fağır qürfədə, bir istiğna,
Sanki fironların qəsrinə lağ eyləmisən.
Bu qala-qallı şəhərdən çəkilibsən qırağa,
Nazlı Məsuməni gözlərdən iraq eyləmisən.
Bu səfalı komadan kəndimizin iysi gəlir,
Məni də bu qoca vaxtımda damaq eyləmisən.
Köçdürübsən elə bil Tehrana Heydərbabanı,
Nənəqiz əmqızının sən üzün ağ eyləmisən.
Nənəqiz əmqızının burda camalı görünür,

Lalədən qızlara yandıqca yanaq eyləmisən.
Gecələr sübhə kimi burda çıraqlar sönməz,
Ayı, ulduzları yüz şanlı çıraq eyləmisən.
Zövqdən bilmir adam burda yata, orda yata?
Ay-günəşlər oturağında yataq eyləmisən.
Burda bir çeşmə də tap, qoy baxa Heydərbabaya,
Bilmirəm hansı gözü Daşlıbulaq eyləmisən?
Çoxlu kənd evləri baxsan qara palçıqdı, suvaq,
Burda sən kənd evini bir ağ otaq eyləmisən.
Cemilə əmqızının iynəsi saplandı, dedim:
- Kəndi də Tehrana yırtıqca yamaq eyləmisən.
Səidin əksini gördüm, nə gözəl oğlandı!
Görüm inşallah onu barlı budaq eyləmisən.
Mir Əbülfəz məni bir də gətirənməz buraya,
Gördü ki, sən məni artıqca qonaq eyləmisən.
Şəhriyar, səndə cavanlıq yenidən pöhrə verir,
Yoxsa Heydərbabanı burda soraq eyləmisən?

## GETMƏ, TƏRSA BALASI

"İzn ver toy gecəsi mən də sənə dayə gəlim,
Əl qatanda sənə məşşatə təmaşayə gəlim".

Sən bu məhtab gecəsi seyrə çıxan bir sərv ol,
İzn ver, mən də dalınca sürünüb sayə gəlim.

Mənə də baxdın o şəhla gözülən, mən qaragün
Cürətim olmadı bir kəlmə təmnnayə gəlim.

Mən cəhənnəmdə də baş yastığa qoysam sənlə,
Heç ayılmam ki, durub cənnəti-məvayə gəlim.

Nənə qanında da sənlə əkiz olsaydım mən,
İstəməzdim doğulub bir bu dünyaya gəlim.

Sən yatıb cənnəti röyada görəndə gecələr,
Mən də cənnətdə quş ollam ki, o röyayə gəlim.

Qıtlıq illər yağışıtək quruyub göz yaşımız,
Kuyi-eşqində gərək bir də müsəllayə gəlim.

Sən də səhrayə marallar kimi bir çıx, nolu ki,
Mən də bir seyrə çıxanlar kimi səhrayə gəlim.

Allahından sən əgər qorxmayıb olsan tərsa,
Qorxuram mən də dönüb dini-Məsihayə gəlim.

Şeyx Sonan kimi donquz otarıb illərcə,
Səni bir görmək üçün məbədi-tərsayə gəlim.

Yox, sənəm! Anlamadım, anlamadım, haşa mən
Buraxım məscidimi, sənlə kəlisayə gəlim!

Gəl çıxaq Turi-təcəllayə, sən ol cilvəyi-tur,
Mən də Musa kimi, ol Tura təcəllayə gəlim.

Şirdir Şəhriyarın şeri, əlində şəmşir,
Kim deyər mən belə bir şir ilə dəvayə gəlim?

*Azər ayı, 1353*

## FƏXRİYYƏ ÖLÜMÜ

Seyidin vay səsi gəldi, ocaq söndü, çıraq öldü,
Bizim Fəxriyyəmiz ölsə, çəmənlər soldu, bağ öldü.
Seyid əyləncələr qurmuş, bu şəhrə dil-damaq vermiş,
Seyid ölsə, deyin əyləncə köçdü, dil-damaq öldü.
Seyidin xətminə getmək, bu asanlıqda ki olmaz,
Dizimdə qüvvətim qurtardı, əl yatdı, ayaq öldü.
O bir oğlan idi, yas məclisində varid olsaydı,
Görərdin toy tutuldu, güllər açdı, qaş-qabaq öldü.
Bizi bir ömr güldürdü, dönüb axırda ağlatdı,
Deyin gözlər sulansın, bağımız yandı, bulaq öldü.
Gözüm qalmışdı yollarda ki, bir gəlsin, üzüm gülsün,
Qara bəxtim kitab açcaq, qara görsəndi, ağ öldü.

Seyidin qüssəsi yaddan çrxartdı hər nə matəm var,
Bu dərdü dağ gəlcək hər nə varsa dərdü dağ öldü.
Bu il biz intizardaydıq ki, Təbrizə qonaq gəlsin,
Xəbər gəldi ki: qızlarun qara geysin, qonaq öldü!
Hünərmənd ölməmiş, bir bax, hünər bağında tufandır,
Ağaclar sındı, yarpaqlar saraldı, qol-budaq öldü.
Nə tək Təbrizin, Azərbaycanın fəxri Fəxriyyə
Gedib əldən uzaq düşdü, əzizlərdən iraq öldü.
Bizi başsız qoyub getdin, deyirlər yarü-yoldaşlar:
Niyə bu bivəfa çıxdı? Niyə bizdən qabaq öldü?
Sənə ölmək yaraşmır, xalqı ağlatma, diril, qoy gəl,
Görək birdən genə gülmək dirildi, ağlamaq öldü.
Mən ölmüşdüm neçə illər boyu, sən sağ idin amma,
Özüm də qalmışam heyran: ölən dirçəldi, sağ öldü.
Lətayif söyləmək fənnindən indi bir nəbuğ itdi,
Məhafil gərm qılmaq sənətindən bir ocaq öldü.
O cür kəskin məharət bir də doğmaz, bir də doğrulmaz,
Qəmə-qəddarə qatlandı, qılınc sındı, bıçaq öldü.
Təbiət öldü sənlə Şəhriyarın dağlı təbindən,
Duman qovzandı, cəngəl itdi, dərya batdı, dağ öldü.

## DÖYÜNMƏ - SÖYÜNMƏ

Bir qərn də qardaşdan uzaqlaşmaq olurmuş?
Qardaş deyə, bir ömr soraqlaşmaq olurmuş?
Birdən də bu qardaşla qucaqlaşmaq olurmuş?
Bunlar belə ki, ərz elədim, gəldi və oldu!
Mən hər nə məhal fərz elədim, gəldi və oldu!

Biz ayrılalı qərndi qardaşlarımızdan,
Leşlər kimi ayrı düşəli başlanmızdan,
Üzmüş əli qafqazlı qarındaşlarımızdan.
Gör mən nə hal ollam bu qızıl gülləri tapsam,
Rüstəm Əliyev tək gülü bülbülləri tapsam.

Qardaş! Gözüm axtarmada, qoy bir səni tapsın,
Eşqim tilisim dağlan Fərhad kimı çapsın,

Düşmən var isə, əmcəyini təndirə yapsın,
Həsrət qalalı biz sizə bir qəm yarımdır,
Ağlar gözümün şahidi şerim, setarımdır.

Oğraş qaşalan Həlmə, gözü qaşdan ayırmış,
Cəllad qəməsiylə bədəni başdan ayırmış,
Candan ciyəri, qardaşı qardaşdan ayırmış,
Bir millətə dünya boyu bir faciə doğmuş,
Biz ellərin ol qəhrəman ehsasını boğmuş.

Yatsın yava gözlər, hələlik bəxti oyatdım,
El arxama çatdıqda bu gün arzuma çatdım.
Qardaş, səni tapdıqda qəmi, qüssəni atdım,
Sanki Bakını, Gəncəni verdin mənə, qardaş,
Tapdım elimi, arxaımı, qurban sənə, qardaş.

Sən təhvil alırsan məni, qardaş da sanırsan,
Minlər yad içində məni görcək də tanırsan,
Qəlbimdə, dilimdə nə sözüm varsa qanırsan,
Rüstəm, Bakıdan söylə mənə, can sənə qurban,
Təbriz sənə layiq nədi, Tehran sənə qurban!

Qardaş, yenə sənsən ki, dalımda dayanıbsan,
Qardaş yata bilnəzsə, uyubkən oyanıbsan,
Mən hər oda yanmışsam, ona sən də yanıbsan,
Yad qardaş olanmaz bizə, qardaş da yad olmaz,
Qəlbim sən ilə şad olu, sənsiz de şad olmaz.

Sizlərcə "böyük" inqilabız xalqı ayıtdı,
Çapqın mal olan, mal-davar olsun da, qayıtdı,
Amma bizim insanlarımız getdi ki, getdi,
Qafqaz qayıdıb dönmədi öz kəc mədarından,
Qismət hələ yox Şəhriyara Bəxtiyarından.

Rüstəm, sənə qurban! Bu salamı götürərsən,
Ol qəhrəman ellərdə gəzərkən yetirərsən,
Ordan da gələndə bizə şadlıq gətirərsən,

Deynə Domurul bürcünü düşman yıxa bilməz,
Qardaş nə qədər yadlaşa, yaddan çıxa bilməz.

Sarğındı o süsənlərə, sünbüllərə könlüm,
Bülbül kimi qandır, o qızılgüllərə könlüm,
Vahidlərə, Qabillərə, Bülbüllərə könlüm,
Şair olalı borcludu Sabirlərə ruhum,
Vurğundu Süleyman kimi sahirlərə ruhum.

Rahimli, Süleymanlı görüm Bəxtiyar olsun,
Gülgün bacım Azər qadını bərqərar olsun,
Osman, Nəbi, Kürçaylı, Rəsul, Tudə var olsun,
Fürsətdə Səhənd ilə sizə gül səpərik biz,
Hər göz sizi görmüşşə, o gözdən öpərik biz.

Eşqində könül göz yola dikmiş yarı gözlər,
Könlüm yar itirmiş, arayıb axtan gözlər,
Dil səbr eləyib dinməsə də, yalvarı gözlər,
Aşiq gözüdür, çeşmeyi-Zəmzəm də deyirlər,
Hicran odudur, nari-cəhənnəm də deyirlər.

Bir gün olu ki, fatihə biz sağ-sola verrik,
Dünya hamı bir millət olub, qol-qola verrik,
Düşmən də məhəbbət tapa, bizlər yola verrik.
Qardaş üzünə həsrət olub çəkməm o gün ah,
Xalqı oda yandırmağa bir tək qalı Allah!

*12.9.1349*

## əzİzə

Nə zərif bir gəlin, Əzizə, səni
Mənə layiq tarım yaratmışdı.

Bir zərif ruha bir zərif cismi
İzdivac qüdrətilə qatmışdı.

Eşqimin bülbülü səni tutmuş,
Hər nə dünyadə gül var, atmışdı,

Sanki dustaq ikən mən azad idim,
Elə eşqin məni yahatmışdı.

Sevgilim sanki həmnəfəs olalı,
Qəfəsimdən məni çıxartmışdı.

Cənnət etmiş mənim cəhənnəmimi,
Yandırıb-yaxmasın azatmışdı.

Qara gün qarqası qonanda mənim
Ağ günüm varsa da, qaratmışdı.

Adıbatmış əcəl gələndə bizə,
Mən ayım çıxdı, gün də batmışdı.

Saralıb gün, şəfəqdə qan çanağın
Qorxudan titrədib calatmışdı.

Qara bayquş çalanda ağ quşumu,
Zəfərantək məni saratmışdı.

Kor qəza öz yolun genəldəndə,
Çarənin yolların daratmışdı.

Nə qədər ovdum, açmadın gözüvü,
Göz sükuti-əbədlə yatmışdı.

O ala göz oyanmadı ki, mənim
Bəxtimi min kərə oyatmışdı.

Daha kipriklərin olub neştər,
Yaramın közməsin qopatmışdı.

Səni verdim Behişti-Zəhrayə,
Mənə Mövla əlin uzatmışdı.

Sən nə yaxşı eşitmədin, balalar
"Ana vay" naləsin ucatmışdı.

Ürəyi doğranan anan mələdi,
Dünya zəhrin ona yalatmışdı,

Sən bahar etdiyin çəməndə xəzan
Hər nə gül-qönçə var, sozatmışdı,

Nə yaman yerdə köçdü karvanımız?
Nə yeyin yük-yapın da çatmışdı?!

Qırxa sən yetmədin, cavan getdin,
Mən gedəydim ki, yeddim atmışdı,

Qoca vəqtimdə bu qara bəxtim,
Məni qultək bəlay satmışdı.

## QƏM BASDI QƏLYANIMI

Qışm qərə qeyidi alıb mənim canımı,
Xortdan deyib qocalıq, kəsib mənim yanımı.
Bu siqar da zəlitək düşüb mənim canıma,
Dodaq-dodağa qoyub sorur mənim qanımı.
Sazaq sazın quraraq, qulaqdı sanki, burur –
Çəkibdir ipliyimi, qırıbdı qeytanımı.
Yenə qışın qoşunu payız marşın çalaraq,
Kərdimdə varsa biçər laləmi, reyhanımı.
"Üşüdüm ha üşüdüm!" - deyir mənim dərdimi,
Kürsü tovun itirib, axtarır dərmanımı.
Payızlamış zəmiyəm, vəryan mənə nə gərək,
Dönərgə döndərəcək döndükcə vəryanımı.
Qoy çalxasın bizi bu zəmanə nehrə kimi,
Mənim südüm çürüyüb, turşutsun ayranımı.
Hünər dilin, qələmin işdən salan məni də
İşdən salıb, itirib pak adımı-sanımı.

Heydərbaba yolutək yol bağlanıb üzümə,
Ovçu fələk ovlayıb sürüylə ceyranımı.
Nazlı yarım gedəli sönüb mənim çırağım,
Xan varsa da, nə karı, evin ki yox xanımı.
Məryəm köçüb gedibən, Şəhrzadım da gedir,
Fələk əlimdən alır dürrümü, mərcanımı.
Yetimtək üz-gözümü neybət basıb, basacaq,
Yaman qarışdıracaq səlqəmi, səhmanımı.
Nə diz var ki, sürünüm, nə üz var ki, qayıdım,
Nə yük qalıb, nə yabı, soyublar karvanımı.
Eldən məni qocalıq azğın salıb, salacaq,
İtirdi Təbrizimi, uduzdu Tehranımı.
Bizim də çayxanamız, çay tökərək qonağa,
Doldurdu zərdab ilə mənim də fincanımı.
Qəlyanla, Şəhriyarım, qaldır qəmi, baxalım,
Mən də xoruldadıram, qəm basdı qəlyanımı.

*Mehr ayı, 1359*

## TÜRKÜN DİLİ

Türkün dilitək sevgili, istəkli dil olmaz,
Ayrı dilə qatsan bu əsil dil əsil olmaz.

Öz ləfzini farsa, ərəbə qatmasa şair,
Şerin oxuyanlar, eşidənlər kəsil olmaz,

Şerin gərək ehsas ilə riqqətlə qanşsın,
Kənd əhli bilirlər ki, doşabsız xəşil olmaz.

Məndən də nə zalım çıxar, oğlum, nə qisasçı,
Bir dəfə bunu anla, ipəkdən qəzil olmaz.

Ötməz, oxumaz bülbülü salsan qəfəs içrə,
Dağ-daşda doğulmuş dəli ceyran həmil olmaz.

Sözlər də cəvahir kimidir, əsli bədəldən
Təşxis verən olsa, bu qədər zir-zibil olmaz.

Sağ gündə dolar taxta-tabaq ədviyə ilə,
Onda ki, nənəm sancılanar, zəncəfil olmaz.

Şair ola bilməzsən, anan doğmasa şair,
Missən, a balam, hər sarıköynək qızıl olmaz.

Çox da ki, Sərabın suyu var, yağ, balı vardır,
Başı ərşə də çatdırsa, Sərab Ərdəbil olmaz.

İnsan odu, tutsun bu zəlil xalqın əlindən,
Allahı sevərsənsə, bu insan zəlil olmaz.

Millət qəmi olsa, bu cocuqlar çöpə dönməz,
Ərbablarımızdan da qarınlar təbil olmaz.

Məndən də nə zalım çıxar, oğlum, nə qisasçı,
Bir dəfə bunu qan ki, ipəkdən qəzil olmaz.

Düz vaxtda dolar taxta-tabaq ədviyyə ilə,
Onda ki nənəm sancılanar, zəncəfil olmaz.

Fars şairi çox sözlərini bizdən aparmış,
Sabir kimi bir süfrəli şair pəxil olmaz.

Türkün məsəli, folkloru dünyada təkdi,
Xan yorğanı kənd içrə, məsəldir, mitil olmaz.

Bu Şəhriyarın təbi kimi çimməli çeşmə
Kövsər ola bilsə, demirəm, Səlsəbil olmaz.

## ZAMAN SƏSİ

Sübh oldu, hər tərəfdən ucaldı əzan səsi,
Guya gəlir məlaikələrdən Quran səsi.
Bir səs tapanmıram buna bənzər, qoyun deyim:
Bənzər buna, əgər eşidilsəydi can səsi.

Sanki uşaqlığım kimi nənnimdə yatmışam,
Laylay deyir mənə anamın mehriban səsi.
Sanki səfərdəyəm, oyadırlar ki, dur çatax,
Zəngi-şütür çalır, keçərək karvan səsi.
Sanki çoban yayıb quzunu dağda ney çalır-,
Röya dogur quzu qulağında çoban səsi.
Cismim qocalsa da, hələ eşqim qocalmayıb,
Cingildəyir hələ qulağımda cavan səsi.
Sanki zaman güləşdi, məni güpsədi yerə,
Şerim, yazım olub yıxılalı pəhləvan səsi.
Axırzamandı, bir qulaq as, ərşi titrədir
Millətlərin haray-mədədi, əl-aman səsi.
İnsan xəzanıdır, tökülür can xəzəl kimi,
Saztək xəzəl yağanda sızıldar xəzan səsi.
Qırx ildi dustağam, qala bilməz o yağlı səs,
Yağsızsa da, qəbul elə məndən yavan səsi.
Mən də, səsim ucalsa, gərəkdir, yaman deyəm,
Millət acıxlıdır, ucalıbdır yaman səsi.
Doldur nəvarə qoy qala, bir gün bu körpələr,
Alqışlasınla zövq ilə bizdən qalan səsi.
Miğnatis olsa səsdə çəkər, inqilabda bax,
Azadlıq aldı Sərdarımın qəhrəman səsi.
İnsan qocalmış olsa, qulaqlar ağırlaşar,
Sanki yazıq qulaqda guruldar zaman səsi.
Bax bu dərin sükutə səhər, hansı bir nəvar
Zəbt eyləyə bilər belə bir cavidan səsi?
Sancır məni bu fışqa çalanlar da, Şəhriyar,
Mən neyləyim ki, fışqaya bənzər ilan səsi.

*1355*

## AZADLIQ QUŞU "VARLIQ"

Hərçənd qutulmaq hələ yox darlığımızdan,
Amma bir azadlıq doğulub varlığımızdan.
"Varlıq" nə bizim təkcə azadlıq quşumuzdur,

Bir müjdə də vermiş bizə həmkarlığımızdan.
Bəh-bəh, nə şirin dilli, bu cənnət quşu tuti,
Qəndin alıb ilham ilə dindarlığımızdan.
Dil açmada karlıq da gedər, korluğumuz da,
Çünki lallığımız doğmuş idi karlığımızdan.
Düşmən bizi əlbir görə, təslim olu naçar,
Təslim oluruq düşmənə naçarlığımızdan.
Hər inqilabın vur-yıxı son bənnalıq istər,
Dəstur gərək almaq daha memarlığımızdan.
Huşyar olasız, düşməni məğlub edəcəksiz,
Düşmənlərimiz qorxuri huşyarlığımızdan.
Birlik yaradın, söz bir olar biz kişilərdə,
Yoxluqlarımız bitdirəcək varlığımızdan.

*Təbriz, 15 Xordad, 1358*

## O TAYDAN GƏLƏNƏ

Vətəndən ayrı düşən övladım! Qayıt vətənə!
Qayıt ki, göz yola tikmiş anan qayıtdı sənə.

Anan səni itirib, axtarıb yenə tapdı,
Deyir: Bala, sayıq ol, tapdığın itirmə yenə.

Cəvahiri itənin dərdini kimə deyəsən?
Yenə tapılsa, deyin bəs cəvahiri itənə.

Xəzanda ol qara yel bülbülə dedi: Qoy, get!
Gül ilə qaldı görüş, ölməsək, göy ot bitənə.

Göy ot bitib, gül açıb, yaz gəlib, oxur qazalaq,
Qışı çıxardıb uşaqlar, qaçılla çay-çəmənə.

Sənin tanışlarının çoxları qabaqda gedib,
Dalı qalan elə bir təkcə münhəsirdi mənə.

Sənə tanış qalan olsa mənim kimi qocalar,
Cavansa sən gedən illərdə körpə bir ətənə.

Gül əkmədə, qoca bağban, bükülsə bel nə qəmin?
Dalınca rəhmət oxullar bu gülləri əkənə.

Mənim də qədrimi bil, gül başın tikan saxlar,
Canın da, ta dirisən, ehtiyacı var bədənə.

Adın nə qoysa qoyub, şeytanımızdır, bu gədə,
Sadizmi var, nə dədə xərcinə gəlir, nə nənə.

Əcinnətək təmiz insanlar kəsib biçdi,
Bizim cəzirəmizi qoydu xali əz səkənə.

O, Allahın danıb, öz nəfsinə tərəhhümü yox,
Desən də bu nədi, oğlum? Deyər: - Əmi, sənə nə!

O taylı sizsiz olan yerdə Şəhriyar qəzəli
Oxunsa da, elə bil müşkü yollusan Xütənə.

*Təbriz, 4.4.1358*

## SƏNƏTİ MƏMLƏKƏT

Keçən gecə bir kürəyim qovuşdu,
Əcəl mənə yaxınlaşıb, yovuşdu.
Sonra yene çaldı, keçdi, sovuşdu,
Bu it canım qurdu yenə qaçırtdı,
Qurd da ancaq kürəyimi bir çırtdı.

Hey uydum, hey ayıldım, ta oyandım,
İlan kimi bir qıvrılıb dayandım,
Fikrə gedib, yenə od tutdum, yandım,
Bu sür-sümük evcik ki, qurdu yıxmaz,
Kənkan deyər: İp qırtlmaz, can çıxmaz.

Düşmən bizə dişlərini qıcırdır,
Körpə kimi belimizi qacırdır,
Xəmir kimi ayaqlayıb acırdır,
Belə bu yurd yapır bizi təndirə,
Udur, amma inanmıram sindirə.

Dini-dəbi alıb bizdən tünlədi,
Dədələri xoruz kimi dənlədi,
Uşaq da ki, bilməz vətən, din nədi,
Uşaqları hammal edib işiədir,
Çini qabı sındırıban pişlədir.

Mülkü gərək ərbab verə kətdiyə,
Kətdiyə də şəhərdə iş bətdiyə,
Kətdə qarı-qoca başın bitdiyə,
Kətdə daha bir hampalıq sürən yox,
İtlərdə də bir çömbəlib hürən yox.

İndi gərək Amrikadan dən gələ,
Çörək gedə, Fransadan pən gələ,
Dən-düşümüz İsveç, Norveçdən gələ,
Gəlməsə bir gün, acımızdan ölək,
Qapış-qapış bir çörəyi min bölək.

Minnət qoyur, ölkə olub sənəti,
Səktədi, sildi, sərətan-sövqəti,
Ətlər olmuş at əti, ya it əti,
Donmuş ətin iysi başı çatladır,
Qarnımızı qovuq kimi patladır.

Hey burs açrr, hey seminar-sendika,
Montajnı da adın qoyub fabrika,
Dəmir-dümür mark ingilis-Amrika,
Göz baxdıqca hey maşındır, hey qaraj,
Amma dibdə cibim dolu, qarnım ac!

## PƏRVANƏ VƏ ŞƏM

Bərq olmadı, qızım gecə yandırdı laləni,
Pərvanənin o dəmdə baxırdım ədasına.
Gördüm təvafi-Kəbədə yandıqca yalvarır,
Söylür: "Dözüm nə qədər bu eşqin cəfasına?
Ya bu hicab şişəni qaldır ki, sovrulum,
Ya sondürüb bu fitnəni, batma əzasına".
Baxdım ki, şəm söylədi: "Ey eşqə müddəi!
Aşiq haçan olub yetə öz müddəasına?
Bir yari-məhliqadı bizi böylə yandıran,
Səbr eylə, yandıran da çatar öz cəzasına".
Amma bu eşq atəşi ərşidi, candadır,
Qoy yandırıb xodunu yetirsin xudasına.

## "BEYADİ-DUSTİ DİRİNƏM MƏHƏMMƏDƏLİ MƏHZUN"

*Köhnə dostum Məhəmmədəli*
*Məhzunun xatirəsinə*

Məhzun da o nazlı kişilərdən birisiydi.
Zövqündə qəzəl sanki qəzalın sürüsüydü.
Mən yağ dərisitək onu əvvəl dolu gördüm,
Sonda yağı süzmüşdü, qalan bir dərisiydi.
Məhzun bir ovuc torpaq idi dost ayağında,
Fərq eyləməyib - bu ölüsü, o dirisiydi.
Şair dediyin dəryada mirvariyə bənzər,
Mirvari çoxu rizədi, Məhzun irisiydi.

## DAN ULDUZU DA BATDI

Nənəqız əmqızının vay xəbəri çatdı mənə,
Kət gözümdə elə bil titrədi, dam-daş uşdu.
O, bizim karvana dan ulduzu hökmündə imiş,
O da batdı ki, dayanma, daha karvan köşdü.

O gözəllik ki, görürdük hamı "Heydərbaba"da,
Bu gözəllərlə ölüb, göz yaşı gözdən düşdü.
Sanki bir körpünün üstündə durubsan, baxısan,
Üz qoyub axirətə, sel kimi ellər keşdi.
Nənəqız əmqızının gözləri "Heydərbaba"da
Qocalıb ölməsinə bir əbədi qarqışdı.
Şəhriyarın da o mənzumədə kəskin qələmi
Gülə yay-yaz, tikana sanki küləkdir, qışdı.

## QARDAŞIMIN MƏZARI

*Duşizə Şəhin Pəzirənin dilicə*

Daş nə bilir mən bəlalı başım var,
Bu qəbr üstə axan bir göz yaşım var,
Arzı-gürzi tarixçəsindən qalan
Burda ancaq bir yazılı daşım var.
Fatihəni unutmayın ki, burda
Mənim də bir yarali qardaşım var.

## DÜNYA NƏ YAMAN TAPMACADIR

İl keçdi, bahar oldu, xəbər yox gülümüzdən,
Gül açmadı, qovzanmadı səs bülbülümüzdən.
Bayram günümüz yaslı görüşlərlə keçərkən
Şadlıq nə umaq biz ayımızdan, ilimizdən.
Təqvim ala bilməm ələ, gördüm mənə təqvim
Gözdağı ki, Təqvimi də getdi əlimizdən.
Biz bağçamızı belliyə billik? Daha heyhat!
Nomid əcəlin beldarı vurmuş belimizdən.
Təqvimi olardandı ki, yaddan çıxa bilməz,
Yaddan necə çıxsın, adı düşmür dilimizdən,
El içrə başı bir yerə gahdan o yığardı,
O getdi, yığıncaq da yığışdı əlimizdən.
Yoldaş səpələndi, elə bil sam yeli əsdi.

Sərsamdı qalan bizlərə bu sam yelimizdən.
Dünya nə yaman tapmacadır, baş çıxaran yox,
Biz baş tapaq ancaq bu qubul-mənqəlimizdən.
Təqvimi kimi düz kişi? Heyhat, tapılmaz,
Bir şəm idi ki, köçdü bizim məhfilimizdən.
Üç nazlı bala, həmsərilə qaldıla başsız,
Yansaq da, od əl çəkməyəcəkdir külümüzdən.
Bir Kafiyə ondan bacan yadigar olsun,
Baş yolmada, bir teldi qalan kakilimizdən.
El bir də desin: "Sel Saranı qapdı, qaçırtdı".
Ağlaşdı buludlar da bu daşqın selimizdən.
Bir məzrəədir Şəhriyarın ömrü, nə hasil?
Sel qoymuri bir çöp də qala hasilimizdən.

## ANCELA

Gözlərimin ağı-qarası Ancela,
Ürəyimin dağı, yarası Ancela.
Sənli-mənli ürəyimiz dağlıdır,
Dərdimizin yox çarası, Ancela.
Hər kimsəyə qəmdən bu bir hissədir,

Ata dağı bir dağ kimi qüssədir,
"Sel Saranı apardı" tək qissədir,
El yarası, sel Sarası - Ancela.

Mən də yaman saralmışam, solmuşam,
Dolandıqca dərdə-qəmə dolmuşam.
Gemim sınıb, dəryada qərq olmuşam,
Dəryanın də həp arası Ancela,
Gözlərimin ağı-qarası Ancela.

Nazlı yarım getdi, günüm qərəldi,
Onun dağı qəlbimi yardı, dəldi,
Özü getdi, paket içində gəldi,
Bilərziyi, güşvarası Ancela,
Gözlərimin ağı-qarası Ancela.

Bel bükülür, yapışmışam belimdən,
Həzyan kimi adı düşmez dilimdən,
Hara gedim? Hamı gedib əlimdən,
Qəriblərin var harası, Ancela?
Gözlərimin ağı-qarası Ancela.

Sən mənim öz nazlı, gözəl balamsan,
Mən dəniz olsam da, qızıl alamsan,
Kəhliyimsən, fəriyimsən, falamsan,
Buludların mahparası Ancela,
Gözlərimin ağı-qarası Ancela.

Türkiyəyə getdin, unutdun məni,
İstambulun ovçusu səpdi dəni,
Qapdı demək mirvari görcək səni,
İstambulun Marmarası Ancela,
Gözlərimin ağı-qarası Ancela.

Gördün bala, necə tifaq dağılı,
Fələk vurar, şərab küpü cağılı,
Biz də ollux "San inək" nağılı,
Fatiməsi, Qundarası Ancela,
Gözləimin ağı-qarası Ancela.

Heç bilmədim nə vaxt tutuldu toyun,
Bir görmədim, gəlin gedəndə boyun,
Musiqimiz, şerimiz olmuş oyun,
Heyvərələr zəmburası Ancela,
Gözlərimin ağı-qarası Ancela.

İncə, zərif zövqün qalırmı, ya yox?
Ərün səndən bir zövq alırmı, ya yox?
Şerə də bir nəzər salırmı, ya yox?
Ya şeir onun dır-dırası Ancela,
Gözlərimin ağı-qarası Ancela.

Gəlin görək göz bir-birin heç tanır?
Ya yadlaşıb, tanışlığm da danır?
Ömür keçir qara yeltək firlanır
Ruzigarın fırfırası Ancela,
Gözlərimin ağı-qarası Ancela.

## HARA QAÇSIN İNSAN?

Cana gəlmişik biz bu canan əlindən,
Ki nə ins aman tapdı, nə can əlindən.
Müsəlmanə bax, dinü iman qan ağlır,
Bu dinsiz, imansız müsəlman əlindən.
Bu şeytandı, biz ahu, göydə tovlar,
Qaça bilməz Adəm bu şeytan əlindən.
Alar əvvəl İmanı, sondan da canı,
Nə iman qalar dəbdə, nə can əlindən.
Qarışqa kimi div nəjadı qımıldır
Ki, xatəm çıxıbdır Süleyman əlindən.
Badımcan çoxu bazılarda küçüklər,
Da tərpəşmək olmaz badımcan əlindən.
Xoruz tək bizi dənləyib qurtarıbdır.
Çinə qalmayıb noçinedan əlindən.
Pənah olsa biz xəlqə kafər, qoy olsun
Sığıntı düşək küfrə iman əlindən,

Gedib çöldəki neyvana yalvaraydıq,
Ki gəlsin, bizi alsın insan əlindən.
Elə turşadıb İranın ayranın ki,
Gözəllər gözü yaşdı İran əlindən.
Salıbdır ətə sanki Musa əsasın,
Qaçır əjdahalar bu Söban əlindən.
Nə soltanlar olmuş əlində oyuncaq.,
Nə gəlsin oyuncaqlı soltan əlindən.
Beş-üç nəfər başbilən də qalırsa, uşaqtək
Qaçıb gizləniblər bu xortdan əlindən.
Evim, zindanım, məmurum öz içimdə,
Hara qaçsın insan bu zindan əlindən?
Biz insan olaq, ya ki heyvan, aman yox,
Nə insan qurtarmış, nə heyvan əlindən.
Nə divlər ki qaytanla zəncirləniblər,
Qənəflər qırılmış bu qaytan əlindən.
Salıb xəlqi dərman adilən nə dərdə
Ki, dərd ağlayır belə dərman əlindən.

O bəy-xan yazıqlar nə insanmışlar,
Əbəs ağlayırdıq o bəy-xan əlindən.
Verərdik qədim divana ərzə, indi
Kimə ərzə vermək bu divan əlindən?
Nə tufana rast gəlmişik biz, məgər Nuh
Gələ qurtara xəlqi tufan əlindən.

## "RÜTƏB VERİB, TƏZƏK ALDIQ"

Zəmanə bax ki, nə pis nəsli yaxşı nəslə qatır,
Nə çəkdirib ulağa madyanı, bax, doğdu qatır.
Südük atan it atılmış bizim atın belinə,
Suya yatan at olub bəxtimiz, su gördü yatır.
Dönüb çörəkçixana oldu bir qatırçıxana,
Xəmir tağarda neçindir - qeyiş! Şatır nə şatır!
Deyəndə: Bu nə çörəkdir? Şatır söyüş də verir,
Söyüş verir ki, dəxi qalmasın xalanda xatır.
Bu oldu bizdə təməddün! Məsəldi, "düz yerdə
Bizim ulağ gedə bilmir, şoxumda şıllaq atır".

Rütəb satıb alırux biz de eşşəyin təzəyin,
Alan görün nə alır, bir baxın, satan nə satır?
Bu tir-tikan da batır ox kimi mənim gözümə,
Daha həyat gözümdə günəş də olsa, batır.
Nə yaxşı kt, yeni karvan açanda yüklərini
Bizimki yüklərini bağlayıb çatıyla çatır.

## MƏLUL YAZIQ NEYLƏSİN?

İtirmişəm kələfçənin başını,
Tapanmıram üzüyümün qaşaını,
Maşın bizi təbiətdən ayırıb,
Mürdəşirə verim belə maşını.
Naxoşluq da qocalıqla əlbirdir,
Qoymaz qoca dolandıra başını.
Ağız-burun zinə verir çeşmə tək,
Silənmirəm gözlərimin yaşını.
Düz qaməti çəkən nəqqaş dünyanın

Göz üstündə əyri çəkmiş qaşını.
Yorulmuşam, bu dünyadan doymuşam,
Bir ataydım bu küllüyün daşını.
Bir göz damı qəbirdə versə, kasıb
Çul-palazın yığışdırıb, daşını.
Uymuş millət həbərutdan ayılıb,
Yığışdırıb çersini, xaşxaşını,
Cahad gəlib, məlul yaziq neyləsin?
Naməru məgər tək qoyu yoldaşını?
Aşuradır, qoca məlul başyaran,
Qan göründə qeyrət başı qaşını.
Qanla şəhadət güllərin suvarır,
Almış ələ topların abpaşını.
"Ərteşi bist milyonu"[1] tənzim olur,
Şah İsmayıl yığır qızılbaşını.
Cəbhə dalında bacı şeyhə çəkir,

Şəhid verir cəbhədə qardaşını.
Şeytan da yığmış başına hər nə var,
Səddamlar tək əcamir-ovbaşını,
Amerikanın qazanları dib qapıb,
Qıjqırdacaq bozbaşını, aşını.
Min il səbrin tufanı var dalında
Nuh ki, dala gizlədənməz yaşını.
Fəcr açılıb, bülbül doğur çalılar,
Qurub boğur bayquşla xəffaşını,
Nayib imam gəlib, keçib ixtilaf,
İslam tapır itmiş qarandaşını,
Təfriqəni cəm edir əsnafımız,
Börkçi basır bağrına kəffaşını.
Vəhdətimiz bir qazanda qaynadır
Noxudunu, ləpəsini, masrnı.
Sənət yetir xudkəfahq mərzinə,
Ustakar etmiş ehtiyac naşmı.
Şəhriyann Məqsudiyyə zindanm
"Otuz bir" yaz oxumuşam kaşını.

---

[1] İyirmi milyonluq ordu

## ƏZİZƏ CAN

Dərdin olmuş mənə bir simli xəncər yarası,
Fikrə getdikcə yaram günbəgün artıq eşilir.
Göz yaşım qanla qarışmış, ürəyim göynəmədə,
Bir biləydin içərimdə nə çibanlar deşilir.

Əzizim, doymadım səndən,
Nə tez məndən doyub getdin,
Əcəl gəlcək bu qürbətdə,
Məni yalqız qoyub getdin.

Toy, yas ol, gəlin getdi,
Qol, şil ol, əlin getdi,
Vur başa, yazıq bağban,
Bağ solub, gülün getdi!

## BƏDÖV AT

Bədöv minib, ay bədöv bəsləyənlər,
Bədövdə nişanə neçə gərəkdi.
Fınxırıb, çımxırıb çub şığıyanda
Ceyrantək tullanıb keçə gərəkdi.
Uzaq qaraltısı qarışqadısa,
Qulaxlar şaxlanıb seçə gərəkdi.
Dırnağı altında daş-qum, dağ-dərə,
Döşənib yumuşaq keçə gərəkdi.
Səlqəli bal pətək saxlayanındır,
Mənim də şan balım beçə gərəkdi.

## ALNIMIN YAZISI

*(Sərbəst şeir)*

Ayılanda da indilər yuxudan
Huş azıb, tez tapanmıram özümü.
Bilmirəm hardayam, bura haradır,
Ev-eşik yad gəlir hələ gözümə.
Elə bil qalmışam keçənlərdə,

Deyirəm bəs yenə haman adamam,
Yenə sabiq kimi idarəm var,
Tələsik istirəm duram, baxıram,
Bel-buxun, qol-qıçım daha qalxmır,
Daha qüdrət yoxum, durum ayağa.

Qocalıq heç hələ yadımda deyil,
Deyirəm bəs yenə naxoşlamışam.
İstirəm səsləyim yenə xanımı
Ki, davan var gətir, yenə naxoşam.
Amma ev sanki bir qəbristandır,
Hop tutub qızların cığan-vığanı.
Nə küsüblər ki, heç danışmırlar,
Heç xanımdan da səs-səda yoxdur.

Elə bil bir də silkəlillə məni,
Huşum azmış yolun tanıb qayıdır.
Özümü axtarıb, yenə tapıram,
Oxunur ancaq alnımın yazısı.

Burda birdən çökür qaranlıqlar,
Sanki dam-daş uçur mənim başıma.
Qalmışam dam-divarlar altında,
Bir qaranlıq qəbirdəyəm ki, daha
Heç tərəfdən işıqlığım yoxdur.

İçərim sanki öz səsimlə deyir:
- Sən ölübkən, qəbirdə xortdamısan!
Nə xanım? Arvadın on ildi ölüb!
Arvadın öldü, qızların köçdü,
Qocalıq gəldi, qələni aldı.
Səni kor quş kimi basıb qəfəsə,
Nə qoyubsan, əmi, nə axtarısan?
Bir kəsin qalmayıb. Hamı getdi,
Qoca da sən kimi qərib olmaz.
Qocalar içrə də yetim sənsən,
Sən imişsən ölən, xanım dirilib.

Yaramın közməsi qopub acışır,
Hər zadın ziddi də özüylə gələr.
Qərə gün ağ günü salır yadıma,
Sinəmin sazları sızıldırlar.

Dibdə qəlbimdə zar-zar ağlıyaraq,
Farsi bir qitə var, düşür yadıma.
Azəri Bəydili belə yazmış,
O yazıq da mənim halımda imiş:
"Pirəm o adəti-teflan darəm,
Ba mən in şuxi təbərzani.
Vəqti əz xəndə məra qolrizi,
Vəqti əz gerye qolab əfşani.

Əgərəm xəndə nə əz bixərədi,
Və gərəm geryə, nə əz nadani.
Əvvələm xəndə ze bidərdi bovəd,
Vaxərəm gerye ze bidərmani".[1]

**ALLAH BOYAĞI**

İslam oyatdı xalqı, başın qovzayan qaçır,
Şeytan bacarmadı ki, yatanlar oyanmasın.
Hər rəngi at, fəqət boyan Allah boyağına,
Hər aldadan boyaqlara qəlbin boyanmasın.
Xəlqin gözün oyardı şahın mirqəzəbləri,
Qoy bir oyulsun öz gözü, ta göz oyanmasın.
Təbliğ o payədə gərək olsun ki, müddei
Bir nöqtəsində zəfinə barmaq qoyanmasın.

---

[1] Qocayam, amma uşaqların adətindəyəm.
Mənimlə təbiət belə zarafat eləyir.
Elə vaxt olur ki, gülməyimlə gül tökülür,
Bəzən də ağlamağımla gülab tökürəm.
Əgər gülürəmsə ağılsızıqdan deyil,
Əgər ağlayıramsa da nadanlıqdan deyil.
Əvvəl gülməyim dərdsizlikdəndir,
Sonrakı ağlamağım dərmansızlıqdandır.

Əlfazi möhkəm etməli, mənanı çox lətif,
Sözlər gərək soğandısa, hər kəs soyanmasın.
Amma gecə namaz da qılırsan, yavaşca qıl,
Qoy zəhmətilə huşlanan olsa, oyanmasın.
Ağzında dadlı sözlərüvü sən də, Şəhriyar,
Eylə bişir ki, xəlq dadından doyanmasın.

## XAN NƏNƏ

Xan nənə, hayanda qaldın?
Belə başıva dolannam.
Necə mən səni itirdim!
Da sənin tayın tapılmaz.

Sən ölən gün əmmə gəldi,
Məni götdü ayrı kəndə.
Mən uşaq, nə anlayaydım?
Başımı qatıb uşaqlar,
Neçə gün mən orda qaldım.

Qayıdıb gələndə baxdım,
Yerüvü yığışdırıblar.
Nə özün və nə yerin var,
"Hanı Xan nənəm?" soruşdum.
Dedilər ki: Xan nənəmi
Aparıblar Kərbəlayə.
Ki şəfasın ordan alsın.
Səfəri uzun səfərdir.
Bir-iki il çəkər gəlincə.
Necə ağladım yanıqlı,
Neçə gün elə çığırdun
Ki səsim, sinəm tutuldu.

O, mən olmasam yanında,
Özü heç yerə gedəmməz.

Bu səfər nofubdu, mənsiz
Özü tək qoyub gedibdi.
Hamıdan acıq edərkən,
Hamıya acqlı baxdım.
Sora başladım ki: mən də
Gedirəm onun dalnıca.

Dedilər, səninki tezdir,
İmamın məzarı üstə -
Uşağı aparmaq olmaz,
Sən oxu, Quranı tez çıx,
Sən onu çıxınca, bəlkə
Gələ Xan nənə səfərdən.

Tələsik rəvanlamaqda
Oxuyub Quranı çıxdım.
Ki, yazım sənə: Gəl indi,
Daha çıxmışam Quranı.
Mənə sovqat al gələndə.
Amma hər kağız yazanda
Ağamın gözü dolardı.
Sən də ki, gəlib çıxmadın,
Neçə il bu intizarla
Günü, həftəni sanardım.
Ta yavaş-yavaş göz açdım,
Anladım ki, sən ölübsən!

Bilə-bilmiyə hənuz da
Ürəyimdə bir itik var.
Gözüm axtarar həmişə,
Nə yamandı bu itiklər.
Xan nənə, canım, nolaydı,
Səni bir də mən tapaydım,
O ayaqlar üstə bir də
Döşənib bir ağlıyaydım.
Qolu həlqə salmış iptək
O ayağı bağlıyaydım.

Ki, daha gedəmmiyəydin.
Gecələr yatanda, sən də
Məni qoynuva alardın.
Necə bağrıva basardın,
Qolun üstə gah salardın.
Acı dünyanı atarkən
İkimiz şirin yatardıq.
Yuxuda lülü atarkən
Səni mən bələşdirərdim.
Gecəli su qızdırardın,
Özüvü təmizləyərdin.
Genə də məni öpərdin,
Heç mənə acıqlamazdın.
Savaşan mənə kim olsun,
Sən mənə havar durardın.
Məni sən, anam döyəndə
Qapıb aradan çıxardın.
Elə istilik, o istək
Daha kimsədə olurmu?
Ürəyim deyir ki: Yox-yox.
O dərin, səfalı istək
Mənim o əzizliyim tək
Sənilə gedib, tükəndi.

Xan nənə, özün deyərdin
Ki, sənə behiştdə Allah
Verəcək nə istəyirsən.
Bu sözün yadında qalsın,
Mənə qövlünü veribsən.

Elə bir günüm olursa,
Bilisən nə istərəm mən?
Sözümə dürüst qulaq ver:
Sən ilən uşaqlıq əhdin.

Xan nənə, aman, nolaydı,
Bir uşaqlığı tapaydım.

Bir də mən sənə çataydım,
Sənilən qucaqlaşaydım.
Sənilən bir ağlaşaydım.
Yenidən uşaq olurkən
Qucağında bir yataydım.
Elə bir behişt olursa,
Daha mən öz Allahımdan
Başqa bir şey istəməzdim.

## BACIM OĞLU BƏHRUZUN BAYATILARI

Əcəl kəsdi yanıvı,
Ax;r aldı canıvı.
Qırxıvı tutan gecə
Oxudum elanıvı.

Başıva dolanmadım,
Başımı yolanmadım.
Xanbamın qəm günündə
Şərik də olanmadım.

Bu xəbər xoşa gəlməz,
Bu yatan huşa gəlməz,
Zəhməti başa gəlsə,
Nisgili başa gəlməz.

Göz açdı bir zamanda
Ki hamı əlamanda,
Nə çəkdi qurd əlindən
Bu qaranlıq dumanda.

Eşidib bilənmədim,
Yasıva gələnmədim.
Sənlə mən, yazıq balam,
Bir deyib gulənmədim.

O şirin dil aşması,
Dad-duzlu danışması,
Nə qoşaymış, quşumun
Qonmasilə uşması.

Sel gələr divar yıxa,
Qəm gələr ürək sıxa.
Ev yıxan cavan dağı
Olur ki, yaddan çıxa?

Yas gərək qara geyə,
Yaslılar xinov yeyə.
Bacılar başın yola,
Qardaş vay! - deyə-deyə.

Yas gəli, qəm yedirdi,
Saz kimi söz dedirdi.
Qabağca biz gedirdik,
Niyə Bəhruz gedirdi?

Yaz gələr əbir versin,
Qış gələr qəbir versin,
Cavana qəbir verən
Qocaya səbir versin.

Qurtarıb məhərrəmin,
Quyladı axır qəmin.
Qoydu biz qalanlara,
Dünyanın cəhənnəmin.

Bikəsə kəs verən yox,
Səsinə səs verən yox,
Fərmanlar hamı "Ataş!"
Bir "Ataşbəs" verən yox.

Ürək ki xoş olmasın,
Dünyada kaş olmasın.

Ana can, oğul yeri
Boşdusa, boş olmasın.

Səadət səidlərə,
Lənət də yezidlərə.
Bəhruz da şəhid oldu
Qoşuldu şəhidlərə.

Pozular bu nizamlar,
Gələcəklər imamlar.
Şəhidlər duracaqlar,
Alınar intiqamlar.

## DOKTOR CAVİD DƏ GETDİ

Dünya əvəz dəyişdi,
Heyva verən nar alı.
Amma mənim qəlbimdə
Geniş yerin dar alı.
Doktor Cavid də getdi,
Yaralıyam, yaralı,
Qoca - əcəl malıdır
Köhnəni simsar alı.
San çəyirtkə gəlsə,
Sel qabağın sar alı.
Amma əcəl qabağın
Nə bel, nə beldar alı.
Yay can ala bilməsə,
Qış gəli çarçar alı.
Yoxdan ki bir zad çıxmaz,
Behişti də var alı.
Sən varı iysar elə,
Darlığı iysar alı.
Şəhid ol yar yolunda,
Şəhid olan yar alı.
Allah yolundan çıxan
Nuru satar, nar alı.

İman olsa, Allahın
Dilindən ilqar alı.
Mən nə orda, nə burda,
Heç bilmirəm haralı.
Bülbül cəh-cəh alanda,
Qarğa da qar-qar alı.
Qarabəxt dağa çıxsa,
Dağın başın qar alı.

## UŞAQLAR

Uşaqlar dil açanda,
Ağaclar gül açanda,
Gözün bir işıqlansın,
Sazın bir aşıqlansın.

Bir oğlan, bir qız gördün,
Bir ay, bir ulduz gördün.
Eşqin bir yada gəlsin,
Ağzın bir dada gəlsin.

Deyirdim itən yaxşı,
Cövüz kimi bitən yaxşı
Dünyanı dolanmışam,
Hər yerdən vətən yaxşı.

## MƏCNUN

Məcnun ilə mən məktəbi-eşq içrə oxurduq,
Mən Müshəfi xətm etdim, o, "Vəlleyli"də qaldı.
Bir gün də eşitdik ki, düşüb çöllərə Məcnun,
Vəlleyl olub virdi, cavankən də qocaldı.
Bir gün də xəbər gəldi ki, velleylisi ilə
Can verdi, cahan içrə yaman vəlvələ saldı.

## OYUN OLDUQ

İtimiz qurd olalı, biz də qayıtdıq qoyun olduq,
İt ilə qol-boyun olduq.
İt əlindən qayıdıb, qurda da bir zad boyun olduq,
İt ilə qol-boyun olduq.
Qurdumuz dişlərini hey qara daşlarda itiltdi,
Qoyunun da işi bitdi.
Son, soxuldu sürüyə, bir sürünü sökdü-dağıtdı,
Əkilib, it gedib itdi.
Biz də baxdıq it ilə qurd arasında oyun olduq.
İt ilə qol-boyun olduq.

## ÇABALIR ÜRƏK SİNƏMDƏ

Aynaya baxanda gördüm saqqalıma dən düşübdü,
Mən ki çox qocalmamışam, bilmirəm nədən düşübdü.
Hünər olsa ruh cavandır, hələ-hələ düşgün olmaz,
Ondakı gördün düşübsən, bu nəfir bədən düşübdü.
Oraya ki, sən gedirsən, quyular açıbdı ağzın,
Şeytanın toru yamandır, hər gəlib-gedən düşübdü.
Nə qədər başın salamat, əl-ayaq da başsız olmaz,
Ayağa dəmir düşəndə, başıva çədən düşübdü.
Quyudan ki, xəlqə qazdın, çıxa bilməsən səlamət,
Adam incidən bəlayə adamincidən düşübdü.
Çabalır ürək sinəmdə başı kəsilmiş toyuqtək,
Pilləni çıxanda gördüm sinə nəfədən düşübdü.
Sərçədən, siçandan artıq toru biz quranda düşməz,
Amma şir torun quranda fil, ya kərgədan düşübdü.
Şəhriyar Ədəndən ayrı, mirvari yetim qalanda
Yəməni-Cənubidən də baxasan Ədən düşübdü.

## QARABASDI HEKAYƏSİ

Dünən gecə cinlər qoşun çəkdilər,
Mən qorxudan cınqırığım çıxmadı.
Yorğan üstdən mənə sınx çəkdilər,

Mən də sırtıx, heç sırığım çıxmadı.
Birdən durub cırıqların çıxartdım,
Kimdi desin mən cırığım çıxmadı.

## AĞIZ YEMİŞİ

Bir gün ağız qalı boş,
Bir gün dolu dad olu,
Gün var ki, heç zad olmaz,
Gün var ki, hər zad olu.
Bəxtin dura, baxarsan,
Yadlar qohum-qardaşdı,
Amma bəxtin yatanda,
Qohum-qardaş yad olu.
Çalış adm gələndə
Rəhmət oxunsun sənə,
Dünyada səndən qalan
Axırda bir ad olu.
Gördün işin əyildi,
Durma, əkil, gözdən it,
Dostun görər darıxar,
Düşmən görər şad olu.

## YAR QASİDİ

Sən yarımın qasidisən,
Əylən, sənə çay demişəm.
Xəyalım göndəribdi
Bəski mən ax-vay demişəm.
Ax! Gecələr yatmamışam,
Mən sənə lay-lay demişəm.
Sən yatalı, mən gözümə
Ulduzları say demişəm.
Hər kəs sənə "ulduz" deyə,
Özüm sənə "ay" demişəm.
Səndən sora həyata mən

Şirindisə, zay demişəm.
Hər gözəldən bir gül alıb,
Sən gözələ pay demişəm.
Sənin gün tək batmağıvı
Ay balana tay demişəm.
İndi yaya qış deyirəm,
Sabiq qışa yay demişəm.
Gah toyuvu yada salıb,
Mən dəli nay-nay demişəm.
Sonra yenə yasa,batıb
Ağları hay-hay demişəm!
Ətək dolu dərya kimi,
Göz yaşıma çay demişəm.
Ömrə, sürən mən qaragün
Ax demişəm, vay demişəm!

## GÖZÜM AYDIN

Gözüm aydın, görürəm sevgili qardaşlarımı,
Basmışam bağrıma öz doğma qarındaşlarımı.
Açmışam qolları xəlqimlə üzük həlqəsi tək,
Salmışam həlqəyə qiymətli üzük qaşlarımı.
Fələkin çərxini sındırmışam əvvəl daşda,
Ətəyimdə hələ də saxlamışam daşlarımı.
Açmışam qəmimizin bağlı qalan yollarını,
Tapmışam yüz sənə qürbətdəki yoldaşlarımı.
Bu Süleymandı yanımda, görəsən, mən inanım?
Gah açıb, gah qıyıram gözlərimi, qaşlarımı.
Yığışın, şənlik edək, qəmimizin bayramıdır,
Sil gözümdən bu yüz ildən bəri göz yaşlarımı.
Yüz yaşım olsa da, olsun, yox üzümdə qırışım,
Cavanam, kim nə bilir, gizlədirəm yaşlarımı.
Qoçu qurbanlarımı kəsdi Vətən oynaşımız,
Qanımı xeyrat edərkən yedi bozbaşlarımı.
Ana oynaşım qeyrət gözü görsə, kor olur,
Mən nə gözlə görə billəm vətən oynaşlarımı.
Gedəlim Qafqaz uşaqlarını təclil edəlim,
Şəhriyarım, dara saqqallarımı, saşlarımı.

## CAN RUSTƏM

Bir xəbər çatdı mənə Nuhi-nəbi qarğışıtək,
İçərimdə biləsən qopdu nə tufan, Rüstəm.
Yandı bir ləhzədə, xərmən kimi arzum, ümidim.
Canım ol yanğıda yandıqca dedim: "Can Rüstəm".
Bəllidir - Rüstəm olan ağlamaz, amma oxlar
Sənə dəydikcə ürəklərdən axar qan, Rüstəm.
Həftxanlardan aşırsan, alısan div yarasın,
Qəmimiz qəhrəmanı, Rüstəmi-Dəstan, Rüstəm.
Nə qədər varsa bu dünyada Azərbaycan eli,
Şanlı Rüstəmlər üçündür şərəfii şan, Rüstəm.
Tilisim çay dərələrdə nə qoçaq salmışidin

Bir ümid körpüsü ki, yol sala karvan, Rüstəm.
Div yatarkən iki qardaş qonuşurduq gecələr,
O qonuş el qəminn dərdinə dərman, Rüstəm.
Divlər amma ayılıb duydular əhvalımızı,
Hələlik qaldı ümid körpüsü viran, Rüstəm.
Hizbi-şeytandan olan qoy səni ixrac eləsin,
Başda yazmış səni öz hizbinə rəhman, Rüstəm.
Qalmışam mən də bu tayda qolubağlı, asılı,
Səf çəkib qarşıda qəm, sanki verir san, Rüstəm.
Qardaşın qardaşilə bir görüşü, bir qonuşu
Qadağan olmada, bax zülmə nə tüğyan, Rüstəm.
Yetişib vədəsi həqqin, əmin ol, dəm dəmidir,
Açıla həqq qapısı, mat qala şeytan, Rüstəm.
Nəbi tək bizdə qılıc Rüstəmi çoxlar var imiş,
Sən qələm Rüstəmisən, can sənə qurban, Rüstəm.
Şəhriyar arzugöz oldu ki, Səhəndilə gələ
Bəxtiyar məclisinə, başda Süleyman Rüstəm.

## İNSANSAZ İNQİLABIMIZ

Burulur seltək inqilabımız,
Durulmaqdadır məncəlabımız.
Arıdır bizi, övsəyir bizi
Qərbilləyərək inqilabımız.

Bir ümmet olaq, boyaqlar getsin,
Nə qırmızımız, nə də abımız.
Mübarək olsun imam xəttimiz,
Sazişkarlardan ictinabımız.
Cıracaq hər cür nisbət naməni
İmam xəttinə intisabımız.
Mübarək olsun imam xəttində
Hər əyabımız, hər zəhabımız.
Casus yuvasın cavanlar aldı,
Mübarək olsun fəthi-babamız.
Qar-yağışsa da, Qüdsə çatarıq,
Fəthülfütuhdur qar-doşabımız.

Cəbhə - Kərbəla, Fəllahilərtək
Hüseynilərdir həmrikabımız.
Hizbi-cümhuri inficarında
Behiştilərtək Bu Türabrmız.
Məhərrəm gəlir, aşura gəlir,
Şölə çəkəcək iltihabımız.
Şəhid məhrabdır Əsədullahə,
Bizim saqimiz, qan - şərabımız.
Aşura bizim məktəbimizdir,
Qanla yazılmış bu kitabımız.
Ya Hüseyn, biz də Kərbəlamızda
Çox Əsğərimiz, çox Rübabımız.
O qatılı gözlə bir baxış, bəlkə
Azala bizim də əzabımız.
Vabəstəlikdən bəlkə qurtulaq,
Açıla qoldan bu tənabımız.
Xudkəfa olaq, öz ocağımız,
Öz ciyərimiz, öz kababımız.
Burda tikilə, burda toxuna
Öz başmagımız, öz corabımız.
Möhtəkir bilsin: baha satandan
Yağ-bal atmağa yoxdur qabımız.
Özümüz yenə sabun bişirrik,
Qoy heç olmasın fərzan-fabımız.
Hizbullah yolu dünbələndüzdür,

Müzməhil olsun kəc əhzabımız.
Bizim babımız müstəzəfindir,
Müstəkbər deyil bizim babımız.
Fərşin xabı tək sağ-sola yatmaz
Düzünə yatar bizim xabımız.
Bu yoxsullardan soruşanlara
Məhşərdə varmı bir cavabımız?
Bu gün Səddamın odundan qaçaq,
Allah oduna varmı tabımız?
İranın ərzi xaricə getməz,
İslamdır bizim ərziyabımız.
Mühasireyi-iqtisadini
Sındırar bizim etisabımız.
İmperializmə bac verənmərik,
Bağlanıb daha bu hesabımız.
Da bizdən ona rəiyyət çıxmaz,
Mötəmən olsun xan-ərbabımz.
Cavanlar! Cahad qolun çıtmayın,
Abad olacaq hər xarabımız.
Kampyüter də düzəldənməsək,
Kamil olacaq üstürlabımız.
Avarələri bağrıza basın,
Mühacir - ənsardır savabımız.
Döyünmə də var, söyünmə də var
Olacaq labüd iztirabımız.
Ayətüllahi-Mədəni kimi,
Gün batarsa da, var məhtabımız.
Ayətüllahi-Meşkini tək nur
Nuralar duayi-müstəcabmız.
İnsansaz məktəb hələ də durur,
"Gülüstan" kimi var "nəsab"ımız.
Molla Möhsüni Kaşi əsəri
Cənnət bağıtək var "Əbvab"ımız.
Münzəvi olmuş şairlərimiz,
Zəhirəddini-Fariyabımız.
Şəhriyar, qovza Heydərbabanı,
Qoy abad olsun Xoşginabımız.

**DƏRYA ELƏDİM**

Türki bir çeşmə isə, mən onu dərya elədim,

Bir soyuq mərəkəni məhşəri-kübra elədim.
Bir işıltıydı, Süha ulduzutək görsənməz,
Göz yaşımla mn onu üqdi-Sürəyya elədim.
Ümidim var ki bu dərya həl oğyanus ola,
Ona zamin bu zəminə ki, mühəyya elədim.
Ürfana çatmasa serü ədəb əbqa olmaz,

Mən də ürfanə çatıb, şerimi əbqa elədim.
Əbədiyyətlə yanasdım doğula Hafizə tay,
Şirazın şahçırağın Təbrizə əhda elədim.
Türkinin camm almışdı həyasız tağut,
Mən həyat aldım ona, heqq üçün əhya elədim.
Feyzi-Ruhülqüdüs oldu mədədim Hafiztək,
Mən də Hafiz kimi ecazi-Məsiha elədim.
Qəmə-qəddarələr ağzında dil olmusdu söyüş,
Mən səvinc etdim, xəncəri xurma elədim.
İndi göylərdə gözəl səflə, səfa ilə gəzir,
Məncəlablarda üzən ördəyi durna elədim.
Bax ki "Heydərbaba" əfsanətək olmuş bir Qaf,
Mən kiçik bir dağı sərmənzili-ənqa elədim.
Burda Rövşənzəmirin də hünərin yad edəlim,
Mən onun da qələmin tutiyi-quya elədim.
Nə tək İranda mənim vəlvələ salmış qələmim,
Bak ki Türkiyyədə, Qafqazda nə qövqa elədim.
Bax ki Tehranda nə Fərzanələr olmuş Valeh,
Bax ki Təbrizdə nə şairləri Şeyda elədim,
Həm "Səhəndiyyə" Səhəndin dağın etdi başuca,
Həm mən öz qardaşımın haqqını ifa elədim.
Acı dillərdə şirin türki olurdu hənzəl,
Mən şirin dillərə qatdım onu, halva elədim.
Hər nə qalmışdı keçənlərdən ona bal pəteyi,
Əridib mumlu balın şəhdi-müseffa elədim.
Türki, vallah, analar oxşağı, laylay dilidir,
Dərdimi mən bu dəva ilə müdava elədim,
Şəhriyar, heyf, sovuxdur bu dəyirman hələ də,
Dartmağa yoxdu dəni, mən də müdara elədim.

## "ƏSLİ-KƏRƏM" ŞERİNƏ BİR HAŞİYƏ

*Kərəm deyər: Mən bir səfil səyyadam,*
*Hər marala tor ataram, mar gəli.*
*Yar bağının bülbülləri oxuyur,*
*Bizim yurda siyrə də yox, sar gəli.*

***"Əsli-Karəm" dastanından***

Evdə bir il ah çəkərəm, xəbər yox,
Evdən çıxam mən o yana, yar gəli.
Tay-tuşlarım çölə çıxa, gün çıxar,
Mən çıxanda yağış getsə, qar gəli.
Yazıq quzum! Aclığa döz, darıxma,
Bu gün-sabah bahar gəli, bar gəli.

Bizə gələ-gəlməyə bir kal iydə,
Qonşumuza heyva gəli, nar gəli.
Xan evinə şir gələ, quyruq bular,
Bizim evə kor it gələ, har gəli.
Xəlqə qonax gəli gözü sürməli,
Bizim evdən kor getməmiş, kar gəli.

Bəxtimə arvad nə çıxa, bilmirəm.,
Bəllidir ki, sərsağa sovsar gəli.
Bir "üç ətək" əndazədir əynimə.
"Salisburi" gen gəlməsə, dar gəli.
Dövlətliyə yas da gələ oynayar,
Biz kasıba toy gələ, axsar gəli.

Qəm yükündən kəndxudanın hissəsi
Xərdal olu, bizimki xalvar gəli.
Kənddə bizi döyüllə, bir havar yox,
Biz bir kəlmə haqq danışaq, car gəli.
Darğa şayırtlar bizə sərkər çrxar,
Dar dibindən qurtula, sərdar gəli.
Bundan belə özgə görəm özgədən
Minnət çəkir, qeyrət mənə ar gəli.
İşçi, toyuq kəsəndə mən baxanmam,
Bilməm necə ürəyindən var gəli?
Qəmdən mənim bir eynək var gözümdə,
İşıq-aydın gün gözümə tar gəli.

Eşqim düşüb yadıma, gözlər daşar,
Baharda sel atlanı - çaylar gəli.
Çox şairin təbi donar buz kimi,
Şəhriyarın şeri də qaynar gəli.

## SABİRİN XORUZU

Sübh xəyalilə xoruzlandı kənd,
Mən də Hopop tək bir ağız banladım.
Qalmadı salim mənə də qol-qanad,
Banlamağın mən də dadın anladım.

Cücələrim gəlmədilər bağrıma,
Ağrımı aldım yanıma, yanladım.
Bax, necə heyvan eləyirlər məni?
Mən necə bu heyvanı insanladım?

Aqil olub əql məni danladı,
Aşiq olub mən də onu danladım.
"Əl atıb Allah ətəyin tut" - dedi,
Gör necə müşgülləri asanladım.
Tehranı Dəccal mənə Təbrizlədi,
Mən də gəlib Təbrizi Tehranladım!

Qapqara zülmət gecəni sızlayıb
Sübhə qədər sursatı sahmanladım.
Xalqı oyatdım bu sınıq qətb ilə -
Allaha şeytanları şeytanladım.
Küfr, müsəlmanları kafirlədi,
Mən də dedim: -Küfrü müsəlmanladım.

Şükr ola, mən istəmişəm zülmdən
Bir para zalımları peşmanladım.
Bax ki, xoruztək açılanda səhər,
Mən də acıq səslə qoçaq banladım.

## ALLAH VƏDƏSİ

Qoy bu inqilab sel kimi axsın,
Göy guruldasın, ildırım şaxsın.
Müstəzəfin qoy, haqqa çatarkən,
İslam baydağın dağlara taxsın.
Məzlumun ahı qoy alov çəkib
Zülmü rişədən yandırıb-yaxsın.
Allah süfrəsi açıq olarmı? –
Bir iddə yesin, bir iddə baxsın?!

## İNS VƏ CİN

Bar ilahi! Sən bizə ver bu şəyatinidən nicat,
İnsanın nəslin kəsib, ver insə bu cindən nicat.
Bizdən ancaq bir qalırsa, şeytan artıb min doğub,
Hansı röyada görüm mən, bir tapa mindən nicat?
Beş min ildir bu səlatinə giriftar olmuşuq,
Din də gəldi, tapmadıq biz bu slatmdən nicat.
Bir yalançı din də olmuş şeytanın bir möhrəsi,
Doğru bir din ver bizə, ver bu yalan dindən nicat.
Hər dua şeytan edər, dünya ona "Amin" deyər,
Qoy dua qalsın, bizə ver sən bu "Amin"dən nicat.
Ərsini təndirlərin guvduşlarında oynayır,
Kimdi bu guvduşlara versin bu ərsindən nicat?
Ya kərəm qıl, kinli şeytanın əlindən al bizi,
Ya ki, şeytanın özün ver bircə bu kindən nicat.
Öldürür xəlqi, sora xətmin tutub, yasin oxur,
Bar ilahi, xəlqə ver bu hoqqa yasindən nicat.
Şurəvidən də nicat umduq ki, bir xeyr olmadı,
Olmasa çay sandığında çay, gələ Çindən nicat.
Mən toyuq tək öz hinimdə dustağam illər boyu
Bir xoruz yolla, tapam mən bəlkə bu nindən nicat.
Şəhriyarın da əzizim, bir tutarlı ahı var,
Düşməni Əhrimən olsun, tapmaz ahindən nicat.

## QAFQAZLI QARDAŞLARLA GÖRÜŞ

Ey səfasın unutmayan Qafqaz,
Gəlmişəm zövq alam marağından.
Qeyrəti coşğun olmayan nə bilər,
Ki nələr çəkmişəm fərağından.

Qoy gəlim bir qucaqlaşıb öpüşək,
Bir çəkək ruzigar əlindən dad.
Tanrının şükr edək cəlalına ki,
Bu qədərlikcə olmuşuq azad.

Oxuruq biz sizin təranələri,
Yadigar ömürlərdən, illərdən,
Bakının söz-soyu, hekayələri
Düşməz illər durunca dillərdən.

Sazımın qəmli simlərində mənim
Bakının başqa bir təranəsi var.
Sinəmin xərabəsində dərin,
Bu cəvahirlərin xəzanəsi var.

Mən sizin şanlı qəhrəmanlarızı
Sözlərimdə həmişə yad edərəm.
Zülmə qarşı qılınc sözüm kəskin,
Qəhrəmanlar kimi cəhad edərəm.

Sən kimi qardaş öz qardaşını
Atmayıb, özgə kimsə tutmayacaq.
Qoca Təbriz də yüz min il keçsə,
Bakı qardaşların unutmayacaq.

Gün o gündür ki, həq yolun düzlər,
Onda biz də düzü-düzə qoşarıq.
Ayıranmaz o gün bizi şəmşir,
Əbədi vəsl üçün qucaqlaşırıq.
Rahimin, Rüstəmin əlin sıxmaq,
Mənə dünya boyunca izzəti var.

Qocalıqda bu izzəti tapmaq
Bir cavanlıq qərərcə ləzzəti var.

Dilimiz, qanımız bir otduqda
Qırmaq olmaz bu əhdü-peymanı.
Xəlq ilə ehdi möhkəm etdikdə
Boşlaya bilmərik bu imanı.

Gəlmişik doğma yurdumıız Bakıya,
Qoy bu tarixdə iftixar olsun.
Şəhriyardan da bu üfiiqlərdə
Bu sınıq nəğmə yadigar olsun.

## QƏMLƏ ATIŞ-BARIŞ

Qəmə dedim: Haçanatək bizi bezikdirəcaqsan?
Dedi: Siyir, budu gəldim! Dedim ki, si...dirəcaqsan!
Dedi: Palan kimi tikdirmişəm qalın sənə bir çul,
Dedim ki, eşşək özünsən, tikmə, sökdürəcaqsan,
Dedi: Dübürdüvə de qoşmuşam hovia, xəbərin yox,
Dedim: Hovlanı qoşandan sora nə əkdiəcaqsan?
Dedi ki: Çor tapşırdım gələ, dedim: Neçə misqal?
Dedi: Nece neçə misqal? Qapanda çəkdirəcaqsan!
Dəvə gəlib çuri çatmış, qapında istiri çöksün,
Dedim ki: al dəvəni öz qapunda çökdürəcaqsan.
Dedi: qanın tökərəm, hər kim oldu hizbi-ədalət,
Dedim ki: Hizbi-zəlalət qanın da tökdürəcaqsan?
Dedi: Samavərə də neftimiz tükəndi, da sən də
Qaz üste "Kitri"de çay dəmləyib birikdirəcaqsan.
Dedim: Qayış yaxama tikmə, al qutar bu canı get!
Dedi: Hələ neçə bayram donun da tikdirəcaqsan.
Abı mahutlan bəzzaz kəsəndə, dərzi biçəndə -
Gözəlcə tikdirib ağ buxçalarda bükdürəcaqsan.
Darıxma! Gəl barışaq! Qışların çıxıb-çıxarında,
Mişovda kəhliyi qarda qovub hənikdirəcaqsan.
Hələ qocalmamısan, qoy sənə ərus gələ, damad,
Fərihləri hələ kəhlik sayağı səkdirəcaqsan.

# YALAN DÜNYA

*Bu dünya fanidir, fani,*
*Bu dünyada qalan hanı?*
*Davud oğlu Süleymanı*
*Təxt üstündən salan dünya.*

***Xəstə Qasım***

Sənin bəhrən yeyən kimdir?
Kiminkisən? Yeyən kimdir?
Sənə doğru deyən kimdir?
"Yalan dünya, yalan dünya!"

Səni fərzanələr atdı,
Qapıb divanələr tutdu,
Kimi aldı, kimi satdı,
Satan dünya, alan dünya,

Atı əzəl dağa saldıq,
Yorulduqca dalı qaldıq.
Atı satdıq, ulaq aldıq,
Yəhər oldu palan, dünya.

Çatıb səndən keçən keçdi,
Əcəl camın içən keçdi,
Olan-oldu, keçən-keçdi,
Nə istirdin alan dünya.

Boğulaydın doğan yerdə,
Doğub, xalqı boğan yerdə,
Oğul nəşin oğan yerdə
Ana zülfün yolan dünya.

Qazanıb, hey talanıbsan,
Qalanıb hey calanıbsan,
Əzəldən çalxalanıbsan,
Yenə də çalxalan, dünya!

Nənə qarnı ilk beşiyin,
Qəbristanlıq sən deşiyin.
Nə içərin, nə eşiyin,
Qaranlıq bir daları dünya.

Səni bayquşlar alqışlar,
Dəli viranəni xoşlar.
Dolan əqlə səni boşlar,
İçi boşla dolan dünya.

Sənə Qarunlar allandı,
Qızıldan təlli qallandı,
Batıb zülmatə quylandı,
Ölüb təlli qalan dünya.

Ocaq ikən sönəymişsən,
Çanaq ikən çönəymişsən,
Nə pis qan nənəymişsən
Nağıl! Yalan-palan dünya.

Biri ayna, biri pasdır,
Biri aydın, biri kasdır,
Gecə toydur, səhər yasdır,
Gül içində solan dünya.

İgidlərin başın yeyən,
Qocalar bozbaşın yeyən,
Qəbirlərin daşın yeyən,
Özü yenə qalan dünya!

Nə qandın, kim gül əkəndir?
Kim qılınc tək qan tökəndir?
Teymur hələ kürəkəndir,
Çingiz canın alan dünya.

Yaman qurğu, yığılaydın!
Tufanlarda boğulaydın!
Noleydi bir dağılaydın,
Bizi derdə salan dünya.

## SÜLEYMAN RUSTƏMƏ

*İkinci məktub*

Demədin sözümə niyə ağladın?
Söz ki sən söylədin, mənə saz oldu.
O söze ağlayan tək mən deyiləm,
Siz çalan sazlara aləm baz oldu.

Bir gecə daradı ahım qəfəsi,
Ah çəkib Araza saldım nəfəsi,
O taydan səslədin, aldım o səsi,
Onda qış çevrilib mənə yaz oldu.

Xızr ilə istədim aşnalıq salım,
Qismətim yar olsa, əbədi qalım,
Yeni ki, o hüsnün mətahın alım,
Can nəqdin sanadım, gördüm az oldu.

*İsfənd, 1348*

## SAZLI ŞAİRİMİZ SAFİ RUHUNA TƏQDİM

Sızıldar sinemin sazı "Dəraməd" eylərəm "Şuri",
"Çobanım" sən də "Səlmək"lə sızıldat tari-tənburi.
"Hüseyni" kəkilin "Üzari" getdi, nəzmi olmuş kəsr,
Çağır "Şahnaz"mı, mənzum edək bu şeri-mənsuri.
"Şikəstə" qəddi "Azərbaycan" "Dilkəş"lə qılsın "Rast",
"Əraqi" - "Rak"dən endir firuzda bağla "Mahur"i.

Çal ol "Cargah"də “Zabil”, "Müxalif varsa "Məğlub" et,
"Hasar" içrə darıxdım, qoy dara çəksinlə "Mənsur"i.
Sazunda simlərin ol tar zülfün tək olub nacur,
Daraq, mizrabə cövr et, bəlkə cövr etsin bu nacuri.
Sızıldat "Dəşti" və "Sarəng" - "Türk əfşarini" neydə,
"Bəyati-kürd"ü çal, son "İsfəhan" kök eylə sənturi.

"Rəhab" ilə "Nəva"dən pəncə qoy "Rast pəncgah" üstə,
"Mərkəb xan" edir məhdur, qoy İsrafil çala suri.
"Qarabağım" çıxıb əldən "Segahım" qoy "Yetim" olsun,
İgidlər yurdusa, bir gün guruldar təbli-şeypuri.
"Humayun" dəstgah olsan sazında, Şəhriyar, yad et
Ki, millət şairi Safi bizə yazmış bu dəsturi.

## İMAN İLƏ GETDİ

Yığdı xeyrü bərəkət süfrəsin, ehsan ilə getdi,
Əmn-amanlıq da yükün bağladı, aman ilə getdi.
Bəy-xan olmasa, - deyərdik, - olacaq kəndimiz abad,
O xarab kət də vəlakin elə bəy-xan ilə getdi.
Silu dair olalı hər nə dəyirman yığışıldı.
Amma xalis-təmiz unlar da dəyirman ilə getdi.
Müstəbid sultanı saldıq ki, ola xəlqimiz azad,
Sonra baxdıq ki, azadlıq da o sultan ilə getdi.
Bir "bəli, qurban!" olub indi bizə min "bəli, qurban",
Amma "xələt verən" o bir "bəli qurban" ilə getdi.
Düz müsəlmanə deyirdik: qulağı tüklüdü bədbəxt,
İndi bax, gör ki, o düzlük də müsəlman ilə getdi.
Vermə, - Sabir dedi, - o dolma-fisincanı axunda,
Ağzımızdan da dad ol dolma-fisincan ilə getdi.
Dedi - insanımız azdır, hamı insan gərək olsun,
Amma insanlığımız da o az insan ilə getdi.
Bu qədər dəftərü əsnad ilə bir haqqa çatan yox,
Haqq verənlər pitigi Mirzə Qələmdan ilə getdi.
Bizdə bir din qala bilmişdi miras, bir də bu İran,
Din gedəndə dedi: "Tək getmərəm!" İran ilə getdi.
Yorğanı oğru qapanda dedi Molla Nəsrəddin:

- Neyləsin, çıplaq idi, oğru da yorğan ilə getdi.
İstədik qanla yuyaq ölkəmizin ləkksin, amma
Ölkəmiz xalis özü ləkkə olub qan ilə getdi.
Hava insanı boğur baş-başa "qaz-karbonik" olmuş,
Yel də əsmir, elə bil, yel də səliman ilə getdi.

Su Kərəcdən xlor ilə gəli bu paslı dəmirdə,
Görəsən "Şah suyu" tək çeşmə nə ünvanilə getdi?
Türki olmuş qadağan, divanımızdan da xəbər yox,
Şəhriyarın dili də "vay!" deyə divan ilə getdi.

## HƏKİMƏ CAN

Sən vətəndən sarı qəlbin döyünürsə, maralım,
Vətənin də maralından sarı qəlbi döyünür.

Yətəni bağruva bassan söyünərsən yenə sən,
Ki vətən də balasın bağrına bassa söyünür.

Mənim eşqim ucalıb, qürbət olub dünya mənə,
Dost duyanmır döyünür, düşmən duyanmır, öyünür.

*Təbriz, Abanmah, 136.*

## *QƏZƏLLƏR*

### GECƏ XUMARI

Yuxuma dun gecə bir laləüzar gəlmiş idi,
Gənc ikən sevdiyim o incə nigar gəlmiş idi.

Ey könül gülşəni, tufanlı zamanın keçmiş,
Yasəmənli çəmənə tazə bahar gəlmiş idi.

Meh əsib rəqsə gətirmişdi çəmən susənini,
Gül gülür, bülbül o gün gülşənə yar gəlmiş idi.

Eşidirdim fələyin mən əbədi nəğməsini,
Mehri-çöhrəmdə mənim xəndə nisar gəlmiş idi.

Fərhadın tişəsi əfsanə deyib Şirindən,
Xosrovun qarşısına orda şikar geəmiş idi.

Sərvi-nazım mənə bir an da yaxın düşmədi heç
Qol-budaq atmış idi, üstünə bar gəlmiş idi.

İstədim bir də tutum mən, ətəyindən yapışım,
Yolum üstə mənim o sevgili yar gəlmiş idi,

Çox çağırdım mən uzaqdan, səməri olmadı heç,
Qaçdı ahu kimi yar, yer ona dar gəlmiş idi.

Göz açıb gördüm o gənclik səhərindən yox əsər,
Qocalıq gündüzü axşam kimi tar gəlmiş idi.

Məstliyin dadlığı çöhrəmdə görünmürdü daha,
Ağrı sarmış başımı, dərdli xumar gəlmiş idi.

Ah! Əfsunkar ömür, həsrətə bənzər kimidir,
Kimsə bilməz ki, neçün aləmə xar gəlmiş idi.

Şəhriyar yazdı bu şux incə pərişan qəzəli,
Çünki yar zülfü tək aləm ona tar gəlmiş idi.

## ƏHDİNİ QIRAN SƏNƏM

Ay üzlü qırdı cəfa ilə əhdi-söhbətimi,
Qərəzlə çırpdı daşa şişeyi-məhəbbətimi.

Görüb o qönçə dodaqlı çətin həyat sürürəm,
Bəyənmədi belə ağır keçən məişətimi.

Könüldə kimsəyə kin bəsləməzdim, ah, konlüm,
Edibsə ayinə tək aydın hər küdurətimi.

Zəlalətin yoluna qoymayın düşüm məni siz,
Təmiz ürəkli hanı, eyləsin dəlalətimi.

Nə istəsə ürəyin, razılıq verər bu könül,
Ya istə izzətimi sən mənim, ya zillətimi.

O sərvi-nazi-nəhalın ola həmişə uca
Ki, sayəsində onun tapdım istirahətimi.

Ona məlamət əgər eyləsəm bu aləmdə,
Rəvadı cümlə-cahanın çəkim məlamətini.

Nə əmri olsa itaətdi borcum hər yerdə,
Gərək qəbul edə ancaq o da itaətimi.

Niyaz ilə baş əyib dərgəhi-xudavəndə,
Onunla mən görürəm cümlə rənci-möhnətimi.

Gileyli olmamışam mən kərəmlə feyzindən,
Yetər, verib mənə təbi-səfayi-niyyətimi.

Çəkilməsəm yox əcəb bir kənara üzlətdən,
Yetib səadətə könlüm, atıb o üzlətini.

Həqir külbəm olub aşiyah vəfaya mənim,
Salıbdı üstümə kölgə humayi-himmətini.

Səzadı dövləti azadlığın həmişə ona
Ki, Şəhriyar sanır azadələr rəiyyətini.

## CƏNNƏT QUŞU

Mənimlə bir gecə, aydan gözəl yarım, səhər etdin,
Günəştək aşiyanımdan səhər vaxtı səfər etdin.

Gəlir ətrin şəbistani-vəfadan indi də hər an,
Gecə şamtək ətir saçdın, mənim ilə səhər etdin.

Səfa verdin bu dərvişə, olum kuyində mən qurban,
Böyük sultan idin dərvişə, canan, xoş nəzər etdin.

İki quş tək qucaqlaşdıq, məhəbbətlə, fəqət əfsus,
Humayım, sən səhər uçdun, məni bibalü pər etdin.

Uçub göylərdə sən seyr eyləyirkən bir kiçik quşdun,
Neçin torpaqdakı zindan yuvama sən güzar etdin?

Mənə munis baxışlarla baxıb bir başqa tədbir tök,
Mənim bünyadımı baxmaqla son zirü zəbər etdin.

Gözün yadilə vəhşi laləyə mən munis olmuşdum,
Qəzalım dağlara saldm, işimi qəm-kədər etdin.

Səmavi gözlərinlə ilk görüşdə bir dəfə baxdın,
Mənə eşqin cahanında nə vardırsa xəbər etdin.

Anamçın ağlaram hər an onu mən yada saldıqca,
Ata yurdundan, ay canan, bu tifil dərbədər etdin.

Alıb Leyli sorağını tozundan karivanın mən,
Məni Məcnun kimi tozlar içində bisipər etdin.

Nə atəşpara idin könlümün iksiri, şimşəklə
Paxır tutmuş misi sən döndərib bir anda zər etdin.

Bütün aləmdə indi, Şəhriyar, şerin sevilmişdir,
Olub şeyda qocaldıqca, sözünlə çox hünər etdin.

## AŞİQİN GİLEYİ

Sənin hicrində elə yandı könül, can, sorma,
Məni bir atəşə yaxmış ki, bu hicran, sorma.

Giley etdikdə sənə, üz çeviribsən məndən,
Gileyim var nə qədər səndən, a canan, sorma.

Oldu Kənan ayı Misrin o gözəl taxtı sənin,
Qismətim oldu mənim külbeyi-əhzan, sorma.

Sərvi-nazım, belə naz ilə çəkilsən, getsən,
Çəkmərəm əl ətəyindən sənin asan, sorma.

Eşq dəryası mənə sahili göstərdi əzəl,
Ömrümü verdi yelə sonra bu tufan, sorma.

Düz deyib əql ki, mən sığmaz idim bir qabığa,
Sındırıb qəlbimi ol püsteyi-xəndan, sorma.

Bu səsi ləli-ləbin mancə halaldır, gözəlim,
Gül dodağındı sənin dərdlərə dərman, sorma.

Göyə pərvaz eləmək şövqü gəlibdir səndən,
Boyuna olmuş o bir sərvi-xuraman, sorma.

Eşq dəftərçəsinin xətti olur şövqi-ümid,
Qəm-kədərlə ona gəlmişsə də payan, sorma.

Şəhriyar, gəz bu qara telli gözəllərdən uzaq,
Eşqdən oldu könül öylə pərişan, sorma.

## MƏHƏBBƏTƏ GƏLMİŞ AYÜZLÜ

Nə oldu ki, yenə də yadi-aşina etdin?
Yaxınlıq eyləməyin əhdini bina etdin.

Küsüb həmişə cəfa eyləmək şüarın idi,
Nə oldu, mehrə gəlib sən bizə vəfa etdin?

Mənə cəfa eləyəndə, sənə vəfalı idim,
Görəndə mehri-vəfa, sən yenə cəfa etdin.

Gəl, ey gözəl, mənə namehribanlıq etsən də,
Səfa gətirmək ilə məclisi səfa etdin.

O gözlərin ki baxır naz ilə, gözəl canan,
Sənə deyən tapılarmı nə macəra etdin?

O sərvi-qamət ilə, sərvinaz zülfün ilə
Əyib mənim belimi, halımı fəna etdin.

Mən ahu gözlərinə canımı desən, verrəm,
Sən isə, ahu gözəl, xəttimi xəta etdin.

Əgər cahanın işi keçməsə muradım ilə,
Gələndə sən bizi şadlıqla aşina etdin.

Mənim bu canıma min dərd göndərib, canan,
Gələndə dərdlərimə ən gözəl dəva etdin.

Xəzinədan sən oldun mənim qəzəllərimin,
Bu Şəhriyarı - könül şahmı gəda etdin.

## HİDAYƏT ÇIRAĞI

Yatıbdı fitnə, itirmə bu fürsəti, ey dost,
Çatıbdı növbə, edək ünsü ülfəti, ey dost

İtirmə fürsəti, olsan fərasət əhli əgər,
Ki, fitnə məhv eləyir bir də fürsəti, ey dost.

Ürəkdən indi gülə, sərvə, laləyə yanıram,
Təbiətin bağı görmüş çox afəti, ey dost.

Təəssüf eyləməyirsən məgər gedənlər üçün?
Bilək biz indi qənimət bu söhbəti, ey dost.

Cahan tikanlığının varsa bir ətirli gülü,
Odur məhəbbət! Əziz tut məhəbbəti, ey dost.

Deyəndə düşmən əgər, bağla dostunun əlini,
Uyub ona gəl itirmə mürüvvəti, ey dost.

Fələk həmişə biriyçin edirmi dövr məgər,
Dəyirmanunda onun vardı növbəti, ey dost.

Verir qəzanın əli bizlərə gülü, tikanı,
Görək nədir qədərin indi qisməti, ey dost.

Xəzanı seyr elə bir, gör o xatiratı açan
Əcəb açıbdı bu gün lövhi-ibrəti, ey dost.

Cahanın işlərini bilmək istəyirsən əgər,
Dal indi seyrə xəzani-təbiəti, ey dost.

Tutubdu qəlbi, gözü qəflət uyqusu necə gör,
Oyaqların gözü görmür həqiqəti, ey dost.

Qüsuru varmıdı bəxtin, yox isə himmətimiz?
Kömək edər bizə bəxt görsə himməti, ey dost.

Mənim dediklərimə hüsni-rəğbətin olmuş,
Həmişə dinləmisən, dinlə söhbəti, ey dost.

Cavana xeyri olar, söhbət eyləsə qocalar,
Eşit sənə dediyim bu nəsihəti, ey dost.

Düşüb qabaqda gedir Şəhriyar, elində çıraq,
Yanr hidayətinin nuru zülməti, ey dost.

## TUFAN ŞAMI

Uzun illərdi könül şam kimi odlarda yanır,
Eşqi pərvanədən öyrənmiş o, əyləncə sanır.

Hanı nur çeşməsi, ey zülmətə dönmüş gecələr!
Canım atəşlər içində necə gör qarsalanır.

Dikmişəm göz üzünə, sanma təəccüblü bunu,
Könül uymur iki dünyaya, o müjganı anır.

Heç zaman sönməyəcək atəşimiz, çox itidir,
Güclü tufan kimi göz yaşlarımız dalğalanır!

Səpir ətrafına göz yaşlarımı, sevgili yar!
Gör könül qanı ilə gözdə neç dürr yaranır!

Zülfünü bir yana çəksəm, görünər ay tək üzün,
Bu hünər badi-səbadəndi bu eldə dolanır.

Qəlbimin Yusifi ki, olmuş əsiri qəminin,
Verməərəm mən iki dünyaya bunu, yar inanır.

Şəhriyar, köhnə hərifdir bu fələk, mən uşağam,
Könlümü şahmat edib gör necə əyləncə sanır.

## QƏDİM ƏHDİ-PEYMAN

Hanı ol əhdi-qədim, haradadır ol yari-nədim,
Döndü könlüm qana, düşdükcə yada əhdi-qədim.

Hanı qəlbi cana peyvənd eləyən türrə, daha
Qoymayır oxşamağa qəlbimizi incə nəsim.

Bir açıq əl kimi könlümdə səxavət var ikən,
Onu dargöz kimi, yarəb, nə rəva təng eləyim.

Yada düşdükcə uşaqlıq, atamın qayğısı, ah!
Tökülür göz yaşı, sinəmdə olur dürri-yetim.

O keçən xatirələr qaldı vətən tək çox uzaq,
Onları üfqə edir şami-qəriban tərsim.

Yarəb! Ahu kimi cananları ya sülhə gətir,
Ya gəl ariflərə vermə bu qədər zövqi-səlim.

Simuzər oldu məhək gövhəri mərd insan üçün,
Görüm olsun üzünüz qarə sizin, zər ilə sim.

Dərd deyilmi ki, ola çaqqala bir aslan əsir?
Ya ki, möhtac ola bir alçağa bir şəxsi-kərim.

Bülbülün qarğa nə layiqdir ola həmnəfəsi,
Ruha naəhlin ola söhbəti bir dərdi-əlim.

Boynumu əymərəm heç varlıların nemətinə,
Himmətim çoxdu qənaətlə bu dünyada mənim.

Tanrı! Göz dikmişəm aləmdə sənin lütfünə mən,
Hər bəla gəlsə mənə, qəlbimi etdim təslim.

Ey nigarım, nə qüsur varsa, səbəbkarı bizik,
Yaman iş görməyə qoymaz o xudavəndi-həkim.

Şəhriyar, dostun olub qəm nə zamandan bəridir,
Xoş olur qəlbə, əgər söhbət edə yari-qədim.

## KƏC BƏXT

Nəzərim onda ki ol türreyi-tərrarə düşər,
Bu məhəbbətzədə könlün güzəri darə düşər.

Güzərin düşdü, gülüm, indi də bazarə tərəf,
Qorxuram razi-nihanım da bu bazarə düşər.

O qara zulfünü qoyma tuta ay tək üzünü,
Əfi tək kölgə salar, ay üzünə qarə düşər.

Tari-zülfünlə o mehrab qaşun görsə əgər,
Həvəsi söylə kimin kilsəyə, zünnarə düşər?

Kim səri-zülfünə uymuşsa, bilir halımızı,
Dərdlinin dərdini çəkmək yenə qəmxarə düşər.

Şəmə pərvanənin, əlbəttə, olur söhbəti xoş,
Dərd olar onda ki, yar söhbəti əğyarə düşər.

Kuyinə düşsə güzarım, gözəlim, incimə gəl,
Gülün hər yerdə bilirsən, ətəyi xarə düşər.

Saqinin nərgisinin məsti olub məclisimiz,
Şəhriyar, burda utanmaq yazıq huşyarə düşər.

## DƏLİ PƏRİ

O göyərçin ki, vəfa dağına düşmür səfəri,
İtdi gözdən nə yazıq, bir de görünmür o pəri.

Yenə röyada pəri zülfünü görməkdi peşəm,
Andırır görkəmim indi yenə divanələri.

Bəlkə bir də yetişəm xaki-səri-kuyinə mən,
Bir nəsimi-səhərəm, eşqin olub dərbədəri.

Quş kimi könlüm əsir oldu qəfəsdə necə gör,
Yaxdı gül fəsli bu həsrət, nə edim balü-pəri.

Yad edib gül üzünü, şəbnəmi axdı gözümün,
Çəmənə axdı yaşım islada gülbərgi-təri.

Ahu gözlü gözəlim açdı yenə tellərini,
Saçlarından yerə saldı qana dönmüş ciyəri.

Bir xəbər tutmadım ömrüm nə zaman keçdi mənim,
Ah! Ömür getsə, daha gəlməz onun bir xəbəri.

Məni bihuş elədi dün bu könül nalələri,
Bülbülün naləsi ilə duya bildim səhəri,

Haləyəm ay kimi dövrəndə sənin, ay gözəlim!
Görmürəm əmni-aman mən yenə dövri-qəməri.

Əyilən təkcə mənəm sanma fərağmda sənin,
Əyilir dağ belə hicrində, öpür sanki yeri.

Xeyr ola yadi o tiflin ki, yeni dərsə gedir,
Keçib elmi-ədəbinlə neçə sahibnəzəri.

Məndən aldınsa məhəbbət ilə sevda dərsi,
Oldun ustad könül qırmağa sən, nazlı pəri.

Bəslədim göz yaşı gözlərdə mən övlad yerinə,
Axdı göz yaşları, yaxdı məni həsrət kədəri.

Həmdəm etdim özümə indi də tənhalığı mən,
Tək qalanda dedim insanın olur çox hünəri.

Sərvi-azad kimi göylərə yüksəldi başım,
Oldu barsızlığın, əlbət, mənə bir çox səməri.

Şəhriyar! Atdı səni, getdi o nazəndə pəri,
Kin atar eşqə düşən sən kimi divanələri?!

## QƏZAL VƏ QƏZƏL

Bu gecə badə ilə dəfi-məlal eyləmişəm,
Ömrümün bir gecəsində belə hal eyləmişəm.

Biz hara? Tar hara, yarəb, gecə meyxanə hara?
Unudub dərdi bu əyyamda məcal eyləmişəm.

Saqinin qəmzəsi ox, mey camı olmuş sipərim,
Fələyin cövrü ilə cəngi-cidal eyləmişəm.

Mey dəmir tək eləyib canımı, qəmlə vuruşum,
Qəm demə, düşmənimi Rüstəmi-Zal eyləmişəm.

Acı əyyamı şirin etməyə sərxoş dolanıb,
Könlümü indi əsiri-xətü xal eyləmişəm.

Görmüşəm mən üzünün yarısını, tək qaşmı,
Ay üzündə necə gör seyri-hilal eyləmişəm.

Getmiş hicran orucu görcək hilal qaşlarını,
Bayram olmuş bu görüş, əzmi-vüsal eyləmişəm.

Görmüşəm üzdə o zərrin teli pərvanə kimi,
Yanmışam odlara, tərki-pərü bal eyləmişəm.

Eşq dərsi mənə öyrətsə də hicran qəmini,
Eşqə düşməklə belə kəsbi-kəmal eyləmişəm.

Yatmayıb sübhə kimi mən gecə, günüzlü yarın,
Sinəsi güzgüm olub, seyri-cəmal eyləmişəm.

Saqinin zülfunə eşq bağlamasa ömrü əgər,
Mən belə dərk eləyib, böylə xəyal eyləmişəm.

Şəhriyari-qəzəl etmiş məni ceyran, gözəlim,
Gör qəzəl ilə necə seydi-qəzal eyləmişəm.

## EŞQİN MEŞƏSİ

Elə əsiri-qəmi-möhnəti-məlal oldum,
Xəyal tərkin edib, canlı bir xəyal oldum.

Çəkil ki, ləşgəri-hicran mənə edəndə hücum,
Uzatmadm əlini, yerdə payimal oldum.

Sənin meşəndə məni eşq bəbri məhv etdi,
Uşaq kimi mən də əsiri o xəttü-xal oldum.

Vüsal qəsrinə şövq ilə eylədim pərvaz,
Qanadlarım sınıb, indi şikəstəhal oldum.

Mən eşqin ormanına gəldim, əldə oxla kaman,
O şir baxışlarının seydinə qəzal oldum.

Rəqibin elləri dəydi sənin ipək telinə,
Cəmiyyət içrə bilirsən nə halbahal oldum.

Sənə şikayət üçün min sözüm var idi, fəqət,
Dilim tutuldu görəndə o hüsnü, lal oldum.

Ayüzlüm, ayrılığından sənin bir il keçmir,
Qocaltdı hicr məni, həsrəti-vüsal oldum.

Havayi-zülfün əyib qəddimi, əritdi təni,
O qaşların kimi, ay dilbərim, hilal oldum.

Gəlirmi xatirinə Şəhriyar, dedim. Susdu.
Sualım ilə mən öz ömrümə zəval oldum.

## HAFİZ ƏBƏDİDİR

Nə qədər meykədədən yerdə nişan olmalıdır,
Qaşının tağı mənə qibleyi-can olmalıdır.

Qədəhin naləsini dərk eləməz sərxoş olan,
Arifə dərdlilərin dərdi əyan olmalıdır.

Dolmamış torpaq hələ gözlərimin kasəsinə,
Bir gözəl görməyə hər an nigaran olmalıdır.

Nə qədər qalsa cahan, qalsa məhəbbətdən əsər,
Hafizin şeri də dillərdə bəyan olmalıdır.

Kim xərabatə gedib içməsə dirlik suyunu,
Olsa cənnət gülü bağında, xəzan olmalıdır.

Hafizin şeri günəş çeşməsidir, yoxdu sonu,
Əbədi feyz ilə bu çeşmə rəvan olmalıdır.

Dinlədim piri-xərabatımızın sözlərini,
Ruhum hər an belə söhbətlə cavan olmalıdır.

Nə qədər ki fələyin göydə yanan ulduzu var,
Parlayıb ay gecələr, nuru əyan olmalıdır.

Zülfünün xatirəsilə elə bağlandı könül,
Nə qədər sağdı canım, mişkfəşan olmalıdır.

Girdi zülmətlərə, can verdisə İskəndər əgər,
Başqa insanlar üçün dövrü zaman olmalıdır.

Şəhriyar, meykədədə aç əlini, qəlbin evi
Əbədi məhrəmi-əsrari-cahan olmalıdır.

## İNSAN OL

Unutma əhdimizi, gəl vəfalı canan ol,
Keçim olub-keçəni, sən də gəl peşiman ol.

Gedən həyatını qaytar dübarə aşiqinə,
Zəif vücuduma qüvvət gətir, mənə can ol.

Cavanlığm niyə qalsın könüldə xatirəsi,
Qocalmışam, deyirəm, get nəsibi-nisyan ol.

Həbibim, ol bu ağır yarəmə mənim məlhəm,
Gəl, ey təbib, ağır dərdə yaxşı dərman ol.

Şəkərli süfrənə oldum sənin qonaq, gözəlim,
Ciyər qanı içənə indi sən də mehman ol.

Sevinc havası çalırdın həmişə nəşə ilə,
Fəğanə gəl daha, ey ney, qəmimlə nalan ol.

Kəfən niqabmı çəkdim üzə, ay üzlüm, gəl,
Kədər buludları ötmüş, buludda pünhan ol.

Bütün qəzəllərim həsr oldu hüsni-dilbərin,
Qəzalrm, indi mənə sən də gəl qəzəlxan ol.

Mələk də qibtə edir insan olmağa, mələyim,
Uyub məhəbbətə düş eşqə, sən də insan ol.

Vüsal müjdəsini vermiş aşiqin əbədi,
Deyən kim oldu çəkil get, əsiri-hicran ol?

Gəzib dolansam əgər yüz budaq, mənə səs ver,
Qıran zaman qəfəsi, üç göyə, pərişan ol.

Gəl eşq rəmzini bu Şəhriyardan öyrən,
Gülüm, bu bülbülü sev, bu çəməndə dastan ol.

## YANIQLI SAZ

Ələ al şövq ilə çal qəlbi yaxan saz bu gecə,
Göz yaşım axsın, olum saz ilə dəmsaz bu gecə.

Qəlbimin dərdini sazın sənin izhar eləyir,
Sanma ki, vardır əlindən gileyim az bu gecə.

Qəfəsində sinəmin quş kimi nalandı könül,
Bülbülü sazma gördükdə həmavaz bu gecə.

Sazın hər pərdəsi min raz eləyibdir pünhan,
Qorxuram qalmaya heç pərdədə bir raz bu gecə.

Yandı, ey şux, sənin şam üzünün atəşinə,
Oldu pərvanə könül, eylədi pərvaz bu gecə.

Nazənin, gülşəninə gəldim, edim razü niyaz,
Məni məftun elədi, sevdiciyim, naz bu gecə.

Şövqi-vəsli-çəməninde sənin, ey mayeyi-naz,
Təbimin bülbülüdür qafiyəpərdaz bu gecə.

Tökdü ulduz kimi göz yaşları, gəldi yanına,
Şəhriyar vəstin üçün, dilbəri-tənnaz, bu gecə.

## SƏHƏR PİYALƏSİ

Saldı dirlik suyuna, Xızr səfa verdi mənə,
Mən fənadan lüt idim, gör nə bəqa verdi mənə.

Su idi, atəş, əzəl zənn eləyirdim yanıram,
Çırpdı torpaqlara o, badi-fəna verdi mənə.

Əbədi hüsnü-camala məni ayinə edib,
Pası ayinədən almaqla cila verdi mənə.

Gözümü bağladı ki, görməyim eyb ilə xəta,
Könlümü güzgü edib, qeybnüma verdi mənə.

Gəldi eşq sıtması, yandırdı həsəd atəşi qəlb,
Sevginin nazına əhsən ki, şəfa verdi mənə.

Bir səhər ay gözəlim əldə günəş tək qədəhi,
Gəldi təqdim elədi, zövqü səfa verdi mənə.

Vəst üçün verdi qərar badə sonunda mənə yar,
Sağərin xətti o dəm sirri-qəza verdi mənə.

Yarımı görməyim oldu mənə merac gecəsi,
Uçmağa quş qanadı - bali-Hüma verdi mənə.

Meyimi, sazımı, bu qüdsi-nəvamı bir eşit,
Gör ki, eşqin nə qədər şuri-nəva verdi mənə.

Şəhriyar, mən yenə himmət elimi üzmədim heç,
Şükr edib, söyləmərəm yar cəfa verdi mənə.

## TACBƏXŞİN KAMANI

Eşitmişəm ki, verirsən hər eşq şahına tac,
O taci-eşqinə, dostum, mən olmuşam möhtac.

Sənin adındı əgər Tacbəxş, mən də bu gün
Söz hökmdarıyam, olmuş günəş mənimçin tac.

Kamanı köklə, kədər ləşkəri hücum eləyir,
Xəyalı, qəsdi budur, ömrümü edə tarac.

Düşübsən eşqə əgər, tut məhəbbətin yolunu,
Qumarda olsun hərifin sənin gərək Leylac.

Sənin sazınla doyub könlüm ərş zövqündən,
Vüsal günün mənə xoşdur, düşünmürəm merac.

Gəlir ziyafətinə tutilər şəkərçin hamı,
Heyifdi qəndimizi milçək eyləsin tarac.

Şeir dilimlə mənim mədh olan tapılmayıb heç,
Veribdi sazına təbim fəqət həmişə xərac.

Kamanının teli imanımı apardı mənim,
Edibdi din evimi sənətin tamam hərrac.

Sanır səni hamı bir tacidari-hüsnü-hünər,
Rəvadı taxtın ola bir gümüş sinə, nədir ac?

Gözəl deyib bu sözü Xacə: meydən ayrılsam,
Gələnə lalə zamanı edin mənə bir əlac.

Kamala çatdı sənin sənətinlə musiqimiz,
Necə ki, şerə verib Şəhriyar təbi-rəvac.

## HƏZİN NALƏLƏR

Baxanda könlümü çəkdi apardı yar məndən,
Apardı göz yaşı hicrində ixtiyar məndən.

Behişt, hər nə ki var, sizlərin qiyamətdə,
Mənimki olsun o yar, düşməsin kənar məndən.
Könül, deyildi səninlə qərarımız böylə,
Dönəndə xəncərə sən, getdi iqtidar məndən.

Saçından oldu qara ruzigarım, ey dilbər,
Daha nə istəyir artıq bu ruzigar məndən.

Təranələr yaranar hər zaman bu aləmdə,
Ucalsa, göylərə çıxsa bu ahü zar məndən.

Piyalənuş həriflər salanda yadə məni,
Bitər məzarımın üstündə taləzar məndən.

Düşürmü yadına aydın gecə görüşdüyümüz
Ki, oldu göz yaşı gövhər kimi nisar məndən.

Sən əhd bağladın, ulduzlar oldu şahidimiz,
Sitarələr utanır indi, ey nigar, məndən.

Özümlə olsa, o xalə, könül, uduzmaz idim,
Hərif aparmış idi əvvəl ixtiyar məndən.

Mənimlə yarın işi bitdi, Şəhriyar, artıq
Qalan bu incə qəzəl təkcə yadigar məndən.

## TARIM MƏNİM

Sızlayır əhvalıma sübhə qədər tarım mənim,
Təkcə tarımdır qara günlərdə dildarım mənim.

Çox vəfalı dostlarım vardır, yaman gün gəlcəyin,
Tardan özgə qalmayır yari-vəfadarım mənim.

Yer tutub qəmxanədə, qıldım fəramuş aləmi,
Mən tarın qəmxarı oldum, tar qəmxarım mənim.

Gözlərimə hər təbəssüm sancılır neştər kimi,
Kipriyi xəncərdi, ah, ol bivəfa yarım mənim.

Asiman aldı kənarımdan ay üzlü yarımı,
Yaş tökər ulduz kimi bu çeşmi-xunbarım mənim.

Ey bu qəmli könlümün tabü-qərarı, söylə bir,
Əhdi-peymanın nə oldu, noldu ilqarım mənim?

Şəhriyaram, gərçi mən söz mülkünün sultanıyam,
Göz yaşımdan basqa yoxdu dürri-şəhvarım mənim.

## DÖYÜŞ

Nədən bu halımı, ey şux, zar edib getdin?
Bu intizarı əcəb intizar edib getdin.

Təbəssüm ilə gəlib sonradan acıqlandın,
Məni bu dərdə neçin sən düçar edib getdin?

İnan, yaman dolanır ruzigarı yaxşıların,
Bu ruzigara məni etibar edib getdin?

Vüsal fikri bir an keçməmişdi qəlbimdən,
Məni kəməndə salıb, sən fərar edib getdin.

Ömür gedib, köçür artıq bu karivan, ey gül,
Bu yolda sən də mənim tək güzar edib getdin.

Amandı, zülfünə şanə toxunmasın bir də,
Könül evin əbədi tarimar edib getdin.

Nigarı tərk eləmək bizlərə deyil adət,
Vəfasızım, niyə bəs tərki-yar edib getdin?

Gülüm, səhər şəfəqim, mənsə bir sönən şəməm,
Bu son nəfəsdə təbəssüm nisar edib getdin.

Ümid təkcə sən idin, alovlu eşqim sən,
Şəbidinəm, məni şəmi-məzar edib getdin.

Vüsalə, hicrə özün hakim idin, ey dilbər,
Mənə həmişə feraq ixtiyar edib getdin.

Mənim gözəl maralım, tülküyə şikar olma,
Məhəbbətinlə sən aslan şikar edib getdin.

Xarab könlüm işıqlandı şəmi-arizlə,
Məni qəzəldə, gülüm, Şəhriyar edib getdin.

## ƏBƏDİ XƏZAN

Günəşim, ay üzlü yarım məni dərdə yar edibdir,
Nədən ötrü, sor qəmindn, məni böylə zar edibdir?

Demə aşiqin bəlası fəqət ayrılıqdı ancaq,
Məni vəslin intizarı əcəb intizar edibdir.

Bu cavanlığın meyindən belə sərxoş olmusan sən,
Görə bilmisən ki, həsrət məni də xumar edibdir.

Elə sanma Xosrovun var yenə də şikarə meyli,
Bu kəməndi-zülfi-Şirin həvəsi şikar edibdir.

İti kirpiyin bir iynə, sapı öz telindən olsun,
Yaralı könül həyatın sənə etibar edibdir.

Elə bil şikəstə sazam, acı keçmişin xəyalı,
Məni sevgilim, özündən sənə yadigar edibdir.

Qəmi-ruzigara söylə, məni öz halımda qoysun,
Məni böylə qəm əsiri, qəmi-ruzigar edibdir.

Demə arzumun bahan əbədi xəzanə məhkum,
Nə qəm ol xəzanə ki, yaz onu tarumar edibdir?!

Ürəyim yanan ocaqtək yenə odlu sözlər istər,
Alışan, yanan bu qəlbim məni Şəhriyar edibdir.

## TƏDRİCİ ÖLÜM

Gəncliyimdən xəcalətəm, çünki yoxdur zindəganlıq,
Həyatımda nə sevinc var, nə bir fürsət, nə cavanlıq.
Az ömrümdə cana doydum, həyatımdan bezdim inan,
Nə yaxşı ki, birce ömrə yazılmamış cavidanlıq.

Oyananda hər gün səhər qara bulud gördüm ağlar,
Bu üfüqlər bircə dəfə görməmişdir şadmanlıq.
Bəlkə kədər özü mənə bir tədrici ölüm ola,
Əfsus ölüm özü belə olmamışdır bircə anlıq.
Sillələrlə üz qızardan elə bilmə təkcə mənəm,
Bu məclisdə bir üz belə görməmişdir ərğəvanlıq.
İt cildində pasibanlıq eyləyən o qurdlara bax,
Ağa canı belə deyil, belə olmamış çobanlıq.
Xəzan vurmuş Şəhriyarın gülşənini, gülünü de,
Bülbül təbi susan gündən qalmamışdır nəğməxanlıq.

## QƏMLİ NEY

Bu gecə ay ürəyə təskindi,
Ayrılıqdan mənitək küskündi.
Ayrı düşdüm günəşimdən, ayrı,
Ey hilal, dərdini duydum indi.
Gəz pərişan bu məhəbbət çölünü,

Ürəyimdə yenə həsrət dindi.
Göz yaşı gövhəri saxlar ətəyim,
Ətəyində gövhərin min-mindi.
Qəm qubarın hamı mehtabla yuyar,
Bu gecə mehtab özü qəmgindi.
Taleyimtək səni məhzun görürəm,
Gözlərim inci tökər Pərvindi.
Gül əkər, xar dərər bağbanlar,
Get gülüm, layiqin ol gülçindi
Torpağından göyərib Fərhadm,
Qəmli ney bəlkə dinən Şirindi.
Poz, dağıt, dər, sovur, xəzan küləyi,
Padaşın bircə eylə nifrindi,
Qapımı hey döyür bu tufanlar,
Ey qaranquş, tələs, fərvərdindi.
Şəhriyara, məhəbbət olsa əgər,
Elə dünya sənin behiştindi.

## VƏHŞİ ŞİKAR

İntizarda qoyduğun məni yetər, sevgilim,
Aynlığın ölümdən daha betər, sevgilim.
Dünən zülfün dil açdı sazın pərdelerində,
Ayrılığın əzabı nə vaxt bitər, sevgilim?
Sazım kövrək sözümlə dil tapmışdı bu axşam,
Sandım qara günüm də sona yetər, sevgilim.
Ulduz batdı, öldü şam, kimsə oyaq qalmadı,
Yuxum xəyallarında batar, itər, sevgilim.
Dedin ki, Rey qızları, şair, laləüzlüdür,
Səndən başqa gözəllər, gözə neştər, sevgilim.
Təbim kəməndə düşmüş, ahu şikar istəməz,
Aslandır, aslan kimi şikar istər sevgilim.
Sındırmaz zindanları heç vaxt acı tənələr,
Dünya qəfəs olsa da, ürək ötər, sevgilim.
Xəcalətdən ölürəm, sənsiz diriyəm hələ,
Sənsizliyim nə zaman sona yetər, sevgilim.
Şerin tacı başımda, sənsizəm, ey qəzalım,
Eşqin mülkündə şair şahlıq istər, sevgilim.

## GÖVHƏR SATAN

Ömrümü sənə qıydım, eşqində ilk qurbanam,
Sən artıq bir anasan, mənsə subay-sultanam.
Sən cigərparəni də süddən ayırdm, gülüm,
Çarəsiz yalqızınam, dərbədər, bağın qanam.
Ürəyimin qanını içərəm səhər, axşam,
Budur günahım: ancaq düşünən bir insanam.
Eşqimin sərabında itdi cavanlığını da,
Xatirat qoynunda da qəlbi qırıq cavanam.
Atan qızıla satdı sənintək gövhərini,
Bu eşqin yollarında viranə xanimanam.
Necə qiymətsiz imiş boyük eşqim, hünərim,
Kim bilir ki, dürr ilə varlanmış bir ümmanam.
Kaş ki, girov qoyaydım qızıla hünərimi,
Bu alver bazarında oli boşda qalanam.
Dünya lənətləmişdir bu on üç rəqəmini,
Mən də bu rəqəm kimi hər yerdən qovulanam.
Köhnə əhdi, ilqarı bir də təzələməkçün
Gülüm, sizin qapıdan yol salardım bir zaman.
İndi özgəninkisən, mənə bəsdir xatirən,
Məni başqa biçimdə yaratmışdır bu dövran.
Qəlbimdə dalğalanan ləl, yaqutdur qanım,
Bu ömür kürəsində mənəm alışan, yanan.

## HİCABIN ÜZ QARALIĞI

Aytək üzündən at, gözəlim, o niqabı sən,
Ta ki, xəcalət eyləyəsən afitabı sən.
Gör, mən yazıq ki, gözlərinin bir fədasıyam,
Bundan xərab eyləmə mən tək xərabı sən.
Qorxum budur ki, tapmayasan gülməyə macal,
Axtar bu göz şüşəmdə o gülgün gülabı sən.
Onda ki, gözlərin süzülüb bir çimir gəzər,
Qov lap uzaqlara belə qəflətli xabı sən.
Gör, inqilab bayrağı zülfündə gizlənir,

Qalx, qaldır, ey mələk, aləmi-inqilabı sən.
Nöqsana, eybə pərdə çəkər, gizlədər niqab,
Ey gül, götür üzündən, ayır o niqabt sən.
Ağlar bulud ki, gülşəni-aləmdə gül gülə,
Gülsən o gül kimi, dağıdarsan səhabı sən.
Öz haqqın istəyərsə qadın, söylə bir görək,
Hardan, necə, nədən verəcəksən cavabı sən.
Ağ gün gətirdi şeyxə sənin qarə paltarın,
Qarə gününlə qarə edibsən hicabı sən.
Meydən danışma şeyxə, ona mey nəyə gərək?
Xalqın qanın içir, yerə əndər şərabı sən.
Düşdü güzarmız yenə də qəm diyarına,
Bir yolluq eylə qafilədən bu sərabı sən.
Şərin cırağı olmasa, aydındı yolların,
Öz xeyr əməllərinlə qazandın savabı sən.

Saqi, dayan, qulağa pıçıldar bahar yeli,
Şövq ilə səslə bir də bu eşqi-əzabı sən.
Dünya qopanda qəm qopacaq hər tərəfdə, bil,
Fövt etmə fürsəti, götürüb çal rübabı sən.
Gör ki, necə bu çərxi-fələk firlanır hələ,
Yad eylə torpaq olmuş o Əfrasiyabı sən.
Xacəylə, şeyxlə vuruşur Şəhriyari-şeir,
Çöndər, varaqla bir də o zəngin kitabı sən.

## EY QADIN!

Hüququndan söhbət ac, bir söz söylə, ey qadın!
Ağır zəncirləri qır, düşsün dillərə adın.
Bu matəm paltarını parçala bir gün səhər,
Sənin aydınlığından işıq alsın üfüqlər.
Son ki, həyat nəfəsli Məsiha yaratmısan,
Bəlkə yeri, göyü də elə sənsən yaradan.
Sən günəş timsalısan, yaraşıq ver özünə,
Ox ol naməhrəmin də, məhrəmin də gözünə.
Dinib-danışan saz ol, yaşa nəğmələr kimi,

Bu sonsuz kədərinlə parçalama qəlbimi.
Şərəf-şan bayrağını ucalt öz əməlinlə,
Səadət bayrağını sanc dünyaya əlinlə.
İstərm görünməsin bir də gözlərində nəm,
Mərd ol, cəsarətini görsün bütün bu aləm.
Sən aysan, öz başına yumruq niyə döyürsən?
Düyünlə yumruğunu, şeyxin başına döy sən!

## FƏLƏYİN BAYRAMLIĞI

Ay keçdi, il dolandı, ondan nişan gəlmədi,
Bahar gəldi, gül açdı, namehriban gəlmədi.
Sən qara ürəklisən, ey bayram, üzün qara,
Azadə insanlara bayram əlvan gəlmədi.

Dostlar qonaq gələrdi hər il şəkərə, qəndə,
Fəqət ürək qanına kimsə mehman gəlmədi.
Mənim evim yox daha, məntək xanimansızın
Görüşünə bir nəfər, bircə insan gəlmədi.
Hara uçub getdi bəs mənim ağ göyərçinim,
O mələk aşiyana niyə bir an gəlmədi.
Məhəbbət carçıları harda qaldı görəsən,
Niyə geri dönmədi, o karvan gəlmədi?
Bayramlıq nə gətirdin bu il bizə, ey fələk,
Get-get, səndən nə ümid, nə də aman gəlmədi.
Hamı görüşə gədər sabah biri-birinə,
Kasıbın görüşünə qoca, cavan gəlmədi.
Acı göz yaşlarına alışıb döz, ey ürk,
Yaxşılara dünyadan bir ərməğan gəlmədi.
Ürəyini, qəlbini mənfəətə bağlama,
Gözü tox insanlara bundan ziyan gəlmədi.
Cavanlıq qüruru da ötəridir dünyada,
Ömür də, cavanlıq da, bil, cavidan gəlmədi.
Bahar gəlir, o yandan bu ömür gülşəninə
Kim deyir ki, bahardan sonra xəzan gəlmədi?
Dünyaya bənzərin var, dünya kimi vəfasız,

Vəfa iyi dünyadan, bu cahandan gəlmədi.
Acı dərdlər əlində sümüyə dönmüş bədən,
Qurmadı huma quşu bir aşiyan, gəlmədi.
Səndən başqa kimsəni yad eyləməm dünyada,
Adım sənin dilinə heç bir zaman gəlmədi.
Dostların ürəyini həmişə şəfqətlə al,
Əsl dostlar, sevgilim, ələ asan gəlmədi.
Vüsalın həsrətiylə yaşayırdım, dözürdüm,
Bu qədər dərd əlində boğaza can gəlmədi.
Ey səba küləyi, gəl yadına sal əhdini,
Bayram gəldi, görüşə yenə canan gəlmədi.
Eşqin əfsanəsini oxuma, ey Şəhriyar,
O, qəm saçır, dilinə özgə dastan gəlmədi?!

## MƏN OLMAZ

Rəqibim hünərimi oğurlasa, mən olmaz,
Bir gül bitirmək ilə tulanbar gülşən olmaz.
Qızıl zəmi biçəsən gümüş oraqla gərək,
Yoxsa bir neçə sünbül döyülsə xərmən olmaz.
Bir məhrəm çobanı var Turi-Təcəllanın da,
Ondan qeyri bu dağın sirrini bilən olmaz.
Küp başında yeddi növ mey içəndən soruş sən,
Hər şərab igidləri yerlərə sərən olmaz.
Sərt tufanlar tacını tarac eyləsin gərək,
Yoxsa dağın sinəsi yox yerdən mədən olmaz.
Şüşənin boğazına usta üfürsün gərək,
Hər naşının dodağı şüşüfürən olmaz.
Hafiz atəşgahında yanmaq mənim qismətim,
Axı hər yanan çıraq zülmətlər dələn olmaz.
Bu daş ürəkli təbib məndən dərman əsirgər,
Məgər qol sınan zaman ağrıyan bədən olmaz.
Soyuq küləklər əsən bir yerdə, bir məkanda,
İki yüz şam alışdır, yenə də rövşən olmaz.
Sədəf xəzinəsindən ayrıldınsa, qabıqsan,
Cəvahir bazarında sənə göz dikən olmaz.
Kişilik xislətini sən yerin bətnindən al,

Bu qoca Zal bir daha bəhər gətirən olmaz.
Sinələrdə boğulan ümid fəğan doğurur,
Heç bir ölüm şivəni bu sayaq şivən olmaz.
Sanma ki, gül qıranda susdurdun bülbülləri,
Bilmədin dil tikanı olmayan süsən olmaz.
Necə mum tək əriyib, yanmayım atəşdə mən,
Əzizlərim, aşiqin qəlbi dəmirdən olmaz.
Tənələrin oxuyla Yəqub tikdi yaxasın,
Fəqət bir köynək ətri həmin pirəhən olmaz.
Güllər yağır ətəkdən, qaç çəməndən yel kimi,
Qan izi var bu yerdə, çəmən o çəmən olmaz.
Dostları candan sevən, hanı səntək Şəhriyar,
Düşməndən dost olmamış, dostdan da düşmən olmaz.

## QIŞ AĞASI

Qış ərbabın çiyninə xəzli palto salıbdır,
Qar altında yoxsulun lüt bədəni qalıbdır.
Bu dövlətsarayların yolun tanımayan qış,
Bizim matəmsəradan bir gün uzaq olmamış.
Zülüm saraylarına baş əyir qar, yağış da,
Kasıbın dərisini soyur şaxtalı qış da.
Yoxsulun bu ölkədə dərdi var, dərmanı yox,
Mürüvvətsiz təbibin pulu var, vicdanı yox.
Acı göz yaşlarında can ver, azadə insan,
Ürəksizdi, alçaqdan aman istəmə, aman!
Kimə pənah apardıq, açılmadı bu müşkül,
Əllər, qollar bağlısa, müşkül açılan deyil.
Oyun zamanı yadlar tanış maska geyindi,
Oyun qurtaran kimi, yad üzlər də göründü.
Hər atəş fərmanına can tapşırdı alaylar,
Viran qalsın, dağılsın fərman verən saraylar.
Ruzusunu bu xalqın möhtəkirlər mənimsən,
Bu əjdaha qarınlar iti bir kəsər istər.
İzzətlə verməyindən, zillətlə almaq gərək,
Ağılsızın, qanmazın yadına salmaq gərək.
Hərif istehza edib Şəhriyara söylədi:
Yoxsulları tuturlar, ehtiyatlı ol, dedi.

## GÜLÜN ARXASI, ÜZÜ OLMAZ

Hüsnünü tay tutmaram, bir daha gülzarə mən,
Ətrini udmuş mehəm, dönmüşəm əttarə mən.
Eşqimizin dastanı gəzmədə dildən-dilə,
Susdura bilməm eli, qalmışam avarə mən.
İsmətin aydan arı, könlümə şəfqət saçar,
Vəslin ilə dərdimə, kaş ki, qılım çarə mən.
Arxa nədir, üz nədir, hər yanı güldür gülün,
Qalmadı pünhan sözüm, söylədim aşkarə mən.
Başıma qar yağdırıb həsrətin, ey nazənin,

Eyləmişəm səbr ilə qəlbimi yüz parə mən.
Gör necə aydır üzün, nur umar ondan günəş,
Canımı qurban dedim böylə səhirkarə mən.
Söylədi səbr eyləyim, qalmamış ömrüm daha,
Gəncliyimi qıymışam əhd ilə ilqara mən.
Ey qaşı mehrabımız, səcdəyə gəldik sənə,
Oldum o vaxtdan bəri bəxti, günü qarə mən,
Gün keçir, ey Şəhriyar, bir belə qəflət nədir,
Qalxdı günəş zirvəyə, qoy yetişim yarə mən.

## MƏHƏBBƏTİN MƏLALI

Məhəbbətin qəmiylə səni qovsam özümdən,
Uzaq getmə, fəğanım edər səni peşiman.
Ahımtək küdurətin yolun tutma, göz yaşım,
Şəfaət peyki kimi qovar səni nigaran.
Göz yaşı gövhərimsən, sən səfa dürdanəsi,
Düşərsən ətəyimə kiprik çatdığın zaman.
Ey mənim uca sərvim, yetmirsən fəryadıma,
Mən ki, ayırmamışam səni ulu tanrıdan.
Sən ruhum, sən canımsan, qırılmaz can telləri,
Nə vardı bədən olsan, verərdim qarşında can.
Eşq matəmsəramı niyə odlara yaxdın,
Törətdiyin yanğından çəkinmədin bircə an.

Başıma ara-sıra nəvaziş əlini çək,
Saza döndüm, səninçün dilə gəldim bir zaman
Məhəbbət diyarını tərk etmədin, ey ürək,
Bu uğursuz məhəbbət eylədi bağrımı qan.
Ətirli qönçəm idin, dayan, güldürüm səni,
Bahara qürrələnmə, pusquda durmuş xəzan.
Bir gecə zindanıma tələs, sübhə acıq ver,
Şəmi yandırıb-yaxım, qarşında tapşrım can.
Dəyiş təbəssümünü canıyla Şəhriyarın,
Sevinclə bunu verib, onu alardım, inan!

## SEVİNC YAŞI

Gec gəlmisən, əlim ətəyindən qopan deyil,
Can müjdə vermişəm, çəkəm ağuşa can kimi.
Bəlkə yuyam sənin gül üzündən qubarım,
Qəh-qəh çəkib, hey ağlayaram asiman kimi.
Dağ çəkdi sinəmə necə də ayrılıq dağın,
Ayrılmışıq bu zülmlə arıyla şan kimi.
Sizdə, gülüm, məgər neçədir nırxı busənin,
Gövhər sayır gözüm bir ömür ərməğan kimi.
Hicrində hər gecə başıma doydüyüm bu əl,
İndi sürahi boynunu qucmuş cavan kimi.
Ey qəm, yolun uğurlu, fəqət haqq-say qalır,
Boşdur yerin ürəkdə, yaxın mehriban kimi.
Sən ayrılıb gedəndə, fəğan etdi Şəhriyar,
Təsirli bir fəğan yox imiş bu fəğan kimi.

## SƏFƏR AZUQƏSİ

Gecələr oyaq qalar, ulduz sayar gözlərim,
Dan ulduzu çırtladı, harda qalmış səhərim?
Hanı sübhün qoşunu, al günəşin yolunda
Vuruşmaq istəyirəm, hanı məni kəsərim?

Günəş üçün açmasa qapısını asiman,
Pərdəsini yırtaram ulduzlarla qəmərin.
Fələyin atlısıyam, öz qızıl nizəm ilə
Gecənin zülmətini doğramaqdır nəzərim.
Sübhün rikabındayam, axtarıram günəşi,
Ulduzlara uçuşum, ulduzlara səfərim.
Bu atəşdən, bu oddan keçib qurtarsam əgər,
Külək kimi torpağa, suya düşər izlərim.
Bu diyardan, bu yerdən qaçıb qurtara bilsəm,
Bu diyara, bu yerə bir də düşməz güzərim.
Qanadımı gərmişəm eşqin aşiyanına,
Atılan o daşlardan sınmasa balü pərim.
Məni zirvəyə çəkir məndən qaçan maralım,
Dağların möhnətindən qırılmasa kəmərim.
Şirin sözün sevincə çəkir səni, Şəhriyar,
Fəqət qərq etmək istər yenə acı kədərim.

## HƏYAT ZİNDANI

Nə qədər ki, mən sağam, bilməzsən kimliyimi,
O zaman goləcəksən, yükümü bağlamışam.
Həyat adı daşıyan ölüm astanasında,
Necə deyim, həyatı qovaraq haqlamışam.
Göz yaşımın gülabı göstərir ki, gül kimi
Bir gün gülmüşəm əgər, bir ömür ağlamışam.
İki iyirmi yaşadım, iki yüzə bərabər,
Bəxtim kamımca deyil, sinəmi dağlamışam.
Səbir imtahanında, münsif münsifsə əgər,
Qiymətimi beş yazar, nəfsimi oxlamışam.
Xəfiyyəyə söylə ki, vərəqdən pozsun adımı,
Atdığım hər addımı mən özüm yoxlamışam.
Gövhərşünas arama bu şəhərdə, Şəhriyar,
Saxsılar arasında mən sədəf saxlamışam.

## SƏNƏTKARIN AYI

Könlümü yormuş, ey gül, bir baxışa qənaət,
Bir ömür ki, qənaət eyləmək olmaz əlbət.
İllərdir halə kimi başına dolanıram,
Bir baxışla başından açılımmı nəhayət.
Ayla ülfət bağladım, çün sənə bənzəri var,
Səndən ayrılsam əgər, ayı bürüyər heyrət.
İşığına gəlirəm yazıq pərvanə kimi,
Atəşinə yanıram, könüllər yaxan afət.
Nə əlim çatır sənə, nə də ki, ünüm yetir,
Səsim sənə çatınca, üzər məni bu möhnət.
Gül tikana sığınar, sinəmə baş qoy, gülüm,
Məni yandırıb-yaxır bu ayrılıq, bu həsrət.
Sənin ay camalının arzusuyla dolandım,
Bircə dəfə etmədin aşiqinə mərhəmət.
Ömür boyu bir eşqin alovunda yanmışam,
Ulu tanrım, nə verdi mənə barsız məhəbbət?!
Bəxtiyar deyilmiyəm, bir ömür sevdim səni,
Varmıdır bundan artıq, bundan ulu səadət.

## YANAN PƏRVANƏ

Pərvanə kimi mən bu gec’ odlara yandım,
Ey ş’m, sənin çevrənə şövq ilə dolandım.
Baş əydi ürəkdən mənə göylərdəki ay da,
Onda ki, səni mən günəşin yavrusu sandım.
Gülşəndə bitən susəni gördüm, səni gördüm,
Sünbülləri gördükdə sənin zülfünü andım.
Gəl, sil gəlişinlə ürəyimdən bu qubarı,
Yarım, sənə dönməzdi, dəyişməzdi bu andım.
Tarınm, yuxuda gördüm onu, ah, bu nə röya,
Dünya mənə cənnət olalı, cənnəti dandım.
Gördüm ki, sevincdən dəxi bülbül də susarmış,
Lalə dodağın qaçdı, gülüş sirrini qandım.

Hurim, mələyim, gözlərimin nuri də sənsən,
Səndən savayı dünyada hər şeydən usandım.
Qumru oxudu Şəhriyarın nəğməsin əzbər,
Sərvim, başına qumru kimi bir də dolandım.

## NAKAMLIQLAR

Həyat oldu, mən oldum, bir də dərdü qəm oldu,
Bircə bu qəmli ürək şairə həmdəm oldu.
Nakamlığa o qədər öyrəşdim bu dünyada,
Həsrət xoş günümdə də qəlbimə məlhəm oldu.
Söylə, necə döndərim bu dönük taleyimi,
Dünya mənə əzəldən bir dönük aləm oldu.
Ayrılıq alovunda bir saza dönmüş könül,
Dinən ürək tellərim gah zil, gah da bəm oldu.
Adımdan, şöhrətimdən nə xeyir aparmışam,
Mənim şeir aləmim bir sonsuz ələm oldu.
Mən yazığa bir kərə zülfü də ram olmadı,
Məni ram edən, fəqət yenə bəxtikəm oldu.
Dünya sirrini duydum çöhrəsindən saqinin,
Duyan ürək sirrimi Hafizlə Xəyyam oldu.
Şəhriyar, vərəqləri yu peşmanlıq yaşıyla,
Qoy pozulsun adın da, sənə min sitəm oldu.

## ƏLİM ƏTƏYİNƏ

Nə vəslini görəydim, ey gül, nə hicranını,
Yandı canım cəfayə, gəl öldür qurbanım.
Döz deyirdin, eşqinə illərdir dözürəm mən,
Səbrim yoxdur, a zalım, təzələ peymanını.
Bülbültək nəğməxanəm, sənsə gül kimi parlaq,
Tikanlardan uzaq tut o gültək damarımı,
Vəslini istəmirəm, eşqini alma məndən,
Alışmışam dərdinə, istəməm dərmanını.

Mənim yorğun ümidim güləşir əcəlimlə,
Ölümmü, ya qalımmı, de, buyur fərmanım.
Qəlbimdə keçən gecə hicrinlə danışırdım,
Ağlar gözlə ürəkdən soruşdum sultanını.
Gecələr sayə kimi sürünürəm qəsrinə,
O ümidlə ki, görüm uzaqdan eyvanını.
Gözüm yaşına bənzər ləldən boyunbağın,
Məzlum qanı olmaya, tutar giribanını.
Necə dözsün ürəyim sonsuz dərdü qəminə,
Azalt, ey daş ürəklim, dərdi-firavanını.
Ürəksizlər də sevir şerini, ey Şəhriyar,
Vüsal ərməğanıdır, uca tut divanını!

## MƏNƏ HƏMDƏRD OLAN NEY

Danış, ey ney, sənintək qəmliyəm mən,
Əzəldən sirli bir qəm axşamım var.
Ürək yüz yarə almış yar əlindən,
Nə səbrim, nə davam, nə də şamım var.
Ay üzlüm bircə an girdi qapımdan,
Acı tufanlara düşmüş kəmim var.
O getdi, sinədə yandırdı məşəl,
Məni tərk etməyən yüz bir qəmim var.
Özüm öz qəlbimə toy vədə qıldım,
Ürək hardan biləydi mıatəmim var.
Açar güllər səhər, bilməm nədəndir
Gözümdə hər gecə gur şəbnəmim var.
Məgər bətnimdə təbim bəslər İsa?
Ürəkdə bir müqəddəs Məryəmim var.
Necə mən əl üzümləlindən, ey gül,
Əlimdə bir dəyərli xatəmim var.
Qırılmaz qollarım varsa cahanda,
Qəmim tək bir basılmaz Rüstəmim var.
Qəmin dəryadır artıq Şəhriyara,
Kimə söylər ürək tək məhrəmim var.

## HƏZİN TƏRANƏ

Qəlbim eşqin nəvasına başlayanda hər səhər,
Ulu tanrım, özün söylə, neyləsin bu dərbədər.
Dünən gecə yatmamışam naləsindən ürəyin
Bu gün odlu nəğməsini kaş edəydi müxtəsər.
Yazıq sənin bağbanına, bar gətirməz zəhmətin,
Həyatmı bada vermiş, ömrü getmişdir hədər.
Dünən gecə göz yaşında qərq olmuşdu ürəyim,
Gül yanaqlım, həsrətində nələr çəkmişəm, nələr?!
Köç qəlbimdən, qorxuram ki, göz yaşımın tufanı
Sənin könül otağını edə yerlə bərabər.
Məhəbbətin yollarında ömür qoyan aşiqə
Bir nəzər qıl, yola sal ki, gəlib çatdı son səfər.
Xəyalına söylə qalsın, hicranına alışım,
Öz alovlu eşqinə də, lütf eyləsin bir qədər.
Ey vəfasız, qorxuram ki, ölüb gədəm, dünyada
Məndən sonra əhvalına acımaya bir nəfər.
Gördün yazıq pərvanənin nahaq tökülən qanı
Qoymadı ki, şəm eyləsin zülmətini al səhər.
Şəhriyarın ürək yaxan qəmli təranəsini
Eşq oduna alışanlar əzbər deyəcək, əzbər.

## CANANIN CİLVƏSİ

Camalın etə bir şam alışdırdı, sevgilim,
Elə şam ki, əzəldən pərvanən idi sənin.
Ağlımın pərdəsini parçaladı məhəbbət,
Ağlım çıxdı başımdan, divanən idi sənin.
Fələyin kuzəsinin aytək piyaləsi var,
Əlində saxladığı peymanən idi sənin.
Müdrik qoca qoruyur cavanları şərabdan,
Özünün məskənisə meyxanən idi sənin.
Göyün doqquz süfrəsi yenə aşıb-daşırdı,
Göz dikdiyi, gəzdiyi ənbanən idi sənin,
Dünən gecə yatmayıb, sübhü gözümlə açdım,
Quşların cəhcəhində əfsanən idi sənin.

Bubbu quşu o bağda səndən söhbət açırdı,
Vəsf etdiyi o zülfün, o şanən idi sənin.
Gözlərinin xumarı pozdu xumarlığımı,
Xumarlığın nəğməsi təranən idi sənin.
Səndən başqa hamıya biganədir ürəyim,
Fəqət bu vurğun ürək biganən idi sənin.
Sübhə kimi uzandı Şəhriyarın naləsi,
Başqa bir ağların yox, yeganən idi sənin.

## DİVAN VƏ DİVANƏ

Yarəb, rəva deyildir, canan düşə ayaqdan,
Dərdi canıma düşsün, getsin yolunda bu can.
Bir ömür ağlamışdım, tanrım, rəvamı indi
Onsuz qalım bu yolda bir də olum peşiman.
Zülm eyləmişsə yarım, mən razıyam cəfayə,
Dözməm əzabına, gəl, eylə o dərdə dərman.
Hicrində qılmışamsa min bir fəğan, rəvadır,
Lakin rəva deyildir, bir dəfə qılsın əfgan.
Əfsunlu gözlərinə bir gün gözüm sataşdı,
Ruhum, canım alışdı, od qalxdı varlığımdan.
Məntək uğursuz eşqə salma o gül camalı,
Məntək məhəbbətində qoy olmasın pərişan.
Əl üzdüm arzulardan, hardandı məndə o bəxt,
Bir gun bu göz yaşımtək damanə düşə canan.
Mən bir gün ağladımmı, özüm-özümə bir gün,
Qılsın fələk nə yerdən səhmansız ömrə səhman.
Ovçu xəyal birdən atsa aya kəməndin,
Mehtab tora düşərsə, nurla dolar bu zindan.
Peşınanlıq eyləyər bil, divanə Şəhriyara,
O gül camalı, vallah, düşsə əlinə divan.

## BAYRAM AXŞAMI

Gəldi bayram axşamı ay üzünün nurunda,
Öz novruz süfrəmizi bu il açaq, sevgilim!
Köhnə il köhnə qəmlə köçüb getdi dünyadan,
Yeni ildə qəlblərə fərəh saçaq, sevgilim!

Cavanlıq həvəsiylə al əlinə setarı,
Ulduz qoparmaq üçün göyə uçaq, sevgilim!
Gözəl bahar çağıdır, gözlər səhralar bizi,
Bahar küləklərinə sinə açaq, sevgilim!
Köhnə əhdi, ilqarı təzələyək yenidən,
Məhəbbət gülşənində bir gül açaq, sevgilim!
Səhər yeli soyüdün telini hörən zaman

Biz də günəş sayağı işıq saçaq, sevgilim!
Sazı, çəngi, setarı yerə qoyma əlindən,
Nəğmələrdən vüsala bir yol açaq, sevgilim!
Sənin eşqindən özgə bayramdan istəyim yox,
Həsrətdən, ayrılıqdan uzaq qaçaq, sevgilim!
Gəldi bayram axşamı, ay üzünün nurunda
Öz novruz süfrəmizi bu il açaq, sevgilim!

## HİCRAN ÇƏKMİŞƏM

Ətək çəkmə naz ilə, hicran çəkmişəm, gülüm,
Rəqiblərin nazını yaman çəkmişəm, gülüm!
Bəlkə Yusif sayağı əzizləyə bu həyat,
Bir ömür onun kimi zindan çəkmişəm, gülüm!
Gözlərimə bir daha rəva bilmə göz yaşın,
Bu gozlərdən bir ömür ümman çəkmişəm, gülüm!
Çiynimə qoy başını, sinəm üstə əlini,
Elə bil ki, yarama dərman cəkmişəm, gülüm!
Sənsiz keçib keçənlər, soruşma həyatımı,
Öz ömrümdən əlimi coxdan cəkmişəm, gülüm!
Sənin eşqin, həsrətin hələ bir yana dursun,
Amansız ruzigardan aman çəkmişəm, gülüm!
Xəyalımda o qədər sənə pay göndərmişəm,
Bu boş qalan süfrəmə mehman çəkmişəm, gülüm!
Təkcə hicran qəmimi mənim dərdim, möhnətim,
Alçaqlar minnətini hər an çəkmişəm, gülüm!
Ey diş çəkib, ağrıdan səhərəcən yatmayan,

Sən ağrılar çəkəndə mən can çəkmişəm, gülüm!
Könlümün lövhəsində səndən özgə heç nə yox,
Hər nə ziynəti varsa, ondan çəkmişəm, gülüm!
Kimsəyə baş əyməmiş uca təbin, Şəhriyar,
Qənaət yollarında karvan çəkmişəm, gülüm!

## AZƏRBAYCAN

Könlüm quşu qanad çalmaz sənsiz bir an, Azərbaycan,
Xoş günlərin getmir müdam xəyalımdan, Azərbaycan!

Səndən uzaq düşsəm də mən, eşqin ilə yaşayıram,
Yaralanmış qəlbim kimi, qəlbi viran Azərbaycan...

Bütün dünya bilir, sənin qüdrətinlə, dövlətinlə
Abad olub, azad olub mülki-İran, Azərbaycan!

Bisütuni-inqilabda Şirin - vətən üçün Fərhad
Külüng vurmuş öz başına, zaman-zaman, Azərbaycan!

Vətən eşqi məktəbində can verməyi öyrənmişik,
Ustadımız deyib: heçdir vətənsiz can, Azərbaycan.

Qurtarmaqçün zalımların əlindən Rey şümşadını,
Öz şümşadın başdan-başa olub al qan, Azərbaycan!

Varəb, nədir bir bu qədər ürəkləri qan etməyin,
Qolubağlı qalacaqdır nə vaxtacan Azərbaycan?

İgidlərin İran üçün şəhid olub, əvəzində
Dərd almısan, qəm almısan sən İrandan, Azərbaycan!

Övladların nə vaxtadək tərki-vətən olacaqdır?
Əl-ələ ver, üsyan elə, oyan, oyan, Azərbaycan!

Bəsdir fəraq odlarından kül ələndi başımıza,
Dur ayağa! Ya azad ol, ya tamam yan, Azərbaycan!

Şəhriyarın ürəyi də səninkitək yaralıdır,
Azadlıqdır mənə məlhəm, sənə dərman, Azərbaycan!

## İNTİZAR

Bəxt ulduzum, nə oldu ki, eyvana gəlmədin,
Ey məhvəşim, nədən şəbi-hicranə gəlmədin?

Şəmim yanırdı ta ki, gülə, gül camalına,
Pərvanə tək, gözəl, bu şəbistanə gəlmədin?!

Məhbusun idim, aybənizim, söylə bir nədən,
Bir an da olsa bu qara zindanə gəlmədin?

Sevda hədisi tək gecəmiz catmadı sona,
Qəm etdi aləmi mənə viranə, gəlmədin!

Qoyma ki, qarət eyləyə milçək bu qəndimi,
Tuti quşum ki, sən şəkəristanə gəlmədin.

Şerim sənin dilinlə xoş ovlar könülləri,
Əfsus, bülbülüm, bu gülüstanə gəlmədin.

Bağrmı qan oldu, süfrənə düzdüm şəkər sənin,
Nazlı qonaq, bu məclisi-cananə gəlmədin.

Divani-Hafizim! Dəli-divanən olmuşam,
Div ilə, ey pəri, yenə divanə gəlmədin.

Gördün ki, səbr qayığımı qərq edir eləm,
Tapşırmayınca təxtimi tufanə, gəlmədin.

Biçarə qəlbimin toyumı matəm eylədin,
Döndərməyincə eyşimi ənzanə, gəlmədin.

Ey Şəhriyar, sənin ki, təbi-baharın xəzan olub!
Nur saçmağa bu sünbülü reyhanə, gəlmədin!

## NƏ ÇƏKMİŞƏM

Eşqində bir ömür məni tutdu kədər, eləm,
Aşiq də olmadın biləsən ki, nə çəkmişəm!

Eşq ilə əql getmədilər heç zaman yola,
Aşiq olarsa kimsə, daha əqldən nə qəm.

Röyadə görmüşəm ki, dünən vəslə catmışam,
Sübh oldu, görmüşəm yenə hicranla həmdəməm.

Bir busə ilə könlümü qəmdən xilas elə,
Bir böylə dərdilə sən özün olginən həkəm.

Bir gün Səba saz ilə dedi: Şəhriyar, aman,
Səndən nə yazmayıb mənə tale yazan qələm...

## PƏRVANƏN OLUBLAR

Şəmlər sənin o çöhrənə pərvanən oloblar,
Hər əqli olan eşqdə divanən oloblar.

Ayla günəşi cəm eləyibdir sənə fələk,
Onlar belə bir şövqilə peymanən oloblar.

Pirlər ki, məni mən eləyib gənclərə daim,
Ancaq ki, sənin özləri məstanən oloblar.

Can gözlərini tikdi sənə, könlünü verdi,
Can, göz və könül hər üçü cananən oloblar.

Gördüm o qara gözləri, ovsunladı yarəb,
Əfsunilə onlar sənin əfsanən olublar.

Biganə bilib sirlərini, aşnalıq etdi,
Onlar ki, səni duymadı, biganən olublar.

Qonşu dedi ki, Şəhriyarım, sübh açıldı,
Qəmlər hələ fəryadilə həmxanən olublar.

## BİR GECƏ QƏMƏRLƏ

Gözün kor olsun, ey göylər, bu gün nazlı Qəmər burda,
Gecə ta sübhədək, bəh-bəh, xoşavazlı Qəmər burda.

Dilimdən söyləyin siz tez fələk qoy arxayın olsun,
Gəzib axtarmasın nahaq, qonaqdır ay, qəmər burda.

O xoş səcli gözəl qumru, təbiət qumrusu, bəli,
Tükənməz bir məhəbbətlə açıbdır balü-pər burda.

Yanır xəlvətdə bir şəm tək üzündən nur saçır daim,
Odunda yanmağa hazır durub pərvanələr burda.

Demə tək mən bu məclisdə özümdən bixəbər oldum,
Bütün aşiqlər olmuşlar özündən bixəbər burda.

Üzün görməkçün evlərdən hücum çəkmiş qonum-qonşu,
Divar üstdən durub bir-bir salırlar hey nəzər burda.

Həyat bir dərdi-sərdirsə, bu gün ya ki, qara zindan,
Bir anlıq da əgər olsa, keçir bir dərdi-sər burda.

Qəmər məfruni, ey İyrəc, sən ey nakam böyük şair,
Ayıl, dur gəl məzarından, maral gözlün gülər burda.

Onun ay çöhrəsin daim tutardı halətək tellər,
O tellər burdadır, burda tutulmuşdur Qəmər, burda.

Səhər lazım deyil əsla, günəş, durma yatağından!
Bu axşam ki, Qəmər burda, Qəmər burda, Qəmər burda!

## ARAZIN QAYIQLARI

Nəğməkar bülbül idim, düşdüm uzaq bağımdan,
Güllərimdən aralı qəlbimə ox vurdu tikan.

Çox təəssüf, tikana səhv eləyib gül demişəm,
Olmuşam indi, nə etmək, əməlimdən peşman.

Kəkliyi şahin əgər tutsa, bu bir adətdir,
Məni quzğunlara yem etdi bu nakəs dövran.

Gül göyərtməz günəşin nuru şoranlıqlarda,
Tərbiyəylə nə cürə əhl olacaq bir nadan?

Eşqə hörmət eləyin, səcdə edin meykədəyə,
Gələ bilməz bura məhrəm kimi hər bir insan.

Bu suyunda Kərəcin zövqü-səfa görməmişəm!
Kaş minəydim qayığa öz Arazımda bir an.

Dostların xatirəsi çıxmayacaq qəlbimdən,
Unudarmı çəməni, bülbülü həbs etsə zaman?

Şəhriyara, demə sən qəmlə ki, qəmxar hanı?
Göz yaşın tək belə bir yar veribdir hicran.

## İNDİ NİYƏ?

Gəlmisən, canım sənə qurban ola, indi niyə?
Düşmüşəm əldən daha, ey bivəfa, indi niyə?

Nuşdarusən, fəqət Söhrab ölüb, gec gəlmisən!
Eyləməz təsir ona heç bir dəva, indi niyə?

Mümkün olsa mərhəmət qıl, ömürlərdə yox vəfa!
Söyləmə mehmanına zövqü-səfa indi niyə?

Gənc idim, ləzzət alırdım, nazəninim, zülmdən,
Eyləyirsən söylə bəs cövrü cəfa indi niyə?

Bir şirin-söhbət üçün əydim önündə qəddimi!
Zəhrtək verdin cavab Fərhadına indi niyə?

Ey qara hicran, elindən bircə dəm göz yummadım!
Bəxtimi sən tutmusan bu laylaya indi niyə?

Asiman qıldı pərişan, halımı zar eylədi!
Qaldırıbdır qəhr ilə min bir bəla indi niyə?

Sən ki, gül hicrində, təbim, lal kimi xamuş idin,
Salmısan bülbül kimi şurü nəva indi niyə?

Sən Həbibsiz, Şəhriyarım, getməz idin heç yana,
Son səfərdir, tək çıxıbsan sən yola indi niyə?

## EY VƏFASIZ

Ey vəfasız, səni mən ta özümə yar elədim,
Gül kimi ömrümü saldım ayağa, xar elədim.

Əhdü peyman bizim, zövqü səfa özgələrin,
İnanıb andına əvvəl səni dildar elədim.

Kafir olsaydı əgər rəhmə gələrdi, gözəlim,
O qədər ki, sənə mən dərdimi izhar elədim.

Qeyr ilə həmdəm olub qəmlə məni yad elədin,
Səndən ötrü haımnı könlümə əğyar elədim.

Qoymusan nazbalışa başını, hardan biləsən
Ki, daş üstündə nə cür cismimi bimar elədim.

Ata dağiylə yanan körpə kimi dərdindən,
Ətəyində anamın odlu fəğanlar elədim.

Sırğanın dürrünə bənzər bu axan göz yaşımız,
Bu səbəbdən onu mən min dəfə təkrar elədim.

Dinləməz bir də fələk kimsə şikayət etsə,
Çünki fəryadım ilə artıq onu kar elədim.

Göz dikib mən qapma hər gecə ta sübhə kimi,
Aləmi öz başıma həsrət ilə dar elədim.

Şəhriyara, məni zülm ilə o, pamal etdi,
Ta öpüb yollarını, eşqimə sərdar elədim.

## ƏFSANƏ ŞAİRİ

Gəl bu hicran dərdini Nima, çəkək bir yerdə biz,
Həmfikir, həmdərd olaq, məskən salarsaq harda biz.
Qaf dağından son yol aç, mən bu kahadan, birləşək,
Eylə gülsün bəxtimiz, ayrılmayaq heç yerdə biz.
Eylədi gözdən bizi bu ərşə qalxan tüstülər,
Bir iştq tapsaq, yəqin ki, düşmərik bil, dərmə biz.
Bu çırağın nuruna nurlandı tək eyvanımız,
Qəsrlərdə şam kimi yandıqca qaldıq darda biz.
Od salıbdır sinəyə bir də pərişan şanələr,
Gəl pərişanlıq alaq bu şanələrdən burda biz.
Mən də səntək almışam əfsanələrdən ilhamı,
Düşməyək kaş ki uzaq ilhamdan, olsaq harda biz.
Verdilər eşqin camından qətrə-qətrə bizlərə,
Gəl quraq məclis bu rindlərlə xeyirdə-şərdə biz.
Bil ki, mərdlikdən deyil, döndərsək üz meyxanədən,
Çünki örnək olmuşuq, örnək olaq hər mərdə biz.
Gəl ki, bu meyxanəyə çökmüş sükutu sındıraq,
Heç rəvamı olmayaq sadiq belə tədbirdə biz.
Gizlidə gülmək gərək divanənin fəryadına,

Bil ki, bu hikmətlərə olmaz çəkərsək pərdə biz.
Dünyanın boynundakı muncuq da gildəndir, fəqət,
Ondakı mənanı çox müşküldü tapsaq zərdə biz.
Hər gözəl bil, tərif ilə yüksələ bilməz yəqin,
Özgə bir məna gəzək hər ləldə, hər gövhərdə biz.
Biz ki, bülbül olmadıq, bağ-bağçalarda gəzmədik,
Bəlkə viranlıq gəzək bayquş kimi hər yerdə biz.
Neyləyək, pərvanə tək yanmaqda aciz olumuşuq,
Şam olaq, matəm tutaq pərvanəyə gəl bir də biz.
Bu çəkilməz dərdlərə yadlar uzaqdan güldülər,
Dərdmənd olduq fəqət, hər dərdliyə, hər fərdə biz.
Körpətək vardır gülən, hər kəlməni hədyan sanan,
Gəl ki, bu nadanların dərsin verək şerdə biz.

## SƏNİN AYRILIQ GECƏN

Sən bahardan da gözəlsən, gözümdə bil, gözəlim,
Səni görməzsə açılmaz bu çəmən, çöl, gözəlim!
Qoyma hicrində ürək şan-şan ola, yalvarıram,
Gəl vüsalınla üzümdən bu qəmi sil, gözəlim!
Gözlərimdə qaralır dünya o qaşın kimi, bil,
Mənə şəkk eyləmə sən, şəkk eləmə gəl, gözəlim.
Tel-tel ağlar kamanım seyrə çıxa sərvi-rəvan,
Bəlkə çaylardı axar, yoxsa coşar sel, gözəlim.
Qızarar çöhrəni görcək necə də gör lalə,
Bənövşə, lalə kimi yox həyalı gül, gözəlim.
Hər baxanda utanar gözlərim əsmər üzünə,
Qara zülfün işığında gəzim el-el, gözəlim.
Kaş ki tərk eyləməsin ömrümü o qarə telin,
O qara tel çiləyər ömrümə nur, bil, gözəlim.
Mən nə çəkdimsə, o dan ulduzu şahiddi buna,
Yatmaram sübhə kimi, baxəbər ol, ol, gözəlim.
Gözlərimdən silinib surətin əsla getməz,
Sevgi ağlarsa, ovutmaz onu heç dil, gözəlim.
Bu rəvan təbimi gendən-genə duydun, bildin,
Onu hicrinə edərsən niyə bəs kül, gözəlim?

Yenə də qarə qaşın qəsdimə dursun, dözərəm,
Baxışınla günümü qarə elə gəl, gözəlim.
Şəhriyarın gözü dolsun yenə qoy yaşlar ilə,
Bu şəhərdə sənə mən bağlamışam bel, gözəlim.

## ŞƏHRİYAR VƏ KƏNDLİ

Hicrində sənin bil ki, könüldə qubarım var,
İndi görəsən, qəmlə dolu ruzigarım var.
Baxdıqca yola, düşdü tovundan bu gözlərim,
Vallah bu bəxtdən yenə də intizarım var.
Göz yaşları tökdüm, tükənib getdi ixtiyar,
Ömrü sənə verməkdə fəqət ixtiyarım var.
Gəl arzumu bir anda xəzan eyləmə, ey gül,
Bil ki, bu bahar yaşda mənim öz baharım var.
Şərimlə xəyalın yol açar sübhə mənimçün,
Öpmək üçün o saçlarını arzularım var.
Məstlikdə keçən vəslə necə vəsl deyim mən,
Əfsus yuxuda vəslini gördüm, nigarım var.
Gülüzlülərin torpağıdır lalə bitirmiş,
Sinəmdə yanan lalə kimi yadigarım var.
Çəkdikcə sığal saçlarına hey səhər yeli,
Tellərdə kamandan ucalan arzularım var.
Hicran gecəsindən nə danışdım şama, bildi,
Sənsiz gecədən sübhə gedən bir güzarım var.
Versə bu könül dünyama qüvvət, saçın verər,
Bil ki, saçının şəfqətinə etibarım var.
Hərçənd solub getdi mənim ömrümün yazı,
Gülüzlülərin eşqi kimi növbaharım var.
Hərçənd özümə Şəhriyaram, söyləyirəm mən,
Bir kəndli kimi qəmlə keçən ruzigarım var.

## DOSTUN SİFARİŞİ

Gəldi bahar, əlində çiçək gətirdi gəldi,
Naxış vurdu onlara rəng-rəng, gətirdi gəldi.
Bənövşənin, lalənin şeh yandı tellərində,

Güllərə zər naxışlı çələng gətirdi gəldi.
Gül gəlini güllərin ətirləndi, bəzəndi,
Nəğməsini quşların külək gətirdi gəldi.
Sərvlərin başında qumrular hey uçdular,
Quştar təranə dolu ürək gətirdi gəldi.
Səhər yeli dolandı bağçaları, bağları,
O, dərdli ürəklərə kömək gətirdi gəldi.
Çəmən-çəmən göy otlar boy atdı, dalğalandı,
Qönçələr də könüldə istək gətirdi gəldi.
Fərəhdən vəcdə gəlmiş bu çöllərə, düzlərə,
İnandım ki, şadlığı fələk gətirdi gəldi.
Dindirdi yaz yelləri körpəcə sünbülləri,
Sünbüllərə qızıldan köynək gətirdi gəldi.
Meh əsdikcə ürək də sevindi bu təmasdan,
Əfsus ki, yardan xəbər, o, ləng gətirdi gəldi.
Sinəm alışdı, yandı, taleyimə daş ağlar,
Nə gəldisə bəxtimə, fələk gətirdi gəldi.
Küləklər də Mahmudun məzarının tozundan
Ayazdan da bircə tel, örnək gətirdi gəldi.
Şahım, əfsuslar olsun o verdiyin fərmanın
Torpağıma mənim də şimşək gətirdi gəldi.
Tale qoymadı gülsün yazıq göyərçinləri,
Şahinləri ustünə sel tək gətirdi gəldi.
Şəhriyarın qəlbinin aynasına haqq özü
Ay üzlüm, bir sənin tək mələk gətirdi gəldi.

## XƏBƏRSİZ KARVAN

Gəldi karvan, nə deyim, könlümə həmdərd yoxdur,
Demərəm mən yenə də odlu məhəbbət yoxdur.
Soraq etdim, dedilər gəlmədi Yusif, əfsus,
Bu nə yoldur, qayıdıb gəlməyə fürsət yoxdur.
Bəxtimin ay üzünü görməsə karvan qalsın,
Getmək olmaz bu gecə, göydə ay əlbət yoxdur.
Mənə bir namə də yazmaz, bil, eşit, ey tanrım,
Deyə də bilməyirəm onda cəsarət yoxdur.

Oda düşmüş ürəyin biz harayından uzağıq,
Gah gülür tale üzə, gah da ki, şəfqət yoxdur.
Aynasında ürəyin mehr, vəfa yox, tanrım,
Bəlkə bu şan-şan olan sinədə qüvvət yoxdur.
Mənim o zülmətə düşmüş ayımı görsən əgər,
Fələyin nuruna üz tutmağa hacət yoxdur.
Bəxtimin şəminə gül taxtımı bəxş etmişdim,
İndi gül taxtı qalır, şahlığa rüsxət yoxdur.
Taxtı o sultanımın indi əyilmiş üfüqə,
Xeyməsində günəşin bil ki, kəramət yoxdur.
İstəyirdim ki, gedəm dostlarımın ardınca,
Bir xəbər gəldi ki, bu yolda zəlalət yoxdur.
Şəhriyar, kim qoşularsa bu ümid karvanına,
Bəxti dönmüşlərə heç yerdə inayət yoxdur.

## TUTİYA

Söylədin, baş götürüb cövrü cəfadan gedərəm,
Səni tərk etsə bu könlüm evi, nalan gedərəm.
Söylədin, cövrü cəfadan usana bilməyirəm,
Mən bəlanı edərəm dərdimə dərman, gedərəm.
Əhdini, ilqarım and yeri bildim, bilirəm,
Bu cəfakeş canı verrəm yenə qurban, gedərəm.
Müşki-ənbərdi, inan, saçlarmın ətri mənə,
Günahı yoxdu, saçın eyləsə fərman, gedərəm.
Həddi yoxdur işığa həsrət olan sevgimizin,
Secərəm meyxananı, rindliyə nalan gedərəm.
Şir kimi can ataram, can ataram arzuma mən,
Əjdaha ağzına da düşsə əgər can, gedərəm.
Sadiqəm sevgimizin Kəbəsi olmuş ürəyə,
Gedərəın quş kimi o Kəbəyə, olan gedərəm.
Hara getsəm orada hiss edərəm sən varsan.
Dönərəm mən küləyə, yolları asən gedərəm.
Son odunla yaşadarsan suyumu, torpağımı,
Harda olsan, olaram sinəsi şan-san, gedərəm.
Oduna, tüstünə həsrət eləmə mən yazığı.

Qürbətin tilsimi sınmazsa, nigaran gedərəm.
Doğma yerlərdə bu eşq ilə dolanmaq dilərəm,
Sevgimin zirvəsini alsa da tufan, gedərəm.
Məni endirsə küləklər, yenə də yüksələrəm,
Həmsəfər olmasa da mənlə o karvan, gedərəm.
De bu həsrət qəfəsində nə qədər can qoruyum,
Eşq tanrım təki versin mənə imkan, gedərəm.
Ey Xızır, təşnə olan qəlbimə yol göstər sən,
O həyat çeşməsinə bil ki, nigəhban gedərəm.
Şəhriyaram, güc alıb, qüvvət alıb eşqimdən,
Mən huma tək uçaram, sinəsi suzan gedərəm.

## DOST

Dərdə əlac eylə, dost, qoyma arzum kül olsun,
Yarəb, özün yol aç sən, yastığım yüngül olsun.
Zülfün olarmı, yarım, bu qürbətin əlacı,
Bu qubarı ürəkdən yumaz çay, ya sel olsun.
Məhəbbət görməliykən həsrət düşübdü bəxtə,
İstəməzdim mən bu fal gül açsın, hasil olsun.
Hər sevirəm deyənlər çıxmır, çıxmaz sınaqdan,
Eşqimdən dönmərəm mən, istər ay, ya il olsun.
Eşidin Şəhriyardan ötməyi, ey çiçəklər,
Nəğməmə səs verən də deyin ki, bülbül olsun.

## BÜLBÜLÜN NALƏSİ

Dostlarım, ağzımızı gör nə deyib bağladılar,
Bu gözü, ağzı olar fənd eləyib bağladılar.
O qəfəs küncü mənə and içirəm, rahət idi,
Bu gərilmiş qanadı sanki, əyib bağladılar.
Çəmənə yol eləsə, bağlamaq olmaz ayağı,
Quşların nəğməsinə qəm bələyib bağladılar.
İnana bilməyirəm, bülbülün ah-naləsini
Yasəmən güllərinə düyməläyib bağladılar.
İndi Çin ətrini hardan tapasan, sən alasan,

O xütən ceyranını bil ki, döyüb bağtadılar.
Əhd-peyman elədi qarğalar ilə güllər,
Bülbülün gözlərinə qum ələyib bağladılar.
Neçə huşyar tapılıb, dostlarımın qollarını,
Gözümü zülmət ilə sürmələyib, bağladılar.
Hanı el oğlu cavanlar ki, Vətən eşqi ilə
Yükünü sevgi, məhəbbət çiləyib bağladılar.
Hər döyüş vaxtı qılıncı kəfənin üstə qoyub,
Mərdi-mərdanə vuruşlar diləyib bağladılar.
Şəhriyar, doldu qara qarğalar ilə bağımız,
Bülbülün nitqini sus, dinmə, deyib bağladılar.

## AYIN KÖLGƏSİ

Mənim aydan da nurlu, nur selindən sərvətim vardır,
Bu bəxt aynamda ahımdan qutarmaz dövlətim vardır.
Qapında qalmışam, qallam, vəfalı qul kimi vallah,
Bilənlər bildi, şahımsan, yanında hörmətim vardır.
Dilimdə nəğmə, seyr etdim xəyalən göy çəmənlərdə,
Nə yaxşı, ahu gözlüm, tək səninlə ülfətim vardır.
Dönən namərd fələk mənlə oyunlar oynadı, bəsdi,
Başımda bu papaqdandır ki, ali qiymətim vardır.
O kirpik oxlarından da mənim bir zərrə qorxum yox,
Gözəllik padişahımdan tükənməz qüvvətim vardır.
Mənəm şahlar şahı dilbər, bu sevgi aləmində bil,
Hünərdə, sevgidə sonsuz, ilahi şöhrətim vardır.
Bu sevgi dünyamız bir də mənə yol verdi, xoşbaxtam,
Ucaldım, gördüm əfsus ki, bu yolda həsrətim vardır.
Ağırdır ayrılıq dərdim, ürəkdə qəm yüküm hədsiz,
Bu gücsüz canda bir gör ki, çəkilməz möhnətim vardır.
Özüm təqsirkaram, gərçi sinəmdə dərd-qubar bağlar,
Bu dərdi silməyə ahimlə ey yar, cürətim vardır.
Şeir şahiddi, şahiddi, məhəbbət ləl, cəvahirdir,
Sübuta ehtiyac olsa, əlimdə fürsətim vardır.
Kaman qaşlarını dilbər, xəyalım rəsm edər hər dəm,
Üzün görmək üçün hər gün zamandan möhlətim vardır.
Deyir ki, Şəhriyar, yarın camalı nurlu dünyadır,
O nurdan könlümün gör ki, evində sərvətim vardır.

## RUZİGARIN BƏDBƏXTİ

Aldı zülfün bil qərarım, qalsın onda yadigar,
Zülfün almış çün qərarım, qalmışam mən biqərar.
Ruzigarın əlləriylə ol pərişan zülflərin
Halımı pamal edib, olmuş pərişan ruzigar.
Qalmışam meyxanə küncündə xəyalınla sənin,
Mehrili bir cüt gözün camında olmuş aşikar.
Daşla az doy qapını, zahid, gəlib bir yaxşı bax,
Burda kuzə tez sınar, yoxsa ki, pəhriz tez sınar?
Gözləri tovdan düşər baxsa fələk bu ay üzə,
Gecələr qoymaz yatam sübhə kimi ayüzlü yar.
Qəlbimə çəkmiş hasar, zindana salmış tellərin,
Ey şahım, ey aycamallım, de, nədir böylə hasar?
Zülfünün sevdası aşiq qəlbimi bərbad edib,
Oldu asudə başım eşqinlə bil sərmayədar.
Ahu tək qaçdım cəmiyyətdən, dedim azad olum,
Ahuya bənzər gözün etdi məni məndən fərar.
Gəlməsən ölləm daha, yoxdur amanım cismidə,
Gözlərim yolda, özüm xəstə, könül də intizar.
Qış bahar olsun mənim qoy qəbrim üstə gəlməyin,
O pərişan zülfünün ətriylə dolsun ta məzar.
O cəmalın şövqünə ollam qəzəlxan mən yenə,
Çünki bülbül də qəzəlxanlıq edir fəsli-bahar.
Bil, qəzəldə Şəhriyar olmaq mənə bəs eyləyər,
Məndən özgə ölkədə yoxdur daha bir Şəhriyar.

## VƏTƏNƏ QAYIDARKƏN

Yenə qanadlanıram mən vətən havası ilə,
Necə qanadlanar hər quş bahar yuvası ilə.

Vətən sarı yeriyən qafilə dağı oyadır,
O şad xəbər gətirən zənglərin sədası ilə.

O doğma yurda yetişsəm, ürək də hiss edəcək,
Axı Xütən qoxuyur yurdumun havası ilə.

Ona şükür edirəm, yar ilə diyarə yetib,
Qovuşmuşam yenə də dostların vəfası ilə.

Vəsalət istəyirəm qəhrə getmiş eşqin üçün,
Necə ki, tövbəni rind sındırar rizası ilə.

Açıbdı bülbülə bənzər təbim yenə dəhənin
Ki, qönçələr açılar nəğmənin nidası ilə.

Nə xoşdu nəğmələrim birləşə bahar yelinə,
Çəməndə rəqs edə güllər onun səfası ilə.

Nədəndi gül şaxına qonmağa cəsarəti yox
O bülbülün ki, qalıb hicranın cəfası ilə.

Fəqət nə fayda ki, hər yerdə üzbəüz oluram
Bu hiyləgər fələyin mən yenə cəzası ile.

Köçüb gedən o əziz dostların yeri görünür,
Sədaları qarışıb çöllərin nəvası ilə.

Gətirdi oğlunu Kənana nalə ilə Yəqub,
Fəqət məzarda görüşdü oğul atası ilə.

Gözümdə qətrələnən yaş deyil, ürək qanıdır,
Əqiqə bənzəyir o, rəngi, həm bəhası ilə.

Bacılarım yığılıb dövrəmə bir halə kimi,
Necə ki, halə salar dövrə ay ziyası ilə.

İnan ki, Şəhriyarın qəlbdən qəmi silinər
Fəqət bu doğma, əziz torpağın dəvası ilə.

## GÖZ YOLDA

Neçün gəlməz təbibim, qalmaya könlümdə dərd pünhan,
Neçün döyməz qapım canan, yığılsın gözlərim yoldan.
Nə dərdimə olar dərman, açılmaz sübh, gecə zindan.

Bu hicranla keçən ömrü amandır, sayma sən asan.
Yarın ətrin gətirsə sübh yeli qoy canımı alsın,
Səhər vaxtı sönən şamtək verərəm canımı qurban.
Dəmirtək pəncənə sən də güvənmə çox da, ey səyyad,
Rəvadırmı bahar fəsli edirsən bülbülü nalan.
Səhər nərgiz gözündə şəbnəmə bənzər axan yaşlar,
Bunu dərk eyləyər ancaq gözündə nur olan insan.
Səhər meh əssə torpağa düşər şeh danəsi mey tək,
Bu bağda lalələr yanmışdır yaz vaxtında, bağtından.
O güldən də gözəl hüsnə nəzər salmaq nə müşküldür,
Tamam nazdır, tamam qəmzə, baxan insan olur heyran.
Məni öz oğluna dilbər, əgər irsən ata etsən,
Bu sevdada qazancım tək ata olmaq olar, canan.
Əgər söndürsə mehr ilə məhəbbət şəmini gərdun,
Mahaldır, söndürə bilməz hünər şamını heç dövran.
Əsər qoy Şəhriyar, sən də əgər cavidlik istərsən,
Cahanda kim əsər qoysa olar aləmdə cavidan.

## YARI YAD ETMƏK

Bahar olanda gəlir xatirimə yar mənim,
Oyadır xatirəmi şövq ilə bahar mənim.
Güləndə gün göy üzündə bulud tökər yaşını,
Ürəyim ağlayacaq anda zar-zar mənim.
Elə artar qəmimin, fəryadımın da sayı bil,
Özünə dərdli sinəm dərdləri bağlar mənim.
Gətirər sübh yeli yarımın ətrin, nə gözəl,
Yadıma bir də düşər ətri-zülfi yar mənim.
Görəndə laləni dağın döşündə, kövrələrəm,
Dağlı könlüm darıxıb gör nec ağlar mənm.
Yada düşdükcə nigarımla keçən günlərimiz
Gözlərimdə bu çəmən, gül də olar yar mənim.
Yaz da yaşıl geyinib, barlı olur bağlar da,
İlahi arzularım verməyibdi bar mənim.
Çəməndə bülbül ötər, gül görünsə gözlərinə,
Nədəndir güllər olur gözlərimdə xar mənim.

Nə xoşdu xəstə dəmimdə əgər gələ nigarım,
Yenə təbibim ola gözləri xumar mənim.
Kəsib məlamət ilə sultanım sözü, getdi,
Sanıbdı söhbətimi bəlkə də o ar, mənim.
Bu qönçə qəlbimi həsrət yamanca sarsıtdı,
Yenə açılmayacaq gəlsə yüz bahar, mənim.
İlahi, qaytar özün Şəhriyara nəğməsini,
Desin, baharda gələr xatirimə yar, mənim.

## ƏBƏDİYYƏT

Əbədiyyət nə zaman, harda təcəlla elədi,
O bizim ayinədə qəlbləri yəğma elədi.
Biz də şahid sayağı onda necə məğrur idik,
O da bu ayinəyə böylə tamaşa elədi.
Qəlbimin tüstüsü eşqiylə yanan oddandır,
Külə dönmüş sinəmi ayəti-sina elədi.
Müddəi atdı üzündən elə ki, örtüyünü
Eşqini saldı üzə məlumi-dünya elədi.
Sənilə aşina olmaq elə asan da deyil,
Gözlərin sirrini qaşlar açıb ifşa elədi.
Məst olub saqi ilə mən də şəbüstanda idim,
Sübh eşitdim ki, şərab kuzədə qovqa elədi.
O sədəf camın içində iri bir dürr gördüm,
Sanki zülmət gecəni ay yədi-bəyza elədi.
Ey kərəm sahibi, bu gövhəri kim verdi, dedim,
Dedi bu töhfəni bəxşiş sənə dərya elədi.
O ki, öz başmı şəmşirə verib xoşluq ilə,
Bizə şam oldu, fəqət sirrini ifşa elədi.
Külə dönmüş sinəsində şəmi pünhan tutdu,
Odlanan qəlbi yenə göz yaşı rüsva elədi.
Ürəfa məclisi idi bu ötən gün, orada
Hafizin şeri yenə mərəkə qovqa elədi.
Kipriyinlə tozunu sil bu sənət məbədinin,
Dərdinə, istəyinə bəlkə müdava elədi.

## BU SƏNSƏN, HAFİZ

Hüzuruna gəlmişəm, əl çəkməm damənindən,
Bəxtimə inanmıram, doğrudan bu sənmisən?
Dolanmışam Şirazı, düşüb əldən-ayaqdan,
Ayağına baş qoyub rahatlanım indi mən.
Kəbəndə savad aldım, ancaq ürək dedi ki,
Kəbəni görmək üçün bu səfərə çıx hətmən.
Müsəlmanlar, sinəmdə bu Kəbədən alov var.
Bu atəşə alışmaz qəlbi kafir bir bədən.
Ürfan kitabxanəsi kitablarla dolubdur,
Hafizin şerindədir, məhəbbətdən olan fən.
Bu torpağın altında Hafiz yatır, İlahi,
Niyə matəm səsinə qərq olmayıb bu gülşən.
Bu camıma şərab süz, pəhriz etmək hədərdir,
İçimdə atəşim var, pəhrız edim mən nədən.
Hafizin qəbri üstə dua etmək vacibdir.
O, səadət çətrini edib ömrümə yelkən,
Əziz tut öz canından, Şəhriyar, bu türbəti,
Müqəddəsdir səninçin Hafiz yatan bu mədfən.

## HAFİZDƏN SÖZ AÇARKƏN

Qiblə bildim haranı, mən səni gördüm, canan,
Qaşmı mehrab edib çünki əzəldən yaradan.
Üzünün xəttidi hər çöhrədə aydın görünən,
Aynanı saxlamısan pərdə dalısında nihan.
Zülflərin çiyninə düşmüş ipək örtük yerinə,
Topuğa tək uzanan qara saçındı, ya ilan?
Qəlb evində bataca bir baca var xəlvətdə,
Kuyinə bir cığır açmış ürəyim o bacadan.
Bunu eşq əhli olanlar hamısı yaxşı bilir,
Sənə eşqin qalasın almaq olubdur asan.
Qəlb evin yıxmağa çatmaz hünəri Əhrimənin,
Qala olmuş komanı məhv edə bilməzlər, inan.
O ki, bağlar qapını bil ki, sənin cadundur,
Qapını qırmağa tək səndə var ancaq imkan.

Su axan yerdə çinarlar ucalar, kölgə salar,
Tək sənin kölgənə həsrət çəkir hər aşiq olan.
Hər kimin var şərabı kuzədə, bil cənnəti var,
Mənə cənnət yolunu camdakı mey verdi nişan.
Sinədə olmuş o əfsanə, ya zərgər danasın
Qaşın ilə gözünün işvəsi etmişdi yalan.
Bizdə divanəlik üz versə də vardır səbəbi,
Zülfünün silsiləsində eləyib fitnə məkan.
Qocalıq dərdi soyutdu bədənimdə həvəsi,
Sən mənim eşqimə həm dərman idin, həm loğman.
Şəhriyar hardakı səndən söz açır, ey Hafiz,
Ləl kimi bil qızarır onda xəcalətdən hər an.

## İRƏCİN QƏBRİ BAŞINDA

Başını qaldır, ey İrəc, təzə dövran gəldi,
Çünki əmr oldu, sənin eşqinə heyran gəldi.
Söhraba töhfəsi Simurğ quşunun ləngidi çox,
Çox təəssüf ki, gec oldu ona səndan gəldi.
Sanki, səndən onun heç qorxusu yoxdur əsla,
Şir ölüb, meydanına körpəcə ceyran gəldi.
Qalx, bahar gəldi, təbiətdə yenə qovqa var,
Biz də pərvanə olaq, sevgiyə meydan gəldi.
Ruhum arxanca uçan quş kimi pərvaz eləyir,
Görürəm söhbət uzandı, boğaza can gəldi.
Sən də qaldırbaşını, torpağın altdan, İrəc,
Bu cavan nəsl məzar başına mehman gəldi.
Gec gəlibsə bu şirin üzrünü sən gəl qəbul et,
Çünkü üzr istəməyə indi bu imkan gəldi.
Bu günahın səbəbin sorma, həyatdan gəlir o,
İmkanı yox, bu əmrdən çıxa insan, gəldi.
Nəsimin laylayıdır, yoxsa neyin naləsidir,
Dinlə pəsdən, ya da zildən niyə nalan gəldi?
Gülzarın bülbülünə bənzəri vardır təbimin,
O behişt quşlarıtək etməyə tüğyan gəldi.
Tapşır eşq məktəbini Şəhriyara, ey ustad,
Deməsinlər bu məqama o da asan gəldi.

## EŞQİN İNTİQAMI

Meylin salıb ol mah, cəfakara özündən,
Qəlbin verib o indi dilizara özündən.
Hərçənd mənim tək ona min-mindi giriftar,
Olmuşdu giriftar, o giriftara özündən.
Çox qəlbi giriftarlara vermişdi cəfalar,
Axırda giriftardı cəfakara özündən.
O xəstə gülün çoxlu pərəstarları vardır,
Bax indi pərəstardı o, bimara özündən.
Durdum yolun üstündə onu bəlkə görüm mən,
Kimsə eləmişdi onu avara özündən.
Dünyada nə gül varsa gözümdə tikan idi,
Xar rast gələcəkmiş demə ki, xarə özündən.
Ey canım alan, ey büti-əyyar, sənə əhsən,
Çaldın, ürəyin rast gəlib əyyara özündən.
İnsaf deyil incidəsən sən o nigarı,
Rast gəlmədi çün canlar alan yara özündən.
Tapşır məni də sən ona bu eşqdə ancaq,
Qayil deyil o, çünkü vəfadara özündən.
Gördükdə şirin təbimi ol ləl dodaqlar,
Bənzətdi onu şəhdi-şəkərbara özündən.

## SÜRƏYYANIN ŞÖBƏDƏSİ

O qara gözlərini süzmə, gözün qurbanı,
Bir qıya baxmaq ilə məhv eləmə pünhanı.
Fitnəkar gözdə nə var, ay onu görcək gecələr,
Özünə məskən edər dalğalı bir ümmanı.
Sən özün, gül libasın, bir də o vəhşi baxışın,
Səbrini əldən alıb saqilərin pünhanı.
Zülfünü eylə kəmənd, sal kəhərin boynuna sən,
Ahular görsə yəqin tərk eləyər səhranı.
Ovlanır indi şəhərdə nə qədər nazlı maral,
Ver xəbər, çöldə marallar bilə bu dastanı.
Qalmayıb başda nədəndir daha eşqin havası,

Bəlkə o ahuların yoxdu buna imkanı?
Atdanıb eşqə nə ah çək, nə də tök göz yaşını,
Kim ki, haqq aşiqidir eşqin olar qurbanı.
Nəyə lazımdı qəbilə hamısı Məcnun ola,
Bəs edər bircə qəbilə sevə tək Leylanı.
Sən inanma ki, Züleyxanı unutmuş Yusif,
Qocalıq salmayacaqdır araya hicranı.
Fərqi yox, baxmayacaq olsa da Məryəm hətta,
Vamiqin axtaracaq gözləri bil Əzranı.
Yox Sürəyya kimi bu göz yaşını rəsm eləyən,
Ay ilə ulduzu rəsm eyləyən olmuş, bəs hanı?
Yetmişəm cənnətə bir gün, haram olsun, mən əgər
Özümə məskən edəm mən orada Tubanı.
Şəhriyar, sən də bizim dilbərə eyb axtarma,
Söyləmə sən o, fəramuş eləyib cananı.

## HAFİZİN FALI

Nə qəm məni tərk edər, nə də ki, gəlməz həvəs,
Heyranam ki, nə yaxşı kəsilməyibdir nəfəs.
Sən olanda nə qəm var, nə də ömrün əzabı,
Haray çəksəm hayıma tapılacaq dadirəs.
Evdə dərdi-sor olsa soruşarlar tez onu,
Ancaq ürək dərdimə ortaq olmaz bircə kəs.
Yoxsulları oğrular soysa təəccüb deyil,
Çəyirtkə toxumunu milçək yesə onda bəs?
Yusif quyuda qəmgin, ulduz ona söyləyər,
Karvan gəlir, görürəm, qəmgin olma sən əbəs.
Baharın sübh yelindən təbiət də oyanar,
Ətrafa ətir yayar təzə soğanla ədəs.
Qəfəsdə qalmış quşu azad etsən getməz o,
O yazıq adət edib, cəlb edər onu qəfəs.
Bu həyatın işləri şahmata bənzər inan,
Nə qədər güclü olsa fil etməz fərzi əvəz,
Sən ibrət bacasından başını çıxarıb bax,
Bir qədər getsən əgər qarşma çıxar Ərəs.

Göyün əyrisi altda zamanm selinə dal,
Gedən karvan fərqi yox bir gün dönər, ya dönməz.
Öndə də, arxada da birdir əsrin qatarı,
Eşq olanda deyirlər nə avand var, nə də tərs.
Gecə gedən divardan, ya əsadan tutacaq,
Gecə keşikçiləri qaldıracaq onda səs.
Çəməndəki gülləri bada verən dövranın
Süpürgəsi həyatda nə xar qoyar, nə də xəs.
Qaşqabaqlı oturma süfrəsində Tanrının,
Sanma ki, sən boş qalan yerə başqası gəlməz.
Gecənin zülmətində görüb Qüdsün işığın
Musa yenə yol gedər, vadidə qorxu bilməz.
Şəhriyar sübh zamanı Xacə ilə fal açdı,
Müjdə gəldi, Məsiha nəfəsidir bu nəfəs.

## SƏHƏR ŞANAPİPİYİ

Kim ayağın tozunu sürmə edər, əhsən ona,
Verərəm gözlərimi döndərə o, sürmədana.
Bülbülün nəğməsinə gözlərini açdt fələk,
Tutiya etmək üçün sən yenə düşdün yadına.
Heç olubmu görəsən kama çatan xoşbaxtlar
Düşünə nakamı da, çarə edə hicranına.
Çatacaqmı görəsən göydə müsəlla yerinə,
Asiman da yetişə Şərq ilə Qərbin dadına.
Hicranın təlxəyini bilməyir eşqin təbibi,
Müşkül işdir o çata xəstələrin imdadına.
Hikmətin sirrini nadan nə bilir ki, nə desin,
Biz kimi hey soruşa, hey yana hikmət oduna.
Şah odur ki, unudub taxtü tacı, səltənəti,
Harada olsa çatar rəiyyətin fəryadına.
Yığışıb el hamısı nifrət edir düşmənə bax,
Bu geniş qəlbli rindlər eləyir şükrü səna.
Düşmən ancaq bunu bilmir ki, bu dostun əməli
Tanrının əmri ile daxil olub qəlbə, qana.
Əsl sufi şəraba məstlik üçün meyl eləmir,

Məstlər guya içirlər şərabı sufiyana.
Bu kəramət ki, edirsən, o riyasızdır əgər,
Həsir ilə xalı mümkünmüdü bahəm dayana.
Asılan pərdədə ibrətlə dolu lövhə bizim
Eləyib sinəmizi xatirələrlə sinema.
Yıxılan bir kəsi görsən tut əlindən qaldır,
Bir bəla gəlsə gərəkdir dönə əllər həyana.
Şəhriyar, üzmə böyüklər qapısından əlini,
Odur imdad qapısı, çarə yox ondan o yana.

## EY ŞİRAZ

Səni gördüm ürəyim oldu aram, ey Şiraz,
Verirəm baş əyərək mən də salam, ey Şiraz.
Borcluyam çünkü sənə, indi xəcalət çəkirəm,
Borcunu verməmişəm çünkü tamam, ey Şiraz.
Sən mənim bəxtim olubsan, bunu Tanrım da bilir,
Yoxdu qəlbimdə mənim özgə məram, ey Şiraz.
Bağına, bostanına baxmağa gəldim bura mən,
O gözəl güllərinin ətrin alam, ey Şiraz.
Bilmirəm bağa baxım, ya çəmənə, ya çiçəyə,
Bu gözəllikdə çaşıb qalmış adam, ey Şiraz.
Bürünüb tazə gəlin tək yaşıla boylu çinar,
Söykəyibdir buluda başını şam, ey Şiraz.
Sənin hər kərpicinin, hər daşının tarixi var,
Keçmişindən mənə verməkdə pəyam, ey Şiraz.
Sərvlər sərv kimi qızlarına bənzəmədə,
O gözəllərdi verən sərvə inam, ey Şiraz.
Əsrlər keçsə yenə Sədini olmaz unudan,
Onu illər yaşadar sanki ənam, ey Şiraz.
Sədi şerində soyub sözlərin atmış qabığın,
Söz deyil, məna olub onda kəlam, ey Şiraz.
Hafizin içdiyi ləl rəngli o meyden nə olar,
İstərəm lütf edəsən, sən mənə cam, ey Şiraz.
O xorabatda ki Xacə oturarmış, mən də
Nə ola bir bucağında oturam, ey Şiraz.

Eşqdə yanmamışam, düz demir ariflər inan,
Sən yanar odsan əgər, mən hələ xam, ey Şiraz.
Yarı yanmış kimiyəm, heç xoşa gəlməz bu yəqin,
Gərək eşqimdə yanam mən də tamam, ey Şiraz.
Elə hakim deyiləm sözdə, çəkəm xəncərimi,
Söyləyəm, mən də bu meydanda varam, ey Şiraz.
Şəhriyaram, toza, torpağa boyandım yolda,
Xacə Hafiz qapısında qulamam, ey Şiraz.

## İQBAL VƏ MUSİQİ

İqbala olmuş idi sevgili yar musiqi,
Güllər açdı əliylə, oldu bahar musiqi.
Səsi qulaqlarımda əks-səda verər hey,
Sanki axar dağlardan bir abişar musiqi.
Ömrün xəzan çağında min bir fəziləti var,
Budaqlarda səslənir leylü nahar musiqi.
Sinəsində aynatək cilvələnir hər zaman,
Olub lalə yanaqlı, nazlı nigar musiqi.
Bulaq kimi çağlayan ürəyimin şövqündən
Lalə açıb eylə bil bir laləzar musiqi.
Tərəzidə qızıltək, gümüştək çəkmək olmaz,
Olmayıbdır onlarla çün həməyar musiqi.
Allaha and içirəm sənin nəğmələrintək,
Görməyib indiyəcən bir şahkar musiqi.
Orda şerin qartalı uçmağa imkan etməz,
Sənin mahnılarından məclis qurar musiqi.
Farsdilli şerlərin canıma od salıbdır,
Şahinləri ovlayan göyərçinvar musiqi.
Deyər ona himmətlə İqbalın bayrağını
Götürsün öz çiyninə o şahsuvar, musiqi.
Sənin iftixarına bu qəzli yazmışam,
Eyləyirəm bununçün mən iftixar, musiqi.
Nəsil-nəsil ruzgarın dönüb ağır yükünə,
Qaldı sənin üstündə bir yadigar, musiqi.
Sən əbədi yaşarsan, səndən sonra bərbət, saz

Məzarının başında ağlar zar-zar, musiqi.
Həsrətinə dözməyib ayağına baş qoyar,
Torpağından hər dəfə etsə güzar musiqi.
İnanmıram sənin tək bu sənət göylərində
Ya parlayan bir ülkər, ya ay doğar, musiqi.
Sənin səsin yazılmış səhifəni göz üstə
İftixarla qoyaraq təskin tapar musiqi.
Min-min şükürlər olsun, ancaq sənin sayəndə
Olmadıq bu həyatda biz şərmsar, musiqi.
Könül, uzatma sözü mehmandı bu məclisdə,
Bu Şəhriyari qəzəl, o şəhriyar musiqi.

## HƏYATIN ƏFSANƏSİ

Aşiqlər eşqdə udmaz, bunu aşiq olandan sor,
Fələyə əl aparmaqçün de kimdə vardır imkan, sor.
Cavanda iddia varsa, qocalarda peşimanlıq,
Gecənin məstini ancaq səhər xumar qalandan sor.
Qərarı yoxdu dövranın, necə gör biqərardrr o,
Bunu dostlar sinəsində olan dağdan, nişandan sor.
Soyuq daşlar kimi indi yatın siz də, ayıq gözlər,
Gecənin qanlı röyasın gecə bidar olandan sor.
Gözün, qəlbin qəmin bilməz inan mərdümgiriz insan,
Gözüm yaşımla qəlb ahım yağışdan sor, borandan sor.
Bu bəxtin dilbəri heç kəslə tənha qalmayıb əsla,
Nağıldır bu gəlin dilbər, bunu sorsan cahandan sor.
Günəş baş qaldırar hər sübh üfüqdə odlu köhlənlə,
Bu nurun ordusun sorsan fəqət sən o səvardan sor.
Fələk əymiş belim daim, pıçıldar astadan, xəlvət,
Cavansan, bəxtini ancaq zamandan, ruzigardan sor.
Rəqabət bağçasında bir fidan əksən bəhər verməz,
Məhəbbət bağına yol sal, bu işi bağıbandan sor.
Zaman viran edir hətta sarayi-təxti-Cəmşidi,
Bunu tarixdən öyrən sən, bizə miras qalandan sor.
O kərpiclər Cəmin camı, ya da İskəndər aynası,
Ya da Dara kimi şahdan, bizə qalmış nişandan sor.

Yenə də Xacənin şerin bu axşam yada saldım mən,
Keçib öz ordusuyla Zindəruddan yol salandan sor.
Ölüm hökmün fələk vermiş, bizə hər bir yaranmıştək,
Xəzanın lalə, nəsrinin bahar vaxtı tufandan sor.
Azadlığa məsəl olmuş qafın ardındakı vadi,
Əgər simurğu sən sorsan fəqət get o məkandan sor.
Camalın müddəilərdən həmişə gizlədib canan,
Soraq al xəlvət əhlindən, bu razı razdardan sor.
Fəqirin bəxtinə düşməz gedib Şiraza yetsin o,
Gəl onda Təbrizə, halım soruşsan, Şəhriyardan sor.

## YATMIŞ BƏXT VƏ OYAQ DÖVLƏT

Yar gəlibdir evimə, olmamışam evdə nədən,
Ev uçuldu başıma sanki, eşitdim bunu mən.
Məni xoşbəxt edəcəkdi gəlişiylə bilirəm,
Qayıdıbdır qapıdan, danlayacaq hər eşidən.
Bəxt yatıb, dövlət oyaq, öz qədəmiylə gəlib o,
Bir ömür mən yolunu gözlədiyim incə bədən.
İstəyirmiş ürəyimdən qəmimi bəlkə silə,
Mən silərdim ayağın tozunu görsəydim həmən.
Bu gəlişlə o ucaldıb başımı ulduzadək,
Bil qoyardım başımı təzim edib torpağa mən.
Sən də ey sübh yeli, şəmi-şəbüstana de ki,
Hicrana yandı canım, tüstüsüdür dağdakı çən.
Canımı hərraca qoydum, de, xiridan hanı?
Sənlə sevdada ziyan eylədim ey gül, bəs sən?
Ahunu şeri ilə ram elədim, Şəhriyarım,
Onu ram eyləməyim müşkül olubdur deyəsən.

## USTADIN TƏLİMİ

Qocalarda qaydadır, ötənləri yad eylər,
Ötənləri yad etmək ürəkləri şad eylər.
Cavanlarla oturmaq məhəbbətdən nişandır,
Sən bəlkə unutmusan, mənim qəlbim yad eylər.

Bu möhnətli könlümün bir küncün məskən etsə,
İnanıram yenə də o Behcətabad eylər.
Qəlbimin gözlərində eşqin köhnə pərdəsin
Yenidən bərpa etsə, bilirəm, Behzad eylər.
Bisütunda nəqşələr şirin-şirin dil açsa,
Deyər, nə etsə yenə bu dağda Fərhad eylər.
Bu koksümün altında qəribə bir aləm var,
Mən susub dayansam da, o daim fəryad eylər.
Ürəkdə həkk olanı ordan silmək mahaldı,
Məhəbbəti əbədi könüldə ustad eylər!
Başım ərşə ucaldı Rumlu Xacə şerilə,
Eşqimin hekayəsin "fe" ilə Fərhad eylər.
Xoşbaxtdır o ürək ki, bu tikanlı səhrada
Sərv kimi ətəyin tikandan azad eylər.
Torpağına, suyuna bu dünyanın bənd olma,
Ömrünün xərməninə od vurub bərbad eylər.
Məni də arif kimi bəxtim yaman aldatdı,
Nəğməmin sodasına o, dadü bidad eylər.
Başun kötük üstündə, ölüm aşın gözlərəm,
Görüm fərmanı icra nə zaman cəllad eylər.
Fələk qəhvəyi suda əks etməz, bu bəllidir,
Qələmdən şikayəti çün İbni-İbad eylər.
Hərakarlığın səfasın bilirsən ki, Şəhriyar,
Dostlardan Şeyx Bəhayi, bir də Mirdamad eylər.

## RUHUN NALƏSİ

Yamanca xəstə eylədi srxıb bu dar qəfəs məni,
Qocaltdı, saldı qüvvədən əzab, məni, qərəz məni.
Ayaqlarımda kündə var, canımda pərvaz eşqi var,
Çəkir öz arxasınca bax, o karivan, carəs məni.
Hücum edibdi üstümə, qoyub sinəmə pəncəsin,
Boğur bu qurda bənzəyən həyat məni, nəfəs məni.
Gətirdi ülvi göydən o bir parça qəndin istəyi
Bu tuti təbim, eylədi o milçəyə əvəz məni.
Mən sərv idim, budaqlarım gülə salardı kölgəsin,

Nədəndi möhtac eylədi kola, tikana bəs məni.
Deyil münasib eşq üçün suyu, havası bu yerin,
Axırda yandırar yəqin bu odlu ah, həvəs məni.
Qəmimdən özgə bir kəsi bu yad məkanda görmədim,
Kimə deyim bəs dərdimi, tanımayır bir kəs məni.
Çıxmaz bu yerdən Şəhriyar, səsin, fəğanın bir yana,
Gərək kəmənd edib telin ayım, çəkə o tez məni.

## YUSİF EHSAN EVİNDƏ

Qəlbinin əmri ilə yanıma canan gəldi,
Ömr edib qəlb döyünəndə təzədən can gəldi.
Süfrəyə lalə gətir, gül gətir, ey könlüm, o ay
Gül kimi üzdə təbəssüm mənə mehman gəldi.
O qoca Yaquba dünya yenidən cənnət olub,
Çünki Yusifdi onu eyləyən heyran, gəldi.
Heyranam ol kəsə ki, aldı o peymanə ələ,
Canü dildən edərək əhdinə peyman gəldi.
Boynuna qol dolayıb, zülfünü mən aldım ələ,
Sanki çovkanla topu vurmağa imkan gəldi.
Bir qəzəl yazdını o dilbər yara mən bəndə kimi,
Sultanımdan cavabımda mənə fərman gəldi.
Üzünün şöləsi düşdü ürəyin səhnəsinə,
Gündüz ay doğdu, işıqlandı bu zindan, gəldi.
Başıma hər nə gəlib zülfi-pərişanı edib,
Yenə də saçlarım etdi pərişan, gəldi.
Özü bilmir ki, nələr çəkdim onun hicrində,
Məni divanə edən, etməyə divan, gəldi.
Tanrının lütfüdü insanlara bu şeir demək,
Şəhriyar, bu ki, bu nemət sənə hardan gəldi.

## SAZ VƏ YANĞI

Çalgınan, qəlbimə od salsın o sazın bu gecə,
Dinləyim ağlayaraq sazın, avazın bu gecə.
Çaldığın sazda ötən mən yazığın naləsidir,
Həm mənim var gileyim, həm də o sazın bu gecə.

Ürəyim quş kimi köksümdə yenə nalə edər,
Saz ilə eylə bəyan razi-niyazın bu gecə.
Sazının pərdələrində nə qədər sirr yatır,
Açasan sirlərin bəlkə bir azın bu gecə.
Bu yanan canıma, ey şux, gül üzün şam kimidir,
Aşiqin yandı, şama açmadı ağzın bu gecə.
Çəkərəm nazım ta ki, yetişəm məqsədimə,
Çəkmərəm əl, nə qədər olsa da nazın bu gecə.
Vəslinin şövqü edibdir mənim, ey nazlı nigar,
Təbimin bülbülünü qafiyəsazın bu gecə.
Şəhriyardır bu gələn, gözdən axan yaşına bax,
Ver bu eşq sayilinin sən də murazın bu gecə.

## YOLUNU AZMIŞ ŞAHİD

Yol azıbsan nədi, ay üzlü nigarım, gəldin,
Yox, yola gəldim, inan səbrü qərarım, gəldin.
O qara gözlər ilə bir nəzər et ağ saçıma,
Soracaqsan hanı bəs, fəsli-baharım, gəldin.
Həsrətim bir quyudur, düşmüşəm indi quyuya,
Təzə aytək doğaraq son, havadarım, gəldin.
Mən hələ ölməmişəm bil, quyuda var nəfəsim,
İstəsən ayinə tut, ayinədarım, gəldin.
O sitəm astanasından bu dağın başınadək
Öpərəm gəldiyin o yolları, yarım, gəldin.
Sənə şahlar sarayı layiq ikən, ey gözəlim,
Yox bu yoxsul komada dam-divarım, gəldin.
Sinəmə sığmır ürək, istəyirəm şir kimi mən,
Qoparım nərə ki, ey ahu-şikarım, gəldin.
Səni gördükdə günəş hüsnünə heyran oldu,

Salama gəldi səni, qəddi-çinarım, gəldin.
Dinimə səndən əgər gəlsə zərər, qorxum yox,
Üzr də istəmirəm, dar-nədarım, gəldin.
Şəhriyar, təbrik edim qoy bu təzə eşqini mən,
Şükr elə, söylə yarım, dövlətü varım, gəldin.

## ZAMANIN SAQİSİ

Hicrinin gəldi qəmi könlümü bir gün sorağa,
Lalənin qəlbini dərdim boyadı qarə dağa.
Gözümün yaşı axıb hər yana ki, oldu rəvan,
Unudub qəmli qəmin, qəlbimi gəldi sorağa.
Ümidim tazə gül açmaqda idi qönçə kimi,
Xəzan oldu hamısı, doldu sinəmdə bu bağa.
Zamanın gərdişi saqim olaraq, əldə qədəh
Qanla dolmuş qədəhi başladı o paylamağa.
O gözəl üz ki, gözümdə çırağa bənzər idi,
Qeyb olub döndü gözümdə yenə sönmüş çırağa.
Zülfünün ətri ki, əvvəl mən ilə munis idi,
Sonradan qan qoxuyub, saldı özündən uzağa.
Sənlə xoş günlərim olmuşdu, unutmam onu mən,
Tapşıra bilmərəm o günlərimi mən fərağa.
Şəhriyar, indi gülün soldu, düşüb torpağa o,
Bir də dağ çəkdi bu dağ lalədəki köhnə dağa.

## ŞÖHRƏTİN ZİYANI

Əcəldən istəmədim mən aman, cahanda qalım,
Mən eşqə verdim ömür ki, dedim qoy onda qalım.
Çün ölmək ilə çıxar can bədəndə zindandan,
Mən eşqə verdim ömür ki, yenə də canda qalım.
Bu ölmək ilə dirilmək əcəb hekayətdir,
Qələt deyilsə əgər, daima cahanda qalım.
Naz ilə tərk elədim tuba aşiyanı nahaq,
Rəvamı torpaq olum, bir kiçik məkanda qalım.
Mən eşq çeşməsinin içmişəm həyat suyunu,
Qalım həmişə babarda, nə ki xəzanda qalım.
Həyat çeşməsinə pərdə saldı Zülqərnəyn,
Qocaldı Xızr əgər, mən gərək cavan da qalım.
Çün illər ilə süründüm bu tənha guşədə mən,
Dedim ki, kimsəsizəm, bəlkə binişan da qalım.
Şəbüstana salaraq mehrimi, məhəbbətimi,

Nəzər dəyər deyirəm bəlkə də, nihanda qalım.
Tökülsə başıma daş-törpağı dedim zamanın
Buna da razıyam imkansa laməkanda qalım.
Çalışmadım çəkilim şöhrətimlə xəlvətə mən,
O üzdə dostluq edəndən də mən amanda qalım.
Günəş doğunca sənin, Şəhriyar, şamın yansın,
Səhər o quşlar ötən nəğmədə, fəğanda qalım.

## DOST GÖRMƏDİM

Ozüm kimi qarabəxt tanımıram cahanda,
Qara baxtın əlindən gün görmədim bir an da.
Dostuma söyləməkçün qəlbimdə çox sözüm var,
Əsil ürək dostunu gəzib tapım hayanda?
İndi ümid gözüylə baxmağa bir kəsim yox,
Ümid gözü kor olar, ona tənə vuranda.
Sığındımsa hər kəsə, məni saldı qəfəsə,
Vohşi quştək qalmaram dən səpilən məkanda.
Dostum, əlim çatmayır mənim vəfa əhlinə,
Salamımı yetir sən o kəslərə, çatanda.
Biryarpağam, nəsibim şimşəklərin qəzəbi,
Heç özüm də bilmirəm niyə yarandım onda.
Səhər yeli, yavaş əs, mənə inayət eylə,
Yarpaqtək titrəyirəm sən əsdiyin zamanda.
Külə dönüb sovruldum, göz yaşımın odundan
Qara torpaq od tutub, şölə çəkib yananda.
Günah insan üzünü əgər qara edirsə,
Qara üzlü kəslərə Şəhriyaram cahanda.

## SOYUQ DƏMİR VƏ İSTİ AH

Heç bilirsənmi nə iş tutdun sən,
Nə bəla çəkmişəm hələ səndən?!
Mən vəfa eylədim, cəfa gördüm,
Sən görübsən fəqət vəfa məndən.

Nə əzab olsa mən dönən deyiləm,
Zülmünü gəl azaltma bəndənən.
Soyumaq bilməyən bir atəşsən,
Yumuşalmaz soyuq olan ahən.
Torpaq olsam külək sovursun qoy,
Ayağın altına düşüm hərdən.
Nəfsin ilə vuruşmağın xoşdur,
Sən də ol öz-özüylə cəngə girən.
Mən iradətlə gördüm hər işimi,
Sən dönük çıxdın eşqdə de, nədən?
Yara vursan da məlhəmim sənsən,
Dərdə düşsəm elə sən o dərman edən.
Məni az sanc, sən ey şirin bulağım,
Naz elə, naza olmusan məskən.
Ürəyim odlanır, yanır, kül olur,
Ürəyin buz kimi soyuqdu nədən?!
Ey qızılgül, payız döyər qapını,
Bil, xəzəltək solub saraldım mən.
Qorxuram ki, o qurduğun tələyə
Gün gələ onda sən özün düşəsən.
Şəhriyar sənlə cəng edə bilməz,
Sən pələng məğlub etmisən, əhsən!

## KÖHNƏ DOST

Bilirəm, tutmayacaq bir də qumarım sən ilə,
Oyuna girmək üçün yoxdu dinarım sən ilə.
Kim azad olsa, o təşviş eləməz tövbə üçün,
Mən ki, dərviş babayam, indi nə karım sən ilə.
Məst olan vaxtda mənim camıma mey tökməmisən,
Dərdi-sər olmaya ta sübh xumarım sən ilə.
Götürə bilməyirəm çiynimə düşmüş yükünü,
Üstəlik istəmirəm olsun azarım sən ilə.
Yanmadın sən otağımda mənim, ey nurlu şamım,
Qalmışam xatirələr, bir də nigarım, sən ilə.
Nə gül oldum, nə də bülbül bu könül bağında,

Silinib getdi inan, bağü baharım sən ilə.
Ya gül olsun, ya tikan, birdi mənimçün sənsiz,
Yoxa çıxmışdı tamam gül ilə xarım sən ilə.
Köhnə dostlarla, tanışlarla əlaqə hələ var,
İstəyirsən qırıla köhnə qərarım sən ilə?
Nə bilirsən bu qoca başda məhəbbət yoxdur,
Gəl özün gör ki, yenə aşiqi-zarəm sən ilə.
Köhnə əhd, köhnə vəfa cümlə qalıb canımda,
Dəyişilməz yenə də köhnə qərarım sən ilə.
Nə varımdır hamısı zövqü səfadır, onu bil,
Sən vəfa eylə, qala darü nədarım sən ilə.
Yükümü bağlamışam, vardı yükün, ver aparım,
Gedirəm, təki qala yari-diyarım sən ilə.
Diri idim, mənə bu həbsdə şam olmadın, heyf,
Ulduz ol, bəlkə işıqlandı məzarım sən ilə.
Şəhriyar, kimdi sənin əhdini yaddan çıxaran,
Dağıl ey şəhr, əgər olmasa yarım sən ilə!

## NAKAM NALƏ

Get-get, ey türküm, daha məndən məhəbbət gözləmə,
Salımsan gözdən məni, gözlətmə, ülfət gözləmə.
And nədir, peyman nədir, yadlara meyl etmək nədir,
Bir könül ki, qırmısan, ondan sədaqət gözləmə.
Bir belə zülm eyləməz kafər də, qorxar tanrıdan,
Bir qiyamətdir bu dərd, qeyri qiyamət gözləmə.
Qəlbimi qarət qılıb, dürdanələr verdim sənə,
Göz dikib talan olan evdən də qarət gözləmə.
Nazbalışlar üstünə baş qoydun, ey məstanə yar,
Daşlar üstə baş qoyanlardan xəyanət gözləmə.
Ah ilə yandırmışam öz qurduğum kaşanəni,
Gözlərimdən bir daha hüsnünə heyrət gözləmə.
Həm atamdan, həm anamdan ayrı salmışdır fələk,
Yar da getmişdirsə, baxtımdan şəfaət gözləmə.
Göz yaşımdır daşqaşın, haqsız qan eylər göz-qaşın.
Dünyada bundan savay şahanə ziynət gözləmə.

Ruzigarını döndü məndən, sən də döndün, ey təbib,
Mən şəfa möhtacıyam, ah çəkmə, şəfqət gözləmə.
Sübhümü kipriklə acdım, açmadın dərvazəmi,
Ey könül, əğyar olan yardan səadət gözləmə.
Yar gedən yollarda toz qaldırma bunca, Şəhriyar,
Qismətin qəmdir sənin, bir ayrı nemət gözləmə.

## BABİL CADUSU

Nə vaxt ki, cilvələndin sən, çəməndə sərvsən, gülsən,
Nə vaxt ki, nəğmələr saçdın, bahar şeydası bülbülsən.

Sənin yaqut dodağından uçan türkü bir əfsunmuş,
Şirinləhcə, şirincəhcəh, şirinavaz, şirindilsən.

Qaşın Rüstəm kamanıymış, saçın bir Zal kəməndiymiş,
Kamanınla, kəməndinlə can aldın, əhli-Babilsən.

Tökülmüş yasəmən tellər, dodağın qönçəsin örtmüş,
Gülüş qonmuş dodağınla qızılgülsən, qərənfilsən.

Məgər ki, şəhri-Babildə camalın cadugər olmuş,
Nə Babil sən olan yerdə, əcəb əfsuna qabilsən!

Təxəyyüldən saray qurdum, ona hüsnün çıraq oldu,
Xəyal pərvanəsi, uçma, yetişsən vəslinə - külsən!

Düşüb sübhün nəsimitək bu xalqın meyli ardınca,
Doluxsunmuş baxan gözlər, uzaq bir səmtə mayilsən.

Əlac olmuş əzəl gündən səbr, təmkin sevən qəlbə,
Üzün görsən yanar səbrin, könül, gör sən nə qafilsən?!

Çəməndən qalxar avazın, susar quşlar, həsəd eylər,
Dönər pərvanəyə bülbül, qaranlıq içrə qəndilsən.

Sözüm gülqənd, sinəklər də pay almşdır bu nemətdən,
Şəkərdən qaçma, ey tuti, nolar şerim şəkər bilsən.

Neçin divanəsən, könlüm, ilan saçlar xəyalıyla,
Dolanmaz boynuna bir dəm, qəmə, hicrana qayilsən.

Nə tapdın, Şəhriyar, göylə, ay-ulduzla bu söhbətdən,
Görərsən ki, lüt-üryansan, əgər qəflətdən ayılsan.

## XOŞLƏHCƏ TUTİ

Gözəllikdən mətahım yox bazarıma gələsən,
Qorxursanmı gözüm dəyə, nəzərimə gələsən.

Ahu gözlüm, kəməndinə özüm saldım özümü,
Şikarınkən aldanasan, ah-zarıma gələsən.

Lalə, nəsrin bitirmişdir yenə təbim gülşəni,
Nə zamandan həsrətdəyəm gülzarıma gələsən.

Qalxanımdır sülh-səfa, qılıncımdır məhəbbət,
Öldürəsən, yol salasan məzarıma, gələsən.

Ovçuluğun şərti bumu: hamı düşsün toruna,
Pünhan yerdə tor qurasan güzrıma, gələsən.

Təzə şeir nüsxəsiylə gəldim, dərman dilədim,
Təbəssümlə sən verəsən azarıma, gələsən.

Eşqin ilə gündüzümü döndərmişəm gecəyə,
İstəmirəm yanan vaxtı qızmarıma gələsən.

Göz yaşımla şerin şəkər qamışını bitirdim,
Şux tutimsən, rəhm edəsən öz yarına, gələsən.

Doluxsunmuş yaz buludum, yolun gözlər Şəhriyar,
Qoşulasan dağdan əsən ruzgarıma, gələsən.

## DODAQ

O gecə ki, mən sorurdum qənd o yarın dodağıdan,
Göz yaşımı qəndlə içdim şux nigarın dodağından.

Dodağıma yetib indi dodağından ayrı canım,
Bir xoş xəbər eşidəydim xəbərdarın dodağından.

Sözün ki, can qiyməti var, qafil olma, dəli könül,
Söz almırsan, can alırsan bir qəmxarın dodağından.

Nə vaxtdandır öpməmişəm o qızılgül yarpağını,
Gül eşqiylə çox öpmüşəm tikanların dodağından.

Düsdüm hicran soyuğuna, ürəyimdə dərd ocağı,
Qara saçın tez ağardı vaxtsız qarın dodağından.

Həsrətinə can verməərəm, ümid varsa vüsalına,
Ölüm hökmü yoxdur hələ sitəmkarın dodağından.

Xəlvət gecə ikilikdə qəzəl dedik, gülqənd yedik,
Sanki şəbnəm səpilirdi ilk baharın dodağından.

Mən qocalmış bir ağacam, kəsilməmiş fəqət barım,
İçmişəm öz bar suyumu o novbarın dodağından.

Ayrılanda saçlarının ucu dəydi dodağıma,
Daddım hicran zəhərini cüt şahmarın dodağından.

İxtiyarım yoxdur mənim onsuz köçəm bu dünyadan,
Adı düşməz mənim təki ixtiyarın dodağından.

Qəzəl xoşdur hər oxuyan ondan dodaq şehdi içə,
Daha xoşdur eşidəsən gülüzarın dodağından.

Külək oğru an kimi bal qaçırmış ondan yəqin,
Çox eşitdim tərifini xoş rüzgarın dodağından.

Nə olsun ki, Çin müşküylo qara saçlar sığallanır,
O dodağın ətri getməz Şəhriyarın dodağından.

## DƏNİZ AYI

Pərişanam, sevdiyimin Rəştə getmək həvəsi var,
Şümşadımın diyar-diyar güzar etmək həvəsi var.

Dərya kimi gülmək istər, açsın alnım qırışım,
Axır Bəndərpəhləviyə gedib yetmək həvəsi var.

Mavi dərya, bəyaz bədən, əlində tas, göy də ayaz,
Çimə-çimə gah görünmək, gah da itmək həvəsi var.

Qara saçın kəməndiylə dara çəkib şəhərlini,
Naz və cilvə şəməndiylə çöldən ötmək həvəsi var.

Göy tanımaz dəryadakı yırğalanan ay qayığı,
Ayparamın göy dənizdə sərqi etmək həvəsi var.

Səkkiz bağlı behişt qızı, yeddi dərya gözüm yaşı,
O səkkizlə bu yeddinin eybin örtmək həvəsi var.

Ey Şəhriyar, təzə ili şimiylə, güllə qarşıla,
Ay üzlümün bəlkə dönüb dada yetmək həvəsi var.

## BALACA ƏSGƏR

Səndən ötrü mən istərəm lap şah ətəyindən tutam,
Bir çətinə, dara düşsən, Allah ətəyindən tutam.

Səni bu cür böyüdənin dolanam başma gərək,
Gah-gah əllərindən öpəm, gah-gah ətəyindən tutam.

Arzum budur amm oxu düşməninə dəysin sənin,
Hədəfinə yetsin deyə mən ah ətəyindən tutam.

Papağında "Şiri-xurşid" şəkilli bir düymə də var,
İşin düşsə mən hazıram padşah ətəyindən tutam.

Sənə xətər toxunmasın bu qorxulu, qanlı yolda,
Gəlmişəm sübhə yalvaram, sabah ətəyindən tutam.

Qıymaram qara yellərə başındakı bir tükü də,
Pənah ola tale sənə, pənah ətəyindən tutam.

Ulu Tanrı, dərgahından bu cavana bir qapı aç,
Şəhriyaram, əhd eylərəm dərgah ətəyindən tutam.

## HUŞUM GEDİR

Yol üstəsən, sənin ilə fikrim, ağlım, huşum gedir,
Gözəl Nuşin, dərdin qalır, mənim eyşi-nuşim gedir.

Xəyal sənə bənd olalı gözlərimə zülmət çökür,
Qonub o zərif çiyninə mavi könül quşum gedir.

Karvanbaşı, qocalmışam, karvanını aramla çək,
Çəkirəm dünya dərdini, çiynimdən qurğuşun gedir.

O xumar gözdən ayrıldın, ayrılıq sərxoşu könül,
Car olur həsrət gözümdən, bu leysan yağışım gedir.

O gənclik karvanındadır, mən qocalıq karvanında,
Ürəyimdə bahar eşqi, saçlarımda qışım gedir.

Ağlım deyir dönə-dönə: əl çək ondan, ey ağılsız,
Qulağıma girmir bu söz, dəng oluram, başım gedir.

Beynim elə qarışıqdır, şeir deyə bilməm daha,
Çaylaq daşı qalır mənə, dürdanəm, daşqaşım gedir.

O bir sənət pərisidir – təbim nazm çəkən pəri,
Açılıbdır sir pərdəsi, həmdəmim, sirdasım gedir.

Bu yamanlıq nədir belə, niyə qoyub gedir məni,
Göylərə ucalır ahım, fələyə qarğışım gedir.

Mənim ömür sarayımdan sən çıxdığm gündən bəri,
Sanki İskəndərim gedir, sanki Dariyuşum gedir.

Xatirən yar oldu mən, özün əğyar olma ban,
Ömürdən nə qalıb daha, dost-aşnam, tay-tuşum gedir.

Daha sızlatma qəlbini, zülm eyləmə Şəhriyara,
Yonulmuşdur məzar daşım, günüm keçir, yaşım gedir.

## PAYIZ

Qopdu yenə tufanları payızın,
Yol üstədir karvanları payızın.

Məlakələr dərmiş gülü, çiçəyi,
Daşqaş tökür ormanları payızın.

Nazlı bahar boşanmışdır ərindən,
Yollar kəsir dumanları payızın.

Külək qovub qara bulud gətirir,
Selə dönür leysanları payızın.

Yer islanır aşiq gözü yaşından,
Yaman olur hicranları payızın.

## CƏMŞİDİN PİYALƏSİ

Aldığım hər bir nəfəs hər dəm onunla canlanır,
Yoxluğu varlıq olan aləm onunla canlanır.

Şadlığıyla öldürüb, qəmlə diriltdi könlümü,
Dünya qəm dünyasıdır ki, qəm onunla canlanır.

Kəbəsi aşiqlərin saf qəlbidir ay üzlümün,
Qəm də Kəbə daşıdır, Kəbəm onunla canlanır.

Gözlərim şəmi sozaldı, qətrədən buldum həyat,
Zəmzəmə bənzər gözüm ki, nəm onunla canlnımr.

Canımız dünyaya bir damlayla bağlanmış müdam,
Bir qızılgüldür, bəli, şəbnəm onunla canlanır.

Bu qədim çesmə başında bir qədəh nuş eylə sən,
Güc onunla canlanır, ərdəm onunla canlanır.

Baxma torpaqdan yaratmış Tanrı insan oğlunu,
Eylə bir naz sərvidir, İrəm onunla canlanır.

Eşqdir ilham ilə dövr etdirən dünyamızı,
Tanrısı qəlbim olan ölkəm onunla canlanır.

Bu sairlər təbinin sehrini bilmək istəsən,
Hər sözüm, hər söhbətim, kəlməm onunla canlanır.

Rumi ney vermiş sözə, şeyx Nizami qəmli çəng,
Ruhudur şərqin əzəldən, Cəm onunla canlanır.

Bir şahənşah admı dünyaya car etmiş bu cam,
Eylə ad ki, ən qədim dirhəm onunla canlanır.

Başə çıxmışdır müdam əhli-kərəmlər badəsi,
Ziynət, izzət, mərifət, görkəm onunla canlanır.

Tanrı çəkmiş bu camalın, bu cəlalın nəqşəsin,
Hər ocağın istisi, hər şəm onnnla canlanır.

Öz ölümsüz dünyanı dərk et ölümdən sonra sən,
Şəhriyar, şəkk eyləmə, kölgəm onunla canlanır.

## DOST, YOXSA CAN DÜŞMƏNİ

Ürəyim türfə gözəllər ilə seyranı sevir,
Bu nə candır, canıma düşmən olan canı sevir.

Sirrə bax ki, ürəyim eşq oduna yandıqca
Şad olur, xeyrini bilmir, elə ziyanı sevir

Yar mənə düşmən olub, dadıma yet, ey Tanrı,
Nə könüldür mənə verdin, o da düşmanı sevir.

Könlümün güzgüsünü sildimi eşqin gəlini,
Aşiqin qəlbi açıqdır qəmə, mehmanı sevir.

Qocalarla həmişə ixtilata meylim var,
Ürəyim gəncdir ancaq, gözü ceyranı sevir.

Kamana döndü belim ahım oxun atmaqdan,
Neyləyim, sevdiciyim ox ilə kamanı sevir.

Ey gözüm, kor olacaqsan bu oyaq qalmaq ilə,
Bəxt oyanmır yuxusundan, o da röyanı sevir.

Qəlbimin sazı könül sirrini faş eyləməsin,
Qocalar eşq oduna yanmağı pünhanı sevir.

Hansı bağban əlidir dünyanı gülşən eləyən,
Etibar qalmaz o bağbana ki, xəzanı sevir.

Tələsir yanmış ürək – hövsələsiz quşcuğazım,
Qalmamış səbri daha, fəryadı, fəğanı sevir.

Şəhriyar canlar alan sərvi-rəvan heyranı,
Sərv ayağına tökür yaş ki, o, leysanı sevir.

## TABLOÇƏKƏN

Daha gülşən tərəfə şövq ilə pərvazım yox,
Qanadım olsa belə uçmağa heç arzum yox.

Qoy çəmən quşları min bir yuvadan səslənsin,
Yuvası yanmışa dəymə, səsim, avazım yox.

Nə bu sazdan, nə bu sözdən könül aram olmuş,
Həvəsim qalmamış heç bir şeyə, dəmsazım yox.

Get, a nazəndə müğənni, apar öz tarını da,
Gedib artıq şüurum, şur ilə şahnazım yox.

Nəfəsim dəysə saza bir quru çöptək alışar,
Sinəmin dağları üstündə dinən sazını yox.

Ey bizimlə həmişə nazü niyaz bəhsi çəkən,
Qailəm taleyin hər verdiyinə, nazım yox.

Yenə qəmlər neyinə odlu nəfəs ver, könlüm,
Ağ olursan üzümə, qafiyəpərdazım yox.

Bu da eşqin qələmi, diqqətimə xət çəkdi,
Lövhələr çəkməyə şövqüm, qələmim, yazım yox.

Hamıdan mən ki, seçildim uca yoxsulluqla,
Məni inkar eləyər təb, desəm almazım yox.

Dəydi izzət ayağım eylə hərəm qəsrinə ki,
Hörmət, izzət ümidiylə göyə murazım yox.

Könlümün aynası hərdən tutular ahımdan,
Şahidim sənsən, a ceyran, olar-olmazım yox.

O kitabın ki, mənəm əvvli, həm də axırı,
Qaralıb, şum-şum olub, xam çölüm, yazım yox.

Şəhriyaram, qonaram quş kimi köhlən belinə,
Bil ki, ovxarlı qılıncam, demə sərbazım yox.

Fitnə qılsa sənin eşqin, cilovu döndərsəm,
Qoca şair düşər atdan, təbi-şahbazım yox.

## VURĞUNLUQ

Mən ki, rindəm, dolu peymanələrin vurğunuyam,
Yenə məstəm, gözü məstanələrin vurğunuyam.

Aşiqin şöhrəti və izzəti rüsvaylıqdır,
Mənəm aqil ki, bu divanələrin vurğunuyam.

Ay üzün haləsini çəkdi bu rindanə könül,
Qəlbi sevda dolu rindanələrin vurğunuyam.

Bu sərv qamətinə məclisimiz səcdə qılır,
Sən kimi sevgili cananələrin vurğunuyam.

Çırağı hüsnün imiş əhd-vəfa qəsrimizin,
Oda yanmış dəli pərvanələrin vurğunuyam.

Saçmın uclarıtək hərcayidir məst ürəyim,
Yurdu anmam daha, viranələrin vurğunuyam.

Hansı Şirin gözəlin böylə şirindir dodağı,
Mən də Fərhad kimi mərdanələrin vurğunuyam.

Kaş ki, şahmar saçın bir dolana boynumuza,
Vəslin əfsanədir, əfsanələrin vurğunuyam.

Bənzəyir kəc fələyə, daşlara vur minam,
Sanma göy rəng ilə kaşanələrin vurğunuyam.

Şəklini gördü qədəhdə gecə meyxanə piri,
Gözəl əfsun ilə piranələrin vurğunuyam.

Dodağın şəhdini çəkmiş sözü bu Şəhriyarın,
Noğul olmuş belə dürdanələrin vurğunuyam.

## ŞÖVQ BAZARI

Onu yad eyləməzdim vəfadar olmasaydı,
Oda yanmış ürəyi mənə yar olmasaydı.

Aramızdan əzəllər bir qətrə su keçməzdi,
Necə xoşbəxt olardıq kəcrəftar olmasaydı.

Ona vəfasızlığı öyrədə bilməzdilər,
Dost bildiyim düşmənin gözü dar olmasaydı.

Bir vüsal ümidiylə ürək yandı, sızladı,
Eşidərdi naləmi, bəxtimkar olmasaydı.

O zamanlar qoca qəm tanımazdı qapımı,
Şadlıq qədri bilməzdim o qəmxar olmasaydı.

Bir səhər köçdü getdi, yarından keçdi getdi,
Dərd çəkmirəm, deyərdim saçım qar olmasaydı.

Qəlbim onun yatağı, oyaq gözüm keşikçi,
Dərdim neydi, ürəyim tarımar olmasaydı.

Eşqin əsarətini bilməz hicran çəkməyən,
Yox olmazdıq, bu dünya yoxdan var olmasaydı.

Şövqün öz bazarı var, eşqin mətahı dolu,
Dünya buza dönərdi bu bazar olmasaydı.

Belə göz bağlamazdı qoca Şəhriyar sözü,
Əgər Səba sazında ah-zar olmasaydı.

## GÖZ YAŞI ARXI

Xəbər yox mehribanımdan, ömür namehriban keçdi,
Könül keçməz o dilbərdən, zaman keçdi, yaman keçdi.

Qanadlanmaq xəyalıyla dolandım bağda, gülşəndə,
Yoxuymuş vaxtın insafı, bahar keçdi, xəzan keçdi.

Ömür qoydum, can incitdim boranlı, qarlı yollarda,
Dilimdən min bir ah qopdu, ürəyimdən fəğan keçdi.

Keç, ey qafil, gəl od vurma güzaran tapdığın mülkə,
Bu mülkə od vuran kəslər olu tüstü-duman, keçdi.

Şahənşah olma, ey dostum, tamah zindanına divtək,
Nağıldır Rüstəmi-Zal ki, o yeddi asiman keçdi.

Qorunsun, xalq üçün qalsın həyatın bəhrəsi-barı,
Bu sevdayla xəyalımdan müzəyyən bir cahan keçdi.

O gözlər ki, xumar baxdı, gözümdən qanlı yaş tökdü,
Qıraqdan köksümə baxsan görərsən yandı can, keçdi.

Küsənmiş nərgizəm, boynum bükülmüşdür yol üstündə,
Baxıb rişxənd ilə güldü, yanımdan ərğəvan keçdi.

Neçin qarğayə tapşırdı məhəbbət bu gülüstanı,
Didərgin şeyda bülbüllər gül üstən bağrıqan keçdi.

Amansız, qansız ovçuydu, güzərgahlarda tor qurdu,
Dağılmış aşiyan qoydu, əlində ox-kaman keçdi.

Cihazım, qumrovum yoxdur, ömür səssiz keçir, yarəb,
Oyanmır röyadan bəxtim, düzüldü karvan, keçdi.

Vəfasız dünya şövqüylə varından keçdi ihamım,
Sənin mülkündə memardı, yaratdı xaniman, keçdi.

Gözüm yaşından arx açdım, saralmaz söz gülüstanı,
Nə fayda Şəhriyar ağlar, baxıb sərvi-rəvan keçdi.

## ƏTƏKDƏN TUTAN TİKAN

Gəlməz ay üzlümüz, ah, ev mənə zindan oldu,
Evdə hər kim var idi qəlbi pərişan oldu.

Boyamış meydanı Söhrab yarasından qan axıb,
Gecikib nuşdarı, yer ilə yeksan oldu.

Ətəyindən yapışıb yoxsa tikanlar gülümün,
Təbimin şaqraq ötən bülbülü nalan oldu.

Mən kimi yolçusu var zövqü səfa Kəbəsinin,
Kim kəsib yolları, Allah, ürəyim qan oldu?!

Girə salmışdı bizi türfə qəzəl qafiyəsi,
Andım ahu gözünü, müşkülüm asan oldu.

Məni qəm süfrəsi doydurdu, ilahi, bu gecə,
Önümə şəfqət ilə pay çəkən hicran oldu.

Ömrü son mənzilinə çatdıracaq intizan,
Üz çevirdim fələyə, möhləti bir an oldu.

Kipriyi tikmə tikən iynə kimi dümdüz idi,
Neylədim, kipriyi ox, qaşları kaman oldu.

O xumar gözləri kiprik oxuna ram olmur,
Qara pəncəylə saçı ov tutan aslan oldu.

Eşqimin sehrinə bax ki, məni qoymur qocalım,
Onun hər xatirəsi cismimə bir can oldu.

Təbimin şahsuvarı qəlb ovuna çıxmazdı,
Şəhriyara ahular məskəni meydan oldu.

## İNSAN MƏQAMI

Dərunimi işıqlat, ey görünməz ruhani,
Ey qəlbimin, gözümün əbədi çıraqbanı!

Ucalığın ucası papağıdır dərvişin,
Taki sultan taxtına baş əydirmə dünyanı.

Meyxanə qapısında neçə ki, dayanmışam,
Qapıçı götürmərəm meyxanəyə sultanı.

Eşqimin qanadını fələk damına gərdim,
Məlakə həsəd ilə duysun ulu sevdanı.

Yalnız müdriklər ağlı dirilik şərbətiylə
Sağaldar hər cahili, ayıldar hər nadam.

Bu dünya bazarını gəzdim canım ovcumda,
Şadlıq ucuz, qəm baha, taraz tərəzi hanı?!

Hər xaqan yadigarı bir müdhiş xərabədir,
Mədain xütbəsini car çəkmirmi Xaqani?!

Boyunbağı düzmüşdür boğazıma göz yaşı,
Bu yağış havasında tor gördüm asimanı.

Sevinc yaşlarım ilə yusam qəm qubarını,
Bəqa çeşməsi çıxar, suvarar bu cahanı.

Gecənin quyusıından qoy çıxsın bədr olmuş ay,
Gül səpsin üfüqlərə, bəzəndirsin hər yanı.

Ayrılıq gecəsində göz yaşı tökən şamım
Dedi: sükut diliylə vəsf eylə yaradanı.

Dünyanın barısından gecə gizli qapı aç,
Dərgahına yetişsin məhbusların fəğanı.

Zöhrəmin ətrafında sürüsünü otarır
Camalı nur saçan ay-ulduzların çobanı.

Bu tufan körfəzindən xərac alasan gərək,
Sahildir xilaskarın, sinənlə yar dəryanı.

Ürfan nəğməsi deyir Allah vahidliyindən,
O böyük Xacə Hafiz süsləndirir ürfanı.

Hafiz taxtına çıxan sərmayəsiz Şəhriyar,
Tənəzzüfə düşməsin bu şeir xanədanı!

**ŞÖVQ KARVANI**

Səməndini səyirdərək toz qaldrıb gəldi yarım,
Göz yaşımla tez yuyuldu ürəyimdən qəm-qubarım.
Kipriyimi yumub səpdim qədəminə sevinc yaşı,
Neylər mənə hicran qəmi, yanımdadır qəmküsarım.

Canda canım qalmamışdı, canım gələn nigar imiş,
Qurbanlığım olmasa da, baş ucaltdı şux nigarım.

Dizimdə taqətim vardı düşəm dilbər ayağına,
Gözümüzündə qalmışdı, əlindəydi ixtiyarım,

O gül üzdən uzaq yolun qubarım yumaq üçün
Gözlərimdə bulud kimi doluxmuşdu intizarım.

Boynuma qol saldı vüsal, yoxa çıxdı qəm kölgəsi,
Qaysaq tutdu sinəm dağı, loğman imiş cəfakarım.

Gündüzlərim üzündəydi, gecələrim saçlarında,
Belə gecə-gündüz ilə bəxtiyardı ruzigarım.

Cismim oda tutulduqca şimşək çalan ağac kimi,
El yüyürsə nə faydası, təkcə odur xilaskarım.

Çıraq tutdum yollarına sevdalanmış gözəllərin,
Qəm çəkmərəm, bu yollarda sona yetsə son güzarım.

Sərv boylu gözəllərin kölgəsində can dirçələr,
Əksiltməsin bu kölgəni başımdan pərvərdigarım.

Göyərçinim, ha deyirdin bu fəryadm faydası yox,
Görürsən ki, bar gətirdi fəryadlarım, dualarım.

Kor taleyin hər cövrünə bir dağ kimi tab eylə sən,
Bəxtiyar ol, ayparatək sən də qalma bəxti yarım.

İnsanlığın meyarıdır ümid, qorxu, bir də rica,
Qorxu qoruqçu olmasa oğurlanar ümid barı.

Yarəb, salam yetirsin qoy nigarıma səhər yeli,
Salamımdan şad olsa yar, abad olar yar diyarı.

Yaddan çıxmaz o günlər ki, məclisimin çırağıydı,
Şirin-şirin xatirələr gül üzlümün yadigarı.

Şair Sayə kölgəsində nurlanmışdı üzlərimiz,
Ucaltmışdı başımızı Nadirpurun şah vüqarı.

Şir ovlayan bir ovçuydum mən ki, sənət ovlağında,
Fəqət burda yar gözünün boynuburuq bir şikarı.

Müşiri ki, çoxlarını şahmat ilə mat eylədi,
Üzündədir bu şairin həm xəzanı, həm baharı.

Tənəli bir təbəssümlə söyləyirdi Məftun gözü:
Nə şəhəri xoşlayıram, nə şəhərli Şəhriyarı.

## MƏLƏYİN MÜJDƏSİ

Səhərin ağ müjdəsini gətirmiş bir mələk bizə,
Xoş avazlı hüma quşu bağışlar ağ lələk bizə.

Çərxin davarını sağır Zöhrənin çobanı məgər,
Süd şüalar bir töhfədir göydən şəlalətək bizə.

Ağ pərinin dərgahından qaçmış qara div ordusu,
Al geyinmiş Süleymanı göstərəcək fələk bizə.

Allaha yaxın qocanın kamanından çıxan oxlar
Uçur çərxin billurundan, gətirir min dilək bizə.

O xərabat qocasına sübh çağında müjdə verin,
Kəhər atlı piri-muğan bir azdan gələcək bizə.

Məsihadır yoxsa Qüdsün nütfəsindən yaranmışdır,
Nəfəsiylə can gətirib, o vermişdir ürək bizə.

Hərçəndi, gec gəlməyindən bağrım qana döndü mənim,
Hər tükündən nur saçılan qızıl aslan gərək bizə.

Daha pünhan qala bilməz nə xeyir, nə şər əməli,
Küdurətin küp qarısı gələ bilməz kələk bizə.

Onun qızıl nizəsinə hədəf eylə öz sinəni,
O, bir şəfa şahmarıdır, təbib olsun gərək bizə.

Ən bilici mühasibdir, ən bilici müəllimdir,
Hesab, ürfan aləmində odur əzəl örnək bizə.

Qoca fələk öz çarxını arzumuzca fırladacaq,
Kainatın rəhbərindən xəbər verir şimşək bizə.

O vaxtdan ki, qəlbimizi verdik eşqin sevdasına,
Göründü hər iki dünya puçluğuyla gerçək bizə.

Əgər saqi bir içimlə salırsa ayaqdan bizi,
Bir içimdə həyat verir, iylədir gül-çiçək bizə.

Bizi heyran qoya bilməz kainatın bəzəkçisi,
Şəhriyarın yaratdığı olacaqdır bəzək bizə.

## YAŞAYIŞ

Çəkmişəm əllərimi süfrəsindən həyatın,
Yığmışam gözlərimi töhfəsindən həyatın.

Tale qonaqlığında qan içmisən, ey ürək,
Şaxta duydun həmişə nəfəsindən həyatın.

Bir gülər üz ğörmədim axıradək dünyada,
Göz yaşım selə döndü hiyləsindən həyatın.

Başıma bir sayə sal, sən ey ölüm mələyi,
Canım qurtara bəlkə məhbəsindən həyatın.

Karxanalar, mədənlər naləsinə qulaq as,
Ağızlar qan əndərir silləsindən həyatın.

Vaxtsız düşən bir uşaq məhəbbət şivənidir,
Canda bir can məhv olur tənəsindən həyatın.

Olum həyatsa əgər, ölüm qorxusu nədir,
Qurtaran yoxdur hələ tələsindən həyatın.

Ölümlə keşməkeşdə ürək bir qəhrəmandır,
Qəddimiz kaman olur şələsindən həyatın.

Həyat bizimdir deyə güvəncimiz nahaqdır,
Bir ümman dərdimiz var giləsindən həyatın.

Sarvanı ölüm olan bir karvan içindəyik,
İblislər zahir olur kölgəsindən həyatın.

Dünyanın həyanıdır elm, ürfan, mərifət,
Daşdır, arxayın olma pilləsindən həyatın.

Eşqin qoca təbibi dərdə çarə bulmadı,
Sağ çıxmağa ümid yox çilləsindən həyatın.

Başım üstə Nuh kimi dayanmışdı o təbib,
Can qayığım batırdı hæmləsindən həyatın.

Cəhənnəmdə cəhənnəm intizarı çəkirik,
Ölüm həyat istəyir köləsindən həyatın.

## HAFİZ BARGAHI

Nədir gecələr məni zülmətə çağıran səs,
"Oyan" deyib astadan xəlvətə çağıran səs?!

Münacat çəkənlərin yanğılı dodağıyla,
Hafiz bargahına - sərvətə çağıran səs...

Açılmaz tilsimi var onun şeir sazının,
Aça bilmir tilsimi heyrətə çağıran səs.

Ruhunu mələklərin qanadında ucaldır
Qüds aşiyanından cənnətə çağıran səs.

Zöhrənin ilham sazı coşğun təbindir,
Hafiz, öz qəlbinin səsidir qüdrətə çağıran səs.

Orda ki, yar camah mələklər dilindədir,
Fələkdənmi ucalmış söhbətə çağıran səs?!

Hər başa yaraşarmı şerin iftixar tacı,
Könüllər naləsidir şöhrətə çağıran səs.

Hafiz mədhi gərəkdir qafiyəçi bülbülə,
Onun öz avazıdır vüsətə çağıran səs.

Fələyin gərdəninə girdiyi vaxt Ay gəlin,
Çatır dan ulduzuna ülfətə çağıran səs.

O yerdə ki, ilhamı möcüzələr yaratmış,
Bizi məktəbə səslər sənətə çağıran səs.

Hər kəs ki, yaraqlanıb ölməz Divanın ilə,
Onu qorxuda bilməz qəflətə çağıran səs.

Sürmə nazını çəkməz, öz nazı var nərgizin,
Gözələ ziynət deyil ziynətə çağıran səs.

Bu gecə eyvanına ulduz yağır, Şəhriyar,
Qoca Şirazdan gəlir vəhdətə çağıran səs.

## ORUC SINDIRAN

Elə ki, mən oruc tutdum, xurma gələr bazara,
Üzülmüşəm, sonum çatar tutulsam bir azara.

Qəfəsimin qapısını açan olmaz baharda,
Onda qapım açarlar ki, xəzan düşüb gülzara.

Oyaq gözlər kiprik altda min hekayət danışar,
Ahu çıxsa göy çəmənə, şir də çıxar şikara.

Nə qızılgül istəmişəm, nə də lalə baxtımdan,
Boz taleyə n söyləyim mən bozara-bozara.

Əl və əmək alətləri pıçıldayır təbimə:
-Sənətinlə bazar açsan, qalacaqsan avara.

Bu torpağın ürəyindən nalə qalxır anbaan,
-Bir gül idim, tez dərildim, əsir düşdüm qəddara.

Batdı həya gülabına pardaxlanan qızılgul,
Tifil üzü gülsün deyə könlüm düşüb ah-zara.

Nərgiz gözü nigarandır, lalə köksü dağlıdır,
Ay da, gün də dərd çəkir ki, iqbal dönər idbara.

Bulud çəmən günlərinin başı üstə ağlayır,
Çünki güllər xəzəl olur, əsir düşür rüzgara.

Şəhriyarla şeyda bülbül verib yenə bas-başa,
Orucunu sındır daha, nəğmə ara, söz ara!

## DAĞILMIŞ SƏDD

Sular coşub çağlayır, dörd yanımız selabdır,
Qışqır, ayılt qonşunu, aləm qorxunc sərabdır.

Bütün varlıq dağılır, uçub qopur kökündən,
Qarğışdır, hıçqırtıdır, iniltidir, əzabdır!

Qara bulud içində titrər ay məqbərəsi,
Ley tutub göyərçini, hər anı iztirabdır.

Suya qərq olmuş amal, suya dönüb ürəklər,
Bəlkə də bu lövhənin yerliyi tünd şərabdır.

Su üstündə rəqs edər dəhşətli əhrimənlər,
Pəncəsindəki qandır, üzündəki niqabdır.

Allahdan sormaq olmur nədir bu müsibətlər,
Allahın da cavabı məzəmmətli cavabdır.

Küfr, nifaq selidir, qisas alır dünyadan,
Dağılmış sədd ayəli, surəli bir kitabdır.

Yetişib o zaman ki, soruşasan tanrıdan,
Nə səbəbdən Quranın hər ayəsi xitabdır?!

Fitnələr zənciri var boynunda bu dünyanın,
Günaha batdığından xərabədir, xərabdır.

Beyəti sındıranlar üz tutub Şama sarı,
Zülmət vadisi boyu qaçlıaqaç, çaphaçapdır.

Bir tərəfdə hamı cəm, bir tərəfdə didərgin,
Ey qismətləri bilən, bu necə haq-hesabdır?!

O şiri-nər ki, çıxdı ormanların qoynundan,
Qarğalar məclis qurur, aslan bağrı kababdır.

Bu vilayət şahmın qəlbi inam nöqtəsi,
O da ki, su üzündə bir köpükdür, hübabdır.

Xərabəlik anası ağrı çəkib, şer doğur,
Xeyir oyanmır hələ, bu da bir inqilabdır.

Bu dünya dağılsa da, sən qəlbimdəsən, ey şux,
İlahəsən, dar gündə səni anmaq savabdır.

## ŞİRNİYYATÇI TUTİ

Sən ki, rəna bir gülsən, mat qoymusan şümşadı,
Ey uca boylu xurma, yandır sərvi-azadı.

Baxtımız gəlini Ay güzgüdə rəqs eləyir,
Vüsal şamını yandır, gözdə qoyma muradı.

Mən bu qoca vaxtımda sənə verrəm tacımı,
Cavan baxtm Allahdan pay almış istedadı.

Tor quran ovçu çoxdur azad könlüm quşuna,
Ovla qaşınla məni, ey ovçular ustadı!

Yel vurar qara telin ağ üzdə lövhə çəkər,
Ey Xosrovun Şirini, nakam qoydun Fərhadı.

Söhbət şirin, söz şirin, dodaq şirin, dil şirin,
Şirniyyatçı tutisən, mətahındır qənnadı.

Pərilər ətəyində böyütmüş bəlkə səni,
Necə yaraşır sənə ay üzlü gəlin adı,

Özün nurlu şersən, sübh asılmış üzündə,
Cən şerimi sevəli şirindir sözün dadı.

Unutsam da dünyam, unuda bilməm səni,
Özün verdin ey mələk, təbimə bu qanadı.

Axaram göz yaşıtək, düsərəm ayağına,
Məzarımın üstünə qoyma bədxahı, yadı.

Qocalıq tufanları yıxar ömrüm qəsrini,
Dağdar, viran olar, dərin deyil bünyadı.

Şəhriyar çeşməsindən ayrdsan, ey gül üzlüm,
Yandıracaq dünyanı ah-naləsi, fəryadı.

## AYRILIQ MƏŞQİ

Eşqin əzablarına öyrədir hicran məni,
Div ayrılıq eyləmiş qanıma qəltan məni.

Ay üzlüm, tanrı şahid, vəfasız olsam sənə,
Andımız eyləyəcək yer ilə yeksan məni.

Ayrılıq qılıncımn tiyəsi başım üstə,
Nalədən kam almağa çağırır dövran məni.

Hicran şagirdiyəm mən, tapşırıq dəftərim var,
Müsibət müəllimim eylər imtahan məni.

Bəlkə də şair təbi ayrılıqdan yaranmış,
Bu pərdənin dalında görərsən nalan məni.

Şəfa qılmadın mənə, ey daş ürəkli təbib,
Eşqin cəfakeşiyəm, sağaltmaz dərman məni.

Saçların kəməndinə özüm könüllü düşdüm,
Biryolluq verim sənə, incitməsin can məni.

Bu tamah iblisinə qulaq assam incimə,
Gözəllərin qəlbinə etmiş hökmüran məni.

Torpaq eşqi fələyin fərmanına baş əyir,
Özünə Allah eylər gecə asiman məni.

Ucaldar eşqimizi göyə tanrı camalın,
Bu yollarda görərsən yorulmaz sarvan məni.

Qayığım gözəl aydır, qızd buludlar avar,
Qular kimi üzürəm, çağırır ümman məni.

Ayrılıq sərxoşuyam, sözlərimdən incimə,
Şəhriyaram, bu sayaq yaratdı cahan məni.

## YARIN BELƏ FİKRİ VAR

Yenə dindirdi məni tənəli bir naz ilə yar,
Süzülən göz-qaş ilə, incimiş avaz ilə yar.

Hər ota, hər çicəyə, yarpağa paylar gülüşün,
Bülbülə zülm eləyir, düşmən olub yaz ilə yar.

Getsə də qəlbi, gözü axtarar həsrətlə məni,
Qorxuram fikr çəkə, tellərıtək nazilə yar.

Görməmiş lalə dağı faləyanaq el gözəli,
"Olar"a bəli demir, nazlanır "olmaz" ilə yar.

Belə rəftar eləməz eşq ilə yansa ürəyi,
Çalmamış həsrətini yanğılı bir saz ilə yar.

Gəzir azadə küləklər kimi, almır sözümü,
İki dünyanı alar mən verən almaz ilə yar.

Mən ədalət yolunun carçısıyam zülm çağı,
Başa düşsün də, öyünsün belə ecaz ilə yar.

İstərəm ki, qoşa görmək diləsin Şəhriyarı
Qocaman mürşüdümüz Hafizi-Şiraz ilə yar.

## KUZƏÇİ KUZƏ QIRIĞEVDA SU İÇƏR

Yar xətti yar dodağından hər nəfəsdə su içər,
Sanki ceyran sürüsüdür, dəstə-dəstə su içər.

Qalx ayağa, sərv qəddin üfüqlərə ucalsın,
Yaxşı, yaman əzəl gündən kökü üstə su içər.

İnsaf eylə, dodağını dodağımın üstə qoy,
O dirilik bulağından təşnə xəstə su içər.

İskəndər də o çeşməni tapar qoca Xızırtək,
Qoşunundan daldalanıb, asta-asta su içər.

Qapar pəhriz kasasını qoca sarvan şuxluqla,
İpin qırmış dəvə kimi basabasda su içər.

Boğazından qəhərini udmaq istər dərdlilər,
Bir qıraqdan baxan deyər: nə ahəstə su içər?!

Düz fal açdım: kəsik neydən bu bəlağət tarlası
Cana gələr, min arzuda, min həvəsdə su içər.

Göz yaşıyla suvanlır eşqin körpə fidanı,
Çiçək açan xurma şivi - boyu bəstə su içər.

Hər qismətə göz yumaraq qaranlıqda gördüm ki,
Yar gözündən ürəyimdən kecən səs də su içər.

Şəhriyarın ürəyini qırıb naşı kuzəçı,
İndi kuzə qırığında o növrəstə su içər.

## FƏNA KÜNCÜ

Sinəndə gizlət başını, dünyada səfa tapasan,
Tamahına xilaf çək ki, Allahdan şəfa tapasan.

Qıfıllansın ellərində haq və ədəb xəzinəsi,
Qapısını o vaxt aç ki, ağıllı qafa tapasan.

Oyaq ol ki, məhdud ağıl və hikmətlə keçməz işin,
Yatsan, dünya hikmətini gərək röyada tapasan.

Nə bilikdir əxz etdiyin, onda ürfan qüdrəti yox,
Dostum, elə qapı döy ki, dərdinə dəva tapasan.

Sən cəhalət röyasında mərifətin hüsnünü gör,
Fənada bəqa görəsən, bəqada fəna tapasan.

Pas bağlamış bu dəstgahı başdan-başa dağıtmadan,
Bu fırlanan cərx altında inanma vəfa tapasan.

İztirabdan doğulmuşdur bu gördüyün təbəddülat,
Nə nağıldır, nə ixtilat, çəkmədən cəfa tapasan.

Peyğəmbərin çəkdiyini duya bilsən qəlbində sən,
İnanıram, ürəyində nuri-övliya tapasan.

Qəza-qədər qapısının həlqəsini çala bilsən,
Tanrı qoymaz bu fələkdən bir ağır bəla tapasan.

Sən də bir qayna, cuşə gəl, misin dönsün saf qızıla,
Zənn eyləmə tor tökmədən belə bir kimya tapasan.

Dərin quyunun dibindən ay-ulduz yaxşı görünür,
Görünəni düz görməsən düşünmə bəqa tapasan.

Hər açarla açmaq olmaz mərifətin qapısını,
Dırnaqla yol açıb gərək çıxasan Qafa, tapasan.

Sənət zövqü kamalını mənada axtar, Şəhriyar,
Nə istəsən bu eşq ilə çıxasan safa, tapasan.

## MƏKTƏB AYI

Məktəb məni yorub daha, usandırıb dəftər-kitab,
İşrət gərək, bədr olmuş ay, aç üzünü, nədir niqab?

Sütül xəttin olan yerdə kitab xətti göz oxşamaz,
Qədəhimiz öpüşəndə nə intizam, nə haq-hesab.

Sədi məni "Gülüstan"la döndərsə də müsəlmana,
Eşqə də bir qapı açdı, ürəyimdə qoymadı tab.

At başından bu papağı, telin düşsün ay üzünə,
Günəş baxıb, xəcalətdən qoy çəkməsin dərd, iztirab.

Hasar olsun kipriklərin o türkanə gözlərinə,
Xumar gözün bu şəhərdə qoparmışdır bir inqilab.

Allaha bax, qaşın tağı əfsun ilə oynamasın,
Qəlbimizin iman evi istərmisən olsun xərab?!

Qıyma eşqin fəqirinə şəkər məmən giləsini,
Bir də qoymaz ayılmağa sən verdiyin şirin şərab.

Mərdanəlik cəvahiri günəş kimi işıq saçar,
Xoş ülfətin ürəkaçan, uca qəlbin alicənab.

Anan dedi: "Nəyin var ki, qurban ola cananına",
Sevinərək "ürək" dedim, düşünmədən verdim cavab

Divanına Fariyabi həsəd çəkər, ey Şəhriyar,
Kəbədə də gizləsələr oğurlaram, budur səvab!

## SINMIŞ RÜBAB

Bir bənövşə teli qopsa könül sızlar rübab kimi,
Bu həyatın ümmanında hər ömür bir hübab kimi.

Qan ağlatdın ürəyimi, üstəlik də tənə vurma,
Sındırdığın bu şüşədən qan axar al şərab kimi.

Peyğəmbərin qılıncından deyirlər ay parçalanıb,
Tel altından üzün gülür qırılmış afitab kimi.

Saçlarının burma-burma sındırırsan, ey nazənin,
Gözlərimdə dalğalanır, sayrıyır bir sərab kimi.

Oynatdıqca saçlarının burumları xəyalımı,
Göz yaşlarım çəkiləydi tellərinə gülab kimi.

Bəsdir, sinəm sipər oldu min sərgüzəşt dalğasına,
Çıx bu evdən, silkələnir dünya xanəxərab kimi.

Sınıb dağılsa da dünya, sındırmaram peymanımı,
Su üstündə yad əlindən düşüb sınan bir qab kimi.

Mən ki könül şikəstəmi oxuyuram "Mahur" üstə,
İnildəyir Səba sazı şikəstəmə cavab kimi.

Uçuq, köhnə dəyirmana bənzərin var, ey Şəhriyar,
Təbin sənə qan ağladır çəkilməz bir əzab kimi.

# QARA GÖZLÜ ŞİRAZLILAR

Əlimdən alsa könlümü gözəlləri bu Qafqazın,
Qara gözlü sənəmləri inciməzmi bəs Şirazın?

Qoca şirəm, sənin kimi çox ahular ovlamışam,
Şir də düşər kəməndinə saçıntək ovsun almazın.

Gör fələyin kamanını, səngit havalı köhləni,
Haram gözlə hərəm gəzən itirər olar-olmazın,

İstərəm ki, Allah udsun eşqimizin son nərdini,
Tez saralar hüsnün sənin, qalar quru bir avazın.

Özgə dama çıxanların kor olmasın həya gözü,
Şorgöz olsa, göyərçin də tez itirər öz yuvasın.

Qızılgülün xəzanında bülbülləri qəhər boğar,
Bayquş kimi çalanı var qarğa kimi bir dəmsazın.

Dərdlilərin qarğışından axır küdurət doğulur,
İkiüzlü aynanı qır, bu kin, küdurət olmasın.

Aparsın çeşmə başından külək fitnə qubarını,
Hər baxışı bir qəzəldir suya gələn sarvinazın.

Rey mülkünün fəxr etdiyi hər nə varsa keçdi, getdi,
İnsafdırmı zülmün çəkəm fələk adlı sehrbazın.

Ey təbimin şux gəlini, açsan hansı qapını sən,
Orda Sədi pərdəsi var, örtüyüdür saf almazın.

Gül şəbnəmi soz yaydı ki, indi çərçi bazarı var,
O şöhrətli, ləyaqətli şeir mülkündə Şirazın.

Gülüm, hər kəs baş aparsa, sərvtək ucala bilməz,
Razılaş ki, düz deyirəm, yersiz olar etirazın.

Yanında günahım olsa, hüsnünə bağışla məni,
Pərişan eylə telini, qaş düymə, hayıfdır nazın.

Ey Tanrı, sönük bir şamam, sən təzədən yandır məni,
İstəklilər xatirinə təzələnsin alın yazım.

Təbriz, Şiraz gözəlləri, gəlin təbim çeşməsinə,
Ey Şəhriyar, qoy dil açsın sevinc ilə tavar sazın.

## ŞİRİN PÜSTƏ

Mənimlə kəsib aranı nə zamandan o daşürək,
Sən də məni çox incitmə, ey ürəyim, bir döz görək!

Aylar ilə sevgilindən kənar gəzdin, ay üzlü yar,
Olmuşam ay divanəsi, hər sirrimi bilir fələk.

Sən ədavət bəslədikcə, mən də sevgi bəsləyirəm,
Məhəbbətim ədavətlə necə ülfət eyləyəcək?!

Şirin püstəm, üz turşutma, qəm yeməkdən ağzım acı,
Nakamlara şəfqət ilə gülümsəyir incə mələk.

Sənin məstlik piyaləni qırdı düzlük andım mənim,
Qədəhimi daşlara vur, özün yoxla, sınağa çək.

Bilirsənmi müdrik qoca sevənlərə nə söyləmiş:
- Cavanbaxta cavan gözəl, qocaya da qoca gərək.

Mənim kimi can satanın nə sözü, nə söhbəti var,
Can almasan, şirin sözlə nolar versən ürək-dirək.

Çəmənlərin qucağında məclis qurdu bahar yenə,
Gül üzlümdən ayrı düşdüm, saraldım gül xəzəlitək.

Saçlarından xatirələr söylər mənə səhər yeli,
Bu titrəşən otlar kimi gözüm şehli, canım titrək.

Baş qoyaram o dağa ki, qəlbim kimi odlar saçır,
Ahlarımdan göy şimşəkli, göz yaşımdan yer laləreng.

Bir səmanın ulduzunca gözlərimdən ulduz yağar,
Ay-ulduzlu məclis qurram yollarına göz dikərək.

Unutdursa yar həsrəti bir gün vətən həsrətini,
Xəzəl kimi hansı yana aparacaq məni külək?!

Gör Yusifin hicranından nələr keçib, ancaq yenə
Nalə çəkir asimana nakam sevgi, nakam dilək.

Bu ayrılıq həsrətimi kəfənimə yazsın qələm,
Yalvarsam da, yaradanın əllərimdən çəkmiş ətək.

Yandır bu daş ürəkləri öz şerinlə, ay Şəhriyar,
Məzar daşı səni gözlər, can pəjmürdə, ömür gödək.

## AYIN QUCAĞI

Qara bulud arasında on dörd günlük ay tapmışam,
Asiman əzəlki deyil, billurdan saray tapmışam.

Yolum Allah səmtinədir, başqa bir yol tanımıram,
Allah qismətimdən savay hər nə tapsam, zay tapmışam.

Yanılmışam, bir ağ gülün gözündəymiş baxtım mənim,
Kipriyindən ox saçılan bir qasları yay tapmışam.

Ah çəkirdim, könlüm quşu asimanda yalqız idi,
Göy ahımdan ayazıdı, yalqızıma tay tapmışam.

Dərd əlindən göz götürüb, əl üzmüşdüm bu dünyadan,
Baxtın uca yuvasında bir tapılmaz pay tapmışam.

Bir damcıya möhtac idim, qurumuşdu bağça-bağım,
Gulzarımı suvarmağa çeşmə nədir, çay tapmışam.

Şəhriyarın qapısını bir də döyməz dərdin əli,
Kölgəsi çiynimə düşən əfsunlu humay tapmışam.

## MƏNDƏN QAÇAN AHU

Gözlarimin qarasıyla yazdım bu zərif qəzəli,
Bəlkə sözüm ram eylədi sənintək ahu gözəli.

Ağartdı gözüm giləsin sübhədək hicran gecəsi,
Bir sabahın ümidiylə dərdə, sitəmə dözəli.

Gəncliyimi puç eylədin, həsrətin qocaltdt məni,
Get, ey cavan, qocalasan qəmxarından əl üzəli.

Gözümün sevinc yaşıyla sərvtək ucaltdım səni,
Boyun özgəsinin oldu, barsızdır eşqin əzəli.

Ay camalın tilsimmi aydan soruşaram gecə,
Neçin mehrin yoxudur mənə, dili, dodağı məzəli?!

Baharımsan, bir bülbüldən soruş mənim əhvalımı,
Göz yaşıma naxış saldı ömür bağımın xəzəli.

Boğanaq da məndən aldı bu şövqü ki, divanətək
Qaçıb yaysın dağa, düzə dərdimi köhnə-təzəli.

Köynəyimin yaxasını əl atıb cırmaq istərəm,
Başına hava gələnin yaxasın yırtar öz əli.

Bükük belli çöhrə fələk saçımı pambıq eylədi,
Zal olsam da, can düşmənim hazırdır əli nizəli.

Şəhriyarm ürəyi də yarılmış bir nara bənzər,
Tökülüb dənə sözləri, qalıb quruca gəzəli.

## USTADLA VİDALAŞMA

Tufi dalmış qəmə ki, sevdiyi qənnadı gedir,
Şirinin qəlbi qan olmuş, axı Fərhadı gedir!

Ötüşən vaxt: "o əziz canları yad etmə" - deyir,
Daha bilmir ki, canın payəsi, bünyadı gedir.

Bitirib ömrünü Təbrizdə o ustad Mahyar,
Tutuşub odlara şagirdi ki, ustadı gedir!

Neçə cür rəngə çalan sinədəki lövhəyə bax,
İtirib rəngini, solmuş o da - Behzadı gedir.

Kəsib ol sərvü səmən qarşısını bağbanın,
Bu bağın kölgə salan sevgili şümşadı gedir.

Axı ülfət ilə üns olmuş həyatın səməri,
Gülzar ikən necə viran olub hər zadı gedir!

Hər vüsalın sonu hicrandı, bu bəlli, axı bəs
Bizə bəxş eyləyərək zülm ilə bidadı, gedir!

Dostların zülmü başımdan qoparır tüstümü, ah!
Söyləyin, zülm qalıb, bəs niyə haq dadı gedir?!

Yaxşı, Bağdad ilə ədlin bağı əfsanədisə,
Ürəyim tuşlayaraq bəs niyə Bağdadı gedir?

Asılıb zülfünün hər bir telinə odlu ürək,
Sərvinaz isə görün bir necə də adi gedir.

Novşad bayramı gəlmiş, o öz aşiqlərinə
Daddırıb şərbətini, indi də xoş dadı gedir.

Aşiqin naləsini boğmağa pərgardı zaman,
Neyləmək, eşq keçib hər dəfə fəryadı, gedir.

Şəhriyar, göz yaşın ilə yu onun qəm tozunu,
Gül ki, gülgün üz ilə bir Vətən övladı gedir!

## TEHRANI XATIRLARKƏN

Nə xoşdu Tehran ilə nazlı "Laləzar"ı onun,
Gözəllərin beşiyi - sevgili gülzarı onun.

Diyari-eşq özüdür, dostluğun məkanı odur,
Şirin məhəbbət ola kaş ki, payidarı onun.

Xudaya, burda qəribi nə miskin eyləmisən?
Nədən düşübdü uzaq yar ilə diyarı onun?!

Nə xoşdu Şimranın hüsnü, ağacda bülbül oxur,
Gedir fələklərə birbaşə ahü zan onun.

Nə xoşdu "Pəsqələ" yarəb, nə xoşdur orda yuxu,
Şəlalə nəğmə dedikcə yatar civarı onun.

Çiçəkli donda yenə naz edir qədim küçələr,
Sularla nəğmə qoşan arxdı nəğməkarı onun.

Gözəldi "Təcriş" ilə "Körpüüstü" qovğası,
Bu ahugözlülər olmuş əziz şikarı onun.

Varımdı bir salamım əhli-Behcətabadə,
Verəm səba apara, düşsə gər güzan onun.

Nə oldu, hardadır eşqin, cavanlığın gözəli?
İlahi, dostlara çatsın təki nübarı onun.

Gözəldi, razü niyaz ilə keçsə eşq oyunu,
Gözəldi, dağ çəkə gər qəlbə intizarı onun.

Nəyə lazımdı vüsal Ay işıq saçan gecədə?
Gözəldi tar gecədə hicr ilə xumarı onun.

Çataydı dostuma şövq ilə yazdığım bu kağız,
Dəyəydi sevgisinə layiqincə barı onun.

Əgər ki yar mənə mehriban olub, yarəb,
Olaydı mehriban həmdəm pənahı, yan onun.

Bağışla, Tanrı, mənim sevgi bilməyən yarımı,
Yumulmayan gözümə, gözdü pasdan onun.

Var isə nisgili, dərdi, qubarı mən sarıdan,
Axan bu göz yaşım ilə gedər qubarı onun.

Ürəkdə arzudu - getsin gülüzlü yarə tərəf,
Verərsə fürsət əgər bir də ruzigarı onun.

Açılmaq eşqinə düşmüş bu gül, açar yenidən,
Əgər ki, qüdrətini göstərə baharı onun.

Rəqibim, insafın olsun axı, o yarı burax,
Şad oldu bəlkə sevən qəmli biqərarı onun.

Salamımı apar o qəlbi oxşayan gözələ,
Unutmasın necə sadiqdi Şəhriyar onun.

## TƏBRİZ GÖZƏLİ

Nazlı-duzlu o pəriçöhrə ki nərgizgülüdür,
Səni görcək vurular, sanki çəmən bülbülüdür.

Sənin ol gözlərinin çevrəsinin rənginə, bax,
Qərq olub göydə Sürəyya, o, bir ulduz gölüdür.

Salam eylər, əyilər socdənə, Təbriz gözəli,
O zərif sərvi-İrəm ki, özü Şiraz gülüdür.

İti xəncər qaşın ilə qara zülfün oyunu –
"Ləzgi rəqsi"ymiş, adı şerdə Qafqaz selidir.

Yoxdu şerimdə qədimlərdəki riqqət, şübhə,
Bu hekayət danışan telli sazın öz dilidir.

Gözəlim, bir qulaq as, dərdimizin tərcüməsi,
Musiqi varsa, onun həm bəmidir, həm zilidir.

Söyləyin, usta Səba titrəsin ol pərdədə ki,
Orda sirrin evinə pasiban eşqin əlidir.

Cilvəyi-hüsni-ilahinlə bacarmaz rəssam,
De ki, yığsın qələmi, rəngi, o rənglər ölüdür.

Yandırıb qol-qanadım, sonra salıblar qəfəsə,
Quşa bax ki, hələ də uçmaq onun nisgilidir.

Üfüqün Şərqdə İşıqlanması olmur əbədi,
Çünki Qərb də günəşə öz yuvası, öz elidir.

Sənə şohrət gətirib məndə hünər gözləməyin,
Şəhriyaram, qəzəlim incə gözəllər tülüdür.

## MƏRHUM MİRZADƏ
## EŞQİNİN XATİRƏSİNƏ

Özü eşq əhli, mərdlər içrə vahid, binəzir ərdi,
O Eşqi ki, cəmi eşqi, cəmi dərdi - Vətən dərdi.

Ona can bəxş edən şəmin odu söndü, fəqət, yox qəm,
Nə qəm ki, buzlu ahında alov, atəş çiçəklərdi.

Qanad çalmaqdadır hər an şəfəqlər laləzarıyçın
Xəyal pərvanəsi mərdin ki afaqa qanad gərdi.

Can atdı ittifaq qursun kasıbla binəsiblərdən,
Təkəbbür məclisindənsə üzün nifrətlə döndərdi.

Bu eşqin nərdbazı öz canın da verdisə əldən,
Rəqiblər mat qalıb nərddə, necə hay əkdi, vay dərdi!

"Ölərmi heç o kəs ki, qəlbi eşq ilə nəfəs alsın?"
Xeyr, ölməz! Ölər düşmən, qalan Eşqi - səməndərdi.

Öz eşqində o, bir ali məqama yetdi ki, mən çox
Yüyürdüm yel kimi, əfsus, tozundan yer xəbər verdi.

Deyirlər: sahilə çatmaz gəmisi eşq-sevdanın,
Ona yardı o tufanı, nə dincəldi, nəfəs dərdi.

Canındam keçdi pak Eşqi, nə qiymət aldı? Ölməkmi?
O xidmət eylədi, ölkə əcəldən muzd göndərdi!

Bu saf güzgü tutarmı pas? Xeyr, solmaz xəyanətdən,
Ölərkən çöhrəsində qan qızıl afaqa bənzərdi,

O tapdı, Şəhriyar, can vermək ilə dərdə dərmanı,
O Eşqi ki, cəmi eşqi - Vətən dərdi, Vətən dərdi!

## UNUDULMUŞ SAZ

Boşalmış bağlar olmuş lal, sükunətdən oyan, bülbül,
Nədir bunca susub durmaq, bizi yalqız qoyan bülbül!

Gecə aylı, soyuq ruzgar, çəkib bir guşədə səssiz,
Nə həmdəm var, nə həmdərdim, hanı arxa, həyan, bülbül?

Nə vəslim var, nə hicranım, bahar ilə xəzanım yox,
Yararmı eşqə səssizlik, əsil eşqi duyan bülbül.

Soyuq qardan qaçıb bağban necə gör evdə gizlənmiş,
Gələn yoxdur, gedən yoxdur, bağa yoxdur uyan, bülbül.

Kəsilmişdir daha bağdan bağırtı, küy-kələk, tez gəl,
Uçub getmiş qara qarğa - səni düşmən sayan, bülbül.

Qəfəsdən yox daha qorxun, oxu bülbül, xoş avazla,
Sən azadsan, bu azadlıq düzün, yurdun, qayan, bülbül.

Fəqət, fitnə çəməndə məhv edib sərv ilə küknarı,
Nə qəm, ötmüş bəla tufanı, afət, qorxma, can bülbül.

Sovulmuş arx, gəl ay bülbül, tökək neysan yaşı gözdən,
O neysandan doğan çeşme ola dirlik yayan, bülbül.

Mənim, yarəb, gülüm getmiş, xəzanın bir qəzasıyla,
Otur, bir yas tutaq qəlbən, gülü yaşla yuyan, bülbül!

Qızılgülə vəfa qıl sən, mən isə bir san güllə
Edim bəmdə həzin nalə, zil üstə sən də yan, bülbül.

Deyim mən bir ağız nəğmə, dalınca bir ağız sən də,
Səbanın yadlaşan sazı sənə olmuş əyan, bülbül.

Tapıbdır dərdə dərmannı hərə, əfsus, mənəm aciz,
Bu təklik dərdi biçarə, yaram verməkdə qan, bülbül!

Sazınıda qalmamış yanğı, sözümdə yox sehir artıq,
Sənin yanğındı şerimdə fəqət, olmuş bəyan, bülbül.

Unutma, o çəməndə ki, səni salmışdılar ayrı,
Yaşıl donlu nəsildənsən, müqəddəsdir mayan, bülbül.

Nə dünyadır bu tərs dünya ki, qarğa alidir onda?
Fəqət bülbül dəyərsizdir, görürsən min ziyan, bülbül.

Barı aşiqlərə yan, can bağışla nəğmən ilə sən.
Şükür qıl nəğməkarsan, yox səsindən heç doyan, bülbül.

Varındırsa, nəfəs, şükr et, səni gözlər çəmənzar, bağ,
Bahar eşqiylə çıx qəmdən, sevinc ilə dayan, bülbül.

Hədər getmiş isə gənclik, əzizim, qəlbini sıxma,
Həyat yeldir, qəmə batma, şirin cana qıyan bülbül.

Düyün açmaq üçün yummaz bir an da Şəhriyar ağzın,
Açar müşgülləri Allah, şad ol, əlvan boyan, bülbül.

# *MƏSNƏVİLƏR*

## GECƏNİN ƏFSANƏSİ

Gündüzün saqisi günəş camını
Devirib sındırar, meyini tökər.
Ulduzlar səpilər ağlar gözündən,
Göylərə ahından bir duman çökər.
Sevdalı başını qoyar dizinə,
Gündüzün oyunu yetişər sona.
Bu zaman açılar yeni bir pərdə,
Aləm bürünsə də qara bir dona.
Gülməli bir səhnə düzəldər gecə,
Başlanar göylərdə atəşfəşanlıq.
Nə qədər sehirkar bir rejissordur,
Gecənin işini sezsən bir anlıq!
Fələk iynə alıb, qara atlasın
Üstünə şahanə gövhərlər düzər,
O sonsuz dənizin ənginliyində
Səma pəriləri qu kimi üzər.
Ulduzlar başlayar minakarlığa,
Üzünə xal düzər mavi fələyin.
Üfüq arxasından işıq saçan ay
Səhnəni bəzəyər qızıl tac təkin.

## AY ARTİSTİ

Ay adlı artisti görsünlər deyə,
Aləm göz qırpmadan çəkir intizar.
Dünya bir salondur işıq, qaranlıq,
Orada gorünən, gizlənən də var.
Arxalı, çiyinli, ətəkli dağlar,
Vüqarla oturmuş lojalarda tək,
Ucalı-gödəkli sərv ilə qovaq,
Bəzənib düzülmüş cavan qızlartək.

Budaqlarsa dəcəl uşağa bənzər,
İrəli keçməkçin bir-birin əzər.
Gözəl pəri kimi damın dalından
Bəyaz əndamıyla ay ki, boylanır,
Deyərsən ki, Babil sehrkarıdır,
Bir anda quyudan göyə tullanır.
Halədən tor salıb dilbər üzünə,
Tutub çevrəsini mavi dalğalar.
Gecənin yoluna odur nur saçan,
Gecə ilə ayın bir dastanı var.
Hüsnünün tərifi yetişməz başa,
Bütün dünya edər aya tamaşa.
Utancaq qız kimi addımlayaraq,
Səhnəni hüsnüylə işıqlandırır.
Zöhrə rübabını basıb bağrına,
Musiqi səsini dalğalandırır.
Nahidin, Pərvinin qızır dabanı,
Məclisə rəqs ilə gəlir yaraşıq.
Qəfldən elə bir ildırım çaxır,
Aləmi bit anda çulğayır işıq.
O qara hayillər qırılır, qopur,
Dağın arxasına tökülür bütün.
Ayın güzgüsündə, demək, təbiət
Saçını pərişan görmüşdür bu gün;
Hüsnünü aləmə göstərsin deyə,
Saçını toplayıb, atır geriyə.
Dəryada dalğaya bənzəyir mehtab,
Yayılır hər yana naqus səsitək.
Sanki sirr gizlədən bu qoca dünya
İstəmiş sirləri açıb göstərmək,
Böyük əzəmətlə çəkilir pərdə,
Ruhları sarsıdır bu toy, bu büsat.
Salon səhnə ilə birləşmiş artıq,
Salon heç səhnədən qalarmı, heyhat?
İkisi qovuşub günəş camıtək,
Verir əbədiyyət hüsnünə bəzək.
Dünyanın gözünü çulğamış yuxu,

Duyur meşə, dəniz, dağlar da qorxu.
Təbiət rəngarəng bir filmə bənzər,
Sular daş guzgüdür, salınsa nəzər.
Suda qırılmışdır ayın aynası,
Dağılmış hər yana şüşə parçası.
Geyinib yamyaşıl ipəkdən paltar,
Özünə vermişdir bəzək ağaclar.
Rəqs edir vəcd ilə yarpaqlar, budur!
Onların tük qədər nöqsanı yoxdur.
Əsdirir zülfünü rəqqasə nəsim,
Verir zəncir kimi rəqsinə tənzim.
Şəhər bir ala at rəngini almış,
Heyrətə qərq olub, sükuta dalmış.
Susaraq baş-başa vermiş daxmalar,
Sanki ney səsiylə bir sürü yatar.
Şəhərin üstündə ildırm çaxar,
Deyərsən, ləl dolu bir çaydır axar.
Bir təpə üstündə otursan əgər,
Şəhər gövhər dolu dəniz görünər.
Sayələr əlinə qələmi almış,
Xəyal pərdəsinə naxışlar satmış.

## MEŞƏDƏ AY İŞIĞI

Meşənin qaranlıq zolaqlarında
Məşəllər alışıb yandı bir anda.
Ağaclar başını qaldırdı dərhal,
Könüldə həyəcan, iztirab, məlal.
Budur, ay sanki bir futbol topudur,
Şərqin qapısına vurulub qalmış.
Hərlənib quyuya düşməsin deyə,
Üzünə halədən bir tor da salmış.
Bəlkə də bir gümüs qayıqdır, üzüb,
Şərqin sahilində atmışdırləngər.
Köynəyi nurdandır mələklər kimi,
Ətəyi mehtabdır, yerlə sürünər.

Ay işığı quşu çaldıqca qanad,
Gümüş tozu səpər meşəliklərə.
Qalib qoşun kimi nur seli axar,
Üfuqlər qərq olar nurda bir kərə.
Ay-ulduz ordusu ellərdə nizə
Qaranlıq üstünə hücuma keçər.
Pərilər yurduna çevrilər meşə,
Hər yanda əfsanə, əfsun söylənər.
Yağar üfüqlərdən işıq aləmə,
Qaranlıq tüstü tək çəkilər geri.
Əlbəyaxa olar nurla qaranlıq,
Elə bil döyüşiir div ilə pəri.
Mehtab qətrələri firiştə kimi
Bənd edər onları bir şaxa hər an.
Meşəni oxşayan gecə nəsimi.
Budaq xışıltısı, meh əsər, mehtab
Könüldə doğurar nəşə, qorxu, şəkk.
Gümüşü kosunu ay iştğının
Alıb bir tərəfə şığıyar külək.
Sanarsan meşənin dərinliyində
Titrəyə-titrəyə məşəl sürünər.
Küləyin döydüyü suya bircə bax,
Zirehli qoşundan bir sel görünər.
Əks edər hovuzda sərvin sayəsi,
Pərilər şahının firuzə taxtı.
Gümüş əndamıyla ay pəri kimi,
O suda çimər ki, açılsın baxtı.
Ulduzlar dövrədə halqa vuraraq,
Şahın ətrafında kənizlər kimi,
Əsəndə bir yandan yabançı külək,
Titrədər ləpəli dənizlər kimi.
Elə sarınmış ki, şüvlər, budaqlar,
Meşə bir örtülü güllüyə oxşar.
Yarpaqlar hərəsi yaşıl bir hübab,
Asılır altında çıraqtək mehtab.
Meşə bəzək vurub güldən, çiçəkdən,
Dönmüş bir yatağa əlvan ipəkdən.

Bura tənhalığın seyrəngahıdır,
Xəyalın, sevdanın cövlangahıdır.
Görünür hər yandan bir dilbər pəri,
Hərə bir Məcnuna çıxır müştəri.
Hər yarpaq düşüncə ürküb qaçırlar,
Kölgədə eşqdən söhbət açırlar.
Hələ beşikdədir şerin gözəli,
Gözü yuxuludur, sözü məzəli.
Nənnisi asılmış güllü budaqdan,
Mehin laylasıyla yüyrənir hər an.
Xəyal bacasından boylanır könül,
Camal aləmini hey anır könül.
Bu pərdə dalnda yüz sirrə yol var,
Orda ruhanilər xəlvət qurarlar.
Bu təmiz havada səhər çağıtək,
Dünya səhər kimi almış başqa rəng.
Aləmə yayılmş eşqin ləzzəti,
Bəşər ondan almış hüsni-xilqəti.
Bir qız gülüşü tək incədir külək,
Təbiət məhcubdur, pakdır Məryəmtk.
Meşənin gecəsi cənnət sübhüdür,
Orada hurilər yerə nur süzür.
Bir arxdan su axır, bir arxdan gümüş,
Onlardan atəmə zümzümə düşmüş.
Su axır, sanırsan, nəğmə ötür saz,
Hüsn edir eşq ilə hey razü niyaz.
Ağaclar altından kükrəyir arxlar,
Sanki toy tutulub, musiqi çağlar.
Budur, tavus gəzir yaşıllıq bağda,
Sanki şux bir gəlin süzür otaqda.
Mehtab su arxında cilvələnərkən,
Bir civə bulağı axır, deyərsən.
Söyüd bulaq içrə ud kimi yanır,
Kölgə tüstüləyir, nur alovlanır.
O ulduz ki, titrək suda dayanmış,
Qızıl qətrəsidir, civəyə dammış.
Gecə yoldan ötən sərxoşlar kimi
Sel axır, nərəsi basmış aləmi.

Baxın şəlaləyə, necə parlayır!
Saçını topuğa tökür, çağlayır.
Meşənin kaşıdan uca tağı var.
Divan, qapısı incə naxışlar.
Əzəl şairinin təbindən doğan
Qəzəltək yarpaqlar düzəltmiş divan.
Bu tağın qübbəsi ərşə yüksələr,
Hüsnü qarşısında aləm baş əyər.
Sanki asiman da olmuş səringun,
Ona ağaclardan vurulmuş sütun.
Cənnət qürfəsinə oxşar şaxələr,
Qalxıb pillə-pillə göylərə qədər.
O ərşin üstündə necə bir mələk,
Qumru vird oxuyur təvaf edərək.
Ruhlar gah görünür, gah da məhv olur,
Həyula vahimə, xəyal doğurur.
Gözəl manzərədir hər yana baxsan,
Bu sirri anlamaq deyildir asan,
Bu cəlal, əzəmət, bu büsat nədir?
Haqqın camalına bir ayinədir.
Sazında xoş nəğmə çalır mələkut,
Könül nəğməsidir burada sükut.
Dəyir mizrab kimi şaxəyə nəsim,
Ölməzlik sazında şaxələr bir sim.
Baş əyib üfüqdə, üz qoyub asta,
Sazın çanağına saz çalan usta,
Mehtabın gümüşü, ipək telləri,
Sazın simlərinə verib zivəri,
Çalınan ahəngə qulaq asaraq,
Rəqs ilə mahnıya başlamış afaq.
Canlanır gizlicə bütün zərrələr,
Şövqdən həyatın əndamı titrər.
Fələk çalğıçısı dəf edib ayı,
Çalaraq aləmə salmış harayı.
Çərxin əfsanəvi sahir qızları
Rəqs edir, tutmayır bir an qərarı.
Bir güzgü sayılır qoca təbiət,
Tapmış o güzgüdə əksini xilqət.

## MEŞƏNİN XORTDANI

Meşə kənarında, daxmada gecə
Uzanmış sadəlövh, yetim bir uşaq.
Gözünə budaqlar balta görünür,
Xortdanı yadına salır qorxaraq.
Gözünü tərk edir yuxu büsbütün,
"Ana!" - deyib gəzir, hardadır ana?!
Atası dünəndən işə gedərək,
Hələ də dönməmiş öz komasına.
Gecə qaranlıqdır, qış da amansız.
Bayırda tufandır, ağaclar əsir.
Ağlamaq istəyir, birdən xortdanı
Yadına salaraq səsini kəsir.
Əl atıb söyləyir: "Anacan, mənəm,
Qucağın, qılığın, gülüşün hanı?
Vallah, küsməmişəm, anacan, səndən,
Yanında yatıram, quc öz balanı!
Mən ki qənd oğrusu deyiləm, ana!
Ağıllı balanam, vermə xortdana!
Demişdin ki, məndən küsməyəcəksən,
Gəl, mənə nə desən, gözümün üstə!
Nə günah işlədim, qaçırsan belə?
Ataraq gərmişsən üzümün üstə?
Anacan, budur bax, səslənir xortdan,
Alça ağacının dibinə gəlmiş.
Vay, ana, necə də qorxunc səsi var.
Elə bil ifritdir, göyə yüksəlmiş.
Dişin şaqqıldadır, hey mırıldayır,
Deyir: yeyəcəyəm səni, ay oğlan!
Qapının dalına çatmışdır artıq,
İndicə girəcək, vallah, bacadan!"

Çöldə əsən külək güclənir birdən,
Qapını oynadır yerindən həmən.
Div kimi qaraltı girir qapıdan,
Yüyürür, bağırır, durmadan bir an.

Uşağı kabus tək izləyir xəyal,
Bağırıb yıxılır, dili qalır lal.
Nəzər sal halına, lal olsa belə,
Yenə də yalvarır hərəkətiylə:
-Anacan! O xortdan budur, gəldi, vay!
Çənginə alaraq aparır, haray!
İti pəncəsiylə tutub sinəmdən,
Rəhm elə, ay ana, gəl, al əlindən.
Taqətim tükənib, başım hərlənir,
Xortdanlar halımı görüb əylənir.
Rəqs edir dövrəmdə divlər, anacan!
Gözləri od saçır sanki bir vulkan!
Xortdanlar keçirib məni çənginə,
Çəkirlər meşənin dərinliyinə.
Qorxudan, anacan, yəqin bil ki, sən
Özüm öz adımı unutmuşam mən.
Yarıb qaranlığın bağrını hər an,
Bir göldə üzürəm, üzdüyüm su - qan.
Dövrəmdə meşələr, dağlar hərlənir,
Dəstə-dəstə divlər gəzir, fırlanır.
Meyvəli ağaclar, yaxşı qıl nəzər,
Hərəsi bir divdir, əlində xəncər.
Yağır hey başıma ağır yumruqlar,
Xəncərlə bağrımı yaralayırlar.
Dartıb qoparırlar qulaqlarımı,
Qırırlar başımı, ayaqlarımı.
Təpənin dibində deyib-gülmədən,
Bir dəstə dayanmış əynində kəfən.
Qaralıb, əprimiş qoca qarılar,
Çiynində hər yana tabut daşıyır.
Hər yana baxırsan, ölmüş körpədir,
Meyitlər burada təpə-təpədir.
Çəkir hər tərəfə süpürgə külək,

Süpürür cəsədi quru yarpaqtək.
Matəm musiqisi çalır ildırım,
Bulud kəfən biçir hey dilim-dilim.

Ay da bir ölü tək kəfən qullanır,
Bulud kəfənində qəbrə yollanr.
Məgər eşitmədin naləmi, ana,
Niyə namehriban oldun balana?
Ananın ruhu ki, göylərdə bu an
Körpənin halını gördü pərişan,
Taqəti tükəndi bu mənzərədən,
Yarıb üfüqləri çıxdı pərdədən.
Ərşin sütununu əlinə aldı,
Oğlunu qurtarmaq qeydinə qaldı.
Oğlunun canını yataqdan ana
Mehtab kəməndilə çəkdi yanına.
Səhər gördülər ki, yetim verib can,
Qurtarmış həyatın daş zindanından.

## MEŞƏNİN TUFANI

Qaranlıq gecədə meşə uğuldar,
Hər yerdə vəlvələ, qülqülələr var.
Külək ağaclara çəkir sillelər,
Qorxudan gözümə divlər görünər.
Divlər, qaraçılar, xortdanlar bu gün
Yeri də, göyü də tutmuş büsbütün.
Həmhəmə başlayır div ilə pəri,
Qorxudan qan olur xalqın ciyəri.
Bəşərin fikrini div oğurlayır,
Ürəklər sinəyə artıq sığmayır.
Vahimə, iztirab çökmüşdür cana,
Ağıl da qorxudan gəlmiş amana...
Pusquda yırtıcı divlər oturmuş,
Səni tutmaq üçün tələlər qurmuş.
Külək elə vurur sillə üzlərə,
Çökür tüstü, duman yanar gözlərə.
Baxın, hər tərəfi divlər bürümüş,
Monqol ordusutək başlamış yürüş.

Külək qar üzündən alır pərdəni,
Yığır mağaraya yüz min kəlləni.
Qıcıyır dişini vəhşi div, gülür,
Üzündən, ğözündən ölüm tökülür.
Bir div pəncəsidir hər yarpaq, baxsan,
Hər ağac ölümdən qorxunc bir nişan.
Gecə zəncisinin gur saçına bax,
Qəzəb dənizidir, dalğalı ancaq.
Gül tutur ətəkdən bir tikan kimi,
Küləkdən alışıb od yanan kimi.
Ulduzlar ordusu pusqudan çıxır,
Hücuma keçərək hər səddi yıxır.
Sel salır gurultu bütün cahana,
Oxşar zəncirdəki qızmış aslana.
Ağaclar döşəmiş sillə o qədər,
Fələyin yanağı gömgöy görünər.
O qədər qorxuncdur mühit ki, aslan,
Sürünüb yol gəzər, necə bir siçan.
Quşlar çıxarırsa səsini bəzən,
"Əsir uşaqlardır ağlar", deyərsən.
Qıvrılıb ilantək arxda, axır çay,
Boğuq bir ahənglə qoparmış haray.
Divlərin burulmuş buynuzlarıtək,
Budaqlar çatılmış bir-birə, gerçək.
Bitkilər hamısı siyirib xəncər,
İnsanın köksünü budamaq istər.
Uğuldar qulaqda küləyin səsi,
Əks edər beynində şimşək şöləsi.
Kəllələr içində beynimiz qaynar,
Alar dövrəmizi vəhşi canavar.
Ürək köksümüzdə o quşa bənzər
Ki, şahin caynağı canını üzər.
Lakin qönçə kimi açınca mehtab,
Fitnə gətirmədi gur işığa tab.
Behişt pərisitək gülümsədi ay,
Cəhənnəm filmini yığdı laybalay.

## DAĞIN SİMFONİYASI

### GECƏ VƏ DAĞ

Dağın gecə vaxtı bir cəlalı var,
Dağlı düzənliklər cənnətə oxşar.
Gecə ay işığı çulğayır dağı,
Yanar dağ döşündə eşqin çırağı.
Tac qoyub başına aydan, öyünər,
Əyninə qızıldan xələt geyinər.
Bütün səhraların sultanıdır dağ,
Ölnıəz qəzəllərin ünvanıdır dağ.
Dağ bizdə sevincin çeşməsidir, bil,
Babakuhi etmiş dağlarda mənzil.
Məşriqdə elə ki ay, günəş parlar,
Əvvəlcə işığı dağlara salar.
Yenə də məğribə yollanan zaman,
Sonuncu busəni alar dağlardan.
Bu cıxıb-batmağın başqa hüsnü var,
Onu yaxşı duyur bizim dağlılar.
Arxasız, pənahsız bir dağ kimiyəm,
Dağılar dərdini çəkib ölürəm.
Dağdır başımızı göyə qaldıran,
Dağdan fələklərə yol açır insan.
Açıb qarşımıza böyük bir kitab,
Deyir, xilqətdəki sirrləri tap!
Bizim könlümüzü ayırır yerdən,
Fələklər seyrinə aparır hərdən.
Dağı öyrənsələr arif adamlar,
Hikmət şərabından sərxoş olarlar.
Hünər xəznəsi var dağda hesabsız,
Götür o xəznədən hesab-kitabsız.
Arif insan kimi dağ yuxu görmüş,
Hiyləyə, riyaya arxa çevirmiş.
Nə divdən çəkinir, nə də pəridən,
İlahi hüsnilə cilvələnərkən.
Gecə şövq üzündən göyə yüksələr,

Ərşdən-fərşdən dağ tutar xəbər.
İstər işıq olsun, istər qaranlıq,
Dağ ərşə yaxındır hamıdan artıq.
Fələk qulağına deyər nağıllar,
Bəşərin dərdinə əlac axtarar.
Pakdır, müqəddəsdir Məsiha kimi,
İsa nəfəsidir dağın nəsimi.
Dağ beşik sayılır peyğəmbərlərə,
Oradan vəhylər çatır hər yerə.
Dağın vəsfə layiq övladları var
Ki, onlar dünyanı zindan sayarlar.
Bu aləm nə qədər dahilər görmüş,
Onları kamala dağlar yetirmiş.
Dağlar bir körpüdür bəşəriyyətə,
Yol var o körpüdən əbədiyyətə.
Sənə nicat versin deyə, quyudan,
Yerdən aya qədər qurmuş nərdivan.
Sənətin, hünərin rəmzidir dağlar,
Bizləri eşq ilə sənətə bağlar.
Dağ öz məqamilə qazanmasa ad,
Hümmətin şahini açarmı qanad?
Olmasa məkanı Qafın inziva.
Simurq tikərdimi o dağda yuva?
Dağ da hünər kimi yaranmış azad,
Bisütun dağından dərs alıb Fərhad.
Seyr et dağdan axan o çeşmələri,
Şövq göz yaşıdu", yuyar kədəri.
Dağın sinəsindən daman qətrələr
Bir can şirəsidir, onu eşq əmər.
Şeir de şairin ürək qanıdır,
Onun ən qiymətli ərməğanıdır.
Şeir qetrə-qətrə damar inci tək,
Sel tək axıb gələn daşdır ya kəsək.
Orada, dənizdə sanki qovğa var,
Dəniz ordusuna dağ olmuş sərdar.
Verər dalğalara küləklə fərman,
Dalğalar hücuma keçər durmadan.

Dəniz bir üzükdür, dağ onun qaşı,
Dalğalar qoynundan yüksəlir başı.
Dalğalar dağ yaran ordudur əgər,
Dağ qoşun içində Xosrova bənzər.
Sən də sabitliyi get dağdan öyrən,
Nuhu görmüş, hələ qopmaz yerindən.
Çıxınca gəmisi Nuhun tufandan,
Dağda ləngər atdı hələ o zaman.
Dünya alt-üst olsun, dağa fərq etməz,
Onun səbri bitməz, aramı bitməz.
Dağ qəhrin, qəzəbin son pənahıdır,
Üqabın, şahinin cövlangahıdır.
İlkini, sonunu görməmiş aləm,
Ancaq buludlardır sirrinə məhrəm.
Sayıq qəhrəmandır girmiş kəminə,
Çərxin kamanını salıb çənginə.
Bir oxun səngəri dağ olsa əgər,
Uçar, yer üzünü bütün fəth edər.
Dağın cəhrəsində əyrilən hər sap,
Dağa sarınmışdır, bu sirri sən tap!
Sanma çöl bağrında dağ bir yaradır,
Əsrlər yaşamış bir qarqaradır.
Bir çox əsrləri ötüb keçərək,
Başmı dik tutar pəhləvanlartək.
Diri bir qocadır döyüşə çıxmış,
Zamanın filini o, yerə yıxmış.
Sayıq gözətçidir, hər şeyi görər,
Dünyanın işindən dağ xəbər verər.
Hər yerə açaraq dağ ibrət gözü,
İzləyər gözaltı əyrini, düzü.
Qulaq as, dağların hekayəsi var,
Deyilən hər sözdən sən də feyz apar!
Səslənib, dağlara bir söz desən sən,
O söz təkrarlanar dağın dilindən.
Deyər ki: uşaqsan, bilmirsən məgər,
Hər kəs nə əkmişsə, onu da biçər?!
Divə, vəhşiyə də pislik etmə sən,

Pislik qarşısında pislik görərsən.
Sadəcə minarə deyildir dağlar,
Cəhənnəm qapısın bu dağlar bağlar.
Belə deyirlər ki, böyük yaradan,
Etmiş cəhənnəmi yer altda pünhan.
Yerin sinəsinə, desək müxtəsər,
Atəş doldurulmuş dəryalar qədər.
Bizi yandıracaq o cəhənnəmin
Üstündə gəzirik, qorxusuz, əmin.
Püskürmək istərkən atəş cəhənnəm,
Dağlar qarşısında sədd çəkir möhkəm.
Ateş əjdahatək coşduğu zaman,
Dağ çəkib zənciri deyir ki: "dayan!".
Orada bir fitnə getmiş yuxuya,
Nəfəs çəksə, dönər bu aləm suya.
Bu ağır yuxudan oyansa əgər,
Dünya alovlanar, qurular məhşər.
Coşaraq hərdənbir od püskürür dağ,
Verir kəhkəşandan zirvəsi soraq.
Zənn etmə ki, edir atəşfəşanlıq,
Təbiət naz edir ya da bir anlıq.
Bəlkə də udduğu qəzəbdən cahan,
Ağzına gətirir od boğazından.
Coşan qəzəbdir o, hey alovlanır,
Önündə bir nişan xətti canlanır.
Səni çəkindirir bəd əməllərdən,
Deyir: "Azğınlara qulaq asma sən!.."
Bu od ki, qurunu, yaşı yandırar,
Bizi həqiqətdən edər xəbərdar.
Deyir ki: "Ağzını dağ açsa əgər,
Qalmaz kainatdan kiçik bir əsər.
O xumun ağzından almsa qapaq,
Kainat bir ovuc kül olar ancaq.
Ölüm heykəlitək dağ yenə durar,
Cəhənnəm toputək hədəfə vurar.
Bomba da iltimas eləyir dağdan,
Ki, bütün dünyanı etməsin viran".
Sular da coşaraq tüğyan qoparır,

Külək də qızaraq tufan qoparır.
Durmasa bəlaya qarşı dağ əgər,
Yəqin məhv olardı tufanda bəşər.
Bu "İskəndər səddi" çıxsa ortadan,
Olar mədəniyyət qəsrimiz viran.
Dağdır silsilələr oxuna mismar,
Zəlzələ ağzını dağ qıfıllayar.
Dünya tərəzisi düz olsun deyə,
Dağ pərsəng daşıdır o tərəziyə.
Dağsız hər dəqiqə alaraq təkan,
Uçub alt-üst olar bir anda cahan,
Fələk çadırın mismarıdır dağ
Ki, sərxoşlar kimi atmasın ayaq.
Dağ özü səbatm nümunəsidir,
Zahidin yüksələn sövmiəsidir.
Kimin simürğ qədər vardır izzəti,
Qaf ona bəxş etmiş belə hümməti.
Musa təngə gəldi xalqı elindən,
Dağda vəhy eşitdi Allah dilindən.
Dağda haq nurunu o, gecə görmüş,
Qoy özü söyləsin ki, necə görmüş.
Elə ki, yüksəldi Turi-Sinaya,
Bir vüqar, əzəmət çatdı Musaya.
Haləyə büründü nurani üzü,
Hüsnünün önündə məhv oldu özü.
“Tövratı” tutaraq əldə mələklər,
Onun qulağına oxudu əzbər.
Doldu nida ilə can piyaləsi,
Onda xaliqinin qəhqəhə səsi.
Könlünü, gözünü nurda qərq etdi,
Qulağı can sözün Turda eşitdi.
Şahlıq əsasına, taxtına çatdı,
"Kəlimullah" adı onu ucaltdı.
Fironun büsatı zavala gəldi,
Musanın bayrağı göyə yüksəldi.
"Hərra" kahasında bir gün Mustafa,
Vermiş cəmalilə aləmə səfa.

Bir cənnət tavusu gördü şimşəktək,
Məğribdən məşriqə qanad gərərək.
Edir asimanın sirrini əyan,
Haqqı, həqiqəti eləyir bəyan.
Açıb qarşısına haqq kəlamını,
Çatdırır aləmə haqq pəyamını.
Gördü qoyulmuşdur bir təxt nurdan,
Ay isə bir tacdır, fələkdir eyvan.
Oturdu o təxtə bir sultan kimi,
Şəfaət mülkünün oldu hakimi.
Ərşdən fərşə tək gördü mələklər,
Səf çəkib önündə səcdə edirlər.
Mələk də baş əyib səcdəyə getdi,
Bu, haman Adəmə olan beyətdi.
Bu cür nadir hallar çox görüb gecə,
Bunlara biganə qalsın ruh necə!?

## BİR XATİRƏ GECƏSİ

Bu qarlı dağlarda başqa məna var,
Dağ qədər səfalı olmaz ilk bahar.
Bir xatirəm vardır dağ gecəsindən,
Onu başqa yerdə görməmişəm mən.
Körpəydik, qəlbimiz bulaqdan təmiz,
Eşq ilə, ümidlə yaşayırdıq biz.
Qarda sürüşməyə getmişdik bir gün,
Günümüz oyunda keçdi büsbütün.
Nə aclıq hiss etdik, nə də yorulmaq,
Oyun bitməmişdi, gecəydi ancaq.
Qar ola, dağ ola, aydınlıq gecə,
Belə mənzərədən göz doyar necə?!
Qarlı dağ görünür qu kimi dümağ,
Biz xizək üstündə qanad açaraq.
Uçunaq quş kimi üzüaşağı,
Ötüb keçmək istər uşaq uşağı.
Bilmirik şaxtadır, yoxsa sərindir,

Oyunun acısı baldan şirindir.
Dərədə, təpədə dönmüşük yelə,
Xoşhalıq, soyuqdan əssək də belə.
Axşamüstü qalxan bir sazaq ancaq
Batırır gah üzə, gah gözə sancaq.
Bizi gecə vaxtı axtaranlar var,
Budur, bağçalara gəlib çatdılar.
Bağçalar səmtində məşəllər yandı,
Sanki bir meşəlik oda qalandı.
Tüstüdən, alovdan duydu uşaqlar
Ki, ata-ananı üzmüş intizar.
Qorxudan hamımız yarpaqtək əsdik,
Çarəsiz, könülsüz evə tələsdik.
Harda yaxasını parçalamış qar,
Torpağın bağrından göyərmiş otlar.
Yolun bir hissəsi süd kimi ağdır,
Qar gedən yerlərsə zolaq-zolaqdır.
Əcəb tənhalıq var, dərin bir sükut,
Sanki qar edibdir aləmi məbhut.
Biz qarın üstünə basdıqca ayaq,
Səslənir qar, bizi dilə tutaraq.
Səsi gah ucalır, gah da yavaşu-,
Gah nəsihət verir, gah da savaşır.
Çuxur bir dərədən çıxdıq təpəyə,
Gözümüz sataşdı xoş mənzərəyə.
Dəyirmanda vardı başqa yaraşıq,
Məşəl tüstüləyir, rəqs edir işıq.
İnəyin, qoyunun, çobanın səsi,
Sazlarda çalman kəndli nəğməsi.
İtin hürüşməsi, xoruzun banı,
Başına almışdı bütün dünyanı.
Kəndə yaxınlaşır dəstəmiz hər an,
Hüsnünə mat qalıb, oluruq heyran.
Budur, qarşımızda canlanıbdır kənd,
Daxmalar alt-üstə, bir-birə peyvənd.
Çıraq işığıdır baxsan hər yerə,
Sarı gülə oxşar qapı, pəncərə.

Çox yerdən qar getmiş, çox yerdə qalmış,
Kəndi bir zürafə şəklinə salmış.
Burada iki-üç abad daxma var,
Qutuya oxşayır yerdə qalanlar.
Birinin damıdır birinə həyət,
Evlər bir-birinə toxunmuş, əlbət.
Hər evin önündə bir ocaq yanır,
Hər yanda bacadan tüstü boylanır.
Tüstü sütunları yüksəlir göyə,
Qara pərdə çəkib abı lövhəyə.
Söyüdun kölgəsi bir dama düşmüş,
Rəqsdə söyüdlə kölgə ötüşmüş.
Tovlama hərlənir, o qızıl xətdən,
Əlvan dairələr cəkilir həmən.
Zivədən asılmış paltarlar hələ,
Elə bil rəqs edir, vermiş əl-ələ.
Kimi inək sağır, ocaq püfləyir,
Kimi it aparır boynunda zəncir.
Kəndxuda bəzəmiş odur eyvanı,
Geyinib isti kürk, önündə fanus,
Elə bil oturmuş təxtə Keykavus.
Kəndin hər yerində bir canlanma var,
Evlərin çoxunda qaynar samovar.
Dəstəmaz alınır, başlanır namaz,
Kimi dua oxur, kimisə Şahnaz.
Nə gözəl illərdi andığım illər,
Deyərdi, gülərdi bizim bu ellər.
Hər yerdə var idi əmin-amanlıq,
İnsanlar bilməzdi nədir yamanlıq.
Xalqın qəlbi kimi evlər işıqdı,
Evlərə qış günü od yaraşıqdı.
Od idi bəzəyən dost məclisini,
Şəbçərə gəlirdi hey sini-sini.
Şəbçərə əllərdə gəzir dambadam,
Sinidə qoz, iydə, kişmişlə badam.
Uşaqlar küçədə verib səs-səsə,
Bütün kənd əhlini salmış həvəsə.

Bayram axşamından, təzə paltardan,
Danışır hər yanda qoca, hər cavan.
Rəngləri bir-birə alıb qatırlar,
Bayram gecəsində şal sallaynlar.
Budur, bahar gəlir, çatmışdır bayram,
Hel-gülle bəzənmiş süfrələr tamam.
Bayram süfrəsidir əlin zinəti,
Bayramla əl tapıb əbədiyyəti.
Başqa dəstgahı var bayramın bizdə,
Yüz nemət düzülür hər süfrəmizdə.
Yumurta boyanır, quzu boyanır,
Bəzəkli evlərdə çilçıraq yanır.
Şəhərdən yollanır kəndə çərçilər,
Çərçi nə gətirsə, alır kəndçilər.
Zəncirə, araqçın, düymə, sap, qaytan,
Şəvə, muncuq, üskük, kəhrəba, mərcan.
Bayramlıq verməkçün oğul, uşağa,
Xırda pul qoyulur cibə, qurşağa.
Cavanlar bacadan sallayacaq şal,
Açır bu adətlə bizim ellər fal.
Dam üstə duranı tanımasan da,
Hədiyyə verəsən gərək o anda.
Mahir olmalıdır qaynana, gəlin
Ki, düzgün tanısın şalın yeznənin.
Adaxlı şalma bağlansın gərək,
Naxışlı corablar, tirmə, şal, ipək.
Bayramda karvanlar keçər Arazı,
Kəsilməz zənglərin şənlik sədası
Səfərdən qayıdar bizim qəriblər,
Sevinər, nazlanar adaxlı dilbər.
Oğlan gətirmişdir hər nə istəsən,
Qıza deyər: "Cehiz dərdi çəkmə sən!".
Gətirib rəngbərəng ipək parçalar,
Elə das ayna ki, gün kimi parlar.
Şal, üzük, bahalı bolqar başmağı,
Samovar, mecməyi, cam, boyunbağı.
Saat, qızıl zəncir, güşvara, qolbaq,

Tamaşa edəndə göz qamaşacaq.
İnəklər doğacaq, ağuz, bulama,
Eldə bol olacaq süd, qatıq, xama.
Elbəyi gələcək şel-şel, tat-tatı,
Elə gətirəcək sələ-sovqatı.
Bayram gözəllərin şadlıq dəmidir,
Onların aləmi şah aləmidir.
Yeməyi, yatmağı unutmuş onlar,
Kimi xma yaxar, vəsmə qaynadar.
Kimi sığal verər kəkilə, telə,
Bəzənər gecələr yuxuda belə.
Cümədir, şənbədir, bazardır bilməz,
Güzgü qabağından bir an çəkilməz.
Qaşa vəsmə yaxar, elinə xına,
Bəzənib-düzənmək peşədir ona.
Hələ qızlara bax, işvəli, tompul,
Düzülüb araqçına cərgə-cərgə pul
Zilim-zimbə ilə düzəlir yola,
Necə məstan pişik, tiftikli tula.
Evin keyvanısı gözü sürməli,
Başı kəlağaylı, əyni tirməli,
Kürsüdə ağanın yanını kəsmiş,
Qaşını aldırıb, saçını kəsmiş.
Gecəni bağlamış uzun saçilə
Bayaqdan ağanı basmışdır dilə;
Doğulduğu gündən bu günə qədər
Nə olub, nə görüb hamısnı söylər.
Sanki göbəyini o özü kəsmiş,
Bu işi görəndə əli də əsmiş,
EIə ki, əlindən düşübdür bıçaq,
Göbəkdən aşağı bir iz açaraq.
Ən gözəl yerlərdən, şirin şeylərdən,
Danışır o şirin xatirələrdən.
Nişan üzüyünü almış əlinə,
Fərman vermək istər xalqın qətlinə.
Adaxlıbazlığa gəlincə oğlan,
Yüz kələk qurarmış qız qabaqcadan,

Elə ki, xınası, xizabı çatmış,
Necə təmtəraqla vəsmə qaynatmış.
Toyunda çalınmış zurna-balaban,
Belə toy görməmiş hələ bir insan.
Oyun çıxaran kim, at oynadan kim,
Tonqal qalayan kim, tufəng atan kim.
Zəri şəltə, tuman atlanır-düşür.
Sağrılar yırğanır, məclis gülüşür.
Ləzgi rəqsi edir qəmə-xəncərlə,
Qurşaq yapışıbdır Cəfər Əkbərlə.
Aşıq Rüstəm çalır, oxur "Kərəmi",
Sığmayır dünyaya nazı, çəm-xəmi,
Çalınır dəf, tənbur, kaman, ötür tar,
Fələyin qulağı səsdən olub kar.
Gəlinin başına bəy alma atır,
Gəlin oğrun-oğrun baxıb naz satır.
Hacı gəncliyini salaraq yada,
Könlü vəcdə gəlir, damağı dada.
Nişanlı gözəllər, təzə gəlinlər,
Verib tavus kimi otağa zivər,
Divara al-əlvan şəkillər vurub,
Taxçaya nar, alma, heyva doldurub.
Gah örtük toxuyur, gah çəkir köynək,
Bir ilmək zər atır, bir ilmək ipək.
Başına sürməyi çadra salıbdır,
Sanki ay üstünü bulud alıbdır.
Bir şəltə geyinmiş dizdən yuxarı,
Yarır yaxasını bir cüt nubarı.
Bəzəkdir diləyi, paltardır ərzi,
Gah bəzəkçi gəzir, gah tapır dərzi.
Xala-xanbacılar başlamış işə,
Dedi-qodu, yalan dönmüş vərdişə.
Uzun tuman nənə, yaşmaqlı xala,
Tumanı, yaşmağı atıb az qala.
Gecəni gündüzə qatıb işləyir,
Ağbirçəklik edir, məsləhət verir.
Gözəl qaraçı qız düşüb meydana,

Qızıl, gümüş pullar düzüb hər yana.
Taxıb qulağına qızıl sırğalar,
Saçı kürəyində ləpələr vurar.
Gəzir küçələri dəf çala-çala,
Söz atır, öcəşir o, əhli-hala.
Hamını gətirir şövqə, həvəsə,
Toy-düyün arzusu edir hər kəsə.
Zəri, atlas geymiş o gözəl dilbər,
Əprimiş qocanı vəcdə gətirər.
Odur, bağçalarda çılpaq ağaclar
Külək zərbəsindən titrəyib durar.
Baş əyir görüncə keçir bir nəfər,
Bahardan, novruzdan tutarlar xəbər.
Hamısı həsrətlə boyun bükərək,
İstərlər yaz gəlsin açsınlar çiçək.
Bağ elə həsrətdir yarpağa, gülə,
Yuxuda yaz görür, yatsa da belə.
Ordu seli kimi külək hey coşar,
Ağaclar divarla, damla toqquşar,
Yenidən hücuma başlasın deyə,
Yorulcaq çəkilər bir az geriyə.
Kəndi bürümüşdü işıqla kölgə,
Bir lövhə boyanmış gör neçə rəngə.
Vəhm qələmini alıb kölgələr,
Bu dərin sükutu odur rəngləyər.
Canlı şah əsərdir bütün təbiət,
Hüsnü qarşısında acizdir sənət,
Abı çadır kimi göylər ucalar,
Mələk üzü qədər safdır buludlar.
Bir sükut asılmış sanki göylərdən,
Gümüşü pərdəyə bürünüb həmən
Bu mavi çadırın üstündə qəmər,
Almas bir üzüyün qaşına bənzər.
Hərdən bir meteor axaraq gedir,
Bütün ulduzları bağrıqan edir.
Bulud içrə yanır bir tor çırağı,
Huridir, üzündən atsa duvağı.

Zöhrə aşiq olmuş çoban qızıtək,
Gözəllər şahıdır, ləbində tütək.
Zöhrənin hüsnüdür diliər əzbəri,
Şöhrəti eşqdə tapmış o pəri.
Onun otlağıdır mavi asiman,
Ulduzlar sürüdür, o isə çoban.
O gözəl zümrüddən sırğalar asmış,
Zülfünü çəng kimi bağrına basmış.
Çalar nəğməsini hüsni-xilqətin,
Otlar ahulan əbədiyyətin.
Dərədən sanki bir dalğalı ipək,
Çay axır, hayqırır, coşur dəniz tək.
Ay düşüb deyəsən o burulğana,
Çırpınır, çalışır çıxsın bir yana.
Yayılır- ətrafa çayın nəğməsi,
Çalır rübabında haq təranəsi.
Buz tutub, qar örtüb suyun üzünü,
Məhtabdır parladan su güzgüsünü.
Çay axır, burulur sola, gah sağa,
Xəyal dalğalanır, qaçır uzağa.
Görürsən axar su yuxuya dalmış,
Söyüd kölgəsini üstünə salmış.
Karvanın zəng səsi gəlir uzaqdan,
Gedir nişanlı qız əldən, ayaqdan.
Birdən eşq tutdu könlümdən soraq,
Məni şair etdi o gecə o dağ.
Bu qədər mənalı keçsə hər gecə,
İnsan keçən ömrə acıyar necə?!

## GECƏNİN SİMASI

Ey gecə, ey coşğun zülmət dənizi,
Bu ay qayığını kimdir gəzdirən?
Ey tökən saçmı ətəklərinə,
Zülfii seçilməyən qara müşkdən.
Ey qədim dünyanın kölgəsi gecə,

Həyatla ölümü qucaqlaşdıran.
Ey qara saçıyla dünyanı örtən,
Sən dağ üstə çökən qara buludsan.
Ey gecə, ey qara qübbəli çadır,
Ey ay Xosrovunun şahlıq sarayı,
Fələk gəlininin xəlvət otağı,
Düzən pərdəsinə ulduzu, ayı.
Sən ayın çiynində bir qara donsan,
Fələyin əynində qara tiləsən,
Ey gecə, ey gizli sirlər aləmi,
Səndə həqiqəti kəşf edir cahan,
Sən ey şəkkü-şubhə, sükut dünyası,
Qərq olub zülmətin içrə vəhmlər.
Ey ucu-bucağı görünməz dəniz!
Qarşında heyrandır düşünən bəşər.
Sanki bir meşəsən, qara, keçilməz,
Sirrini büməkdə acizdir xəyal.
Keçibsən yolunu baxışlarımın,
Məni valeh edib səndəki cəlal.
Gözə işıq verər sürmə adətən,
Gecənin sürməsi gözə mil çəkər.
Səndə baxış oxu toxunar daşa,
Sənin iqlimində ağıl diz çökər.
Başda bəslədiyin bu nə sevdadır?
Nədir istədiyin, bizi başa sal!
Təfəkkür beşiyi, xəyal yurdusan,
Bir dünya cəlalsan, bir dünya camal.
Necə lalələrlə bəzənər dağlar,
Sənin bəzəyindir əzəmət, vüqar.

## KƏNDÇİNİN ADAXLIBAZLIĞI

Gəcənin qəlbində min xəbər vardır,
Sanki sevgidən də o xəbərdardır.
Gecə gündüz kimi cansıxan deyil,
Gündüzün yanında gecə aydır, bil!

Gecənin mədisi bəzənər ayla,
Gecələr aləmə ay çalar layla.
Gecə ay nurundan çıraq yandırar,
Ondan eşq dərsi alar cavanlar.
Göz qırpar səmada gecə ulduzlar,
Onlardan naz-qəmzə öyrənər qızlar.
Gecə zülmətindən ay ki boylanar,
Könüllərdə doğar ümid, etibar.
Bulud pərdə çəksə ayın üzünə,
Bir an yuxu gəlməz aşiq gözünə.
Fələyin qəsrinə gəlincə ulduz,
Eyvanı tərk etməz bir nişanlı qız.
Bacadan oğrutək ay çıxan zaman,
Çəkməz sevgililər gözünü ondan.
Eşqin aləmini gecə bəzəyər,
Adaxlıbazlığa gedər kəndçilər.
Hanı o illər ki, yay aylarında
Gəzərdim yurdumun yaylaqlarında.
Yaylaqda yaşayan bizim ellərdən,
Şirin xatirələr yaşadıram mən.
Var idi bir qəşəng qızı emməmin,
Adaxlıydı, getdi sonralar gəlin.
Əri bir yenilməz qoçaq gənc idi,
Qaməti, heykəli sanki tunc idi.
Kəndi bibimgildən xeyli uzaqdı,
Yolu dağ-dərəli, hündür, alçaqdı.
Görərdim dumanlı, sisli gecələr,
Şir kimi dağları aşaraq gələr.
Adaxlıbazlığı o mərd oğlanın,
Ağzına girməkdi qızmış aslanın.
Rüstəmtək çəkərkən ayı quyudan,
Kəsərdi yolunu onun "Həft xan".
Yadıma gəlir ki, sirli bir gecə,
Susayıb ayıldım bilmirəm necə.
Gördüm dam üstündə sanki adam var,
Ayağı altında çör-çöp xışıldar.
Gəlib yaxınlasdı bacaya artıq,
Bacanın ağzına çökdü qaranlıq.
Sezdim, uzanmışdı dam üstə yavaş,

Baxır oğrun-oğrun bacadan bir baş.
Deyəsən kiçicik bir daş da atdı,
Qazana toxundu, şivən qopartdı.
Gəlin yatmış görüb evdəkiləri,
Çıxıb gözdən itdi, necə bir pəri.
Mən isə kuzədən sərin su süzdum,
İçib, pəncərədən onları süzdüm.
Kəndin hər yanında hakimdi sükut,
Çölü çən örtmüşdü, dağları bulud.
Baş çəkib göylərə saman tayası,
Tayanın üstündə leylək yuvası.
Elə sakitlikdi, eşidir qulaq,
Durnalar havada qanad çalacaq.
Quşların bu həzin, xoş təranəsi,
Verir təbiətə yuxu həvəsi.
Damların üstüne çökən buludlar,
Sanki hörümçəkdir, torlar toxuyar.
Ayın, ulduzların atəşi sönür,
Kəhkəşan gül gəzir, qərbə sürünür.
Damda çoban iti hürüyür hərdən,
Keçməsin xam xəyal qurdun könlündən.
O, bir keşikçidir, yatmaz, bağırar,
Pəri qoruğundan divləri qovar.
Bağçada bağlanmış buzov bayaqdan,
Ana həsrətilə qoparmış fəğan.
Ayın məşəlində işıq azalmış,
Yağsız çıraq kimi solub-saralmış,
Piltəsi düşmüş bir çırağa oxşar,
Al-əlvan buluddan bir örtüyü var.
Buludun əlində ayın fanarı,
Sanki yola çıxmış qoca bir qarı.
Gedir üzüaşağı uca təpədən,
Yavaşca dərəyə enir, deyəsən.
Üfüq çadırına yetcəyin ancaq,
O, işıq çətrini başdan atacaq.
Sanki buz bağlamış bir göldür fələk,
Üstündə ulduzlar oynayır xizək.
Bəlkə də inciylə dolu dənizdir,
İncilər sayrışır, suyu təmizdir.

Ağır yuxu tutmuş ulduz gözünü,
İstəyir buludla örtsün üzünü.
Ay isə səprək mehtab suyunu,
Ulduzun gözündən qovar yuxunu.
Quşların nəğməsi gəlir uzaqdan,
Sanki hurilərdir çalıb-oxuyan.
Bir bulaq başında o iki aşiq,
Ağac kölgəsinə verib yaraşıq.
Oturub xəlvətdə, yad gözdən uzaq,
Deyib dinləyirlər eşqdən ancaq.
Gül ilə qənd kimi onlar qovuşmuş,
O bunun, bu onun boynunu qucmuş.
Aşiqin ovcunda lumutək məmə,
Qızın əyləncəsi gümüşqın qəmə.
Eşqə bax, hüsnə bax, durub yanbayan,
Əylənir aslanla qaragöz ceyran.
Gözəllik timsalı olan bir maral,
Aslan dodağından öpər dalbadal.
Bu bir şux gözəldir, çiçəkdən incə,
O, qoçaq igiddir, bir polad pəncə.
O, fədakarlıqdan danışıb durur,
Bu sevgi, vəfadan hər an dəm vurur.
Danışır o, pələng öldürməsindən,
Əlini çəkmədən yar məməsindən.
Bu isə yarının qolunu oxşar,
Deyər ki: "Ərimdə şir ürəyi var".
Bu deyər: "İgidsən, qoçaqsan, inan!".
O deyər: "Bu canım heyana qurban!".
Bu, şux bir maraldır, əndamı qəşəng,
O, qoç bir igiddir, şikarı pələng.
Bu, kəmənd zülfunə baxıb nazlanar,
O öz qol gücüylə edər iftixar.
O istər toy olsun, başlansın düyün,
Bu susar, görünər həyadan küskün.
O, bir qızıl sırğa çıxarıb bu an,
Asdı öz əliylə yar qulağından.
Bu isə qoynundan çıxarıb dərhal,
Azəri zövqülə toxunmuş bir şal.
Əyirib, toxumuş öz hünərilə,

Bağladı belinə incə əlilə.
Mənim qulağıma dedi bir Suruş,
O, kəmərbəstədir, bu, həlqəboguş.
Bu dəm qonşu evdə olan bir nəfər,
Tutub hənirtidən, söhbətdən xəbər.
"Oğru!...Oğru!.." deyə qopardı fəryad,
Boğardım mən onu tutsaydım, ey dad!
Onun nərəsindən kənd çalxalandı,
Böyüklü, kiçikli hamı oyandı.
Yarından ayrılan o həyalı qız,
Öpərək üzündən, dedi: xudafiz!
O aşıb divardan, yollandı dağa,
Bu, gedib sakitcə girdi otağa.

## ŞAİRİN GECƏSİ

Gecə xəbərdardı aşiq qəlbindən
Günü qara oldu odur gecədən.
Biz qara günlüyük, gecə qaralar,
Bedbəxtik, gecənin nə günahı var?
Gecələr ay ilə nurlanar afaq,
Aşiqin mehtabı ümiddir ancaq.
Zəfər çeşməsidir bizim gecəmiz,
Gecədə gizlənir hər qələbəmiz.
Pərişan fikirlər gecə toplanar,
Ən uzaq üfüqler görünər aşkar.
Gecə mərd oğullar gələr özünə,
Tefəkkür başını qoyar dizinə.
Ağlın məzəsini məstikən dadar,
Həyat planını çəkər adamlar.
Gecə xatirələr düzülər sana,
Ömrün müşkül işi dönər asana.
Gecə bir kitabdır, mənası dərin,
Söylər tarixini qərinələrin.

Gecə yuxu gələr, göz xumarlanar,
Olar yorğunluqdan aləm biqərar.
Gecə ana kimi açar qoynunu,
Rahatlıq beşiyi bilərlər onu.
Gecenin canında yuxu dərmanı,
Haq quşu oxuyar şirin dastanı.
Onun peymanəsi gətirməz xumar,
Bunun əfsanəsi qulağı oxşar.
Təbiət gedincə dərin yuxuya,
Təkan verə bilməz aydın su suya.
Dünya yuxudadır, təbiət xamuş,
Vəhdət badəsindən olaraq bihuş.
Özünü itirmiş bütün canlılar,
Sükut aləmində yatıb qalmışlar.
Bütün yer üzünü yatmış görərək,
Heyrətdən gözünü bərəltmiş fələk.
Bu sonsuz sükutu görən kainat,
Qalmışdır əzəmət qarşısında mat.
İncə sirrləri ölçmək istəsən,
Ən dəqiq tərəzi duyğudur, bil, sən.
Bir saman çöpünü tərpətsə ruzgar,
Duyğu qələmilə şəkli alınar.
Könül güzgüsünün pasını silsən,
Bitki nəfəs alsa, sən eşidərsən.
Geniş qanad aça bilərsə insan,
Ruhlar nəğməsini eşidər, inan!
Vursa gecəquşu bir cığa əgər,
Səsi fələklərin övcünə yetər.
Ağacda tərpənsə bircə bir yarpaq,
Sanar zəlzələyə gəlibdir afaq...
Titrəyər səsindən hər yerdə dağ-daş,
Elə bil ki, teşte vurulubdur daş.
Bir barmaq toxunsa çini sağərə,
Cingüti fələyə gedər xəbərə.
Səs sevir havada dalgalanmağı,
O daşdır ki, düşər göydən aşağı.
Bir söz dam üstünə çatarsa həmin,

Tası damdan düşər onu deyənin.
Əgər yaxşılıqdan başqa söz desən,
Arıla ki, özünü rüsvay edərsən.
Yüngül bir meh yeli əsdiyi zaman,
Qopar kainatda müdhiş bir tufan.
Mən üz döndərərəm haqqa o anda,
Könlüm həqqi arar belə zamanda.
Vücudum şam kimi yanıb-yaxılar,
Saz kimi çalınar başımda saçlar.
Könül vəcdə gələr, qoşar avaza,
Gələr ilhamımın quşu pərvaza.
Bu sonsuz dənizə saldıqca nəzər,
Kərəm dalğaları coşar, yüksələr.
Tac kimi gövhərə qərq olub, odur,
Dalğalar üstündə bir mələk durur.
O edir ariflər başına nisar,
İlham gövhərini tutmadan qərar.
Baxır göz yaşınna, coşğun təbimə,
Tökür gövhərləri hey ətəyimə.
Gecələr şairə gətirir zəfər,
Aləmə nur saçır belə gecelər.
Şairin gecəsi şərəfdir, şandır,
İlham güzgüsündə aləm əyandır.
Açıqdır qapısı gecə fələyin,
Gecə sirdaşıdır şerin, əməyin.
Gecə qanad verər bəşəriyyətə,
Ruhunu qaldırar əbədiyyətə.
Gecə pis əmələ qol qoymaz bəşər,
Gecələr gündüzdən xeyli fərqlənər.
Gecə əmn-amanlıq axtarar insan,
Məhəbbət mülkünə yollanar insan.
Məkrdən, riyadan qalmaz bir əsər,
Bəşər xain olmaz gündüzkü qədər.
Çəkilər bəşərin ruhu xəlvətə,
Qəlbi vaqif olar sirri-vəhdətə.
Gecə öz səsini eşidər könül,
Sığmaz dərisinə, fəxr edər könül.

Ruh da qanad açar, qəfəsdə qalmaz,
Edər əbədiyyət mülkünə pərvaz.
Gecə, ibadətin vaxtı çatınca,
Xərabat damına çıxar bir qoca.
Üns dərbarının damında birdən,
Ərşdən gəlmiş bir mələk görərsən.
Üzü üfüqləri işıqlandırar,
Üzünün əksidir, göydə bir ay var.
Onun camalından yayılan işıq,
Yüksəlib, göylərə verər yaraşıq.
Vəhdət muğamını başlar bir avaz,
Nahid o havanı çalar eldə saz.
Mütləq bir camalın vəsfini söylər,
Məst ikən dilində haqq adı əzbər.
Sevincin, kədərin, səfanın quşu,
Ərşin qülləsinə başlar uçuşu.
Mələklər səmanın qürfələrindən,
Yerdəki şənliyə baxarlar bəzən.
Bəzən asta-asta edib hərəkət,
Yerə gətirərlər xeyir-bərəkət.
Gecənin qəribə bir dünyası var,
Gecə röyasında ömür bal dadar.
Çoxdur gecələrdə belə hünərlər,
Bu sədəf yetirmiş çox belə gövhər.
Aman, səhər birdən ordunu çəksə,
Rumlular həbəşin qanını töksə,
Başlasa qovğası gecə-gündüzün,
Gündüz zəfər çalıb ağartsa üzün.
Fələyin gəlini qocalar birdən,
Saçları ağarar qəmdən, qüssədən.
Üzündən bəzəyi yuyar göz yaşı,
Enər sinəsinə möhnətdən başı.
Bir ahı söndürər ay məşəlini,
Quyuya tullayar ulduz şəmini.
O qədər lalədən xali qalar bağ,
Lalə ürəyinə günəş vurar dağ.

## GECƏ XATİRƏLƏRİ

Gecənin nə qədər sirri var, aman,
Gecə nələr görmüş, yarəb, dünyadan.
Nə görmüş, nələri düşünür gecə?
Bunca qəribəlik doğurmuş necə?
Vüsallar görmüşdür sözlə, söhbətlə,
Hicranlar görmüşdür qəmlə, möhnətlə.
O görmüş rüxsan ay Mənijəni,
Quyuda həbs olan igid Bijəni.
Leylini görmüş ki, dağ-daşı gəzər,
Məcnunun eşqilə canını üzər.
Görüb Şiruyəni, deyərək qan-qan,
Div kimi yavaşca düşür bacadan.
Çingiz ordusunu görmüşdür gecə,
Qiyamət qoparır döyüşdə necə.
Görüb təxti-Cəmşid necə odlanır,
Gülür İskəndərin halına, yanır.
Görub zindanları, işgəncələri,
Göylərə açılan miskin əlləri.
Dağ görmüş ananı o ağlar görüb,
Məcnun Leyli qəbrin qucaqlar görüb.
Pərviz rikabına Şirini necə,
Çağırır, görmüşdür Şəbdiz, hər gecə.
Veys ilə Ramini yataqda görmüş,
Ayı şəm kimi o, otaqda görmüş.
Elləri görmüşdür səhradan keçər,
Yığıb çadırları, obadan köçər.
Görmüş dəvəçilər hay-haray salar,
Kimisi oxuyar, kimi ud çalar.
Karvan elbəyisi gedir qabaqda,
Gəraylı oxuyur, əli qulaqda.
Dəvə zəngi ilə yürüyür karvan,
Zəngin zümzüməsi - sirli bir kaman.
Karvanlar yollardan ötmüşdür əzbəs,
Salmışdır zəngləri dağa-daşa səs.
Karvan qarışqatək dağa dırmaşar,

Yol iyə sarınmış bir sapa oxşar.
Ruhları oxşayan zümzüməsilə,
Yolları zəng açır, keçir qafilə.
İpək bir tel kimi insan xəyalı,
Dolaşır, açılır, yola çıxalı.
Suyun şırıltısı, zəngin səsindən,
Bilməz yuxu nədir, gecə yol gedən.
Yolçu kəcavədə yuxuya dalcaq,
Ay əfsanəsindən ləzzət alacaq.
Çavuşlar carlayır, yollanır zəvvar,
Çavuşun çiynində yaşıl ələm var,
Leylinin əli də həmin bu yoldan,
Keçmişdir Yəmənə, Nəcdə bir zaman.
Kəbəsi bilərək nakam eşqinin,
Məcnun təvafına gəlmiş bu yerin.
Oğrular, düşmənlər görmüşdür gecə,
Vəhşi yolkəsənlər görmüşdür gecə.
Canilər görmüş ki, gözləri parlar,
Qaniçən quldurtək pusquda durar.
Görmüş sərkərdələr edir məsləhət,
Hücum nəqşəsini çəkirlər xəlvət.
Döyüş fərmanını verir genrallar,
Marşal məğlub olub edir intihar.
Görmüş atdan düşür bir çox qəhrəman,
Daşların üstünə ləkə salır qan.
Boğulur insanlar qəhrü qəzəbdən,
Boğur düşmənini qəhrilə düşmən.
Əli qana batmış xain adamlar,
Qaranlıq gecədə pənah axtarar.
Hiylədən doğulan qara ləkədən,
Gecə ayın üzü qaralmış bəzən.
Nə qədər namuslu məsum gözəli
Görmüş parçalayır ehtiras əli.
Gecə şahid durub tərpətsə dodaq,
Göylər xəcalətdən alt-üst olacaq.
Yaxşıdan, yamandan görüb yüz pərdə,
Gəda atlas içrə, şah quru yerdə.

Görmüşdür bir bəxti dönmüş qumarbaz,
Var-yoxu əlindən getmiş, usanmaz.
Sonuncu varağı əlində tutmuş,
Ümidi onadır, özün unutmuş.
Düşünür varağı o necə atsın
Ki, bir ailənin sonuna çatsın.
Titrəyir, gecikir, əli gəlməyir,
Bilməyir nə oyun hazırlar təqdir.
Pərdə arxasında arvad-uşağı,
Gözü yaşlı qalmış, başı aşağı.
Qaranlıq, qorxulu bir uçurum var,
Ağzını açaraq hey yaxınlaşar.
Bir bayquş ulayar, damda inləyər,
O yaman günlərdən gətirmiş xəbər.
Gecə qonaqlıqlar görmüş, bayramlar,
Çıraqla bəzənir evlər axşamlar.
Onu da görmüş ki, elə bu zaman,
Tufan insanlan qoyub sərgərdan.
Görmüş ki, Hüseynin öldüyü axşam
Bayram paltarını geyinmişdir Şam.

## GECƏ XATIRATININ DAVAMI

Gecə Nuhu görmüş, qədim dünyanı,
Nuhun gəmisini, böyük tufanı.
Dünya başdan-başa burulğan ikən,
Gecənin gözləri bərəlmiş qəmdən.
Görünmür dünyada bir qarış torpaq,
Göy dəniz üstündə çadırdır ancaq.
Tufandır, su tutub bütün aləmi,
Bir köpük qədərdir su üstdə gəmi.
Ölümün ağzından alov püskürür,
Həyat diri ikən qəbrə sürünür.
Ölülər çiyninə yuklənmiş həyat,
"İntiqam" deyərək, səslənmiş həyat.
Qəzəbli dalğalar tutub aləmi,

Nicat nöqtəsidir təkcə bir gəmi.
Gecə Şərqi görüb qədim zamanlar,
Qədim Hindistandan xatirəsi var.
Görüb rumluları, sasaniləri,
Finikyalıları, kəldaniləri,
Misri, Suriyanı, qədim Livanı,
Firon ehramını, Nildə tufanı.
O dərin dənizi görmüşdür gecə,
Musa əsasıyla yanlır necə.
Görmüş necə köçür Bənİ-İsrail,
Qərq edir Fironu ordusilə Nil.
Qeysər cəlalmı, Dara namını,
İskəndər aynası, Cəmşid camını.
Qəsrlər görmüşdür aynabənd, mərmər,
Fərşini bəzəmiş mirvaridlə zər.
Bəzəmiş səqini büllur çıraqlar,
Nərgiztək lalələr göz vurar xumar.
Pərdələr nargülü, limon rəngində,
Minalı qəsrlər İranda, Çində.
Büllur qədəhlərdə qırmızı şərab,
Səpilmiş hər yana mişk, ənbər, gülab.
Qıvrımsaç qullarla dolmuş dəhlizlər,
Eyvanda yanağı xallı kənizlər.
O çalır bərbət, ud, oxuyur qəzəl,
Bu səpir manqala ud ilə səndəl.
O geyib arxalıq, bağlamış kəmər,
Bunun qulağında sırğaları zər.
Qapılar, divarlar gövhərdir, ipək,
Verir libaslara zər-zivər, bəzək.
Artırır zər, tafta, tül o cəlalı,
Zəri, tirmə, atlas, həm kəşmir şalı.
Gecə xatırlayır o zamanlan
Ki, görmüş qərq edir Nil insanları.
Ay gülür, gəlintək bəzənmiş dərya,
Su içrə cəsədlər bir qəmli röya.
Görmüş alov qalxır atəşgədədən,
Sanki nur süzülür aydan, günəşdən.

Görmüş su sonası şux dilbər kimi
Qızlar odda üzür səməndər kimi.
Atəşdən ağ alov yüksəlir dil-dil,
Sanki günəş altda parlayır qızıl.
Ya da tər yaqutdur vurulmuş taya,
Parlayır, şəfəqi düşmüşdür aya.
Qanlı sinəsində ya da fələyin,
Yaxmış təndirini günəş şəfəqin.
Görmüş uçurulur köhnə məbədlər,
Qalır yetim kimi tənha günbədlər.
Bir-birə qarışmış qorxunc daxmalar,
Sürünən kölgələr vahimə salar.
Heybətli, rəmzli taclara baxsan,
Qıfıl asmış rəmzin daş sandığından.
Sanarsan zəncirə bağlanıb ruhlar,
Hərdən bir-birinə söhbət açarlar.
Gecə sirdaşları sükutu gözlər,
Tilsimlər sirrini diqqətlə izlər.
Caduları görmüş dar daxmalarda,
Pəriüzlüləri saxlamış darda.
İfritə qanlar meşəliklərdə
Cadu quyuları qazmış hər yerdə.
Qanlar saçından asılmış qızlar
Hər maral boynunda bir əjdaha var.

## NAZ EYVANI

O cavan, yenilməz aşiqi görmüş,
Eşqdən qəm dolu bir ömür sürmüş.
Gecə damdan-dama atılar, gəzər,
Onu hər addımda izləyər xətər.
Məcnun tək sorağı gəlir hər yandan,
Əlində sənəd var, yazısı qandan.
Sürünər gah əli, gah dizi üstə,
Əli yara olmuş, dizləri xəstə.
Gah əli-ayağı tutar sütundan,

Gah başı görüner bacadan bir an.
Gah bir təkan ilə süst ayaqlan,
Ağır əndamını dartar yuxan.
Oturar bir uca dam üstdə, ağlar,
Görünən saraya könlünü bağlar.
Bu haman cənnətin gözəl qəsridir,
Behişt hurisinin əzəl qəsridir
Burada yaşamış o füsunkar yar,
Bəli, buradaydı o şux füsünkar.
Yarın zülfü kimi bükülmüş saray,
Salıb fələklərə hiddətdən haray.
Açıb aslan kimi ağzını eyvan,
Deyər: "Xor baxmayın mənə siz, aman!".
Qıcayıb dişini sütunlar, deyər
Ki, "Ölüm üzünə gülər bixəbər!".
Deyər ki: "Burada varsa da şikar,
Aslan ağzındadır, çətin ovlanar...
Hənəklə qaşıma aslan boynunu,
Qalx, mənə öcəşmə, azma yolunu!"
Lakin çəkinərmi vəhşi aslandan
Eşqin meşəsindən keçən bir insan?!
Şikara çıxarsa ülvi məhəbbət,
Aslanın ağzına əl verər əlbət.
Salar pəncəsini şirin kəməndə,
Çəkər ayağını hünərlə bəndə.
Aslanı ayaqdan bəndə salanlar,
Bu yolda keçsələr başdan, yeri var.
Onlar elə yerə basarlar ayaq
Ki, göyün ayağı aciz qalacaq.
Milçək o mənzilə çatarmı, heyhat,
Ki, simurğ orada salmışdı qanad!
Açıb mələk kimi qol-qanad insan,
Pərilər qəsrində tutmusdur məkan.
Ağzını açaraq gözəl qəsrlər,
Püstə ağzı ilə hekayə söylər.
Varaqlarla dolmuş içi qönçənin,
Sığmaz qabığına içi püstənin.

Huri oylağıdır, pəri yatağı,
Qapısı, divan tər gül yarpağı.
Sünbüllə, süsənlə bəzənmiş çəmən,
Bitmiş dəstə-dəstə onda yasəmən.
Suyundan incitək damar qətrələr,
Oyun sədəfində bəslənər gövhər.
Eyvanın fərşinə bax, valeh ol sən,
Həşyəsi minalı fil sümüyündən.
Hər yana baxırsan güzgü tək parlar,
İkişər tikilmiş aynabənd divar.
Hər şaxə üstündə yanır bir çıraq,
Laləsi bağdakı lalədən parlaq.
Aynabənddə yanan lalələr hələ,
Bir səhər yaratmış şən, gülə-gülə.
Asılmış tül pərdə pəncərələrdən,
Huri saçlarıdır, baxsan, deyərsən.
Eyvanın önündə söyüd ağacı,
Yayıb hər tərəfə pəri tək saçı.
İlmələr vurmuşdu yaşıl ipəkdən,
Keçir ay işığı sanki ələkdən.
Elə bil ud şaxı od alıb yanır,
Yel vurur, şöləsi ərşə dayanır.
Pərdə tək asılmış söyüdün teli,
O teli oxşayır xoş səba yeli.
O gah fil sümüyü, gah da şəvədən,
Möhrələr götürüb qoyur deyəsən.
Ay inci səpərək titrəyir, deyir;
"Bir öpüş qiyməti, görən, neçədir?"
Söyüd mütrüb kimi şux-şux yellənər,
Asıb tellərindən pullar, pərəklər.
Rəqs edər yerində o yavaş-yavaş,
Baş əyər, sanarsan, istəyir şabaş.
Sərv boylu bir gül təxt üstdə yatır,
Mələfə altında sinəci atır.
Mələfə istəyir uzansın bir az,
Qucusun boynunu, lakin bacarmaz.
O qız bir gözəllik ilahəsidir,

Cəllad qəsri onun toy hicləsidir.
Zülfünü çinləyib o, kəmənd atar.
Biləyi dayanmış alma buxağa,
Bir narınc asılmış şümşad budağa.
Qatlanıb sanki bir şahin dimdiyi,
Bir cüt nərgizini örtmüş kirpiyi.
Qara gözlərinin ahusu hərdən
Otlayır, çəməni kitabdır, deyən.
Qzıl bir şamdanda ənbər şam yanır,
O gümüş əndamlı nura çulğanır.
Şamdan örtüsündən süzülən işıq,
Verir kitabına xoş bir yaraşıq.
Hüma qanadıtək kirpiklərindən
Düşür gül üzünə sayə deyərsən.
Tavuz lələyidir saçının tağı,
Xoruz pipiyindn aldır dodağı.
Hərdənbir naz ilə o, xumar-xumar,
Açıb gözlərini yuxarı baxar.
Vəhdət güzgüsüdür üzü, sanarsan,
Boynu o güzgünü döndərir hər an.
Qəlbitək üzünə verərək seyqəl,
Sonsuz bir camala çatmış o gözəl.
Mələk simasıdır ondakı sima,
Sinəsi üstündə var Turi-Sina.
Mələfə o qəddə əcəb yaraşar,
Sanki cavan sərvin üstə yağıb qar.
Mələfə o sərvi ağuşa çəkər,
Elə bil qarışmış süd ilə şəkər.
O sanki bir Aydır, çulğanmış nura,
Ya da bir balıqdır, düşmüşdür tora.
Sirrinə məhrəmdir mələfə, ancaq,
Ona köynək kimi açmışdır qucaq.
Bax o mələfəyə, pərdədir düzü,
Hər şeyi pərdəsiz göstərir özü.
Yüz şirin hekayə söyləyir bizə,
Şirinlik artırır hekayəmizə.
Bac alar narıncdan bir cüt məməsi,

Bir narınc bağıdır mərmər sinəsi.
Qarnı ortasında gümüşü göbək,
Sehrli ceşmədir dağ üstə, gerçək.
Qırqovul döşü var ordan aşağı,
Mən ona deyərdim qızılgül bağı.
O dağda gizlənmiş bir ülvi camal,
Oradan sürüşər zövq ilə xəyal.
O dağ ətəyini sanki qar almış,
Bir ahu balası qarda iz salmış.
Tük kimi belindən bir az aşağı,
Yüksəlir gümüşdən sağrılar dağı.
O dağ mərmərdənmi, fil sümüyündən?
Bac alır onlardan ancaq, mən bilən.
Verib ay işığı o dağa bəzək,
Pərilər sultanı oynatsın xizək.
Yarıq sinəsində vardır bir dərə,
Nadir bir dərədir, təmiz, bakirə.
Onda uçuruma məhkumdur könül,
Orada xəyalın sürüşəcək, bil!
Kor kimi ayağın gec atsa gözün,
Tasa qarışqatək düşərsən özün.
Orda sürüşməyən insanın gərək
Olsun qara daşdan bağrında ürək.
Ehtiras orada pələngə oxşar,
Çünki qarşısında ceyran izi var.
Çəkib budlarını pərgar qələmi,
Qıçı zərifliyin cəmidir, cəmi.
Dizləri qönçətək qəlbi edir bənd,
Cüt bullur şaxəyə vurulmuş peyvənd.
Aşiq bu gözəli gördüyü zaman,
Təşnə, həyat suyu tapmış sanarsan.
Görər məməsini, heyrətdən donar,
O bir cüt huludan agzı sulanar.
Məhəbbət diz çöküb camal önünd,
Xəyal mat qalıbdır cəlal onündə.
Həya ilə ismət iki casus tək,
Acıqlı-acıqlı deyərlər: "Əl çək!

Basma ayağını bundan o yana,
Salma aşiqləri zəhmətə, qana!".
Qorxu titrəməyə salmış aşiqi,
Üzünün rəngidir ayın işığı.
Yavaşca-yavaşca o, nəfəs çəkər,
Qorxar o güzgüyə toxunsun zəfər.
Bu naz dərgahında o yazıq hələ
Utanır mətləbin gətirsin dilə.
Sanki göz yaşını o bilir murdar,
Axıtmır ki, birdən torpaq bulanar.
Boğur hisslərini, yumur gözünü,
Qorxur ki, abırdan salsn özünü.
Bu yerə yol tapmaz başla can belə,
Mən ayaq basaram nə xəyal ilə?
Heyifdir, gül öpüş alsa o ləbdən,
Bir div öpmək istər, deyil ədəbdən!
Aşiq, ay işığı, söyüd və səba,
Civətək titrəyir, baxsan ətrafa.
Aşkara titrəyir qapı, həm divar,
Hamının könlündə gizli eşq var.
Gecə çox görübdür belə mənzərə,
Lakin sirr açmamış hələ bir kərə!

## ŞAM VƏ PƏRVANƏ

Gecələr hal əhli xatircəm olar,
Pərvanə məbədi yanar şəm olar.
Yadıma gəlir ki, gənclik çağında
Bir gecə başıma vurmuşdu sevda.
Sanki yatağıma tökdülər tikan,
Qaçdı gözlərimdən yuxu əzabdan.
Düşündüm: İndi ki, yatmayır gözüm,
Qoy sazla deyilsin hər ürək sözüm!
Şam ürək oduna alışdı, yandı,
Qaranlıq mənzilim nura boyandı.
Elə ki şam güldü sarı gül kimi,

Həyəcanlı bir kölgə gəzdi evimi.
Kiçik bir qaraltı göründü birdən,
Önümdə oynadı, gizləndi hərdən.
Sanki bir aşiqdi miskin, avara,
Başını hey döydü daşa, divara.
Kölgəylə qaraltı verdi baş-başa,
Havada ayrıldı, gah gəzdi qoşa.
Leyli qəbri kimi daxmam məhzundur,
Sərgərdan o kölgə sanki Məcnundur.
Salır pərdələrdən evə sayə qəm,
Xəyal fanusunu xatırladır şəm.
Bu mənim pərişan ruhumdur məgər,
Bədən zindanından qaçmaq istəyər?
Bəlkə xəyalını göndəribdir yar,
Bu yazıq aşiqin könlünü alar?
Açdım ağuşumu, yıxıldım sərxoş,
Gözümü açaraq gördüm əlim boş.
Gördüm pərvanədir o kölgə, gəzər,
Görüb cananını, canını üzər.
Canan eşqi ilə hey qanad çalar,
Qarşısında istər can etsin nisar.
Suçundan keçmədim əvvəl qibtədən
Ki, o vəslə çatmış, hicrandayam mən.
Lakin əhvalına edincə diqqət,
Gördüm əldən salıb onu məhəbbət.
Aşiqin qisməti qəmdir, məlaldır,
Vüsal aşiq üçün bir xam xəyaldır.
Eşq elə dərddir ki, tapılmaz dərman,
Dərmanı yandıran bir dərddən, aman!
Vüsal atəşini yandıranda eşq,
Aşiqi yandırar bircə anda esq!
Vəslə çatan aşiq görməmişəm mən,
Aman bu uğursuz eşqin əlindən!
Mənim yarım kimi qürurludur şəm,
Büllur bir örtünün dalından hər dəm
Nazla, rişxənd ilə dodağı qaçır,
Yazıq pərvanəyə iti dil açır.

Deyir: səbatsızsan, məndən uzaqlaş,
Yol tap, bu meydandan çıx yavaş-yavaş!
Yanmaq hər yetənin gəlməz əlindən,
Eşqə könül verər canından keçən.
Aşiqi yandırıb-yaxan dərd gərək,
O dərd səndə yoxdur, eşqdən əl cək!
Qızıl tək qızarmaq, bu, yanmaq deyil,
Yanan - eşq oduna kül olmalı, kül!
Başım sevdalıdır, mən gərək yanam,
Taleyim belədir, gərək odlanam!
Əriyib mən kimi yanmasan əgər,
Eşqimə düşməyin hədərdir, hədər.
Aşiqi yandırmaq deyildir əbəs,
Aləmə bununla sevgi salır səs.
Yetirdi aşiqi tənələr cana,
Yanaraq söylədi: "Ey şəm, dayan a...
O kəsik başınla nə dil açmısan?
Yazıq pərvanədir canını yaxan!
Qoy dinsin ki, aşiq yaxılır oda,
Sənin nəyin var ki, edəsən fəda?!
Şamın ki, cismində candan yox əsər,
Yanıb kül olması sayılmaz hünər.
Aşiq yar yolunda keçərsə candan,
Özündən bir kəlmə danışmaz, inan!
Bir şam yansa belə, gecə yanacaq,
Onu da yandıran insandır ancaq!
Od tutub alışmaz şam öz-özündən,
Şamın yanmasına yanmayıram mən.
Ey şam, ayaqlama haqqı bu qədər,
Sən qəbrə könüllü gedirsən məgər?
Şamın odu sönər səhər açılcaq,
Bizim odumuzdur əbədi, ancaq!
Əzəl camalından eşqimiz doğar,
Onda əbədiyyət şöləsi parlar.
Səndə bir qığılcım var o şölədən,
Odur ki, vəslinə can atıram mən.
Əzəl şamı harda yansa, durmadan,

Onun şöləsində yandıraram can.
Dost istər şam olsun, istərsə lalə,
Gözümdə bir aydır, mən ona halə.
Şam olsa, başının pərvanəsiyəm,
Gül olsa, bülbüli-divanəsiyəm.
Mənim ürəyimdə eşq odur yanar,
Səninsə palçıqda, suda yerin var.
Sənin odun sudur, palçıqdır ancaq!
Bizim peşəmizdir od içrə yanmaq.
Sizin tacınızda yanan od deyil,
Hər axşam açırsan yeni bir oyun,
Qarışır bir-birə torpağın, suyun.
Yaxıram canımı sənin şölənə,
Zənn etmə yanıram, yaxşı bax mənə!
Oduna yaxdığım ancaq bədəndir,
Canım yaxılmayır, o, şölədəndir,
Bizdə can da qalır, atəş də qalır,
Sevən könlümüzdə atəş də qalır,
Həqiqi pərvanə candır, hər zaman
Gəzər, haq şamını axtarar, baxsan.
Əslində pərvanə, şam onlardır,
Biz heçik, onların mənası vardır.
Can ki, pərvanətək başa dolanır,
Həqiqət şamını taparaq yanır.
Şamın vüsalına pərvanə çatcaq,
Yanmaqla əbədi həyat tapacaq.
Gizli də, aşkar da çıxar pərdədən,
Orada olanlar birdir, görərsən."
Şamın gözlərindən elə yaş axdı,
Yüksələn şöləsi göylərə qalxdı,
Fanusdan yüksəldi şölə aləmi,
Çataraq qucudu pərvanə şəmi.
Azca tüstü gəzdi havada bir an,
Oddan, pərvanədən qalmadı nişan.

# GECƏ BASQINI

Gecə görmüşdür ki, qoşun sel kimi,
Yüz bəla gətirən müdhiş yel kimi,
Gecə basqınına başlamış birdən,
Güllə dolu kimi yağmış hər yerdən.
Görmüş ki, Qafqazın igid elləri
Acizdir, silahsız qalıb əlləri.
Kazak alayları çarın əmrilə
Necə qan uddurur o məzlum elə.
Bayraq dalğalanır, üstündə qartal,
Ellərə gətirir sonsuz qəm, məlal.
Soldatlar düzülüb sıraya dördşər,
Zəncir tək uzanar yollarda səflər.
Dağın arxasında qara bulud tək,
Bəzən dəstə-dəstə, bəzən də tək-tək
Ordu sına-sına qoşur irəli,
Tutmuşdur silahdan hamının əli.
Ayın işığı da fələkdə sönmüş,
Qaranlıq özü də quldura dönmüş.
Dağdan aşıb gəlir sel kimi bəla,
Qandan dağa-daşa iz sala-sala.
Xain oğru kimi ehmalca, yavaş,
Basqın edənlərin ürəyidir daş.
Qara ilan kimi, budur, əsgərlər,
Sərin torpaq üstə iməkləyirlər.
Qıvrılıb-açılır sanki əjdaha,
Gədikdən enirlər üzü aşağa.
Sel kimi tökülüb dağ ətəyindən,
Tüstütək qalxırlar təpəyə, bəzən.
Yürüyür qabaqda atlı, piyada,
Sursat qatar-qatar gəlir arxada.
Gecə küldən qara olsa da həmən,
Gözlər qığılcımtək parlayır hərdən.
Qoşun gah yayılır, gah da toplanır,
Baxanlar gah meşə, gah bir dağ sanır.
Bildirçin dalınca gedən tazıtək
Hamı pusa-pusa yürüyür tək-tək.

Tutulmuş atların nalı keçəyə,
Gözləri bağlanmış, ürkməsin deyə.
Zabitin mindiyi at olaraq ram,
Baş atır, baş tutur hey aram-aram.
Quyruğu diklənmiş, şəkdir qulağı,
Qığılcım çıxarır daşdan dırnağı.
Damağı yellənmiş, fınxırır, gedir,
Yalını boynuna həmayil edir.
Zabit dağ döşündən çəp-çəp baxaraq,
Görür başdan-başa çadırda yaylaq.
Elin yatdığını bilir Əhrimən,
Gözləri bərəlir kindən, qəzəbdən.
Canavar sürüsü işlətsə hiylə,
Yatmış aslanı da tutar məkr ilə.
Dağ-dərə alışıb odlandı birdən,
Müdhiş müharibə başlandı birdən.
Sanki şimşək çaxdı, göy guruldadı,
Alovlar püskürən toplar gurladı.
Ölüm qəhqəhəsi tutdu hər yanı,
Tökdü yarpaq kimi yerə insanı.
El qalxıb yuxudan qopartdı fəryad,
Babalar rəsmiylə başlandı cahad.
Tələsik yuxudan oyandı gənclər,
Elə zənn etdilər qopubdur məhşər.
Boğunuq səs ilə çəkdilər nərə,
Qorxudan əl atdı ulduz xəncərə.
Qoxudu dağ-dərə barıtdan, qandan,
Kəfənsiz cəsədlə doldu biyaban.
Tüstü ilan kimi qıvrılıb qalxdı,
Qəzəbdən gözlərdə ildırım çaxdı.
Vuruşan qüvvələr sel kimi coşdu,
Çatıb bir-birinə onlar qovuşdu.
Gecə gördü, necə bir silahsız el
Vuruşur, əlində xəncər, qılınc, bel.
O hücum eləyir, top, tüfəng ilə,
Bu isə qorunur bel-külüng ilə.
Bu onu, o bunu əzir, çeynəyir.
Qiyamət qopmuşdur, yer-göy titrəyir.

# BİR GECƏNİN BƏYANATI

- Ey vəfalı tüfəng, sənin heç zaman
Güllən ötməmişdir hədəf yanından.
Mən nankor deyiləm, yaxşı qulaq as,
Məni çox bəladan etmisən xilas.
Yoxdur patronumuz, əliboşuq biz,
Daşa toxunmuşdur artıq gülləmiz!
Düşmənin çiynindən asılmaqdansa,
Get, torpaq altında bürün sən pasa! –
Atdı bir çuxura o gənc tüfəngi,
Heybəti salırdı yada pələngi.
Qorxmaz maral kimi aslan qadınlar
Ki, şirin bağrını buynuzla yarar,
Ərləri dalınca, çiynində bellər,
Mərmər sinələri etmişlər sipər.
Tapmış o sinələr paklıqdan səfa,
Bircə söz yazılmış onlarda: "vəfa".
Qızların zülfünü dağıtmış külək,
Ovçu gülləsindən ürkən cüyür tək,
Qaçıb təpələrə, dağlara birbaş,
Düşmənin başına yağdırırlar daş.
Qadınlar vuruşur hey cığ vuraraq,
Nərədən, şivəndən tutulur qulaq,
Dağlaı çulğamış gurultu səsi,
Aləmi sarsıdır elin naləsi.
Bürünüb atəşə çadırlar yanar,
Yanğından dağ-dərə, çöl işıqlanar.
Qığılcım qaçantək alov içindən,
Körpələr qaçaraq qoparır şivən.
Tüstüyə, alova vurduqca külək,
Aslanın bağrında su olur ürək.
Tüstüyə, alova baxsan, deyərsən,
Rəqs edir, qəhqəhə çəkib Əhrimən.
Ay dağın dalına çəkilir qəmgin,
Gizlənir nəzərdən bir casus təkin.
O qanlı səhnəni seyr etmək üçün,

Zülməti işıqda əritmək üçün.
Bəlkə də göy qatıb işə əlini,
Əymiş zülmət üstə ay məşəlini.
Bu qorxunc səhnəni seyr etsən əgər,
Deyərsən: nə yaman canidir bəşər.
Bir sallaqxanadır gördüyün səhnə,
Bu qədər qan axır, səbəb nədir, nə?
Yaralar sızlayır, yüksəlir nalə,
Təbiət özü də batmıs məlalə.
Döyüş meydanında qalmış ölənlər,
Qarğalar, quzğunlar toy-bayram edər.
Hələ canilərin ruhları, inan,
Doymamış tökülən nahaq qanlardan!
Şəhidlərin ruhu açaraq qanad,
Uçur, arxasınca yüksəlir fəryad,
Oğul cəsədini qucmuş bir ana,
Cırıb üz-gözünü boyanmış qana.
Dul qalan o təzə gəlin ağlamış,
Qandan əllərinə xına bağlamış.
O nişanlı qız da intihar etmiş,
Yarıyla yan-yana yuxuya getmiş.
Bir aləm dolusu eşq, ümid, amal,
Cavanlar qanıyla olmuşdur pamal.
Nə qədər tər nərgiz hələ açmadan,
Əbədi yuxuya getmişdir, aman!
Ölülərin üzü necə sirlidir,
Həyat həsrətləri hələ diridir!
Gülməmiş həyatda kimsənin üzü,
Donub baxışlarda min həsrət izi.
Onlar ki əbədi köçür dünyadan,
Sanki belə deyir hər biri bu an:
- Əlvida, ey Qafqaz, ey əziz vətən!
Günəşin, işığın beşiyi sənsən.
Başında tacı var qərinələrin,
Tarixin körpüsü, qapısı Şərqin.
Adın əbədidir, iradən dönməz,
Günəş çeşməsisən, nurun tükənməz.

Sənin qoynundakı hər dağ, hər ova,
Şahinə qoruqdur, qartala yuva.
Azəri igidlər vətəni sənsən,
Döyüşlər meydanı olmuşdur sinən.
Səndə at oynadıb vurmuşlar şikar,
Çovqan oynamışlar, küştü tutmuşlar.
Sənin ağuşunda süd verib ana
Şöhrəti itməyən min qəhrəmana.
Atıb sən gülləni igid övladın,
Düşmənlə vuruşdu, azad yaşadın.
Meyitlər üstündən keçərək ancaq,
Yadlar bu ölkəyə basmışdı ayaq.
Səni tutınaq idi düşmənin qəsdi,
Altmış il qorxudan titrəyib əsdi.
Sinəmiz üstündən indi yol salıb,
Aslandan bir qoca tülkü öc alıb.
Cəni, azad vətən, etdilər əsir,
Ey aslan, zəncirdə halın necədir?!
Təzəcə qayıtmış ürkmüş dəvələr,
Salıb meyitlərə həsrətlə nəzər.
Döşlərində zənglər qoparıb şivən,
Bu şivən səsindən gülür Əhrimən.
Dağları çulğamış zənglərin səsi,
Daşları ağladır bu qəm nəğməsi.

## DƏNİZİN SİMFONİYASI

### DƏNİZÇİLƏR MƏQBƏRƏSİ

Gecə, qəm munisi sahili görmüş,
Dağ, dəniz, meşəni duman bürümüş.
Təbiət yas tutub, sular qan ağlar,
İslanmış kirpiyə bənzər budaqlar.
Dəniz dalğalanır, titrəyir, axır,
Elə bil yas dolu bir gözdür, baxır.
Qızılgül, kəkotu, zirinc kolları

Göz yaşı axıdıb, sular yolları.
Dənizin suyu da sanki qaralmış,
Qınq güzgü kimi paslanıb qalmış.
Ayı məngənədə sıxır buludlar,
Kainat görünür məzar qədər dar.
Dəniz sahilində yüksələn mayaq,
Baxır heyran-heyran, gülməyir ancaq.
Dağlar qəm içində vermiş dal-dala,
Ağsaçlı başlan dalmış xəyala.
Sanki pəhləvanlar düşübdür əsir,
Ayağında kündə, boynunda zəncir.
Gəmi köküs gərib sərt dalğalara,
Alıb dalğalardan yüzlərlə yara.
Yığılıb gəmiyə yük qalaq-qalaq,
Dil deyən bir sözü eşitməz qulaq.
Saçları pərişan sərnişinlərin
Üzündə izi var həyatın dərin.
Alınlar qırışıb, üzlər göyərmiş,
Dövran hamısını torpağa sərmiş.
Gözləri yuxulu, yaşlı görünər,
Verir həyəcanlı röyadan xəbər.
Qabaqda hayqırır qara burulğan,
Ömür faciəsi çapır arxadan.
Səyyahlar seyr edir qorxunc mənzərə,
Titrər dənizçilər olan məqbərə.
Dalğa, ay işığı töküb qaşqabaq,
Suda can çəkişir bir dəstə dustaq.
Üfüqün tağında Hüseyniyyədən,
Bir matəm bayrağı baxsan, görərsən.
Ulduzlar laləyə, qəndilə bənzər,
Lakin hilaldan da solğun görünər.
Kölgələr baş çəkib qınına susur,
Matəm qarasını geyib oturur.
Dalğalar gah aydın, gah da kölgəli,
Gecə-gündüz kimi qoşur irəli.
Onlar da gecəyə, gündüzə oxşar,
Hər birində ibrət, işarələr var.

Oynağan, tələsik çıxıb baxsa da,
Gənclik günlərini gətirir yada.
Odur, ayın əksi düşmüşdür suya,
Təbiət Yusifi düşmüş quyuya.
Suda qərq olubdur ulduzlar, budur!
Su yanıb-titrəyən şamla doludur.
Yoxsa pərilərdir dənizdə çağlar?
Boğulan ay üçün yas qurub ağlar?
Gülümdən görünür mənim bir pərdə,
Xəzanı gözəldir, düşsə də dərdə,
Axıb su tökülür dənizə dağdan,
Zindana nur düşür sanki bacadan.
Bijən olan quyu başında məgər
Mənijə zülfünü yolaraq, tökər?
Üfüq çulğanmışdır qəmə, kədərə,
Bədbəxtlik qatan çıxmış səfərə.
Cəzr də, mədd də olmuş yeknəsəq,
Dövran saat kimi işləyir mütləq.
Ömrün hər saatı durmadan keçir,
Kinli düşmən kimi bu zaman keçir.
Düşmən hücumudur onun gəlişi,
Qayıdıb gedərkən dostluqdur işi.
Sahilin saatı işləyir tıq-tıq,
Dənizin nəbzi də döyünür artıq.
Həyat irəliyə qoşur durmadan,
Dünyanın ömründən azalır hər an.
Lakin ağ köpüklər oynaşır hələ,
Onlar uşaq kimi vermiş əl-ələ.
Sanki sahil boyu bir sürü uşaq,
Oyuna başlamış, səs-küy salaraq.
Ya da ki, dalğanın sehrkar əli
Köpüyü süpürüb atır irəli!
İstər çuvalına töksün şeytanın,
Muzdunu o tufan qoparanların.
Odur ki, səy ilə, min təlaş ilə,
Gövhəri, incini yığır sahilə.

## QULARIN XƏLVƏTXANASI

Uzaqda, bizim bu sahildən kənar
Gözəl xəlvətxana yaratmış qutar.
Sakitdir fəzası, dərindir suyu,
Orada dincələr aləmin ruhu.
Mavi üfüqləri oxşar aynaya,
Bənzər üzüqoylu büllur kasaya.
Dənizin sehrkar ipək suları
Şirin yuxu kimi oxşar ruhları.
O dərin suların sinəsi üstə,
Qar kimi tökülür qu dəstə-dəstə.
Döşləri ağlıqda sədəfə oxşar,
Gözdən o sədəfdə bir cüt inci var.
Bədəni ağappaq pərilər, budur,
Ayın işığında üzür, yuyunur.
Asta-asta qalxar, düşər qətrələr,
Sanki şux gözəllər nazlanıb gülər.
Qətlə kimi açıb qanadlarını,
Pərdədə gizlədər öz əsrarını.
Hərdən şövqə gəlib çəkərlər qiyyə,
Dərin üfüqlərdə əks edər qiyyə.
Dəniz gözəlləri sonatək süzür,
Əbədi bir aləm səmtinə üzür.

## DƏNİZİN SİMASI

Gözəldir dənizin ağı, qarası,
Bir atlas gülüdür ipək dalğası.
Zülmət lil çiləyir, ay işığı zər,
Ləpələr titrəşən civəyə bənzər.
Dalğası bir ipək örtükdür, deyən
Düzüb ətrafına rişə köpükdən.
Köpüklər qumluqda durur sıraya,
Olur o səhnəyə dekorasiya.
Sanki sıra-sıra göbələkdirlər,

Külək təkanından hey tərpənirlər.
Bəlkə də ağ tüklü küçükdür onlar.
O bunun, bu onun üstünə qalxar.
Ya da lopa-lopa pambığı külək,
Yığıb tayalayır hey ətək-ətək.
Bəlkə də dənizdən çıxan sonalar,
Sahildə yuyurlar sabınla paltar.
Bir lalə yanaqlı gürcü gözəli,
Qayıqda oturmuş duzlu, məzəli.
O sular sonası qayığı sürür,
Üfüqə nur salır, suyu güldürür.
Kürəyi quların pərinə bənzər,
O kürək çəkdikcə qayıq da üzər.
Qızışıb hey kürək çəkir o nigar,
Külək saçlarını oxşar, oynadar.
Əynində plaşı hey vurur dalğa,
Qızılgül bürünmüş sanki yarpağa.
Günəş gizlənibdir, üzünü görcək,
Balıq tutmaq istər o üzügöyçək.
Qıvrım zülfü kimi eyləyib çin-çin,
Qarmağı atıbdır suya balıqçın.
Balıq qarmağma ilişir qəsdən
Ki, bəlkə bir öpüş alsın əlindən.
Zülfüdür aşiqlər boynuna zəncir,
Qarmaq o zülfdən xəcalət çəkir.
Nurani mləyə oxsar o dilbər,
Hərdənbir oxuyur şirin nəğmələr.
Yayır o nəğməni ətrafa səba,
Huşu başdan alır o şirin layla.
Qayığın şamları yanır, parlayır,
Ulduz tək hər yanı nura boyayır.
Belə bir cəlalla dəniz gecələr,
Fələyin, ulduzun yolunu kəsər.
Birləşmiş dənizin səthi üfuqlə,
Röya sarayına bağlamış pillə.
Dalğalar gəldikcə qalxır səs-səmir,
Bir-birə sürtünür zülf ilə zəncir.
Yelkənlər küləkdən alaraq təkan,

Sahilə çıxarır inci dəryadan.
Sərincik bir halə, yumşaq bir nəsim,
Oxşar üz-gözünü daim hər kəsin.
Üfüqün çeşməsi salıb heyrətə,
Bizi məftun edib şerə, sənətə.
Qulaq şəklənməsə, coşğun küləkdən,
Bir də huşa gəlməz huşun itirən.
Açır hər baxışda heyrətə yollar,
Dənizin qəribə mənzərəsi var.
Səhnəsi, salonu vəhmə boyanmış,
Havası laybalay tüstü-dumanmış.
Pərdəsi qaçışan ürkmüş marallar,
Kölgəsi aslandır, çəngində şikar.
Sirki bizi salır qorxu-heyrətə,
Kinosu gətirir xalqı dəhşətə.
Şahanə şinəli geyinib dağlar,
Lojada oturub fikrə dalmışlar.
Qular ağ geyimli rəqqasələrdir,
Onların cilvəsi böyük hünərdir.
Oxuyur dalğalar, saz çalır külək,
Onların səsindən titrəyir fələk.
Gəmi, gəmiçilər nərə çəkirlər,
Qalxır qayıqlardan xoş qəhqəhələr.
Əcəb əsatiri musiqidir bu,
Salır simfoniyası ürəyə qorxu.
Dəniz, əbədiyyət asitanıdır,
Sirrin, həyulanın dasitanıdır.
Qəbrə diri gedər dənizdə aləm,
Kor kimi çabalar hər sirri-mübhəm.
Üfüq lal görünər, baxsan bir daha,
Gorərsən sarınmış timsah-timsaha.
Gecə dam üstündə yatanın göylər,
Ruhunu sehrli kamına çəkər.
Yıxılmaq qorxusu duyar, sayıqlar,
Lutun həngaməsi olunar təkrar.
Zəlzələ üfüqü, vahimə, qorxu,
Hissləri sarsıdan bir dərin quyu.
Ağız köpüklənmiş, var künclə, zəncir,
Meşəni doldurmuş dəstə-dəstə şir.

Ürəyi partladan üfüq yarılar,
Sanki alt-üst olub dünyada nə var.
Güzgü tək parlayıb hərlənən fələk,
Başı gicəllənib yerə dəyəcək.
Həll edir özündə ruhun cövhəri
Həlli müşkül olan məsələləri.
Uzaqda dəhşətli mənzərələr var,
Hamı əfsanəvi, hamı sehrkar.
Dağlar qaşqabaqlı, acıqlı, məğrur,
Mavi asimana baş vurub durur.
Sular yuxudadır, üfüqlər xamuş,
Hamı əbədiyyət yolunu tutmuş.
Sanki bir əfsanə oxuyub gecə,
Şəhrzad yuxuya getmiş indicə.

## TƏXTİ-CƏMŞİD

Günəşi basdırıb qayıdan zaman
Gecə oldu Təxti-Cəmşidə rəvan.
Xəyal Elburzunun şah qülləsindən
O karvan dalınca yüyürürdüm mən.
Birdən gecə etdi hamıdan tələb:
- Daranın qəsridir, gözləyin ədəb!
Gəlir ölməzliyin burda sədası,
Başmağın çıxarır dövrün Musası.
Daranın qəsridir, o möhtəşəm şah
Bir zaman olmuşdu aləmə pənah.
Dariyuş, o böyük bir hökmrandı,
Yerə də, göyə də hökmü rəvandı.
Parlaq ulduzuydu Şərqin o sultan,
Gülərdi şimşəktək dövründə cahan.
Tacı Ay olmuşdu, üzüyü Mərrix,
Cəlalı önündə heyrandı tarix.
Əsrin günəşiydi, ağlın bulağı,
Qədim zamanların nurlu çırağı.

Elmə, təməddünə o idi pənah,
Yeni qayda-qanun yaratdı o şah.
Könlünə pak Hürmüzd tutardı ayna,
Başına çətrini açmışdı dünya.
Daranın qəsridir günəş ocağı,
Bu Təxti-Cəmşiddir, sönməz rövnağı.
Təxti-Cəmşid, sirlər qəbridir ancaq,
Uzun ömr ipinə odur mancanaq.
Şahiddir ki, nələr törətmiş ruzgar,
Qədim əsrlərdən odur yadigar.
Qoca çalğıçıdır, əyilmiş başı,
Çaldığı nəğmənin bilinməz yaşı.
Od görüb, qan görüb o dönə-dönə,
Düşmüş İskəndərin vəhşi çənginə.
O qoca kimsəsiz, köməksiz qalmış,
Əzizlər dərdini bağrına salmış.
Hələ də pərişan yuxular görür,
Ərəblər İrana od vurar, görür.
Görür hücum edir, talayır Çingiz,
Tüklər əndamında ürpəşir biz-biz.
Qulaq as, gör qoca nələr söyləyir,
O mənə keçmişdən xəbər söyləyir.
Deyir: "Var burada başqa təmtəraq,
Ədəb gözlə bura basarkən ayaq".
Şahların sarayı olmuş bir zaman,
Onun qüdrətinə baş əymiş cahan.
Qapısında durub keşikçi, şahlar,
Bac verib başına bir çox tacidar.
Burada salama durmuş Ərdəşir,
Rumun qeysərini etmişlər əsir.
Qüruru unudub imperatorlar,
Şapurun atma səcdə qılmışlar.
Onun şövkətini qırmamış fələk,
Sən də ey fitnə, gəl inaddan əl çək!
Qırılmış burada, bil, ilham ilə
İskəndər aynası Cəmşid camiylə.
Batar əl-ayağa xırda şüşələr,

Həyatın damarı burda kəsilər.
Mənzil sala bilməz burada karvan,
Qafil keçə bilməz buradan, inan!
Burada gecənin divi nə gəzər?
Qaçar div buradan edərək həzər.
Bir qərib burada yatsa bir gecə,
Yuxudan oyanmaz bir də ölüncə.
Kimsə baş çıxarmaz bu qəm evindən,
Burda qırılmayan bir baş görməzsən.
Caduda, tilsimdə yatmış xəznəmiz,
Oraya Əhrimən tapa bilməz iz.
Barışıq hissiylə keç yanımızdan,
Bizə qibtə etmə, torpağıq inan!
Etmə oğurluğa, qarətə adət,
Mədəni oğrular qoy etsin qarət!"
Mən təşvişə düşüb heyrətdə qaldım,
Utanıb başımı aşağı saldım,
Ay da həyasından saralıb-soldu,
Gecənin zülməti ikiqat oldu.
Şahlar hərəmini seyrə dalan ay,
Bulud pərdəsinə büründü lay-lay.
Əbədi ordunun nizədarları,
Yığılır, səpilir, bölünür yarı.
Ulduzlar parlayır xirə göz kimi
Axır, səpələnir axta köz kimi.
Doğulub gecənin keşikçiləri,
Deyləmlər hinduya vermişdir yeri.
Divin qorxusundan hindular hər an,
Sanki qoparırlar fəğan, əlaman.
Yuxu təsiriylə lakin bu qovğa,
Boğulub sönürdü od kimi suda.
Məni təlqiniə bir mələk oyatdı,
Parolu söylədim, qalmaqal yatdı.
"İskəndər odu"ydu o parol, düzü,
Görüm qara olsun fələyin üzü.
Müqəddəs fələyin qanadı birdən,
İşarə etdi ki: "Papaq çıxart sən!"
Siyrilmiş qılınctək olmasan əgər,
Bu aslan ağzına girərsən məgər?

Qürurdan özümə qanad bağladım,
Lakin qırılmışdı qolum, qanadım.
Üz tutdum o yüksək saraya doğru,
Çıxdım pilləkəndən üzüyuxarı.
Karnizlər tökülüb diş-diş görünür,
Bizdəki qəflətə sanki o gülür.
Gah əzab çəkərək xəcalətimdən,
Gah da öz-özümə fəxr edirdim mən.
Quş kimi döyünür köksümdə ürək,
Deyirəm: -Başıma nələr gələcək?
Qorxudan, vəcddən əsir bədənim,
Nə edim, əzizdir candan vətənim!
Gecə qaranlıqdı, yolum nabələd,
Qəlbimə bağlıydı ümidim, fəqət.
Dəlitək hər yerə basırdım ayaq,
Qarşıma ürəyim tuturdu çıraq.
Geniş bir təpənin üstünə çıxdım,
Bir qala göründü, heyrətə batdım.
Otuz əsrdir ki, durur bu bina,
Bir xalqın tarixi bağlıdır ona.
Səqfi, divarları uçsa da belə,
Polad bünövrəsi möhkəmdir hələ.
Ağzını açmışsa sökük divarlar,
Sanarsan aslandır, pusquda durar.
Hər qapı başında şir-öküz yatır,
O polad heykəllər lal, sözsüz yatır.
Qorxudan divlərin bağrı olar qan,
Qartal qanad salıb, düşər havadan.
Qocalıb, sökülüb uçsa da tağı,
Cəlal beşiyidir, qüdrət ocağı.
Əzəmət Qafıdır, hümmət qalası,
Nəcabət dağıdır onun arxası.
Xalqın qüdrətindən odur yadigar,
Hər bir sütunundan əzəmət yağar.
Güzgütək parlayır daş döşəməsi,
Daxili sirlidir, işıq çeşməsi.
Əhsən o hümmətə, əhsən o qola
Ki, tikmiş belə bir məhvolunaz qala!
Mərmər pillələdir, yəşmə divarlı,

Dəmir qalalıdır, polad hasarlı.
Xəyal cəlalından doymuşdur cana,
Ucalıqda durar dağla yan-yana.
Başqa bir qapıya sataşdı gözüm,
İki mələk gördüm gözümlə özüm.
Hərəm hümaları, başlarında tac,
Sanki qanad açıb edirlər merac.
Simurğ mağarası buradır məgər?
Qaf dağı bağrında yaradır məgər?
Aslan ürəyini suya döndərən,
Divi əsir edən buradır deyən.
Siyirmə qılıncdır, ağzı açıq şir,
Ondan ötüb keçmək ürək istəyir.
Burada qorxudan titrəyir külək,
Nə edər şam kimi yanan bir ürək?
Nə isə, özümə cəsarət verdim,
Möhtəşəm sarayın içinə girdim.
Kəbəni etmişdir oğrular məskən,
Yəzdanı qılmışdır əsir Əhrimən.
Qəsri zəlzələlər etmişdir viran,
Zəncirə bağlanmış yenilməz aslan.
Elə bil dağlamış ciyərimizi,
İskəndər, ərəblər ayağı, izi.
Torpağa yıxılmış sanki pəhləvan,
Düşmən xəncərindən qanına qəltan.
Sinəsi yaralı can verir Söhrab,
Matəmində olmuş ürəklər kabab.
Rüstəmin gözləri al qanla dolur,
Qəmində Daranın qızı saç yolur.
Gördüm dayanmışdır yüz sütun səf-səf,
Eyvanı baş almış səmaya tərəf.
Divlər pəncəsində olsa da dustaq,
Dağ qədər zəhmli, məğrurdur ancaq.
Baş vıırsan burada hər bir otağa,
Təsadüf etməzən qapıya, tağa.
Səqfi olmasa da, deyərsən, gerçək,
Səqfi əvəz etsin asiman gərək.
Sütun başlarında əzəmətə bax,
Sərvdir, şümşaddır, atmışdır budaq.

Öküz kəllələri verib dal-dala,
Oxşar buynuzları şaxi-marala.
Daşyonan burada göstərmiş hünər,
İncə naxış vurmuş sanki bir zərgər.
Pillələr parlayır saf sədəf kimi,
Karnizlər andırır bir qızıl simi.
Hər daşı bir gümüş lövhəyə oxşar,
Onlarda yüz naxış, yüz kitabə var.
Zəfər bayrağıdır sanki lövhələr,
Qızıla vurulmuş sikkəyə bənzər.
Azadlıq xəttidir sülhün sənədi,
Əsrlər o xətti silə bilmədi.
Bayrağı üstündə var şiri-xurşid,
Nəqş olub orada qələbə, ümid,
Əfsun oxumuşdur ona Dariyuş,
Uzun əsrlərə yadigar qoymuş.
Daranın şəkli var o uca tağda,
İskəndər əlindən xeyli uzaqda.
Bir bitki göyərmiş daşın bağrından,
Sulanıb hadisə yağışlarından.
Fələk etməmişdir onu tarimar,
Məhv edə bilməmiş onu ruzigar.
Sanki qulağına demiş Dariyuş:
-İskəndərə qarşı sayıq ol, vuruş!.
Dövrün qəllaşına demiş ki, Dara:
-Hər nəyi dağıtsan, bu nəqşə qıyma!
Desinlər baxanlar bu naxışlara,
Böyük Dara hara, İskəndər hara?!
İskəndər aynası qvrılmış çoxdan,
Daranın nəqşini hifz etmiş zaman.
Üç dildə yazılmış burda yazılar,
Eylami, babili, mixi xətti var.
Sərhədin göstərib qədim İranın,
Vəsfini vermişdir hər pəhləvanın.
Sayır Həxamənış şahları bir-bi
Hər biri nə işlər görmüş, göstərir.
Deyir: - Bu lövhəyə nəzər yetirsən,
Qüdrətin sirrini onda görərsən.
Divar daşlarına tarix yazılmış,

Şahənşah taxtının nəqşi qazılmış.
Otuz bir qəbilə, diniəri ayrı,
Hərənin üzündə milli vüqarı.
Hamı qulaq asır, göz açıb durmuş,
Şahın qarşısında boynunu burmuş.
Şah deyir: "Bunlardır mənə bac verən,
Başımın tacına həm xərac verən."
Farslar azad idi təkcə xəracdan,
Hamıdan bac-xərac alardı sultan.
Hamısı edərdi şaha itaət,
Hamı ondan görər bəxşiş, ədalət.
Görərsən, diqqətlə yetirsən nəzər,
Parslarda var imiş nə böyük hünər.
Onların nizəsi döyüş zamanı
Lərzəyə salarmış bütün cahanı.
Kəsərli sözüylə hər bir cəngavər,
Şaha, peyğəmbərə olmuş bərabər.
Döyüş meydanında nizə oynadan,
Danışmaya bilməz igid parslardan.
Səadət naminə vuruşur onlar,
Qılmış cinayəti, zülmü tarimar.
O kəs ki, ağlıyla, iradəsiylə,
Taxtı da, tacı da almışdı ələ.
"Dünyanın qapısı" ad vermiş parsa,
Dünyanı tutacaq pars, kimin olsa.

## DARİYUŞUN NƏSİHƏTİ

Deyir ki; Fitnədən, yalandan saqın!
Sənə şamil olsun lütfü xaliqin!
Ey bəşər, qulaq as həqqin sözünə,
İtaət etməyi borc bil özünə.

Şahlara hörmət et, onlara inan!
Səni hifz eyləsin Hürmüzd bəladan.
Kim ədəb gözləsə hər əməlində,
Qalmaz ədəbsizin çirkin əlində.
Hər kəs başqasını istəsə zəlil,
Üzüqara olar özü, yəqin bil!
Hürmüzdü tanıyan, itaət edən,
İstər çiçəklənib yüksəlsin vətən.
Əl açıb göylərə edərkən dua,
Deyər: qələbə et İrana əta!
Əcəb padişahmış, bilikli, adil,
Ruhudur əbədi şahlığa qabil.
Əcəb fəxr etməli tariximiz var,
Şan-şöhrət qalmışdır bizə yadigar.
Bu qəsri görənlər olar pərişan,
Ürək qanə dönər, olsa da daşdan.
Bu nəqşi diqqətlə oxuyan kəslər
İranın ölməzlik sirrini bilər.
Daranın duası boşa getməmiş
Ki, hələ İranın adı itməmiş.
Yoxsa, biz ölülər cərgəsindəyik,
Əli silah tutmaz aciz bəndəyik.
Gördüyüm naxışlar, qazma yazılar,
Eşqdən, hünərdən qalmış yadigar.
Qadınyal atların şəklinə bir bax,
Belində hər atın vardır bir qoçaq.
Hər biri at çapan, nizə oynadan,
Döyüşdə, şikarda şöhəot qazanan.
Burada Daranın bir şəkli də var,
Ona hədiyyələr gətirmiş xalqlar.
Ovlaqdır, hücuma keçmişdir aslan,
Qılınctək boyamış pəncəsini qan.
Döyüş arabası, atlı şikargah,
Aslanı zubinlə vurur padişah.
Getdi xəyalrmız köhnə dünyaya,
Qayıtmaq istərik, yol vermir həya.
Keçən əsrlərin övcünə qalxmaq,

Oradan baş üstə düşməkdir ancaq.
Yoxdur sevincinin, eşqinin sonu,
Çəkər peşimanlıq oxuyan onu.
Tarixin iftixar zirvəsindən sən
Bugünkü batlağa birdən düşərsən.
Keçmişi anmaqdan bizə nə fayda?
Keçir bu günümüz qəmlə dünyada!

## ƏHRİMƏNİN QƏLƏBƏSİ

Nəqş olub Daranın timsalı daşda,
Qəddar Əhrimənlə gedən savaşda.
Əfsus ki, bu savaş çox uzun sürmüş,
Onun faydasını Əhrimən görmüş.
İndi də Əhrimən düşməmiş atdan,
Gücünə öyünür, sulayır meydan.
Bəli, at oynadan o vəhşi külək,
Bildim Əhrimədir, özümə gəlcək.
Gülər vəhşi kimi salar qalmaqal,
Sanki çibanımı doğrayar kal-kal.
Uladıqca bayquş, onun səsindən,
İnlər iliklərim, sarsınaram mən.
Alçaq div vurduğu tənədən, inan,
Qeyrətdən boğulub məhv olar insan.
Orada titrayən tək mən deyildim,
Qapı da, divar da titrəyir, bildim.

## RUHLAR ŞƏHƏRİ

Alnındakı xəttə baxın daşların,
Alm çinləridir qoca rüzgarın.
Sanki bir lövhədir, asmışdır zaman,
Ruhlar şəhərinin darvazasından.
Buradır yoxluğa gedən yol, bəli,
Ehtiyatsız atma qədəm irəli!
Şahların ruhudur xəyala dalan,

Türbəsi üstündə heyrətdə qalan.
Hərdən dodaqaltı pıçıldaşaraq,
Bir hədyan deyirlər, sükutla ancaq.

## ZƏMANƏNİN HƏYULASI

O şanlı günlərdən bircə yadigar,
Bu qəsrin bürcündə hələ də parlar.
Hüma quşu kimi səsi yüksəlir,
Bayquşun əlində əsirdir, əsir.
Orada şadlıqla qəm durur qoşa.
Sanki qucaqlaşıb, vermiş baş-başa.
Qorxaraq zamanın həyulasından,
Kədər də, şadlıq da çəkərlər aman.
Zaman bir sel kimi gurlayır, keçir,
Bir sərxoş fil kimi durmayır, keçir.
Dalğalar axışır qapıdan, damdan,
Əjdaha kamına çəkilir cahan.
Aman bu fitnəkar fələk elindən,
Nə mələk tanıyır, nə də Əhrimən,
Təkcə məhv etməyir Daranı fələk,
İskəndər de ondan yemişdir kötək.

## İBRƏT SƏHNƏLƏRİ

O sonsuz cəlaldan yadigar qalan,
Bu qəsrin dilindən düşməyir yalan.
Budur, dilə gəlib divarlar, daşlar,
Hərəsi bir qədim əfsanə başlar.
Salmaz dil-boğaza sökük hər baca,
Yağdırar nəsihət, hikmət bolluca.
Hanı nəslimizdə bu həssas qulaq,
Onları dinləsin, yorulmayaraq?
Daranın qəsridir qalmış virana,
İstehza eyləyir əhli-İrana.
Şapurlar yurduna, ya rəb, nə olmuş

Ki, bu gün ilanla, əqrəblə dolmuş?
Qızıl məftil kimi bir yanda ilan,
Qıvrılıb yatmışdır, parlayır, baxsan.
Sanki bir qamçıdır, görsən, deyərsən,
Düşmüş bir yaralı sərdar əlindən.
Cəmşidin camını tələk qıranda,
İskəndər aynası sınmış bir anda.
Tək bizim fəxrimiz deyil bu saray,
Dünya gözolidir, solmayan bir ay.
Qoy hamı burada özünü görsün,
İbrət aynasında üzünü görsün!
Fələk ədalətə tutmuşdur divan,
Zülmün evini də qoyacaq viran.
O necə əldir ki, qurar, yaradar,
Bu hansı sərxoşdur qırar, dağıdar.
Günəş qərq eləyir nura cahanı,
Şam isə yandırır bir şəbistanı.

## İKİ KİNO EKRANI

Qarşımda canlandı birdən ekranlar,
Biri digərinin əksiydi onlar.
Biri çıraq kimi nur verir gözə,
Digəri döndərir dünyanı közə,
Birində Cəmşidin təxti nur saçır,
Günəş digərindən utanır, qaçır.
Birində tikilir böyük qəsrlər,
Yıxır digərində qəsri İskəndər.
Birindən gül dərib, dəmətlər hördüm
Ekranın üstündə, ah, nələr gördüm!

## TƏXTİ-CƏMŞİDİN TİKİLMƏSİ

Bu şadlıq qəsrini tiksinlər deyə,
Şahənşah bir fərman verdi ölkəyə
Karvanlar qatarla səs sala-sala,

Yüklənib hər yerdə, düzəldi yola.
Sardlar qızıl ilə geldi İrana,
Günəş tək nur saçdı qızıl hər yana.
Misirdən yükləndi lil ilə mərmər,
Nilin körpüsündən keçib gəldilər,
Çoxlu şam ağacı gəldi Livandan,
Səndəl, fil sümüyü verdi Hindistan.
Verdi kaşanlılar məxməri təl-təl,
Gəldi Bədəxşandan qalaq-qalaq ləl.
Nişaburdan çıxar firuzə daşı,
Yanında fələkdir bir üzük qaşı.
Vuruldu dağlara külüng birinci,
Mədən qızıl verdi, dənizlər inci.
Yanldı sıldırım qayalar bağrı,
Dağların canında duyuldu ağrı.
Ağırlıq qaldıran, mancanaq, ehram,
Filə, arabaya yükləndi tamam.
Qayalar çəkildi divar başına,
Qoyuldu hər bir sutun daşına.
Nəccarlar döndərdi qəsri cənnətə,
Saldı daşyonanlar xalqı heyrətə.
Naxış bağlayan kim, gunbəz çatan kim,
Rəng hazırlayan kim, qələm tutan kimi.
Asılır güzgülər, düzülür gövhər,
Fil sümüyü üstə mina düzürlər.
Qızılla, gövhərlə bəzənmiş hər yan,
Gülab ətri ilə dolmuş gülüstan.
Burada çalışan mühəndis, memar,
Sənətdən yaratmış ölməz yadigar.
Hər biri misilsiz sənətkar imiş,
Hünər incisinə xiridar imiş.
Layihə qarşıda, əllərdə qələm,
Şövq ilə çalışar, iş var bir aləm,
Müxtəlif layihə gəlmiş hər yandan,
Misirdən, Aysordan, Çindən, Yunandan.
Zövq ilə, hünərlə çalışan parslar,
Hamıdan ziyadə şöhrət tapdılar.
Xalqlar çalışaraq çiyin-çiyinə,
Hünər göstərirdi biri-birinə.

İş gedirdi saat mexanizmi tək,
Yormazdı kimsəni tükənməz əmək.
Aynalı sarayı Təxti-Cəmşidin,
Elə parlaqdı ki, günəş deyərdin.
Bir gün səs yayıldı orada, nagah
Ki, gəlib işlərə baş çəkməyə şah.
Hamı bir anlığa işdən əl çəkdi,
Şaha hörmət üçün başını əydi.
Hal-əhval soruşdu bir-bir hamıdan,
Acıqlandı bir an, sevindi bir an.
Kim pis işləmişdi etdi məzəmmət,
Yaxşı çalışana verildi xələt.
Ölkədə ədalət olarsa əgər,
Şah da, rəiyyət də xoşhal görünər.

## MAKEDONİYALI İSKƏNDƏR TƏXTİ-CƏMŞİDDƏ

Bu pərdə nə qədər könül açandı,
O biri pərdədə işlər yamandı.
Hurini Əhrimən çənginə salmış,
Qaranlıq günəşə qələbə çalmış.
İskəndər nağılı, budır tamasa,
Enir kinli qılınc günahsız başa.
Dara büsatmı pozmuşdur fələk,
Talanır el-oba, yoxdur bir kömək.
Makedoniya xanı susamış qana,
Dağıdır, yandırır, qoyur virana.
Qılınc qəbzəsindən ol çəkmir bir an,
İstəyir aləmə olsun hökmran. O,
Təxtı-Cəmsidə basanda qədəm,
Günəş qürub etdi, qaraldı aləm.
Hər yerdə hakimdi iztirab, sükut,
Şahlar cəlalına o oldu məbhut.
Gözləri böyüdü sanki vəhşətdən,

Qamaşdı o yüksək mədəniyyətdən.
O böyük cəlalla gəldi üz-üzə,
Sənət qarşısında şah çökdü dizə.
Nə qədər tamaşa etdi, doymadı,
Hətta Taisaya məhəl qoymadı.
Qadın hər nə qədər gözəl olsa da,
Qəsr ondan gözəldi, düşmədi yada.
Taisa qısqanıb bir hiylə qurdu,
O qəsrin külünü göyə sovurdu.
Qadının peşəsi məkrü hiylədir,
Qısqanclıq da ona bir vəsilədir.
Qəsri başdan-başa gəzdi İskəndər,
Füsunkar Taisa, o nazlı dilbər
Doldurub qədəhi meylə dalbadal,
Söz açdı tarixdən, dedi o nigar:
- Necə Afınanı tutmuş Xəşayar?
Gülüb dodaqaltı fitnəkar sona,
Dedi: - Sən məftunsan düşmən yurduna.
Düşmənin büsatı könül açansa,
Daha gözəl olur alışıb, yansa.

## VİDA, GÖZ YAŞI

Qaranlıq gecəydi, pozulmuş hava,
Dünyanın taleyi dalmış yuxuya.
Zöhrə yorulmuşdu qayıq sürməkdən,
Ay da silkələnib çıxmış dənizdən.
Mars üzük qaşını itirmiş fələk,
Pərdəsi yanaraq, tökülmüş piləк.
Pars, o əfsanəvi, şux, gözəl şəhər,
Dağılmış, sərilir daşlar, kəsəklər.
Dönmüş qəbristana şənlik şəhəri,
Orada görünməz həyat əsəri.
Sökük bacalardan düşən işıqlar
Məzar üstdə yanan şam tək işıldar.

Bulağın gozündən o su ki axır,
Sanki can verənlər gözüdür, baxır.
Göy savaş axtaran sərxoşa bənzər,
Elə bil gətirib müdhiş xəbərlər.
Şimşək məşəlini yaxaraq hər an,
İstəyir alışıb kül olsun cahan.
Külək də acıqlı girib meydana,
Çalışır alovu yaysın hər yana.
Ulduzlar gözünü yummuş əlüstü
Ki, girə bilməsin gözünə tüstü.
Odur, Təxti-Cəmşid, dünya gözəli,
Görünür pərişan, qəmli, qüssəli.
Sanki bir gəlindir, verilir qurban
Odlara, xalqının nadanlığından.
Odlara qalanmış bir xanimandır,
Xəzana uğramış bir gülüstandır.
Şüa saçmaqdadır güzgü ilə su,
Ayrılıq göz yaşı, son busədir bu.
Hərdən işıldayır sönən bir çıraq,
Lalə pərəklənir, xəzan görüb bağ.
Matəm libasını geyinmiş saray,
İşıq qəm tozudur üzündə, ey vay!
Lalələr görünür bağrı yaralı,
Sonuncu şəmləri Dara cəlalı.
Ağlayan göz kimi sönür, saralır,
Bir ocaq kor olur, işıqsız qalır.
Kərəm xəznəsində şahın daş-qaşı
Yetim uşaqlartək tökür göz yaşı.
Baxın təxtə-taca, ləlli-gövhərə,
Talanıb, çapılıb, düşmüş əllərə.
Fərşini tapdalar soyğunçu qəddar,
Cəllad pərdələri qılıncla doğrar.
Qurban gecəsinin qoyunlarıtək,
Tacları qıraraq, tökmüşdü fələk.

## CİNAYƏTİN BAŞLANĞICI

Taisa eləmiş ram İskədəri,
Gülür iblis kimi hiyləgər pəri.
Həvvanı aldadıb etməsə yoldan,
Adəmə əl tapa bilərmi şeytan?
Xidmətçi əlində bir yanar məşəl,
Qılınc siyirmişdi sanki bir dəcəl.
Cani, əməlindən utanmayaraq,
Pərdəni odlayır hamıdan qabaq.
Məsum bir gözələ oxşayır pərdə,
İpək telləridir sürünür yerdə.
Dünya zara gəldi bu cinayətdən,
Cani də, məşəl də əsdi dəhşətdən.
Aləmi çulğadı qorxunc bir səda,
Vicdan qəzəbindən gəldi fəryada:
- Ey cani, əl saxla, felindən utan!
Məgər səndə yoxdur zərrəcə vicdan?
Bu saray şahların qibləgahıdır,
dünyanın ədalət barigahıdır.
Buradan yayılıb elm, mərifət,
Buradan hörmətə çatmış məhəbbət.
Burada bar verib fəzilət, hünər,
Burada yaranmış minlərlə əsər.
Ey cani, nə qədər çirkindir üzün,
Özünü ədəbsiz göstərdin özün.
Hünərə, sənətə edib pərəstiş,
Bəşərin dühası göyə yüksəlmiş.
Belə bir pilləyə çatana qədər,
Dünyanı tapdayıb keçmişdir bəşar.
Göylərə yüksələn bu mədəniyyət,
Bir vəhşi əliylə məhv olmaz, əlbət.
Bir bax, babaların ruhu ağlaşır,
Alovdan, tüstüdən gözlər qamaşır.
Sənin törətdiyin bu cinayətdən,
Ürəklər qan oldu, utanmırsan sən?!

Aləmi həyəcan bürümüş, budur,
Sanki biləyindən milyonlar tutur.
Deyir: - Əl saxla, ey vəhşi, qudurğan,
İffət pərdəsinə od vurma, utan!
Ey fələk, olarmı zillət bu qədər,
Daranın qəsrində gəzir İskəndər?!

## TƏXTİ-CƏMŞİDİN YANMASI

Alov ilan kimi bacadan qalxır,
Elə bil qırmızı qan seli axır.
Həriflər ox kimi qaçır yanğından,
Alov qılınc kimi şütüyür hər an.
Yanğın hücum edir, yayılır işıq,
Kölgələr baş alıb qaçışır artıq.
Tək qalıb, Taisa, bir də İskəndər,
Cəhənnəm əhli tək nərə çəkirlər.
Qəsrin qapıları, fərşi, tavanı,
Yanır, gözü yaşlı qoyur İranı.
Saray külə dönmək istəyir, nədən?
İstəməz hüsnündən kam alsın düşmən.
Üzərlik yerinə mirvarid, gövhər,
Yandıqca atılar, düşər, rəqs edər.
Pərdələr alova bürünüb yanır,
Belə bir cəlalla onlar nazlanır.
Tüstü cilvə verir xəttü xalına,
Alov bəzək vurur məh camalına.
Şölə eyvanlardan yüksəlir dil-dil,
Sanki güldanlarda açmiş sarı gül.
Gözəl naxışlarla bəzənmiş eyvan,
Od içrə görünür daha da əlvan.
Təlai, innabi, yaşıl şölələr,
Baş alıb yüksəlir fələyə qədər.
İpək don geyinmiş gəlinlər kimi,
Tutub ətəyindən səba nəsimi.
Rəqs edir şölələr, uzaqdan baxan
Deyər pərilərdir çalıb oynayan.

Bəlkə də zənn edər görən bir anlıq,
Bayramdır, şah edir atəşfəşanlıq.
Elə bir cəlala, qüdrətə əhsən,
Aləmə nur saçır sönüb gedərkən!
Gözəlin əvvəli, axırı olmaz,
Ay, günəş çıxsa da, batsa da solmaz.
Qüdrətlə, cəlalla tikilən saray,
Yandı, diz çökmədi, salmadı haray.

## ŞƏHƏR OYANIR

Alov toxtaq verir bir az özünə
Ki, tüstü dolmasın xalqın gözünə.
Qıcayır dişini gahbir qəzəbdən,
Deyir İskəndərə: "Yaman dəlisən!"
Kimsə hadisəni bilməsin deyə,
Külək də meydandan dönmüş geriyə.
Lakin tüstü, alov göyə dayandı,
Qanına qərq olmuş şəhər oyandı.
Hələ də yanmamış bir neçə evdən,
Göylərə yüksəldi boğuq bir şivən.
Gördülər odlanıb yanır fəxrimiz,
Gözlər qan ağladı, qan oldu dəniz.
Görüncə şəhəri odlamış yağı,
Ürəkdə göynədi əzizlər dağı.
Gözü uşaqların sataşdı oda,
Bayram axşamını saldılar yada.
Lakin odla yoxdu şənlikdən əsər,
Töhfəsi ölümdü, noğulu zəhər.

## QARININ AĞI DEMƏSİ

Ağı söyləməyə başladı qarı,
Nə qədər çox imiş qəmi, qubarı.
Dedi ki: - Daradan sonra nə üçün
Yaşadm, ey saray, bu oldu günün?

Lakin biz təsəlli alırdıq səndən.
Daranırı adını yaşadırdın sən.
Gecələr çırağın nur saçan zaman
Sanırdıq ki, dünya olmuş gülüstan.
Tapırdı nurundan gecə yaraşıq,
Elə bil gözümüz alırdı işıq.
Nə qədər əvvəlki büsatın vardı,
Səninlə şahların adı yaşardı.
Ədalət eviydin, sən abad ikən
Zülm evi uçardı öz təməlindən.
Sayəndə yatardı bütün el rahat,
Ürəyi asudə, başı farağat.
Gecənin divini etmişdin əsir,
Görürdük qorxudan qarşında əsir.
Hörmət etməsə də fitnə bizlərə,
Qaçırdı kölgəni görcək düzlərə.
Pərilər yurduydun, divlərə zindan,
Tərifin düşməzdi ellər ağzından.
Ümidi hər yandan kəsilmiş ana,
Söz açardı səndən öz övladına.
Uşaqlar çəkməzdi səndən gözünü
Ki, bəlkə görsünlər şahın üzünü.
Nə gözəl günlərdi, aman, o günlər,
Səndə tutulardı toylar, düyünlər.
Sən idin izzəti, rövnağı Şərqin,
Gecə məclisində çırağı Şərqin.
Ey saray, gedirsən, uğurlar olsun!
Şahların sayəsi sənə yar olsun!
O sirli aləmdə Daranı görsən,
Baş əy, bizdən ona salam yetir sən.
Söylə: bu fələyin zülmündən aman!
Ədalət qəsrini elədi viran.
Yaxdı başımızın tacını düşmən,
Tökdü başımıza onun külündən.
İndi dövran sürür zalım cəlladlar,
Vətən torpağını tapdayır yadlar.
Ağlar halımıza biganə belə,
Hardasan, gəl bizə qəmxarlıq eylə.
Günlər belə keçdi, dövran dönmədi,

Tüstü kəsilmədi, alov sönmədi.
Parsın zəfər qəsri yandı, söküldü,
Qəmli başımıza külü töküldü.
Bir saray deyildi təkcə odlanan,
Mərifət dünyası yanırdı, inan!
Sönməzdi oradan qalxan şölələr,
Bu dərdi unutmaq olarmı məgər?
Zənn etmə ki, yanan daşdı, torpaqdı,
Alov ürəyi də, canı da yaxdı.
Oturtduq süfrəyə bir bivicdam
Ki, duzu yeyərək, qırdı duzdanı.
Bu qəsri odlayan daşürək, nadan,
Olacaq əbodi nifrətə şayan!

## AY İŞIĞININ KÖLGƏSİ

Ay ki yavaş-yavaş çıxdı buluddan,
Sanki Dara idi məzardan qalxan.
Kölgədən, işıqdan duyuldu əsrar,
Onların vəhmi də, ilhamı da var.
Könlümdə canlandı işıqla kölgə,
Düşündüm ki, çəkim bir şəkil, bəlkə.
Xəyal fırçasını əlimə alcaq,
Yaratmaq ilhamım qanadlanaraq.
Yenidən bitişdi bütün zərrələr,
Abadlıq göründü o xərabələr.
Ülvi bir eşqdən alaraq ilham,
Otuz əsr geriyə qayıtdım tamam.

## DARİYUŞUN BAYRAMDA ÜMUMİ QƏBUL TABLOSU

Möhtəşəm sarayda, budur,
Dariyuş Xalqı qəbul edir, bir büsat qurmuş.
Novruz axşamıdır, bu şanlı bayram,
Qələbə rəmzidir, şənlikdir tamam.

Qərq olmuş işığa atəşgədələr,
Keçib mehrqanlar, keçib sədələr.
Çalınır nağara, təbil gurhagur,
Düşməni titrədir, divi qorxudur.
Salam musiqisi çalınır yenə,
Əsgərlər düzülmüş qəsrin önünə.
Dövlət quşu kimi qəsr açıb qanad,
Şəhər, sayəsində yaşayır rahat.
O qüdrət qəsrinin üzərində bax,
Şahın qanadıtək əsən o bayraq.
Sanki şəhpərini açıb qaraquş,
Sərçə tək dünyanı çəngində tıtmuş.
Onlarla çilçıraq xoş işıq yayır,
Şahin gözü kimi şamlar parlayır.
Qalanın üstündə keşik çəkənlər
O sərv qamətli, polad bədənlər.
Əldə nizələri gəlməz hesaba,
Elə bil incidir düzülmüş sapa.
Hər bürcün üstündə gözətçilər var,
Uzağı görməkçün şüa saçırlar.
Qəsrin ətrafında su halqa vurmuş,
Elə bil kəhkəşan suda oturmuş.
Baxın, saraydakı gücə bir daha,
Belinə sarımış sudan əjdaha.
Fəvvarə vuraraq qaynayır bulaq,
Hovuz zireh geyir sudan qısqıvraq.
Yeri qılınc kimi su yarır, biçir,
Elə bil aslandır, bağırır keçir.
Aslanın ağzıdır sanki heyvanlar,
Sütun dişlərini qıcmış aslanlar.
Naxışla, şəkillə doludur hər yan,
Çərçivə bürcdən, qapı poladdan.
Qəsrin hər tinində daşdan, dəmirdən,
Zəhmli birpələng, aslan görərsən.
Aynabəndlərində yüz rəmz oxunmuş,
Fərşlər mirvaridlə, zərlə toxunmuş.
Qapılar abinus, heykəllər gözəl,

İpək pərdələrə bəzək vurmuş el.
Zərli pərdələrdə minalı mıxlar,
Qotazı Mərrixin gözünə oxşar.
Nə gözəl döşənmiş pilləkanları,
Naxışla bəzənib dəri-divarı.
Şuxdur pəncərəsi, şuxdur taxçası,
Cənnətdən gözəldir bağı-bağçası.
Çinidən qədəhlər, kaşıdan sənək,
Verir taxçalara başqa bir bəzək.
Bayram axşamıdır, verilsə də bar,
Sarayda yenə də bir əzəmət var.
Dəstə-dəstə gəlir, gedir izdiham,
Gözlənir nəzakət, ədəb, ehtiram.
Otaqlar əyanla, əşrafla dolmuş,
Şahların məhrəmi, sirdaşı olmuş.
Ədəblə dayanıb çiyin-çiyinə,
Heç biri gətirməz bir söz dilinə.
Elçilər, vassallar səf çəkib, budur,
Əllərdə hədiyyə, töhfələr tutur.
Parslar, midyalılar göstərir xidmət,
Hamıya edirlər təvazö, hörmət.
Bağlamış belinə minah kəmər,
Hərəsi bir çinli gözələ bənzər.
Məclisi günəştək gəzər qızıl cam,
Şah, Cəmşid büsatı qurmuş bu axşam.
Belə bir məclisin başqa hüsnü var.
Saqilər sərxoşdur, gözəllər xumar.
Yar, qədəh ləbinə qoyduğu ləblə
Şahənşah adını çəkir ədəblə.
Saqi hey qədəhi doldurub verir,
Şahın şərəfinə bir sağlıq deyir.
Musiqi səslənir fasilələrdə,
Şənlikdən başlayır yeni bir pərdə.
Səf çəkib yüksəlir göyə sütunlar,
Sənət əsəridir hər biri onlar.
Büllur hovuzlarda su vurur fantan,
Üzüm salxımıtək düşür havadan.
Su üstə səpilən parlaq qətrələr,
Tər-təzə inciyə, gövhərə bənzər.

Ağ, sarı, qırmızı balıqlara bax,
Zəncir yaratmışdır, halqa vuraraq.
Su gah ətək vurur, gah səpələnir,
Güzgü qarşısında sanki bəzənir.
Çalınır musiqi, başlanır oyun,
Rəqs edir şüası güzgünün, suyun.
Abadan qəsrində qurulmuş məclis,
O qəsrin dövrəsi eyvandır təmiz.
Fəzası açıqdır hər yana baxsan,
Hərlənən fələkdir o qəsrə tavan.
Lakin örtülüdür eyvanlar bütün,
Damlar səngər imiş burada bir gün.
Burada sərbazlar pusquda durmuş,
Ox ilə düşmənin gözündən vurmuş.
Şah təxtə oturmuş taclı, əsalı,
Fələkləri ötmüş cahi-cəlalı.
Təxtinə brilyant düzülmüş lay-lay,
Təxt kəhkəşandır, şah isə bir ay.
Durub xidmətində hörmətli vəzir,
Ərz etmək üçün o, bir fursət gəzir.
Təxtin ayağında iki şux dilbər,
Manqala ud töküb, üzərlik səpər.
Tüstü yayıldıqca ipək tel kimi,
Yayır ud ətrini səba nəsimi.
Parlayır ay kimi padşahın üzü,
O üzə dikilmiş hamının gözü.
Şahın arxasında cavan vəliəhd,
Şah üçün arxadır, həyan, vəliəhd.
Onun da dalında baş möbid durur,
Mələkdən artıqdır ondakı qürur.
Baş möbid dalında əsləhədardır,
Belində şahanə xəncəri vardır.
Xəncərin qınında Çin naxışları,
Odur padişahın əsləhədarı.
Qəsrin hər yerindən gur şənlik yağır,
Kimsə görməmişdir belə çal-çağır.

Məclis qurtaranda söz çatdı şaha,

O göyə əl tutub oxudu dua.
Zərdüşt nəğməsiylə başlandı bayram,
Bütün el göndərdi Zərdüştə salam.
O zaman çatdı ki, göydə ay batdı,
Şah da yatağına girərək yatdı.
Uçdu xəyal kimi işıq-kölgələr,
Film sona çatdı, düşdü pərdələr.
Bir qaranlıq gecə qaldı, bir də mən,
Mən yuxu görürdüm, yarəb, deyəsən!
Gördüm dayanmışam bilmədən özüm,
Şahın otağına dikilmiş gözüm.
Saraydan enərkən çıxdı qarşıma,
Pıspısa, süsəli, ya cırcırama.
Məni qarşıladı fit verə-verə,
Bəlkə də edirdi mənə məsxərə.
Ki, ey xəyalpərəst şair, yavaş gəz!
Şah yatıb, bu ayaq səsinə dözməz!

## GÜNDÜZÜN YIRTICISI

Gecənin bağrından doğunca səhər,
Meşədən ağ bəbir çıxaraq gələr.
O gülər gördüyüm ağ səhər deyil,
Bəbirdir, qıcamış dişlərini, bil!
Quyruğunu düyüb, pəncə göstərər,
O, xalqın başına açar fitnə, şər.
Saçıdır bu qoca dünyanın yalı,
Pəncəsi bəşərin vəzri, vəbalı.
Günəşdir üzündə qızaran gözü,
Alnında parlayır ədavət gözü.
Həsədi sonsuzdur, acıqlı gülər,
Nə utanmaq bilər, nə həya bilər.
Çeynər insanları, birbəbir udar,
Onun dişsiz ağzı məzardır, məzar!
Hamının sinrini açar o, keçər,
Qudurğan vəhşidir, daim qan içər.

Qanlı pəncəsini hər anda atar,

Bir vacib insanın köksünü yırtar.
Ondan zərər görməz heç bir nakişi,
Yalnız mərdlərlədir onun hər işi.
Dünyada səhərdən axşama qədər,
Qaniçən bu vəhşi hey cövlan edər.
Gecənin səsini eşidən zaman
Meşədə gizlənər, əl çəkər ondan.
Başını yuxudan qaldırcaq səhər,
Yenə tüğyan edər, parçalar, didər.

## GECƏNİN FİRİŞTƏSİ

Gecə cadugəri tüstü bürümnüs,
Hər yerdə qəzəblə gəzib görünmüş.
Kabus çəngəlində gündüzü tutur,
Qara dalğaların içində udur.
Bir əjdaha kimi bəbvi yaxalar,
Qanını axıdar, didər, parçalar.
Ulduzlar fələkdə qaldıraraq baş,
Nazlanar, göz qırpar hey yavaş-yavaş.
Bu zaman açılar yuxulu gözlər,
Qəribə bir aləm sirrini izlər.
Tüstünün sinəsi birdən yarılar,
Gecə firiştəsi ay kimi parlar.
Mələklək ərşdən qanadlanaraq,
Fələyin səqfinə basaraq ayaq.
Üzünün örtüsü mavi bir işıq,
Telləri mehtabdan tapmış yaraşıq.
Çətri var dibadan, qara məxmərdən,
Ay üzündə halə, ipək tellərdən.
Görüncə od tutub yanır yer üzü,
Su çilər, söndürər odlu gündüzü.
Gündüzün tozunu göyə sovurar,
O toz tüstü kimi fələkdə durar.
Görcəyin aləmin üzünü qara,

Döşündən çıxarar sahir aypara.
Ayın ətəyindən bir dalğa vurar,
Yuyar yer üzündən nə qədər toz var.
Ehmalca-ehmalca göydən enərək,
Qonar torpaq üstə bir pərvanə tək.
Sanki mişk qoxuyan səba yelidir,
Gülün yanağından öpərək gəlir.
Qonur şəhidlərin cəsədi üstə,
Ətrindən dirilir can verən xəstə.
Alır xəstələri qara torpaqdan,
Gətirir yatağa salır mehriban.
Zülfüdür hər ağır yaraya məlhəm,
Silər nəfəsiylə könüllərdən qəm.
Bir xəstə yanından oturar bəzən,
Kirpiyi çıxarar tikan ürəkdən.
Şəkər ləblərini büzərsə əgər,
Bizim yaxamızdan əl çəkər zəhər.
Əl atıb saçına verərsə tumar,
Yüz nəğmə gəzdirər tellərində tar.
Başlanar bir həzin layla nəğməsi,
Kirpiyin yuxuya gələr həvəsi.

## GECƏNİN RÖYASI

Çalındıqca şirin, mehriban layla,
Dünyanı qərq edər ağır yuxuya.
Yuxu asta-asta qanad çalınca,
Ruhlar ordusunu çəkir dalınca.
Gənclik röyasına dalsın gözümüz,
Bəlkə o aləmə düşək özümüz.
Ayın işığıyla göylərə varaq,
Çatıb ulduzları köpük tək yaraq.
Xəyal aləmində qanad gərərək,
Camal dənizində seyr edək gərək.
Gah ipək ləpələr qoynunda üryan

Üzüb pərilərlə əylənək bir an.
Gah qızıl qanadlı pərvanlərtək
Eşq bağçasında yarla eylənək.
Gah necə səbrsiz, dəcəl bir uşaq,
Bulud kəpənəyi dalınca qaçaq.
Şəbnəm incisitək səhər nəsimi,
Düzsün gül boynuna boyunbaq kimi.
Mişk olub qarışaq səba yelinə,
Qonaq pərilərin ipək telinə.
Gah cənnət quşuyla verək baş-başa,
Səs-səsə qataraq, oxuyaq qoşa.
Gah göyərçin kimi çevik tərpənək,
Fələyin damından yer üstə enək.
Fələk kilisəsi damında, nurdan,
Mələk kimi geyək əba, teyləsan.
Gah naqus səsiylə ərşi dolduraq,
Mavi üfüqlərdə sükutu qıraq.
Geyinib yamyaşıl fələk çəməni,
Zöhrənin neyindən dinlər nəğməni.
Göydə çoban qızı ney çala-çala,
Sürüsünü yayır fələkdə yala.
Zümrüd sırğasını qulaqdan asmış,
Saz kimi zülfünü bağrına basmış.
Əzəli ahənglə nəğmə oxuyur,
Əbədi ahular otlayır, budur.
Çalaraq ecazkar nəfəsiylə ney,
Yanar şövq odunda, oxuyar o hey.
Fələk nalə çəkər nəfəsimizdən,
Fələyin qəsrini bizik titrədən.
O səmavi neyi gətirrik dilə,
Yerin ahəngiylə, bəşər eşqiylə.
Göylər qulağını açaraq dinlər
Ki, yerdə insanlar həsrətdən inlər.
Fələk qızlanyla gah olub yoldaş,
Mələk ismətiylə sayılıb sirdaş.
Səmavi turaclar kimi çəkib səf,

Uçaraq fələyin səqfinə tərəf,
Olarıq ölməzlik mülkünə rəvan,
Canı yar hüsnünə verərik qurban.
O kərəm çeşməsi qaytarar yenə
Bir əmr ilə bizi varlıq mülkünə.
Yenə üfüqlərin mehrabında biz
Salaq tüstülənən ahımızla iz.
Yüksəlsin ahımız mavi fələkə,
Orda məbudunu axtarsın, bəlkə.
Gah fələk qəndili yandırsı bizi,
Açaq o mehrabda diləyimizi.
Gah olaq fələkdə şığıyan şimşək,
Gah da nərə çəkək bir ildırımtək.
Gah fələk xumunda düşüb qaynayaq,
Gah şəfəq camını içib məst olaq.
Gah qara buluddan bir təyyarədə,
Aya hücum edək, yağdıraq hədə.
Gah şimşək nizəsin alaraq ələ,
Qərbi Şərqə tikək o nizə ilə.
Gah ulduz boynuna uzadaraq əl,
Ətəyə dolduraq çoxlu inci, ləl.
Gah ay qayığına yığıb dostları,
Fələkdən yollanaq sahilə sarı.
Kəhkəşan körpüsü üstünə çıxaq,
Yığaq ulduzları hey qucaq-qucaq.
Gah göy qurşağına naxışlar düzək,
Gah da ay işığı gölündə üzək.
Gah bəyaz nur kimi olunca səhər,
Ayın işığından bağlayaq kəmər.
Gah bulud torunu alaraq ələ,
Ayın qarşısında quraq bir tələ.
Fələyin o çılpaq balığı, mütləq,
Düşəcək tələyə söküncə şəfəq,
Lakin o kiçicik çevik balıqlar,
Torun deşiyindən çıxıb qaçırlar.
Gah çiçək şimşəkdən iti bir şəmşir,

Edək Marsa tərəf hücum, necə şir.
Gah kəməndimizə salmsın Keyvan,
Gah da Zöhrə ilə oynayaq çovqan.
Gah fələk atına qoyaraq yəhər,
Ay ilə günəşdən zər üzəngilər.
Çaparaq fələyin atını hər an,
Bəhram kəməndiylə tutaq bir aslan.
Kamanı alaraq mavi fələkdən,
Qoyub oxlar ataq odlu şimşəkdən.
Ayın qalxanını çokərək başa,
Girək pəri (cimi divlə savaşa.
Gah qoşun düzəldək biz ulduzlardan,
Qozaya, qədərə verməyək aman.
Ütarid əlindən alaq qələmi,
Firuzə lövhəyə yazaq rəqəmi.
Bəşərin taleyi düşünsən bir az,
Bundan gözəl olmaz, bundan xoş olmaz!
Gah zalım fələkdə bir büsat quraq,
Şahmatın şahını nərddə aparaq.
Nəsrdən, Nahiddən düzək möhrələr,
Günəşin tasına salınsın zərlər.
İşlədək oyunda yüz hiylə, kələk,
Bu cığal fələyi aparaq gərək.
Gövhəri, incini biz qalaq-qalaq,
Tutaq o hərifin əlindən alaq.
Qovaq Əhriməni qoca dünyadan,
Aləmin hakimi tanınsın Yəzdan.
Gah büllur don geyək necə bir şəbnəm,
Qoyaq gəzmək üçün behiştə qədəm.
Təkcə ruhlar deyil, bitkilər, daşlar,
Səhər badəsindən olsunlar xumar.
Bax, ağıl sahibi bütün ariflər,
Baş qoyub səcdəyə ibadət edər.
Çulğayıb hər yanı səmavi bir şur,
Bir sükut sazıtək bir aləm susur.
Tavus lələyinə bənzər yarpaqlar,

Gül, fanus içində bir şama oxşar.
Qumru, qırqovullar hər yana baxsan,
Qanadı bağdakı güllərdən əlvan.
Başqa bir aləmdir röya aləmi,
Dindirir baxışla məhrəm məhrəmi.
Gözəllik bir sonsuz kamala yetər,
Xəyal sürətiylə sevgi yüksələr.
Pərdəsiz qorunar hüsndə ismət,
Ehtiras ləkəsi bilməz məhəbbət.
Bir çadır yuksələr dağın döşündən,
Onu Leyli-Məcnun çadırı bil sən.
Orda qəribəlik, kəramət vardır,
Xacə vəsf etdiyi həmin diyardır.
Hafiz dərvişlərlə vurmuşdur həlqə,
Hamı sufi kimi geyinmiş xirqə.
Gəlin, qarşısında salama duraq,
Onun sağlığına doyunca vuraq.
Büllur kuzələrdən mişk ətirli mey
Süzək, badələri başa çəkək hey.
Bir qədər kənara indi nəzər sal,
Sədi dayanmışdır, başında cəlal.
"Bustan"ı bir cənnət bağına oxşar,
Aləmə nur saçan "Gülüstan"ı var.
Hurilər bağından toplayır çiçək,
Hər biri qızılgül dərib bir ətək.
Hərlənir başları gül qoxusundan,
Ətək əldən çıxır elə bu zaman.
Bərzəx, alminə nəzər salanda,
Cəhənnəm bir yanda, cənnət bir yanda,
Görərsən, hər addımbaşı bir nəfər
İtmiş, unudulmuş heyrətlə gəzər.
Musa, İsa, Məryəm o diyardadır,
Adəm baba, Həvva nənə ordadır.
İskəndər zülmətdə qalmışdır heyran,
Doyunca Xızr içmiş abi-həyatdan.
Qafın qülləsində simürğ hərlənir,

Çabəlqa yamnda Qaf bir qələdir.
Vəhdət Kəbəsidir o yerlər ki, biz
Orada görmərik ayaq salmış iz.
Gəlin yenə edək göylərə pərvaz,
Əbədi neğmələr oxuyaq bir az.
Zöhrə ilə olaq bəzən həmağuş,
Uçsun sinəsinde başımızdan huş.
Gah əson küləklə verək əl-ələ,
Uçuşaq fəzada bİz güle-gülə.
Nahidin sazıyla rəqsə gələrək,
Vəhdət nəğməsini dildə vird edək.
Ayın işığında titrəyib qalaq,
Əzəli bir hüsnün aşiqi olaq.
Halə tək gəzişək ay ilə gahdan,
Çiçək güzgüsünə pərdələr ahdan.
Hüsnün, məlahətin şeydast olaq,
Eşqin şərabından məst olub qalaq.
Mavi üfüqlərin saf badəsindən
Güzgütək qəlbimiz nur alsın bəzən.
Gah da mələk kimi qara geyinək,
Fələk qəndilinin başına dönək.
Gecəni tərk edib aynlanda biz,
Ay ilə ulduzdan silkinək təmiz.
Üfüq yaxasında qəhqəhə vuraq,
Sübhün nəfəsindən canlansın afaq.
Fəcrin ürəyindən nur dalğa vursun,
Üfüqlər şəfəqdən qanda otursun.
Aləm al geyinsin lalələr kimi,
Qızılgül üstündə jalələr kimi.
Şəfəq çeşməsinin kənarında biz,
Yığaq ulduzları çiçəktək təmiz.
Gecə sona çatmış, odur, bir kərə,
Ruhları qovurlar fələkdən yerə.
Bir göz qırpımında səhər açılcaq.
Ruhların zindanı bədən olacaq.
Ah, neçin yuxudan durub hər səhər,

Görürəm könlümü çulğamış kədər?!
Hər sabah yerimdən ayağa durcaq,
Qəmlə möhnət olur mənimlə ortaq.
Gündüzün üzünü görüncə, aman,
Ürəyim köksümdə əsir qorxudan!
Şər, fəsad çulğayır dünyanı gündüz,
Kor qoyur insanda vicdanı gündüz.
Salır min möhnətə gündüz bizləri,
O bizə göstərir xəbis üzləri.

## GECƏ VƏ ƏLİ

O, Allahın şiri, ərəbin şahı,
Unutmaz heç zaman Əli Allahı.
Əlinin sirrini bilirdi gecə,
Allahın sirrinə məhrəmdir necə?
Gecə çox yaxından görübdür Əli,
Daha qaranlıqdan görübdür Əli.
Gecə münacatı oxudu Əli,
Qaynardı xaliqə eşqi əzəli.
Şirin yuxudaykən o şahı gördü,
Bir uçuq divara dayanıb durdu.
Fələyin qəsrini qoruyanlara,
Çatırdı naləsi yerin onlara.
Şəmtək göz yaşından olmuşdu bezar,
Göz yaşı tökərək edib ahü zar.
Dərdlinin dodağı açılan zaman,
Qapı, ev, eşik də çəkirdi aman.
Qulaqdan dürr kimi söz asılıbdır,
Kufə məscidi de bihuş olubdur.
Səhərin sinəsin üfüqlər yarıb,
Ölkənin gözləri yuxusuz qalıb.
Oruc tutan üçün gün ki, qurtarar,
Arpa çörəyiylə o, iftar açar.
Gecə qaranlıqda heç kəs bilmədən,

Ərəb yetiminin şamını verən,
Bir şah ki, gecələr gizlincə gedər,
Yoxsullar evinə hədiyyə verər.
Ortürdü bu sirri pərdeyi-cəli,
Heç kimsə bilməzdi Əliydi Əli.
Sirlər qanadında uçan o şahin,
Gedir əbədiyyət tərəfə yəqin.
Elə ki, düşmənə o, qılınc çəkər,
Şirlərin başına göydən od tökər.
Xətər dənizinə batmışdı Əli,
Peyğəmbər yerində yatmışdı Əli.
O səhər qiyamət kimi alovlu,
Məscid qapısı da nə başılovlu.
Qapı da həsrətlə deyər: "Vəlini,
Qoymaram içəri keçsin Əlini".
Şah da açıldı, yolu bağladı,
Ata, getmə dedi, Zeynəb ağladı.
Gizli bir səs gəldi, ey şahi-zəmən,
Şəhadət kəmərin möhkəm bağla sən.
Haqla görüş üçün o böyük insan,
Qatili oyatdı səhər yuxudan.
Səcdəyə düşəndə, zalım arxadan,
Zəhərli qılıncla vurdu başından.
Qatili tutaraq əsir etdilər,
İşarə eyləyib ona dedilər:
Ey əsir! Əlinin qatili sənsən,
Məyər sən Allahsan? Allaha düşmən?
Salıbsan aləmə gör nə böyük şər,
"Əli bəşərdirsə, ən yüksək bəşər",
Ağlayır yuyucu, ağlayır kəfən,
Ağlayır oraya hər gəlib gedən.
Hamı vurulubdur sənə, ya Əli,
Aləm qurban olsun sənə, ya Əli.

## ŞEİR VƏ HİKMƏT

Hanı yer üzündə elə bir insan,
Şəhriyar, sən ona arxalanasan?

Qəlbi hünər dolu, özü mərd olsun,
Səhər nəsimitək könlünə dolsun.

Silsin ürəyindən qəmi-qüssəni,
Qolundan yapışıb qaldırsın səni.

Son qoysun ömründə bu müsibətə,
Qədr-qiymət versin şerə, sənətə.

Əlindən yapışıb, qəlbinə girsin,
Sənin ulağını çaydan keçirsin.

Məni qorxutmayır acından ölmək,
Qorxuram: faydasız yanan bir şamtək.

Tənha bir guşədə yanım, məhv olum,
Bir ovuc qum kimi yelə sovrulum.

Yox! Mənim od qəibim bir bulaq istər,
Yaratmaq naminə yaşamaq istər.

Mən atdan düşsəm də, şahiddir aləm:
Yenə də atlanıb çapa bilərəm.

Öz yatmış bəxtirndən agaham özüm,
Uzaq üfüqlərə dikilib gözüm.

Nə yaylı çarpayı, nə bağ istərəm,
Nə də zər-zibalı otaq istərəm.

Mən aza qailəm, çoxda gözüm yox,
Nəfsimin gözünə batırmışam ox.

Nədir istədiyim? Bir həsir, bir şam,
Bir balınc, bir kuzə arzulamışam.

Bir az ay işığı, bir cam təmiz su,
Bir yaşıl söyüdün bahar qoxusu.

Bir parça çorəyin ağız ləzzəti,
Fəqət dünya boyda ilham qüvvəti!

İnan ki, o suyu, o çörəyi də,
O ay işığını, o küləyi də

Havayı, məccani istəmirəm mən,
Əlimlə qopardıb yanar qəlbimdən,

Mən sizə od kimi sözlər verərəm,
Söz nədir, alovlu gözlər verərəm.

Misra verərəm ki, deşilməmiş dürr,
Hər biri qəlbimin döyüntüsüdür.

Yanar bir ürəkdə yaranan sözlər,
Fikrin şanəsilə daranan sözlər!

Bir söz ki, yolsuzu yola gətirən,
Bir qəlbdən çıxaraq min qəlbə girən.

Sədinin şeritək dərdlərə dərman,
Hafiz qəzəlitək əbədi qalan.

Tutulmuş gözləri aça bilən söz,
İllərin üstündə uça bilən söz!

Yaxşını yaşadıb, pisi yandıran,
Namusu, qeyrəti qanadlandıran.

Yatmışı oyadan qüdrətli bir söz,
Ölünü dirildən şəfqətli bir söz.!

Bir söz ki, Firdovsi nərəsi kimi,
Döyüşdə azadlıq gülləsi kimi!

Düşmənin əlindən bayraq salan söz,
Haqqın ciyərilə nəfəs alan söz!

Bir söz ki, sulanmış xəncərə dönsün,
Atəşi namərdin başında sönsün!

Yumruğu dəmirə, daşa döndərən,
İnsanı havalı quşa döndərən.

Döyüş meydanına aparan bir söz,
Qəhrəman ürəkdə qəhrəman bir söz!

Şairəm, dinlə gör nə deyir ilham:
Mən söz xiridarı, söz sərrafıyam.

Dünyada hər kəsin öz sənəti var,
Şairin əlində söz sənəti var.

Şahiddir gecələr od tökən ürək,
Sözlər qələm ilə güləşən pələng.

Şair nərə çəkir qəhrəman kimi,
Pələnglə güləşən pəhləvan kimi.

Şairin həyatı - əbədi döyüş,
Bütün ömrün boyu hücum et, döyüş!

Sən özün bilirsən mənim əzizim,
İşimiz, gücümüz ayrıdır bizim.

Dünyada nə qədər iş var, sənət var,
Birindən yapışar aqil adamlar.

Hər kəs öz yerini tapsa həyatda,
Sanki xəzinə var başının altda.
Sevdiyin sənəti intixab etsən,

Yoruldum deməzsən, nə qədər getsən.

Könül verdiyin iş ucaldar səni,
Könül vermədiyin qocaldar səni.

Sənin yüz sənətdən başın çıxsa da,
Birini sevirsən yəqin dünyada.

İnsanlar görmüşəm, üzlər görmüşəm,
Acizi məhv edən sözlər görmüşəm.

Yazığın, fağırın başından basan,
Zalımın döşündən ordenlər asan

Nökərlər görmüşəm, söz nökərləri,
Boynuyoğunların öz nökərləri.

Mən onda sıyırdım öz qılıncımı.
Məslək qılıncımı, söz qılıncımı!

Yetər! Saxta sözlər! Yalançı sözlər!
Ömrü oğurlayan talançı sözlər.

Zövqün, hissiyyatın daşan camıtək,
Günəşlə, baharla doludur ürək.

Gəl, sənə bakirə sözlər verim mən,
Ürəkdə bəslənmiş gövhər verim mən.

Dursun gəlin kimi qarşında sənin,
Bir sevdaya dönsün başında sənin.

Bir muştuluq kimi səsləsin səni,
Bir ana qoynutək bəsləsin səni.

Həyatda hər şeyi unutsan da sən,
Onu eşq kimi əzbər biləsən.

Neyləyim, əlimdən ayrı iş gəlmir,
Mən şair yarandım, sadəcə şair.

Sənin səadətin sevdiyindədir,
Eşqi iliyində, sümüyündədir.

Ona gözlərinin nurunu ver sən,
Ona ürəyindən atəş içir sən.

Dünyada ən gözəl şah əsərləri
Yaratdı zəhmətin cəsur əlləri.

Zəhmətə arxalan, işə güvən sən,
Budur tərəqqinin yolu əzəldən.

Atalar nə qədər gözəl deyiblər,
Deyiblər: çörəyi çörəkçiyə ver.

Bizdən qabaqdadır avropalılar,
İşi iş bilənə tapşırır onlar.

Gətir xəyalına firəng dostları,
O cərrah bıçaqlı böyük Pastoru.

Volteri, Didronu xəyala gətir,
Onlar Fransanın əzəmətidir!

Volterin əlindən qələmini al,
Ona kamança ver, de, bir hava çal.

Kim bilir, bəlkə də alar, çalardı,
Fəqət bəşəriyyət onsuz qalardı.

Bu dərdlər mənimdir düşünsən əgər,
Qələm istəyirəm, sayğac verirlər.

Mənə nə idarə, nə möhür gərək,
Söz üstə odlanan bir ömür gərək!

Bu aslan könlümü çox incitməyin,
Şiri şifrələrə əsir etməyin.

Düzdür, başım çıxır riyaziyyatdan,
Qovluqdan, hesabdan, mühasibatdan.

Fəqət inanın ki, gözüm ondadır, -
Şerimin yarımçıq misrasındadır.

Şeir - azadlığım, şeir - həyatım,
Ömrüm, səadətim, müqəddəratım!

Qartalı səmadan ayırmayın siz,
Övladı anadan ayırmayın siz.

Mənimtək mühasib həyatda çox var,
Mənimtək şairsə çətin tapılar.

Min qəlbdə çalınan tar kimiyəm mən,
Əsrimin Hafizi, Saibiyəm mən.

Qələmimdən çıxan irıci misralar,
Neçin boş çöllərə edilsin nisar?

Şeir - göz üstündə bəslənən xilqət,
Ayaqlar altına düşübdür fəqət.

Dilənçi şairlər əskiltdi şeri,
Qara bir pul kimi zay etdi şeri.

Şeri oyuncağa döndərdi onlar,
Şeri mərtəbədən endirdi onlar.

Şeir bir müqəddəs, işıqlı bina,
Qoy natəmiz əllər dəyməsin ona.

Həyhat! Bu sözləri eşitməz onlar,
İlhamı, sənəti pula satanlar.

Bu bağın bar verən ağacıyam mən,
Sınmış qol-budağım gör neçə yerdən.

Fəqət yandırsa da şimşəklər məni,
Döysə də tufanlar, küləklər məni.

Yenə bar verməli, gül açmalıyam,
Yenə şeir üstündə dil açmalıyam.

Şair şam kimidir, şam özü yanar,
Özgənin süfrəsi nura boyanar.

Nə qəm! Qoy şam kimi yansın həyatım,
Təki torpaq altda bəxtiyar yatım.

Məndən gövhər kimi söz istəyirlər,
Qoy ürək qanımdan yaransın gövhər.

Mənim bir ağ saçlı məmləkətim var,
Əcaib, qəraib bir millətim var.

İynənin gözündən kecsək də ellik,
Bəzən darvazadan keçə bilmərik.

Şairlik bir zaman burda dəb oldu,
Kəndlər, şəhərlər də şeirlə doldu.

O zaman şairin şöhrəti artdı,
Şair Fərhad kimi dağ qopardı.

Dillərə düşəndə bəzən bir sözü,
Bəxtini oyadıb, yatardı özü.

Heyhat! Bu təmizlik uzun sürmədi,
Şöhrəti, sərvəti, varı-dövləti

Doğma balasından əziz sayanlar,
Qızıl yığmaq üçün xalqı soyanlar.

Yaltaq şairləri qamarladılar,
Əl çəkib, oxşayıb-tumarladılar

Saraya çəkdilər, dar saraylara,
Gözü kor, qulağı kar saraylara!

Ravilər, rəmmallar, qəsidəçilər
Axışıb gəldilər hey birər-birər.

Gəldilər zahirdə şan-şərəf üçün,
Əslində bir qarın ot-ələf üçün.

Bu ağır zamanda, çətin zamanda,
Sənətin hörməti tapdalananda

Yaxşı ki, dünyaya Firdovsi gəldi,
Məhkum bir ölkənin gur səsi gəldi!

O, sözdə-sənətdə misilsiz dühа,
Baxdı qaranlıqda qızıl sabaha.

Gəldi, fikrimizin baharı gəldi,
Bağlı dilimizin açarı gəldi.

Vətən sevgisilə ürəyi dolu,
Vətən torpağının ən böyük oğlu.

Mətin addımlarla çıxdı irəli,
Əlində ilhamın, sozün məşəli.

Yardı qaranlığı şair gözləri...
Zirvələrdə gəzən şahin gözləri...

Yox! Asan deyildi. Bu çətin işdi,
Onda ki, məmləkət ərəbləşmişdi.

Onda ki, Təbrizdən Tehrana qədər
Ərəb dəvələri nər-nər nərildər,

Vətən torpağını ayaqlayardı,
Ərəb dodaq tikər, qol bağlayardı.

Onda ki, ərəbə təslimdi hamı,
Ərəb əqidəsi, ərəb məramı

İliyə, sümüyə, qana girmişdi,
Xəyalı, idrakı zəncirləmişdi.

Onda bu torpaqdan ucaldı bir səs,
İldırımlar saçan qaynar bir nəfəs!

Yetər bu məhkumluq! Yetər bu zillət!
Bağdada baş əyəlı başlara lənət!

Nifrət əliqanlı qəsbkarlara!
Qoyun qiyafəli canavarlara!

Nifrət fatehlərə əl verənlərə!
Milli simasını itirənlərə!

Əslindən, kökündən ayrılanlara,
Ərəb boşqabını yalayanlara.

O Tus meşəsinin cəsur aslanı,
Belə harayladı o vaxt İranı.

Qəfil nərə çəkib bar-bar bağırdı,
Almas pəncəsilə tilsimi qırdı.

Onun köksündəki pələng ürəyi,
Tağını titrətdi doqquz fələyin.

Hər sözü İranda top səsi oldu,
Sinəsi azadlıq qələsi oldu.

O dedi: bu ellər yasa batmasın,
İntiqam qılıncı qında yatmasın.

Cəmşid diyarında, Key ölkəsində
Ağalıq etməsin beş-altı gədə.

İrandan danışdı, böyük İrandan,
Qılınclı, qalxanlı min qəhrəmandan.

Fikrini torpağa, daşa söylədi,
İnsana, çiçəyə, quşa söylədi.

Ayağa qaldırdı dağı-daşı o,
Şimşəyə döndərdi gözdə yaşı o!

Zərdüştün səsiylə oyatdı bizi;
Qeyrətlə doldurdu ürəyimizi!

Əgər qalıbdırsa, millət onundur,
Can onun, qan onun, qeyrət onundur.

İranın gözünün işığıydı o,
Qaranlıq ölkənin mayağıydı o.

Heyhat! Həyatının qoca çağında
Baş götürüb getdi öz torpağından.

Dostlardan qaçaraq, fəryad qopardı,
Düşmən diyarına pənah apardı.

Gözündə böyük bir ölkənin qəmi,
Pay-piyada getdi Bağdada kimi.

Ağsaqqal Firdovsi düşəndə çölə,
Ünsüri əlində qızıl piyalə.

Taxtın kölgəsində xumarlanırdı,
Aldığı ənamla qürurlanırdı.

Tfu pis üzünə, ey çərxi-fələk!
Sən ikiüzlüsən gecə-gündüztək!

Hünərsiz insanlar səndən kam alır,
Hünər sahibləri kənarda qalır.

Günəş buludlarda fəğan eyləyir
Yarasa ortada cövlan eləyiri

Şair ehtiyacın qulu olubdur,
Şeir məddahların malı olubdur.

Onların nə təbi, nə ilhamı var,
Fqət əllərində şərab camı var.

Onlaın bildiyi bircə "Əlfiyyə".
Şerdən qisməti vəzn-qafiyə.

Çürümüş ip kimi beş-on sətir söz,
Mis kimi, daş kimi utanmaz bir üz.

Nə üzlə şairlik eləyir onlar,
Övlad əvəzinə ölü doğanlar.

Onlar eldən deyir, obadan deyir,
Onlar xarabaya abadan deyir.

Maraqlan, seyr elə şerin ömrünü.
Vəfatı günüdür təvəllüd günu.

Haram tikə kimi dadı bilinməz,
Bic uşaqlar kimi zatı bilinməz.

Heyhat, şair adı daşıyır onlar,
Bizim ömrümüzü yaşayır onlar.

Ən zərif, ən lətif kəlamdır şair,
Ürəkdə qaynayan ilhamdır şair.

Onun cazibəsi, onun sehrı var,
Onun hər sətrində fikir nəhrı var.

Sönmüş ürəklərdə məşəl yandırar,
Şeri duyanları qanadlandırar.

Şeir insan gücü, insan əzmidir,
Şeir Firdovsinin ulu nəzmidir.

Sevincdir, şadlıqdır, qəmdir, kədərdir,
Ən təmiz, ən dərin düşüncələrdir.

Gözə işıq verən xilqətdir şair,
Ürəkdən qəm silən qüvvətdir şair.

Harda ki göründü hüsnün cilvəsi,
O yerdən ucalır bir şair səsi...

Aslanın qəzəbi, maralın səsi,
Coşan bir dənizin nərildəməsi.

Qalın cəngəlliyin mübhəm əsrarı,
Yazda şaqqıldayan bahar suları.

Ürkmüş bır ceyranın birdən durması,
Gül üstdə bülbülün cəh-cəh vurması.

Mətin bir qocanın nurani üzü,
At üstə bir gəncin od dolu köksü.

Bir bala yuxusu, bir ana qoynu,
Namuslu bir qızın sevgi oyunu.

Bir söyüd kölgəsi, bir dağ çeşməsi,
Sellərin dağlarla pəncələşməsi.

Gizli bulaqların üzə çıxması,
Günəşin yayılıb düzə çıxması.

Dağın qılınc beli, qaynayan döşü,
"Gəl" - deyən gözəlin oğrun gülüşü.

Hicranın atəşi, vüsalın dadı,
Bir cüt gül dodaqda ürəyin odu.

Yarın yar əliylə tumarlanması,
Doymayan aşiqin xumarlanması.

Cəsur insanların pak məhəbbəti,
Bax, budur yaradan şeri, sənəti!

Xəzəllər tökülsün qoy payız günü,
Seyr edim qızılın töküldüyünü.

Çırpsın qanadını qara kəkliklər,
Sovuşsun, düşməsin tora kəkliklər.

Turaclar dad çəkib qaqqıldasınlar,
Ərzi dolaşanlar addımlasınlar.

Dinləyim Səbanın saz çalmasını,
Hərdən Şəhriyardan söz salmasını.

Comərd insanlara baxım şadlanım,
Şerin köhlənində mən də atlanım.

Şeir də övladtək canda bəslənir,
İlikdə, sümükdə, qanda bəslənir.

Şairin dilindən saçılan o dürr,
Xalqın dodağında şəkərdir, süddür.

Şersiz bir dünya -ı kədər, qəm kimi,
Şersiz cənnət də cəhənnəm kimi.

İnsanlar şersiz yaşaya bilməz,
Şerə kəm baxana insan deyilməz.

Ey şeir, həyatım, ömrüm sənindir,
Gözümün işığı sətirlərindir.

Ömrümü, canımı alan da sənsən,
Ömrümün qeydinə qalan da sənsən!

Sənsən başım üstə açılan səhə,
Sənsiz gündüzüm də gecəyə bənzər.

Bu sulu, palçıqlı, kirli dünyada,
Səməndər quşunu salırsan yada!

Sən torpaq deyilsən, cansan, ürəksən,
Sən qartal qanadlı bir gələcəksən!

Apar qəlbimizi əbədiyyətə,
Qovuşdur əlinlə bizi hikmətə.

Yaxşı ki, sən varsan, bir də hikmət var,
Bir heçdir gözümdə, inan, qalanlar.

Hikmət bu dünyanın vücudunda qan,
Hikmətdir dünyada əbədi qalan.

Hikmət mahiyyətdir, hikmət əsasdır,
Şeir bir təlatüm, bir ehtirasdır.

Şeir bu dünyanın zövqü, sevinci,
Hikmət təfəkkürün tapdığı inci.

Başlanğıc da odur, intiha da o,
Şeir isə hikmətin bəzəkli donu.

Şeir söz libası geyinən zaman,
Sanki qız bəzənib çıxar otaqdan.

Mən verdim canımı sözə, sənətə,
Öldüm, çatmaq üçün əbədiyyətə.

Sözün köksündədir şairin canı,
Şairi sözündən, şerindən tanı.

Sevirəm şairin qüsurunu da,
Şerin mənzumunu, mənsurunu da.

Al, bir də varaqla "Gülüstan"ı sən,
Əsrlər şahidi o dastanı sən.

İllərcə döysə də yağış, qar onu,
Soldura bilmədi tufanlar onu.

Payız bağa girdi, şerə girmədi,
Şeyxin "Gülüstan"ı xəzan görmədi.

Nə gözəl demişdi böyük sənətkar:
"Gül solar, "Gülüstan" əbədi qalar".

...Məni düşündürür nə vaxtdan bəri,
Şerin şəkilləri, şerin növləri.

Mənsur şeir də var, mənzum şeir də,
Musiqi çırpınar mənzum şerdə.

Mövzun şeir də var, ali nəzm də,
Axtarma atəşi, odu nəzmdə.

O şerin sazını oğurlasa da,
Özününkü deyil o səs, o səda.

Vəzni, qafiyəsi buzdan soyuqdur,
Bədəni olsa da, ürəyi yoxdur.

Yaşasın dünyada ürəkli sənət,
Odlu, ehtiraslı, məsləkli sənət!

Gəlsin qiymət versin sənətşünaslar,
Kimdir qafiyəbaz, kimdir sənətkar.

Dünyada nə qədər şeir yazan var,
Xalqın dərdlərinə gendən baxanlar

Bircə misra belə yarada bilməz,
Qəlbi yanmayana şair deyilməz!

Übeyd Zakaninin zərafətləri,
Hələ Səfahani komplimentləri...

Bunlar da kəlamdır, oxumaq olar,
Fəqət şair deyil, nazimdir onlar.

Şair xalqın səsi, əsrin səsidir,
Vətənin ağsaqqal sərkərdəsidir!

Hökmüylə ordular ayağa qalxır,
Şerinin nəhrindən daşlar da axır.

Şerdə cadu var, şerdə əsrar,
Yatırar, oyadar xumarlandırar.

Üreyin cövhəri, canı ondadır,
Qartal misraların qanadındadır.

Daşürəkliləri yumşaldan odur,
Bağlı gözü açan onun nurudur.

Şerin düşməni var, şerin dostu var,
O da qılınc kimi döyüşdə parlar.

Ölkələr oyanar şerin səsindən,
Şimşək misraların qəhqəhəsindən.

Göz üstə yeri var hər bir diyarda,
Mayağa bənzəyir firtınalarda!

Onun pıçıltısı top səsi kimi,
Sədinin, Hafizin nəğməsi kimi!

Hafiz! Günəş dolu bir könüldür o,
Güllərin içində qızılgüldür o.

Şairlər içində çələng onundur,
Ən gözəl təranə, ahəng onundur.

Tar kimi zili var, bəmi var onun,
Sevincdən qiymətli qəmi var onun.

Onun "Divan"ma nəzər salmışam,
Yüz dəfə, min dəfə heyran qalmışam.

Mən ona sənətin reyhanı deyim,
Yoxsa fars dilinin Quranı deyim?

Ləpələr, küləklər onun səsidir,
Ulduzlar əbədi qəhqəhəsidir.

Yerdə addımlayan o göy şairi
Topladı başına səyyarələri.

Döşündə kiçik bir dəftər saxladı,
Sanki güzgü üstdə gövhər saxladı.

Dünyada yeni bir dünyadı Hafiz,
Göyləri göstərən aynadı Hafiz.

Şerin qılıncım çəkib bülövə,
Gözəl bir dil verdi doğma elinə.

Qeybdən yaratdı "Lisanül-qeyb"i,
Baharın eybi var, onun yox eybi.

Gözün yol çəkirsə, buyur, gəl fal aç,
Elə bil ondadır hər dərdə əlac.

Əsrlər dolanır, əsrlər keçir,
Hafiz çeşməsindən nəsillər içir.

Hər kəs öz dərdini ona söyləyir,
Hər kəsə o, təzə məna söyləyir.

Hafiz bir kainat: təmiz, nurlu, pak,
Fövqünə qalxmaqdan acizdir idrak.

Sonu görünməyən bir dənizdir o,
Ay kimi, gün kimi ləkəsizdir o.

Baxıram, işıqdan gözüm qamaşır,
Açıq, gen alnında nurlu qırışıq.

O baxır təfəkkür zirvələrindən,
Dünyaya nur tökən bir dan yerindən.

O, nələr düşünür, o nələr deyir,
Min dərdin dərmanı nəğməlr deyir.

Onun nəğmələri bahar bülbülü,
Bağrının başında bəsləyir gülü.

Qoruyur gülləri tikandan, xardan,
Qızıl qönçələri yağışdan, qardan

Qoruyur körpəcə qanadıyla o,
Qoruyur qəlbinin fəryadıyla o.

Yox, o, bülbül deyil, şair qəlbidir,
Cəmi aşiqləri çəkir, cəlb edir.

Bağrının başını yandıranda ah,
İnsanlar Hafizə aparır pənah.

Hafiz yaraları açır, bağlayır,
Neçə əsrdir ki, gülür, ağlayır.

Qonağa yer verir gözünün üstdə,
Oxşayır, yatırır dizinin üstdə.

Ürəyi, süfrəsi, qapısı açıq,
Kimsə bu qapıdan sənə deməz: çıx.

Asiman boydadır şair otağı,
Kəhkşan özüdür onun çırağı.

Kimin bu mənzilə ayağı dəysə,
Yeri var, şahlara naz eləyərsə.

Gözünün ucuyla baxmaz taca o,
Çiynini dağ kimi tutar uca o!

Hafizdən mətinlik, mərdlik öyrənən,
Yüksəkdə dayanır səyyarələrdən.

Ay ilə, günəşlə gəzir yanaşı,
Ulduzlu göylərə toxunur başı.

Hafiz dərgahına ayaq basan kəs
Şahlara əl açmaz, saraya girməz.

Hafiz günəş oldu bir cam əlində,
Əbədi xumardır öz mənzilində.

Onun artığını gəlib Xızr içir,
Onun boş taxçası bir xəzinədir.

Ulduzlar içində durur xeyməsi,
Üzünün niqabı - ayın şöləsi.

Onun məktəbində dərs alır bəşər,
Onun məktəbinə gəlir mələklər.

Əhsən xumarlara xələt verənə,
Bu iki dünyanı fəth eyləyənə!

Şamı keçən üçün şam yandırana,
Əqlin göylərini nurlandırana!

Papağı bir yanda, özü bir yanda,
Pərişan saçları çəndə, dumanda.

Bütün yer üzünün əşrəfiydi o,
Adəmin ən böyük xələfiydi o.

Adəm bir arpaya satdı behişti,
Hafiz də eşqdə bu yolu seçdi.

Verdi Buxaranı, Səmərqəndi də
Bir xala, işıqlı bir təbəssümə.

Onun nəzərində var-dövlət fəna,
Yığdı gözəlləri öz otağına.

Açıldı çöhrəsi al səhər kimi,
Baxdı zirvələrdən peyğəmbər kimi.

Dünyanı köksündə saz kimi çaldı,
Günəş şüaları mizrabı oldu.

O səsi dərk edən bir qulaq gərək,
Hafiz məqamına ucalmaq gərək!

Ən gözəl təşbehlər, istiarələr,
Onun bağçasında qönçə kimi tor.

Ariflər şairi, mənalar kanı,
Onu axıracan qavrayan hanı?!

Sənə badə vərər - ürək şərbəti,
Nuş et. Bas bağrına əbədiyyəti.

Qaynar bir arzudur, diləkdir Hafiz,
Təpədən dırnağa ürəkdir Hafiz!

İnsanlıq, məhəbbət nümunəsidir,
İnsan çırağının pərvanəsidir.

Yandırır fitnəni küləş kimi o,
Sevir insanları günəş kimi o.

Bəlkə də günaha batmazdı Şümür,
Hafizin yanında sürsəydi ömür.

Onu dərk etsəydi avropalılar,
Bu qədər amanlar, bu qədər ahlar,

Bu qədər göz yaşı, bu qədər tufan
Bəlkə də olmazdı başdan-binədan.

Hafizi dərk edən, Hafizi sevən
Qan tökə bilərmi? Özün düşün sən.

Hafiz çörəyimiz, Hafiz suyumuz,
Hafiz qəlbimizdə ən saf duyğumuz.

Hafizə vurulan birmi, ikimi?
Qocamı, cavanmı, böyük-kiçikmi?

Əzbər bilməsə də onlar Quranı,
Sinədə əzbərdir Hafiz "Divanı".

Nədir bu sənətin səbəbi, sirri?
Yaşayır! Fəfh edir qərinələri!

Gətir xəyalına mərhum Arifi,
Qəlbə od tökərdi onun təsnifi.

Gecə yayılmamış bu təranələr,
Əzbər deyərdilər uşaqlar səhər.

Aşaraq kəndbəkənd, şəhərbəşəhər,
Şerlər dünyanı bürüyürdülər.

Hələ Tehran poçtu yola düşməmiş,
Arifin sözləri sərhədi keçmiş,

Sədləri, mərzləri aşmış olardı,
Bütün yer üzündə qanad çalardı.

Tufanda tutulsa teleqraf yolu,
Yayardı yenə də küləklər onu.

Bütün yer üzünün üfüqlərinə
Səpələrdi sevən ürəklər onu.

Heyhat! Parçalayır dərdim qəlbimi,
Yağışdan sonrakı göbələk kimi

Yetişir, çoxalır şairciyəzlər,
Acgözlər, dargözlər, pulgir, xəbislər...

İlhamı xəsisdir, təbi xəsisdir,
Fikrində, hissində qurumlar, hislər...

Sənətin abrını aparır onlar,
Qəlbimi köksümdən qoparır onlar.

Saray qapısında var-gəl edənlər,
Fahişələr kimi alver edənlər.

Şerin gövhərini qəpiyə satan,
Qəlbini, hissini ayağa atan.

Şairlik adını yerə vuranlar,
Sinəmə yüz yerdən yara vuranlar.

Böyüklər önündə dördqat olanlar,
Abrının üstündən körpü salanlar.

Mirvarini verib saxsı alanlar
Sənətin qəsrini etdi tarimar!

Nə günə qalıbdır görün şerimiz,
İndi göz yumuruq, görüb şeri biz.

Heç yaxşı şeri də saya salmırıq,
Şerimiz tabutda uzanıb artıq.

Qalxanımız idi şeir bir zaman,
İndi şeir oxdur, özümüz qalxan.

Şeri insanlığa düşmən sanırıq,
Az qala Hafizin özün danırıq.

Bütün yer Üzündə fitnəni, şəri,
Cəmi fənalığı, cinayətləri

Şairlərdən görür az qala millət,
Ətalət sayırlar şeri, ətalət,

Qəzəl olmasaydı guya İranda,
İndi biz uçardıq aeroplanda.

Xalqı geri qoyan qəzəldi guya,
Yox, qardaş, qəzəldə deyildir günah.

Sözündə həqiqət olsa da, coşma,
Bir az çək cilovu, həddini aşma.

Misqaldan danışıb xalvara keçmə,
Hafizin, Sədinin üstünə düşmə.

Bədəndə hər üzvün olur öz yeri,
Qolun qol yeri var, gözün göz yeri.

Ölkəyə bilək də, göz də gərəkdir,
Qılıncla bərabər, söz də gərəkdir!

Hafizi, Sədini, Firdovsini sən,
Könül dəftərindən biryolluq silsən.

Yurdunda, yuvanda bəs nəyin qalar?
Bircə ağzı qırıq nəlbəkin qalar.

Açıb gözlərini bax yaxşı-yaxşı,
Qurunun oduna yandırma yaşı.

Biz demirik şeir göydən enibdir,
O, insan əliylə qönçələnibdir.

Şeir mədəniyyət, incəsənətdir,
İncə ruh, incə zovq, incə sənətdir.

O da musiqitək qəlbin səsidir,
İnsanın ən böyük möcüzəsidir.

Sən təkcə torpaqda axtarma zəri,
Ürəkdə yaranır şerin gövhəri.

O tənqid etdiyin Avropaya bax,
Ədibə, şairə qiymət qoyaraq

Gör hara ucaldıb söz rütbəsini,
Sənətin qranit abidəsini!

Havalı köhləntək baş aparma, dur,
Bəlkə kasa aşdan isti olubdur?

Anadan mehriban dayədir bəlkə?
Günəşsiz səmadır şersiz ölkə!

Şeir də insaın vuran əlidir,
Yaradan əlidir, quran əlidir.

Xor baxma şerə sən, şeir həyatdır,
Qartal ürəkliyə bir cüt qanaddır!

Kimin güclüdürsə şeri-sənəti,
Onun əbədidir mədəniyyəti!

## USTADIN SURƏTİ

*Unudulmaz müəllimim Hacı*
*İsmayıl ağa Əmir-Xizinin*
*xatirəsinə*

Görkəmi möhtəşəm, başı vüqarlı,
Bir azca qaraşın üzündə təmkin.
İri, qara gözlər nüfuzedici,
Üst göz qapaqları bir azca şişkin.

Hər sözü sanballı, hər fikri qəti,
Sevdiyi kütlədən bir azca öndə.
Böyüklüyə məxsus hər şeyi vardı,
Heç nə kəm deyildi böyüklüyündə.

Çatılı qaşları bir azca qalın,
Bir az ətli-canlı, ortaboy, dolu,
Köksü, çiyinləri geniş və möhkəm,
Nəvazişi - ipək, kini alovlu.

Tanrı elə görkəm vermişdi ona,
Görənlər az qala cadulanırdı.
Onun baxışıyla rastlaşanların
Gözündə ehtiram nuru yanırdı.

Sadə insan idi, riyadan uzaq,
Nə tütün çəkərdi, nə mey içərdi.
Elə bil tunc idi sağlam bədəni,
Zərbəsi qurşundan, misdən keçərdi.

Sənətkar xülqünə hopmuşdu onun
Təlim-tərbiyənin zövqü, ahəngi.
İzzətlə, vüqarla yaşadı yüz il
Bir sərkərdə sayaq, bir xadim təki.

Həm xəttat, həm nasir, həm də şairdi,
Can qoyduğu işin hamısı ciddi.
Əmirlər, vəzirlər onun yanında
Necə balacaydı, necə kiçikdi.

Hansı bir məclisə bassaydı ayaq,
Yaramaz adamlar ordan qaçardı.
Onun yolu üstdən ötüb keçməyə
Hansı hiyləgərin hünəri vardı?

Vicdan hökm edərdi olduğu yerdə,
Yalandan, rüşvətdən qalmazdı əsər,
Başı uca idi, mərd, alnı açıq,
Mənliyi susmadı ötənə qədər.

Arxada qoysa da uzun bir ömür,
Yazıb yaratsa da səksən, doxsan il.
İki nisgil qaldı qəlbində yalnız –
Azadlıq nisgili, bir də Vətən, el.

Gənclikdə zamanla ayaqlaşaraq,
Qorxunc döyüşlərdə qəhrəman oldu.
Ancaq döyüşlərdən qayıdan zaman,
Yaralar bağlayan bir loğman oldu.

Əziz həyatını elmə, sənətə,
İnsana, dəftərə, qələmə verdi.
Tükənən ömrünün son çağlarını
Yenə kitab adlı aləmə verdi.

Az bir təqaüdtə məğrur dolandı,
Qənaət bağından bar dərə-dərə.
Ölüm ayağında azca varını
Payladı mərd, yoxsul tələbələrə.

Ağaclar kimiydi, güllər kimiydi,
Həmişə bar verər, ətir saçardı.
Doğulub, boy atıb kim ki, Təbrizdə,
Ondan ürəyində bir şölə vardı.

İnqilab - Məşrutə tərazisinin
Yerdən çətin qalxan çəki daşıydı.
Firqəyə rəhbərdi, Sərdara katib,
Bütün el-obanın can sirdaşıydı.

İkinci Səditək, Fərahanitək,
Şair əzəmətli, katib qələmli,
Şeyx Məhəmmədin məslək elçisi,
"Gavə" toplusunun baş müvəkkili.

Kını qalıb Təbrizdə ondan savayı?
Bir Yegani qalıb, bir Tağızadə.
Arayıb axtarsaq başbilənləri,
Dövran hamısını veribdi bada.

Sinif müəllimi, məktəb müdiri
Yüksəldi, maarif başçısı oldu.
Bütün küləklərə açdı könlünü,
Əl boyda ürəyə daryalar doldu.

Özü köhnə dəbdə şeir yazsa da,
Yenilik gözlərdi məndən hər zaman.
Dünəndən ayrılmaz, bu günə bağlı,
Sabaha can atan teşnə bir insan!

Ruhani ataydı şagirdlərinə,
Köksü dar gələrdi iftixarına.
Ondakı məhəbbət, ondakı şəfqət
Sığmırdı insanlıq hüdudlarına.

Ayrılıq çağında, yay tətilində,
Sınıq könülləri sözlə yamardı.
Bəzən köyrətərdi vida dəmində,
Kişi sifətinə yaslar damardı.

Mən evə bilirdim mirvarilərdir,
Üzündə, gözündə parlayır dən-dən.

Şirin canını da əsirgəməzdi
Yaxşı, dərrakəli şagirdlərindən.

Dərnəklər yaratdı o, gecə-gündüz,
Mərifət dərnəyi, ədəb dərnəyi.
Çıraqlar keçsəydi axşam bir anlıq,
Çırağa dönərdi eşqi, ürəyi.

Mühəndis Natiqlə mütərcim Püsyan –
Onun üzük qaşı, çıraq işığı.
Yaddaşım yar olsa, yad eyləyərəm
Ondan qüdrət alan yüz-yüz uşağı.

Ən gözəl sifətlər timsalı olan
Əyalət maarif başçısı Dehqan
Keçirdi ömrünü dağ çayı kimi,
Safdı, atəşliydi qəlbindəki qan!..

Onun idrakından işıq alıbdır
Gör neçə məktəbin zəka ocağı.
Ona şagird olub gör neçə ustad,
Görüm heç sönməsin onun çırağı!

Alimlər çağırdı Reydən Təbrizə,
Gəldi Müdərrisi, Hümayi, Bina.
Təbrizin özündə gözlərimizə
İşıq verdi Nüxbə, Hadi və Sina.

Onun məktəbini bitirənlərin
Hərəsi bir müdir, bir igid, bir zat.
Hayanda olsalar, xalqın, vətənin
Başını ucaldar yaxşı bir övlad.

Neçə il elmdə nərd oynadı o,
Ulduz tələbələr onun zəriydi.
Hüseyn Umud kimi, Dibaclar təki,
Böyük şəxsiyyətlər möhrələyirdi.

Sənət sarayının özül dasları,
Onun öz çiynidir - desəm, yeridir.
Nə qədər dualar etsən də ona,
Yenə zəhmətinin mindən biridir.

Təkcə müəllimim deyildi, inan,
Xərcimi ödəyən atamdı mənim.
Cismim də, canım da adına qurban!
Onun sevgisilə yaşar bədənim.

Məni o apardı şanlı, şərəfli,
Əziz Yeganinin yanına bir gün.
O da Şeydaniyə tanıtdı məni...
Tanışlıq, doğmalıq hər şeydən üstün.

Sayğacı öyrətdi Şeydani mənə,
Bank işçisi oldum, imtahan verib.
Onun çörəyidir yediyim bu gün,
Könül o gülzardan neçə gül dərib.

Bir gün İsfahana apardı məni,
Mənimlə birlikdə dostu Nüxbəni.
İsfahan- dünyanın solmaz gülşəni,
Səpdi yolumuza gülüşlərini.

Neçə mərd əllərə əlimiz dəydi,
Sədr ilə, Tac ilə gəzdik elatı.
Min işi olsa da, qızıl vaxtını
Ustadımız bizdən qızırqanmadı.

Ölkənin ən böyük alimlərilə,
Əl verib görüşdük məsud, bəxtiyar.
İnsan ömür boyu başdan keçəni
Dərk eləsə, yazsa, "Şahnamə" olar.

Təbrizə hər dəfə mən qayıdarkən,
Mənim görüşümə o özü gəldi.

Qapandım hər dəfə ayaqlarına,
Səpdim göz yaşımı yanaqlarına.

Ölünü göz yaşı dirildə bilsə,
Mən qan-yaş tökərdim, əziz müəllim!
Əgər can verməklə, can geri dönsə,
Həyatımı sənə qurban verərdim!

Hafizi, Sədini tanıtdın bizə,
Xəzinələr açdın, əlində açar.
Şəhriyar, Həriri, Rədi özü də
Sənin ocağında alovlandılar.

Bərzəgar, Nəsudi, hətə Xürrəm də,
Bir vaxt min eşq ilə sizi anıblar.
O nəsil bir azca bizdən qabaqdı,
İndi məzar içrə rahatlanıblar.

Bütün ömür boyu cəzb etdin bizi,
Ey maqnit vücudlu möhtərəm ustad!
Ata-ana ətri alardıq səndən,
Kamal göylərində açaraq qanad.

Kaş geri dolana zamanın çərxi,
Sən yenə müəllim, ustad olasan.
Biz də o məktəbli, dəcəl balalar...
Onda biz qoymazdıq sən qocalasan.

Sən ayrıseçkilik qoyardınmı heç?
Hamıya bir gözlə baxardm, ata.
Düz yola çəkərdi mələklər bizi,
Nə qədər ki, vardın sən bu dünyada.

Təmiz yaşamağı öyrətdin bizə,
Kirli cəmiyyətə ögeydi bu dərs.
Sənin qazanında qaynadıq, ancaq
Həyat kif içində, arzu müqəddəs.

Qaranlıq gecədə yadıma düşsən,
Xatirən nur olub yarar zülməti.
Adına, kölgənə səcdə qılıram,
Mümkünmü unutmaq o pak xilqəti?

Tələbə könlündə yaşar müəllim,
Bu yeri başqası tuta bilərmi?
Ürəyi yaşadan ustad eşqidir,
Eşqdir yaşadan bütün aləmi.

## HAQQIN SƏSİ

Bu nurani dünya, pirani dünya,
Əzəldən meyvəli bir bağa banzər.
Bəşərin qocaman sərt ağacında
Hər insan bir gülə, yarpağa bənzər.

Yarpaqlar, budaqlar ayrı olsa da,
Bu dünya bağının bəhəri birdir.
Udduğu hava bir, icdiyi su bir,
Yerdən şirə çəkən kökləri birdir.

Budaq heç yaşarmı budaqdan ayrı,
Ömr edə bilərmi insan insansız?
O doğma gülşəndən, o bağdan ayrı
İnsan xəzəl kimi ölüdür yalnız!

Mənə elə gəlir: hardasa, kimsə
Bir insan ömrünə qələm çəkirsə,
Özü də bilmədən yüz qan salır o,
Bəşər ağacına balta çalır o.

Bir insan köçürsə dünyadan əgər,
Sən elə bilmə ki, tək bir can gedir.
Hər sönən baxışda saysız diləklər,
Hər kiçik tabutda bir cahan gedir.

O gedir... qalırıq biz yana-yana,
Bu dərdi ürəkdə daşımaq çətin.
Hər gün yer üstündən yerin altına
Köçür bir parcası bəşəriyyətin.

Bəşər dedikləri vahid bir bədən,
Bəs nədən düşübdür ürəklər ayrı?
İnsan cəmiyyəti yaranan gündən
Yollar, təriqətlər, məsləklər ayrı...

Bəlkə buna görə biganəyik biz,
Bəlkə buna görə divanəyik biz?

Bəlkə buna görə ürəyi daşıq,
İnsanı insandan oğurlarmışıq!

Bir kiçik budağı qıranda rüzgar,
Budaq qan-yaş tökər, ağac qan ağlar.
Bir durna ayrılsa öz qatarından,
Qatar mənziləcən gedər pərişan.

Bəs bir durna qədər olmadıqmı biz?
Neçin buza döndü qaynar qəlbimiz?

Axı biz hamımız yaxın sirdaşıq,
Atabir, anabir doğma qardaşıq.

Eynidir havamız, suyumuz bizim,
Eyni torpaqdandır mayamız bizim,

Yoğurub yapanda xüqotimizi,
Eyni gözdə görüb təbiət bizi.

Heç kəsi heç kəsdən əskik etməyib,
Heç bir balasını ana atmayıb.

Sən ey qılınc çəkib, nahaq qan tökən,
Kimə qaldırırsan o qılıncı sən?

Seyr et, qarşındakı can sirdaşındır,
İnsandır, deməli qan qardaşındır,

Nədir bu azğınlıq, bu qudurğanlıq?
O qanlı səngəri seyr et bir anlıq.

Atanın qanıdur, axır dəmbədəm,
Düşmən sandığının sinələrindən.

Təbiət - o böyük ağ saçlı ata,
Bizi bəxş edəndə bu kainata,

Can verdi, qan verdi, qeyrət verdi o,
Bizə insaf verdi, mürvət verdi o.

Bizə əl verdi ki, imdada çataq,
Yıxılan bir kəsin qolundan tutaq.

Bizə ağıl verdi - vicdanlı, mətin,
Dərk edək dərdini bəşəriyyətin.

Sussun o ürək ki, buzdan soyuqdur,
Üzülsün o qol ki, yardımı yoxdur.

Kor olsun o göz ki, alovlanmaya,
Bir insan könlünə işıq salmaya.

İnsan dərdlərinə biganə insan
Quru bir kötükdür başdan, binadan.

Bu qoca dünyanın seyrinə sən gəl,
Təbiət nə qədər gözəl, mükəmməl...

Necə mehribandır çöldə çiçəklər,
Eyni səmtə əsir əsən küləklər.

Çöllərdə ceyranlar dəstəylə gedir,
Dənizdə ləpələr qol-qola verir.

Yeddi qardaş ulduz - işıqlı, iri,
Hələ bircə dəfə küsməyib biri.

İnsan da dünyada - bir çiçək, bir quş,
Onun da xilqəti belə saf olmuş.

Bəs hardan yarandı ikitirəlik?
Haçan zəhərləndi bu qan, bu ilik?

Nədir bu canilik, bu ölüm, bu qan?
Biz ki təmiz idik başdan, binadan.

Sən ey mələk qədər müqəddəs insan,
Ey adı günəşlə qoşa dayanan!

Neçin mələk ikən tblisə döndün,
Qızıl günəş ikən qaraldın, söndün?

Zülmətə çevrildin, sən bir nur ikən,
Bataqlıq yaratdın, saf, büllur ikən.

Dünyaya od-alov tökürsən bu gün,
Dünən qurdugunu sökürsən bu gün.

Göydə ulduzlara sığal çəkirsən,
Fəqət yer üstündə zindan tikirsən.

Baxıram əynində təzə paltara,
Zahirin parlaqdır, batinin qara.

Başında kamalın, biliyin də var,
Daha dəhşətlidir bilikli xunxar!

Biliksiz olmağın bəlası birdir,
Bilikli canilik daha betərdir.

Hansı mərtəbəyə gör çatıb bəşər:
Silahlanıb fitnə, yaraqlanıb şər.

Boynunda qalstuk, əlində silah,
İnsan qiyafəli yırtıcı timsah!

Üzdə mədh eləyir mədəniyyəti,
Ancaq batindəsə fikri, niyyəti

Dağıtmaq, qopartmaq, parçalamaqdır,
Sözü ipək kimi, dişi - bıçaqdır.

Gecələr dalıram gur şəhərlərə,
Gecələr bənzəyir al səhərlərə.

Heyhat, göz güldürən bu işıq, bu nur
Onun silahında ölüm, qan olur.

Deyin, bununçünmü Edison məgər,
Əlləşdi, vuruşdu uzun gecələr?

Gözünün nurunu o gilə-gilə,
Əridib axıtdı bir cüt naqilə.

Düşündü: insana bu, bir köməkdir,
İnsan işıq görüb sevinəcəkdir.

Axacaq ürəyə, idraka işıq,
Bəs niyə nigaran, naçar qalmışıq?

Siz ey yer üzünə ölüm yayanlar,
Zərif duyğuları tapdalayanlar!

Siz ey müstəmləkə havadarları,
Dünyanın "mədəni" canavarları!

Yurdları qurd kimi qamarlayanlar,
Dünyanı min yerdən hasarlayanlar!

Raketlə, tankla, topla, tüfənglə,
Cılız bir ürəklə, dar bir diləklə.

Bu böyük dünyanı tikələyənlər,
İnsanlıq adını ləkələyənlər!

Bilik sizin üçün fitnədir yalnız,
İşığı bəbəkdən qoparırsınız.

Baxıram dünyanın xəritəsinə,
Bu başı bəlalı Yer kürəsinə.

Dünya zolaq-zolaq, dilim-dilimdir,
Çeynənən sərhədlər didim-didimdir.

Nə qədər çəpərlər, nə qədər mərzlər.
Mərz üstə mənasız mübarizələr.

Viran Hirosima, ölüm sükutu,
İyirminci əsrin nəhəng tabutu!

Hələ dəryalarca insan qəmləri,
Daxau, Buhenvald cəhənnəmləri!

Hələ canilərin çoxusu diri,
Hələ Əhrimənlər, Hitlerlər sağdır.

Bəs hansı qüdrətin polad əlləri
Onları dünyadan qoparacaqdır?!

Neçin tərlan kimi havalanmayaq?
Bütün Yer üzünü Vətən sanmayaq?

Qınına çəkmiş tısbağa kimi
Yaşamaq insana eyib deyilmi?

Gözləri nə qədər dardı onlaraı –
Bir qarış yer üstə boğuşanların!

Bir anlıq əl saxla, düşün, ey insan,
Axı nədən ötrü vurhavurdasan?

Bir bax ətrafına, gör dünya nədir?
Sonu görünməyən bir xəzinədir.

Nə zəngin yaranmış ana təbiət,
Torpaqda səxavət, suda səxavət.

Almalı, armudlu bu bağlar sənin,
Səadət qaynaqlı bulaqlar sənin.

Gör dünya səninçin nələr saxlayır:
Daşlar öz bağrında gövhər saxlayır.

Səninidir ağ saçlı şəlalələr də,
Gözləri al çanaq, tər lalələr də.

Sağımız, solumuz gümüşdür, zərdir,
Dünyanın sərvəti dünya qədərdir.

Tamah cilovunu biz yığsaq əgər,
Bu sərvət, bu nemət hamıya yetər.

Yalnız əmək görək, halal bir əmək,
Zəhmət haləsilə əhatələnək!

Dan üzü quşlarla birgə oyanmaq,
Dəryaz çala-çala şehdə yuyunmaq.

Gözəldir arxlarda şırıldayan su,
Kətan parıltısı, torpaq qoxusu.

Gözəldir baharın bağ çiçəkləri,
Sevgili nəfəsi - dağ çiçəkləri!

Zəmilər qoynunda xəyala dalmaq,
Çörəyin ətrini sünbüldən almaq!

Dalıb üfqüqlərin sonsuzluğuna,
Qışqırmaq bu eşqi bütün cahana.

- İnsan Yer üzünün dürdanəsidir,
İnsanın Vətəni Yer kürəsidir

Yalançı sərhədlər silinsin görək,
Ərzin bütövlüyü bilinsin gərək!

Oyanır Afrika, qalxır fil kimi,
Alıb xortumuna cırtdan hakimi,

Çalır qayalara, çırpır daşlara,
Alqış zülm əlindən qurtulmuşlara!

Nilin əzəməti onun səsində,
Azadlıq eşqi var əsrin səsində!

Oyanıb yuxudan Təbrizim mənim,
Yatmır Şəhrizadım, əzizim mənim.

Azadlıq deyirdik. Azadlıq hələ -
Həyatda bizimçin birinci pillə.

Hələ göy üzündə neçə sarhəd var,
Açsın əsrarını aylar, ulduzlar.

Bizə Yer kürəsi dar bir qəfəsdir,
Yetər bu qəfəsdə yaşamaq. Bəsdir!

Qalxaq ulduzlara, aylara qalxaq,
Dünyaya uca bir zirvədən baxaq.

Kainat insanın uçuş meydanı,
İnsan - kainatın zəka tərlanı.

Buludlar - açılan qanadlarımız,,
Kəhkəşan - ucalıq iqtidarımız...

Heyf, bu mətləbi bilməyənlər var,
İnsan harayına gəlməyənlər var.

Hələ gör nə qədər yetim-yesirlər
Şaxtada titrəşir, qarda əsirlər.

Qolları qandallı igidlər min-min,
Gəmirir daşını dar məhbəslərin.

Hələ fitnə-fəsad qovulmamışdır,
Zalimlərin burnu ovulmamışdır.

Hələ neçə xəyal ələk-fələkdir,
Ən böyük dərd isə biganəlikdir.

Bizim qəlblərimiz birləşsə əgər,
İnsan hər ulduzdan parlaq görünər!

Birləşsə cahanda milyard ürəklər,
Bütün arzulara yetişər bəşər!

# PƏRİ

Ey kəndli bacım, konül çırağı,
Şadlıq gətirən gülün budağı,
Qəlbim üzünün xətində şeyda,
Bunlarla lətafətin hüvəyda.
Nazınla adın pəri misaldır,
Mənan da, sözün də dildə baldır.
Ey nazlı pərivəş, ey gur ilham,
Özgə nə deyim, sənə nə cür nam?
Bənzər bu adın uca səmaya,
Bəh-bəh, tapılarmı misli, aya?
Gül əkdi atan, anan doğub gül,
Bar verdi bu nəslinin bağı gül.
Əslin elə safdı - nadir inci,
Sənsən çırağı, gözü, sevinci.
Gül dəstəsitək bəzəkli, gülgün,
Məktəb yolunu gedirsən hər gün.
Çıxdınmı, günəş doğur o andan,
Bir kölgə düşür saçından əlan.
Gizli pərilər halay vurunca,
Ay halədə bənzəyir turunca.
Gül ətri deyir ki, kölgə sallam,
Şümşad deyir - gözətçi qallam.
Nur saçmalıdır bu nazü qəmzən,
Paklıqla həyadır uzdə pərdən.
Sən evdə sevimli gülsən, ancaq,
Məktəbdə bənövşəsən, utancaq.
İlham bağımın baharı sənsən,
Şerin uca şahkarı sənsən.
Saptək keçib iynənin gözündən,
Yırtdın donunu gülün, gülüm, sən.
İşçi qızıtək əməllərin var,
Ev marşına bax, o oldu sərdar.
Gül nəqşi yaratdığm bu tikmən,
Şerindi və varlığmdı hökmən.
Quştək ki uçar əlində millər,

Çağlar ipəyin dilində millər.
Ol razü niyaz ki, bir soraqdır,
Zülfündə gəzən qızıl daraqdır.
Çöhrəndi səadətin baharı,
Zülfünsə - qaranquşu, əyan.
Kuyin əbədi behiştdi, vallah,
Ancaq pəriyə yetişdi, vallah.
Ulduzlara cüt bacı gözündür,
Dərya qızının tacı gözundür.
Zülfün tacı şahpalıdla həmrəng,
Bir cüt qanada olub həmahəng.
Bu möcüzü görməyib xəlayiq,
Ol tuti və hümayə layiq.
Qıvrım hörüyünlə durna boynun,
Salmış yada quyla dalğa oynun.
Yumcaq dilini o qönçə, bişək,
Dərhal gələcək bu, "Şəbçıraq"tək.
Xətrin ürəyəyatan şerdir,
Ay batil olar, məgər sehirdir?
Bir yaz günüdür - nazın, qaçır qış,
Keçdikcə o, qönçələr açılmış,
Tubadı boyun, özün firiştə,
Olsan harada dönür behiştə.
Hər yerdə ki şux lətafətin var,
Ölməz camalındı bil səbəbkar.
Nəğmən can evində zəng çalandır,
Bir sazdı, lətif, ürək alandır.
Sərvin fidanı, bağın vurur bərq,
İlhamıma, veribdi rövnəq.
Ol gül ki, nisaın olmalıydı,
Bil ki, Şəhriyarın olmalıydı.
Əfsus ki, təbim deyildi yüksək,
Yazdım bunu, çox zəifdi gerçək.
Pak gövhərin ilki öz atandır,
Saf cövhəri bil ki, öz atandır.
Azər elı çün kərəmdə təkdi,
Ondan Dəri torpağında əkdi.

Sirlərlə dolu səfa yerindən –
Təbriz dağının ətəklərindən.
Bir dağ ətəyi ki, o diyarda
Cadu sarayı, behişt də orda.
Yaz göytüyü orda filmə bənzər,
Lakin payızı əsil qızıl, zər.
İlhamla həyat bulağı orda,
Zövqün beşiyi düşüb o yurda.
Saxlardı düha xəzinəsin o,
Qoymazdı çıxa uca, səsin o.
Ol pak anada olan lətafət
Saxlamış idi ərə əmanət.
Pak adla ki yüksəlirdi bir vəqt,
Tapdıqca zəminə, tapdı şöhrət.
Hər il budağında gözlənən bər,
Bir meyvə idi - sədəfdə gövhər.
Xurma ilə sərv olunca peyvənd,
Şaxlar uca oldu; meyvəsi qənd.
Hər bir bulağı təbii halla
Göstərmədə cilveyi-təcəlla.
Bu, lütfi-təbin yaratdığı pay,
O, zövq verən saz ilə həmtay.
Bu, nəğmə qoşar, təbi rəvandır,
O1 məşqsiz ərğənun çalandır.
Burda ah ilə şikayət olmuş,
Orda gözə şölə-ayət olmuş.
Qaşın kamanı çatıldı burda,
Zülfü oxusa atıldı orda.
Söz ustası Vərzi-fəxri-Şiraz,
Huşəng şəkərilə - fəxri-Əhvaz.
Var bunda şəkər, düşüb bəyanə,
Onda ürəyə yatan təranə.
Hər don geyinərsə dilbərim, bil,
Mütləq tanıram ki, doğmadır dil.
Vərzi böyüyündü, qardaşındı,
Gövhərdir o da, üzük qaşındı.
Saf gövhərini görüb ilahi,

Şair təbini verib ilahi.
Çaldıqca mələk, o da həmahəng,
Sözlə ürəyi çalır, sanıb çəng.
Eşqi sazının burur qulağın,
Şeri - əbədiyyətin bulağı.
Oğlandakı gül nə safdı, yarəb?
Bu, gül ki deyil, sərabdı, yarəb?
Əks olmadadır- gözündə dərya,
Fikrində qərar tutubdu dünya.
Beynində aşıb-daşır şərarə,
Dünya baxışında min səyyarə.
İlhamı doğub mətinliyindən,
Qorxmaz özü haq çətinliyindən.
Zövqün gözəli ad almış, əhsən,
İlham pərimin bəkarətindən.
Hər cadusu, sehri, sirri vardır,
Ölməz, ulu dildə aşikardır,
O, bir pəridir, gülab məkanı,
Təmsil eləyir ürəklə canı.
Təriflərinin əşası vardır,
Hüsnünlə onun qiyası vardır.
İncindi, həm ulduzun – nəsihət,
Qiymətlidi sırğadan fəzilət.
Məktəbdə çalış sən elmi öyrən,
İşlətsən onu evində, əhsən!
Öyrən sənə vacib olsa hur dərs,
Öyrən qadının işi nədir məhz.
Öyrən analıq işin, ol evdar,
Gəl getmə, idarədə ziyan var.
Qızçın bu da az olur müyəssər;
Seçsin özünə ər oğlu bir ər.
Qız xeylağı qönçədən açılcaq,
Saf inciyə bənzəyər o, parlaq.
Görmüşsə həyatda təkcə nöqsan,
Qəlp gövhər olar, nəinki insan.
Bir sadə misal da söyləyək biz:
Ağ dəftərə bənzəyir zərif qız.

Ağ olsa əgər kağızla dəftər,
Layiqli yazı olar müyəssər.
Vardır yazı, yaxşıdan-yamandan,
Keçmiş daha yaxşıdan, yamandan.
Səy et, salasan, gülüm, gözəl xət,
Ta çəkməyəsən pozanda zillət.
Layiqli əməldi səhvi anmaq,
Lakin əzabı olurmu danmaq?
Bir gənc qız üçün qüruru sonda
Dibsiz quyuya donür yolunda.
Hər kim pula, hiyləyə qoşar baş,
Quldurlara uğrayar o, birbaş.
Zövqün çırağıyla sən işıq saç,
Axtardığm ali haqqa yol aç.
Gəl, yolda unutma ehtiyatı,
Tut əldə əsa, verər nicatı.
Hər sərv ağacı sənə ər olmaz,
Hər baş da cahanda sərvər olmaz.
Vardır çoxu ki, tanınmır andır,
Güldürsə üzü, içi tikandır.
Üzdə yaranan gözəllik azdır,
Bir gəldi-gedər sutək dayazdır.
Ol hüsn əbədi və cavidandır –
Lütfilə lətafəti nihandır.
Ruhən doğulan parıltı, rövnəq,
Zahirdə verir büruzə, mütləq.
Həqdən nur alıbsa ruh, o aşkar
Öz cilvəsini üzə bağışlar.
Yoxdur bu gözəlliyin zavalı,
Solmaz əbədi gülən camalı.
Burdan yaranıbdı zövqün ilki,
Hər sarvətin öz əsası, bil ki.
Ancaq odu "Şəbçırağ"a varlıq,
Etməkdədir eşqə hökmüdarlıq.
Həssas yeri - nəbzidir həyatın,
Həm cilvəsidir o, pak zatın.

Ondan can alıb çapır öz atın,
Hər zərrəsi var bu kainatın.
Güc mərkəzidir o, kəhrəbanın,
Gülzarıdı hüsnü dilrübanın.
Gah bir gözəlin gözündə parlar,
Gah cəzbə dönüb ürəkdə çarpar.
Hüsnün odu gah işıq saçar, şən,
Eşq atəşi tək yaxar da bəzən.
İnsan xəmirindədir o fitrət,
Bimayə xəmir fətirdir əlbət.
Görmüşsə ürək həyat səfasın,
Haqdan nur alıb saçar ziyasın.
Zövq ilə keçərsə xoşdu sevda,
Canlar qovuşarsa, nuşdu sevda.
Zövq ilə hünərdir ömrün əsli,
Puçdur qalanı, bu - yaz nəfəsli.
Zövq olsa taparsan övliyalıq,
Bir də təbiətlə aşinalıq.
Şeir ilə bu musiqi cahanmış,
Yoltək əbədiyyətə uzanmış.
Tut şeri, kədərlə gəl vidalaş,
Tapsın səni ol, vəfalı sirdaş.
Allah nuru parlamazsa qəlbdə,
Tapmaz yolunu nicata qəlb də.
Dünyada nə var həyat üçündür,
Allah deyilən büsat üçündür.
Məktəbdi bizə bu zövq, bu nəşə,
Allahı tanıtdırar həmişə.
Ol şəxs ölümə gülər, sınaqdan
Cürətlə çıxıb qazansın ad-san.
Əzbərləməsən ilahi dərsi,
Seçməz şüurun avandı, tərsi.
Vardır çoxu, anlamır, zəmanə
Zindandır ona, ömür bəhanə.
Əflakə tərəf dilərsən uçmaq,
Eşqin qanadıyla uç sən ancaq.

Zövq olmasa, yox hünərdə qüvvət,
Əfsus, hər hünərdə yox bu nemət.
Axtarma səfanı bihünərdə,
Şər çöl də məgər dəyərmi dərdə?
Vermə ürəyi, əmanətindir!
Allahsız ilə həyat çətindir!
Yazıqsan, əgər bəyəndiyin ər
Qəlbən kor ola, ağılca bitər.
Get zövqü səfaya doğru yalnız,
Hərçənd bular tapılmır, ay qız.
Bax, haq yolu xudpəsəndlər azmış,
Sev Allahı, qisməti o yazmış.
Qandan, qadadan keçib gətirsin,
Allah səni arzuna yetirsin.
Sanma gecəni nahaq buraxdım,
Əfsanə deməklə keçdi vaxtım.
Dağlar ağarırsa sübh gözündə,
Şamım də oyaqdı, mən özüm də.
Bir şam ki, odu qapar çıraqdan,
Bənzər o gözə - axır bayaqdan.
Mən guşənişinəm, əhli-zöhdəm,
Bəs mənlə neçindi fikrin həmdəm?
Mən ki belə küsmüşəm cahandan,
Neyçün xəyalın olub mənə can?
Saysaq gecənin girovu xabdır,
Yuxsuzluğumuz hara hesabdır?
Sənsiz olaramsa, ey gül, əlhaqq,
Ollam o dəm Allah ilə ancaq.
Qəlbim sənə arzular səadət,
Şerim də edir buna şəhadət.
Dövrün pərisi, amandı, barı,
Düşsün fələyin sənə baharı.
Dünyada əgər kama çatarsan,
Xoşbəxtlik oxun demək atarsan.
Ömrün uzun olsa, gör həyatı,
Bir dəfə oxu bu xatiratı.

Xatırla ki, yatmadım gecə, çün
Əfsanə dedim, qala səninçün.
Sidqilə dedim göyə, a kəklik,
Tanrım sənə eyləsin köməklik.
Xidmətlərimi o dəmdə yad et,
Köçmüşsəm əgər, bu ruhu şad et.

## NİŞABURDA

Dostlarım düşdü uzaq, getdi Vətən,
Qaldı bir xəstə ürək, xəstə bədən.
Düşmüşəm bir yerə - yoxdur bir adam,
Olsa da gərçi, vilayətdə yadam.
Nə qədər varsa kasıb - oğru, rəzil,
Hökm edir varlı da zülm ilə: əzil!
Lotuluqla qoçuluq "şanlı" əməl,
Bitirib qəın çölü kor ilə keçəl.
İsməti, canı sayırlar əsil ov,
Özü öz qollarına canlı buxov.
Hamı arsız və xeyirsiz, gücü az,
Amma xəncərlə bıçaq vurmağa saz.
Badə pulsuzsa, olur badəpərəst,
Badə olmazsa, olur qan ilə məst.
Çoxunun geyməyə yox şalvarı, bax,
Lakin hazırdı qılınc ilə bıçaq.
Bilməyirlər nədi ya qazıxana,
Uğrayırlar ya da itoynadana.
Hər yan avarəçilikdir, lotuluq,
Hələ min fitnə-fəsaddan da boluq.
Tiryəki, şireyidir bir parası,
Qamazlıq qurudub, yox çarası.
Hərənin qəsdi ölümdür özünə,
Bənzəyir iblisə, baxsan üzünə.
Hamının evləri dar zirzəmidir,
"Ev"ə, "evdar"a ürək nifrət edir!
Nurludur, gendi qarışqa yuvası,
Buradan xoşdu məzarın havası.
His tutan dər-divan sanki yanıb,
O, qəmin palçığı ilə suvarıb.
Döşəmə yoxdu, kəsif torpağı var,
O rütubətli gilin göz dağı var.
Zöhrənin yox günəşi, dam qarışıq,
Qazmanın daxilinə salsın işıq.
Bu lal, iflic, bu çolaq, kor nə demək?

Öldürürlər sağ ikən gordakıları!
O rütubəli çuxur yerdə, aman!
Torpağın cövhəridir, vermədə can!
Dəhlizin kərpici dibdən başadək,
Qaradır zağlı kömür parçasıtək.
Nəzər et burdakı ölgün şama bir,
Qəbrin üstündə yanan şam kimidir.
Qazmalardan ucalan tüstü bu an
Elə bil gürzədi, qalxır yuvadan.
Burulan tüstü ilandır deyəsən,
Xəlqi də çalmış o andır, deyəsən!
Əlqərəz, sirli bir aləmdi bura,
Adı məşhur o cəhənnəmdi bura.
Ürəyə nur çiləyən vadiyə heyf!
Dil "Fərəhbəxş"ə gərəkdir deyə: heyf!
Geyinib göy donunu dağ, dərə, düz,
Al-yaşıldır ora başdan-başa, süz.
Qəlbə şadlıq gətirir sübhün üzü,
Küləyin ətri açır könlümüzü.
O tukənməz, o əziz nemətin, ah,
Bilməmək qədrini ən ali günah.
Şəhər ətrafı verir ruha cila,
Şəhərin daxili möhnətdi, bəla.
Şəhri viranəlik atmış bir oda,
Görə bilməz onu düşmən yuxuda.
Axı yarəb, nə günah işləmişəm,
Qəzəbinlə belə bir dərdə düşəm?!
Niyə xarlıq gülə üzağlığmıa?
Qıyma gəl, burdakı dustaqlığıma!
Bir yerin Mücrüm isə qibləgası,
Bəndənin orda hünərdir günahı.
Nə deyim, bircə günahımdı-hünər,
Yoxdu "təqsir" daha bundan da betər.
Deyiləmsə mən özüm əhli-ədəb,
Bağlıdır onlara sinəmdəki qəlb.
O qədər onlara sadiqdir ürək,
Tanıyır varlığımı göydə fələk.

O zamandan mənə düşmən kəsilib,
Bu cavan canıma qan-qan kəsilib.
Hər kəs ağlıyla edər düşməni mat,
Ağlım olmuş mənə düşmən, heyhat!
Bu zəkadan nə ziyan çəkmədi baş?
Qanmayaydım, ulu tanrım, daha kaş!
Xoş olar fəhlə, ya hammal olasan,
Başı boş, lüt, özü də mal olasan.
Qoymaya kimsə qəmə, şadlığa fərq,
Ya da bərbad ilə abadlığa fərq.
Kəndlinin ömrü xoş, aram ürəyi,
Kəndlinin ömrü - halallıq küləyi.
Nəyə lazım ayıra dal-qabağı?
Niyə seçsin sol əli, ya ki, sağı?
Qəm ilə şadlığa biganədir o,
El qəmi bir yana, bir yanədir o.
Bolluğa, dincliyə dalmaq işidir,
Ləkələnməkdən uzaq bir kişidir.
Nə rüsumat, görüş ardınca qoşur,
Nə mənim tək sənət eşqilə coşur.
Nə sevir gündə boyunluq ağ ola,
Ütülü şalvarı dümdüz, cağ ola.
Nə bilir qar kimi köynək, kravat?
Qaloşa, getrə həvəs zövqünə yad.
Nə tanışlıq, nə yalaqlıqdır işi,
Sünilikdən uzaq olmuş gülüşü.
Qeydü şərtin o, giriftarı deyil,
Əmrü Zeydə nə qul olmuş, nə veyil.
Başda yoxdursa əgər bir papağı,
Fikri də yoxdu və dincdir qulağı.
Yığıla yüz mamaça, hey dolana,
Düşəcəkdir yenə də güc doğana.
Ümmileyli deyil Afaq, deyə, mən
İstərəm müfləq ipək çadra, jupən.
Nə sevir boynuna taxsın kəpənək,
Nə də sevmir alaqarson, ya bəzək.
Saysalar da bu işi bir dəlilik,

Eybi yox, var bu cünunluqda bilik.
Görünən hər şeyi təqlid nə gərək?
Nökər olsaq da, olaq eşqə gərək.
Nəyə lazım sürülən süni ömür?
Gəl, ömür karvanını sidq ilə sür.
Qanmazın ömrü keçir keyf ilə, şən,
Düşünən insan olur dərdi çəkən.
Bəlli, artdıqca zəka, gün qaralar,
Ürəyi min cürə neştər yaralar.
Artsa elm ilə bəsirət kökü, bil,
Artacaq canda əzabın yükü, bil.
Bədənin ağrısı can ağrısımı?
Yox əzizim, o, şədid dağ basımı.
Xalvar ilən bədənə gəlsə də dərd,
Səy edir misqal ilə tərk edə dərd,
Azalarsa birinin hissi, yəqin,
Qurtarar zəhməti canın, ürəyin.
Canın artarsa əzabı, o zaman
Artacaq hissi də şiddətlə haman.
Dözə bilsə ona hər kim kişitək,
Bu əzablar onu öldürməyəcək.
Nə qədər artsa əzab, azdı, ya çox,
Bu yolun "öldüsü var, döndüsü yox!".
Ya bu dünyada özün qayda yarat,
Ya da əl çək, əbədi bir yana at.
Yoxdu bir kəs bu cahandan ala kam,
Varsa, öz hissinə biganədi tam.
Bilməyincə bu cahan eşqini, bil,
Tanımaq kimsəyə mümkün də deyil.
Bu cahan bəslər ikən kibr ilə qəm,
Kar olaydıq, kor olaydıq, deyirəm.
Göz görür, qəlb əriyir, yaş süzülür,
Gəmirir qurd kimi qəm, can üzülür!

## *QƏSİDƏLƏR*

### HƏYAT

Əzəl gündən bu dünya nemət dolu dəstərxan,
Mən ki, tamah əlimi çoxdan çəkmişəm ondan.
Fələk qara kasadan nə pay vermişdir mənə,
Bu dünya gözlərimdə qaralmışdır hər zaman.
Bir ömürlük göz yaşı axıtmışam aləmə,
Göz yaşı dəryasında dəhşətdir qopsa tufan.
Saçının kölgəsini üstümə sal, ey ölüm,
Nə vaxtacan bu həyat olacaq mənə zindan.
Karxanalar, mədənlər naləsinə qulaq as,
Göylərədək ucalır yerdən qalxan bu fəğan.
Dünyaya göz açanda, uşaq şivən qoparır,
Cəhənnəmi görəntək, fəryad qoparır insan.
Ölum ilə ölümün arası səfər yolu,
Müsafir xurcununda qəmdir, bir də ki, hicran.
Dərdə tablaşmır ürək, döyüşdə əldən düşür,
Elm, ürfan, mərifət tamam hədyandır, hədyan.
Eşqin qoca təbibi itirmiş öz başını,
Çox gəzmiş, dərdimizə tapmamış hələ dərman.
Yatağımın başında oturmadı Nuh kimi,
Gəmisi göz yaşımda tufana düşən zaman.
Ölümlə əlbəyaxa vuruşmaqdır bu həyat,
Bu fəlakət içində necə tab eyləyər can?
İkinci cəhənnəmə nə ehtiyac varımış,
Bu həyat başdan-başa cəhənnəm imiş, inan!
Bu şerə gözlərim sataşan zaman,
Utandım həyatm şərəf-şanından.
Dedim ki, nankərsan, duz-çörək yedin,
Həyat süfrəsində sındı nəməkdan.
Əgər yüksəlişə səndə həvəs yox,
Nöqsan özündədir, özündə, inan.

Həyatla ey könül, əhdin var - dedim,
Abad gördüyünə söylmə viran.
İnsan zəkalısa, baxıb görər ki,
Həyat başdan-başa elmdir, ürfan.
Həyat dənizində eşq qəvvası ol,
Oradan çıxarsan əlində mərcan.
Çətinlik kamala aparır səni,
Həyat imtahandır, böyük imtahan.
Xızrtək zülmətə qatlaşsan əgər,
Dirilik suyunu onda taparsan.
Ömrü zəhrləyən qara ölüm də,
Həyatı özünə seçmişdir məkan.
Heyatın qədrini bildi Şəhriyar,
Həyata şairin canı da qurban.

## ATAMIN MATƏMİNDƏ

Yalqız qoyub gedən məni, ey bixəbər ata!
Getdin özün, məni elədin bipədər, ata.

Ey can verən vətəndə, ölən bir qəribtək,
Yandırdı qəlbimi bu ələm, bu kədər, ata!

Sandım əsa olum sənə, ancaq nə faidə,
Düşdüm özüm də batlağa, bilsən əgər, ata!

Ey bizləri yetim qoyub, kimsəsiz qalan,
Xoş getdin, ay ata, səfərin bixətər, ata!

Gizlin baxım camalına qoy bir də son kərə,
Artıq bu son səfərdi, ağır bir səfər, ata!

Qəlbin qanıyla bəsləyən ey bağban məni,
Dünyada görməyən əməyindən səmər ata.

Oğlundan ötrü eyləmiş əğyar tənələr,
Sarsıtdı bəlkə qəlbini bu tənələr, ata.

Əfsus, qafil imişəm aləmdə gör necə,
Heç bilmədim gəlibdir atamdan xəbər, ata!

Sən rəhmdil, vəfalı, sən əhli-güzəşt idin,
Əfv et məni, bu olsa müyəssər əgər, ata.

Səbrim, mətanətim dağ ola, sındırar qəmin,
Bu ayrılıq dağın qıracaqdır kəmər, ata!

Tək mən deyil ki, əhli-hünər bipədər qalıb,
Millət qalıb, bu yerdə, inan, bipədər, ata.

Söylə, necə dönüm evə bir gün bu qəmlə mən,
Səndən o evdə görməyim heç bir əsər, ata?
Mən qalmışam, ümid qalıb, bir də dərdü qəm,
Onlar da oldu puç, qəmində hədər, ata.

Getdin özün, nə etməli, tufani-ruzgar
Etdi bu xanimanımı zirü zəbər, ata.

Söndün səhər güləndə sən, ey sübhün ülkəri,
Açdın mələk kimi göyə sən balü pər, ata.

Ömründə şamtək yanıb, axırda həmnəfəs
Oldu səhər sənə, bu nəsimi-səhər, ata.

Öldün özün, ürəkdə adın daima yaşar,
Çəkdim qəmində gər biləsən mən nələr, ata!

## ƏZİZ AZƏRBAYCANIMA XİTAB

Fədakarlıq günüdür qalx, anam Azərbaycan!
Əbədiyyət beşiyi, ölümsüz bir cahansan.
Ey min-min balalara sinə gərib, mərd duran,
Ey düşmənlər önündə qaya kimi sərt duran.
Ömrünü, taleyini bəxş edən tufanlara,
Ahm dağlara düşsün, göz yaşm dumanlara.
Ey məhəbbət, ey ülfət məskəni məğrur Vətən!

Gözü yolda, yaralı, həsrət anam da sənsən.
Qolumun zəncirləri nə vaxt parçalanacaq,
Həsrətinlə çırpınan körpə uşağaın, uşaq!
Yuvası yetim qalan bir qanadsız quşam mən,
İsti ana köksünü arzularam ürəkdən.
Azadlıq müjdəsini alır hər yer, hər məkan,
Sən başı bəlalısan elə başdan, binadan.
Qorudun başla, canla ellərin iqbalım,
Qorudun bir ər kimi İran istiqlalını.
Səninlə düşmən kimi dolandı dostlar belə,
Bəlkə düşmən də belə etməzdi düşmənilə.
Sən qiymətli, ləkəsiz, saf büllursan, incisən,
Özgədən yox, ey Vətən, öz özündən inci sən.
Ayırmaq mümkün olar əlbət qoyunu qurddan,
Qurd çoban geyimində, sən necə ayırasan?
Arpa verib əlindən xərmənini qapdılar,
Ağanın tövləsindən sənə çörək yapdılar.
Həyatı, keçmişiylə oynayırlar millətin,
Sənin kimi igidlə fəqət bacarmaq çətin.
Səni yaxşı tanıyır dost da, düşmən də ancaq,
Ədalətin yolunda millət yenə qalxacaq.
Ürək qanilə yazdın tarixlərə dərdini,
Dünyaya nişan verib tarixlər də dərdini.
Zərdüştlər beşiyisən, mərddir sənin övladın,
Hər yerdə mərd tanınır, igid tanınır adın.
Sənsiz başsız qalardı, bikəs olardı İran,
Canısan bu diyanın, belə can sənə qurban!
İranın igid oğlu, bir xələf övladısan,
Qəlbin azər, yenilməz şöhrətin Azəristan.
Sən elə bir oğulsan, ad-sanın dastanlara
Sığışmamış, sığışmaz gələcək zamanlara.
Dağların gərdəninə incidən boyunbağı,
Meşələrin, çöllərin əlvan gəlin otağı.
Qafilələr vurulur sənə Qaflan dağından,
Gələn hər bir qonağın olur hüsnünə heyran.
Sənin çarpaz yolların - sonsuz bir karvan yolu,

Ulduzlu səmaların uca kəhkəşan yolu.
Sən bu əziz torpağın ürəyisən, ağlısan,
Kürünlə, Arazınla bu dünyaya bağlısan.
Nə hədisə yerləşir, nə bəyana qüdrətin,
Dözümlüdür, mətindir, əyilməzdir millətin.
Təbiətin, torpağın necə ürək açandır,
Gülüstanın, gülşənin min bir ətir saçandır.
Buruq-buruq yolların hər gün sənə can verir,
Min illərdir bu yollar ürəyinə qan verir.
Bu çarpaz yollarında ucalan karvan səsi,
Bir zaman harayıdır, bu sonsuz cahan səsi,
Zəngin qəlbin, ürəyin, zəngin bazarların var,
Tacirlərin dünyaya səni qəni tanıdar.
Təbiətin nə gözəl, göylərin necə əngin,
Tarlaların da zəngin, mədənlərin də zəngin.
Harda belə qəlb açan, göz oxşayan günəş var?
Harda belə dumduru, ulduzludur səmalar?
Bir oyaq gözətçidir şiş papaqlı dağların,
Zümrüd geyir həmişə ürək açan bağların.
Çiçəklidir, güllüdür saysız, sonsuz yamaclar,
Çiçək kimi səpilib meşələrə turaclar.
Çaylar əjdaha kimi dağa, daşa sarılır,
Dağların yarğanında düşmən bağrı yarılır.
Dalğalanan zəmilər bir dəryaır elə bil,
Düzlərin gözəlliyi bir röyadır elə bil.
Hər qayanın altında acıqlı aslan yatır,
Sənin ana köksündə yenilməz cahan yatır.
Xəzinədir, xəzinə sənin qoynun, qucağın,
Cəvahirat yatağı sənin hər bir bucağın.
Odun düşmən yandıran, bulağın ürək açan,
Şerin dan ulduzutək dünyaya işıq saçan.
Qeyrət beşiyimizsən halal torpağınla sən,
Tarixə yaraşıqsan zəhmət dayağınla sən.
Məğrurdur dağlarıntək igidlərin, ərlərin,
Həm qılıncı ildırm, həm də kamalı dərin.
Sənin qadınlarının əl çatmazdır isməti,
Ulduzlara bənzəyir qızların əzəməti.
Top kimi körpələrin qızılgül yanaqlıdır,
Halal süd əmdiyindən şəkər, bal dodaqlıdır.

Odludur, alovludur kişilərin qeyrəti,
Dəyişməzdir, dönməzdir onların məhəbbəti.
Oğulların, ərlərin dosta mehribandılar,
Vuruşlarda əyilməz, dönməz qəhrəmandılar.
Kəndlilərin orağı Rüstəmin kamanıdır,
Öz əlinin zəhməti bəxtinin həyanıdır.
Fəhlə günəş çıxmamış belini işə bağlar,
Coşğun təbiətlidir, coşğun çay kimi çağlar.
İşçilər günəş kimi səhər qalxacaq erkən,
Günəşdən tez oyanır, qalxırsan, ana Vətən.
İti nizəyə bənzər alimlərin qələmi,
Qılıncın öz aləmi, qələmin öz aləmi.
Talvarda meynələrin dar ağacı ipi tək,
Çeşmələrin tökülən qanlara bənzər gerçək.
Gün çıxandan ürəktək çarpar mənim Vətənim,
Ürəyi bir, sözü bir, arzusu bir gülşənim.
Sənin qızıl torpağın, sənin qızıl əllərin,
Şerdə, sənətdə də tanınmışdır əllərin.
Şumlanmış başdan-başa hər bir qarış torpağın,
Ürək açar, göz oxşar sənin yaşıl növrağın.
Azərbaycan igidlər, qəhrəmanlar yetirir,
Bu təbiət, bu torpaq mərd insanlar bitirir.
Sarılıq, natavanlıq Reyin öz dastanıdır,
Səlamətlik, təravət Təbriz ərməğanıdır.
Bizim palıdlarımız kəmənd atır Pərvinə,
Ay da, ulduz da düşər palıdın kəməndinə.
Nazlı səməndə bənzər, Səhənd ay doğan zaman,
Üzəngisi hilaldır, yəhərisə asiman.
Səpilmiş çöllər boyu qoyun-quzu sürüsü,
Rəşadətə səsləyir uzaqda at ilxısı.
Aslanın bağrın yarar onun pəhlivanları,
Zinətdir bu cahana igid, mərd insanları.
Qadınları şahsüvar, cəngavər, qəhrəmandır,
Döyüşlərdə ər kimi onlar düşmən yıxandır
Bu haman Təbrizdi ki, dəniztək ürəyi var,
Onu duşmən önündə sədd etmişdir ruzigar.

Bu haman Təbrizdi ki, inqilablar zamanı
Dünyaya bəxş eyləmiş ötməz, mərd Səttarxanı.
Bu haman Təbrizdi ki, cavanların qanından
Min-min lalə bitirir bu dünya görmüş Muğan.
Bu haman Təbrizdi ki, içmiş ürək qanını,
Tarixə bəxş eyləmiş igid Xiyabanini.

İranın tarixini odur qanıyla yazan,
Rəşadəti, mərdliyi vermiş dünyaya nişan.
Onun həssas qəlbi var, o azadə bir məkan,
Onun saf baxışları ürəyinə tərcüman.
Vətən eşqi yolunda imtahan vermişdir o,
Bu cahanın özünə bir cahan vermişdir o.
"Var olsun Azərbaycan" deyir dərdli Şəhriyar,
Var olsun bu dünyada, nə qədər ki, dünya var.

## SƏBA ÖLƏRMİ?

Sona çatmışmı cahan ömrü, Səbamız da ölür?!
Eşq atəşkədəsi, kani-vəfamız da ölür.

Çox əziz dağına səbr eyləmişəm aləmdə,
Buna yox səbrim, ilahi ki, Səbamız da ölür.

Kəfəni ah, gərək göz yaşı olsun qüsli,
Bu əziz ilə bizim zövqü səfamız da ölür.

Ey könül, qəmli bir ahəngilə qıl nalə bu gün
Ki, səni şad qılan nəğməsəramız da ölür.

Bir də Bilqeys Süleymanə yetirməz peyğam,
Xoş xəbər hüdhüdümüz, şəhri-Səbamız da ölür.

Ey könül, şam kimi yan, qətrə olub gözdən ax!
Hünərin son günəşi batdı, şüamız da ölür!

Haq görən göz daha yoxdurmu bu gün aləmdə?
Haqqı təbliğ edən ayati-xudamız da ölür.

Rəsmdir öldürür hər yerdə dəva dərdləri,
Bu necə dərd idi, ya rəb ki, dəvamız da ölür.

Yaşadırdı hünəriylə o, düha əhlimizi,
O gedir indi, bizim əhli-dühaımz da ölür.

Sənətin qumrusu Şahnazi, İbadi yaşasın
Ki, susub bülbülümüz, sövtü-sədamız da ölür.

Hanı Tehrani dəfi, harda Bənan avazı?
Ağlasınlar ki, nə ustad, xudamız da ölür.

Göndərin şurü nəva ilə ona xeyr-dua,
Bizi tərk etdi hünər, şurü nəvamız da ölür.
O hünər qibləsinə üz tutun, ey əhli-hünər,
Bivəfa çıxmaz o ustadə, vəfamız da ölür.

Soruşun siz, hünər əhlini boğan Tehrandan
Ki, nədəndir orada əqlü-zəkamız da ölür.

Əbədi ömr hünərsizlərə olmaz qismət,
Dərd odur ki, daha ölməz fuzəlamız da ölür.

Hünər əhlinə çəkibdir ölüm hər yerdə hücum,
Nə qədər vardır hünər əhli aramızda, ölür.

Ölməz insan olanın ölməsi bir dərd deyil,
Ölməyə qalsa əgər, şahü gədamız da ölür.

Lakin hər yerdə ki, cəkmiş hünərə pərdə qərəz,
Zövq ölür, sənət ölür, işvə-ədamız da ölür.

Bağiban mehrini salmışsa alaq otlarına,
Gül solur, qönçə yanır, badi-səbamız da ölür.

Boş yerə salma özün zəhmətə, bir qanun var,
Yaşayan eşq olacaq, hirsü həvamız da ölür.

Şəhriyara, elə zənn etmə Səba ölmüşdür,
Bütün aləmdə hünər ölsə, Səbamız da ölür.

## SƏDİNİN BARİGAHINDA

Dahi Sədi, eşqin ilə gəlmişik bu gülüstana,
Bülbül kimi şən nəğmələr qoşuraq biz bu bustana.
Əsərlərin əbədi bir məhəbbətə olub məxzən,
Gəldik qoca yaşımızda dərs alaq bu məktəbindən.
Yeddi yüz il yatdıq bəsdir, zaman çatmış biz oyanaq,
Dur, gəl Reydən Şirazına, biz də sənə gəldik qonaq.
Bəs deyilmiş Gülüstandan yığdığımız güllər hələ,
Gəlmişik ki, bir az giley tikanların alaq ələ.
Karvan əhli utanırdı gətirməyə bizi bura,
Dərvişlərtək cildə girib min cür hiylə qura-qura,
Gecə yarı hamı yuxu zindanında qalan zaman,
Simurğ kimi Süleymanın dərgahına olduq rəvan.
Sənin əsil dostunuq biz, fəqət xəyal eyləmədən,
Əhdi pozduq, hüzuruna gəldik belə namüəyyən.
Ustadımız, kömək əli uzatsana can dostuna,
Axı dərdə dərman üçün gəldik sənin hüzuruna.
Oyrətdiyin dərslər bizə ziyan verir indi, ustad,
Möhtac olduq hər cəhətdən, kimsədən yox bizə imdad.
Çətinliklə boğuluruq, baxan yoxdur şikayətə,
Qumdan durub gəlmişik ki, son qoyaq bu fəlakətə.
Gözümüzə nur verməyir sürmələnmiş bu İsfəhan,
Bize fayda verərmi heç öz gözü kor olan zaman.
Özümüzü məhtab kimi Zindəruda vurub gəldik,
İnci kimi, ümmanlarda gizlənmədən durub gəldik.
Gecələr ay işığında, gizli, açıq yol keçərək,
Hüzuruna gəlmişik ki, eyləyəsən bizə kömək.
Şamlar kimi yana-yana ağlayırıq, səs-səmirsiz,
Ahü nalə çəkə-çəkə dərgahına gəlmişik biz.

Əfqanımız boğur bizi, nəfəsimiz cətin gəlir,
Ruhumuz ah etəyindən tutaraq göyə yuksəlir.
Ruminin dar külbəsində Şəms olmarıq heç bir zaman,
Əsrin Əbu-Səidiyik, vətənimizdir Xorasan.
Nasir Xosrov taleyinə bənzəməz heç taleyimiz,
Ayrı cürə avarəyik, şəhərlərdə, çöllərdə biz.
Zavalsız bir nəhəng kimi üzüb vəhdət ümmanında,
Çarpışrıq yaşamaqçın bu ümmanın tufanında.
Ərəblərin şəmşirinə sinə gərdik biz dəmadəm,
Kafir ikən müsəlmanlıq aləminə qoyduq qədəm.
Küfrü atıb biz qaldırdıq islamiyyət bayrağını,
Dinü iman aləmində qurduq inam novrağmı.
Qara bulud qaranlığa salan zaman hər bir yeri,
Qəlbimizə işıq saçdı qüdsi Quran ayətləri.
Ey barigah sahibi! Sən qonaq hesab eylə bizi,
Soruşma heç kimik, bilmə adımızı, yerimizi.
Gərdənləəndi inci olan sədaqətli bəndənizik,
Qarşında baş əyib səni daim təqlid edən bizik.
Namərd zaman təqib edir, bizi qoyur yana-yana,
Biz dərvişlik paltarını geyib gəldik bu meydana.
Vətən "qərib" adlandırıb hey gətirir cana bizi,
O ayaqlar şil olsun ki, gətirdi İrana bizi.
Öz xatirat cənnətindən neçün gərək xaric olum?!
Neçün gərək buğda yeyib Adəm kimi mən qovulum?
Ey Şirazın dərd əhlinə pənah olan mürəbbi sən,
Rəhm eyləyib qurtar bizi bu Tehranın məhbəsindən.
Sakit, əmin bir guşə ver, ömrümüzü başa vuraq,
Qoy şerimlə qaralansın dəftərimdə hər ağ varaq.

## TƏBRİZİN ŞAHZADƏ BAĞI

Bu haman bağdı ki, burda yaşayıb şahzadalar,
Parça-parça olub indi, yenə xoş görkəmi var.
Elə bir ayinədir, əks eləyir indi yenə,
O Abas Mirzəni ki, burda tutardı o qərar.
O ki, öz başını qoydu bu Vətən torpağına,

Tarix olmuş o hekayət, gecə-gündüz ağlar.
Gördüyü xeyirli işlər çıxa bilməz yaddan,
Qəlb evində o bulaqtək hələ qaynar, çağlar,
Bir bu şahzadə bağı, bir də ki, o Şahgölüdür,
Bil ki, o şahzadədən bizlərə bir töhfə qalar.
İnqilab tarixi burda gələcək göz önünə,
Kino lenti kimi bax sən ona təkrar-təkrar.
Atının kişnəməsi indi də dağlarda qalır,
Ona rus saldatı bir vaxt burada oldu səvar.
Sərdarın nərəsini dostları yad eylər hələ,
Adı Səttarxan idi, cəbhədə oldu sərdar.
Hər tərəf qapqara dağlar, necə də qorxuludur,
Sanki zindana çəkilmiş qara daslardan hasar.
Dünən o milli bağın hökm idi qanuni işi,
O bu gün gör necə səssizdi, nə fərman, nə qərar.
Yansın futbol üçün meydan edib gənclər onun,
Nə zaman olsa yarış, orda cavanlar oynar.
Bir azın ordu tutub indi nizamiyyədir o,
Tutub ərbab bir azın da çəkilib dövrə divar.
Onun hər hissəsi hərrac olunub da satılıb,
Udub o milli bağı, iştahalı əjdahalar.
Qaldırardı başını göydə fələkdən də uca,
Bir zaman hər gecəsi nağəli, dastanlı diyar.
Yıxılır köhnə binalar belə söylərdi o da,
Var bizimçin belə tale, görünür lap aşkar.
Asimanın öz əlilə tikilər şanlı saray,
Tanrıya bəlkə şikayət eləyər leylü nahar.
Burda bir arif adam var, o yatıbdır əbədi.
Xarici abad olan daxili bərbad bu məzar.
O dağın keçmişi, bu indiki halı, nə deyim,
Nə gələrsə başına ümmid o Allaha qalar.
Hər şey o bəxt ilədir, çərxi fələk də dolanır,
Nə Süheyl ulduzu vaqifdi, nə də bir səyyar.
Milli bağ park idi bir vaxt bu şəhər əhli üçün,
Nə gözəl günlər idi, xoş da keçərdi rüzgar.
Mən özüm şahidəm, onda qocalar parka gələr,
Kimi vərziş eləyərdi, kimi də nərd oynar.

Bir əsrdir bura zahirdə elə bayramdır,
Batinə baxsan əgər orda hələ matəm var.
Bəşər övladı tutub min əl ilə dünyanı,
Yarpağın titrəməsi yoxsulu etmiş naçar.
Gey o qanunları sən əyninə paltar yerinə,
Düzginən süfrənə de onları, heç eyləmə ar.
Çün qənaət bizə dərman idi, yaddan çıxdı,
Tək rəqabətdi, zaman keçsə də o, yadda qalar.
Asiman verməyir indi bizə, biz istəyəni,
Ərzələr ədliyədə bir-birinin üstə çıxar.
Dünyamız doldu yaşa, artıq o, piranə olub,
Nə qədər vursa bəzək, gənc ola bilməz, qocalar.
Amma şadlıq eləməkçün daha yox onda həvəs,
Çünkü əfsanədi, bu şadlığı ondan kim umar.
Bu təzə elmlər ilə yer üzü məhv olacaq,
Bəşəri vəhşətə salmış necə bu qorxu, azar.
Dünən o, yoxsul idi, qane idi öz halına,
İndi o, varlıdı, əfsus ki, yolun hər gün azar.
Mərifət almaq üçün oldu bu ibrət dərsi,
Tanrıya şükrdü bu, hər kəs onu eyləsə car.
Biri şükr eylədi, o, Allahına oldu yaxın,
Biri küfr eylədi, Allahdan özün etdi kənar.

## MİLLİ İDEAL

Pəyam göndərirəm mən İran cavanlarına,
Alovlu mərdlərinə, şanlı qəhrəmanlarına.

Mənim gurultu salan nərəmin gərək birisi
Yatanları oyada, şirlərin gələ arına.

Dözərmi şirlər, o zəncirə bağlanıb otura?
Əsarət ilə barışmaz, bulaşsa qanlarına.

Bu dar macalda əsirlər sürülmədə yalavac,
Veribdi hökmünü zalim, qıyıbdı canlarına.

Nədir bu naz ilə alver gətirmiş elmə gəda?
Kasıbdan öyrənib elmin, fəqət dönüb harına!

O nəslimiz ki, bizim eradan qabaq xan idi,
Olubdu qəyyuma möhtac yadeilli "xanları"na.

Buludla söhbət edən sirli Təxti-Cəmşidə bax,
Uyubdu Keyvana dair o, dasitanlarına.

Üfüqdə əks eləyən nərələr də layla çalır
Şir Ərdəşiriərinə, qartal Ərdəvanlarına.

O vaxt ki, dindən əsər, elmidən nişan yox idi,
İranda elm ilə din fəxr edirdi öz barına.
Duyammayır sənəti sənətə baxan ağalar,
Misilsiz incəsənət indi bəndədir qarına.

Bu o şahmatdı ki, meydan vəzirlər aləmidir,
Mat olsa, bir baxasan şahın ah-amanlarına...

Beşikdə sirləri boğmuş cavan nəsil doğulub,
Xəyanətin qolunu bir salaydı yanlarına!

Bürünməyib ipəyə, daşla nizə oynadaraq,
Gərəydi sinəsini taleyin tikanlarına.

Gərək olaydı cəsur, alminən, döyüşkən, igid,
Verəydi oxla qılınc "dərsi" yurd yıxanlarına.

Vətən oduyla beyinlər dönəydi gur ocağa,
Ürəklərin qəzəbi - Malikin tiyanlarına.

Siyasət aləminin zülməti, ziyalıların
Fikir çırağı olub, bir güləydi öz yarına.

Cavanların gücü, həm pirlərin duası ilə,
Ağıllı başçıları xalq ilə olanlarına.

Gərəkdi saf məramlı hizbi təşkilat yarada,
İnamla el gələ azadlıq asitanlarına.

Vətən məhəbbətilə hər fəda olan yazıçı
O vaxt qoşulmalıdır ölke pəhləvanlarına.

Xəyanəti açılan dəstə cani dəstəsidir,
O dəstə yetməlidir öz cəzasının darına!

O gün sevinc ilə aclar əsil cəza verəcək
İran harınlarına, kinli qansoranlarına.

Dağılsın əhli gərək Şimran üstü villaların,
Kasıbların ahı düşsün o xanimanlarına!

Həmişə alqışa layiqdi xalq fədailəri,
Hüma gəlin gələcək qalibiyyət anlarına.

Nə qan tökübsə dəni, Şəhriyara, sən onu bil,
Yetər İran da həyatın qızıl zamanlarına.

# ***QİTƏLƏR***

## **DÖRDLÜKLƏR**

**1**

Təklikdə bir dosta öyüd, nəsihət,
Onun xatirini əzizləməkdir.
Lakin yad yanında edilən töhmət,
Dostunu hörmətdən salmaq deməkdir.

**2**

Ey xəsis, ömrünü hədərə vermə,
İnləmə mal, dövlət çıxsa əlindən.
Ömr olsa, taparsan itən malını,
Ömr itsə, tapmazsan onu malla sən.

**3**

Bir sıra adamlar heyvan kimidir,
Zahirdə qulağı, gözü olsa da.
Xəyalı bolluca yemək-içməkdir,
Məsləki, inamı olmaz dünyada.

**4**

Təəccüb deyildir, iki şey üçün
Bütün ömrü boyu dərd çəkər insan.
İtən cavanlıqdır biri, əzizim,
O biri dost üçün cəkilən hicran.

**5**

Nadan dirisə də canlı ölüdür,
Onun vücudu da məzara bənzər.
Bilikdən güc alıb yaşamayanlar,
Başsız külək kimi avara gəzər.

## GÜL SATAN QIZCIĞAZA

Ey cavan nazənin, gül satan mələk!
Güldən söz açırsan yaz bülbülütək.

Geyib gül bəzəkli zərli paltarı,
Güllərlə bəzərsən ilkin baharı.

Ey zülfü bənövşə, gülə həmdəmsən,
Öyrəndin həyanı səfalı güldən.

Gül kimi camalın çox nazəndədir,
Güllərin səfası, şövqü səndədir.

Sünbüli saçların sərv üştə, hər an –
Sevən ürəklərə gültək verir can.

Dünya gülşən olur baxanda sənə,
Bülbül heyran qalır sənin nəğmənə.

Özün qönçə gülsən, hər yanın güldür,
Sən Allah, özün gül, aləmi güldür!

Bülbülsən, pərisən, hurisən, nəsən?
Sənin gül üzünün vurğunuyam mən.

Güllər vəfasızdır, bil ki, tez solar,
Qorxuram sənə də təsiri olar.

Mən də bağban oldum gülə bir zaman,
Çox cəfa görmüşəm tikanlarından.

Pərvanə şam üstə od tutduğutək
Gül üstə yanmışam mən də, ey mələk!

Sən tərif edirsən gülləri, əbəs,
Ayıl, bu güllərlə ülfətini kəs!

Axı gül nəçidir naz edə sənə?
Sən ətir verirsən gülə, gülşənə.

Sən verdin güllərə bu lətafəti,
Sənsiz ola bilməz gülün qiyməti.

Ayıq ol, ey gözəl, nazlı gülsatan,
Özünü qaçırdar mahir bir cavan.

## VƏHŞİ GÜL

Qonşuda bir gözəl gül budağı var,
Görəsən kiminçün qönçəsi açar?

Vəhşidir, uzaqdan gördüyüm zaman
Qaçıb qapısını möhkəmcə bağlar.

Baxanda özümü bəyənmərəm mən,
Məni də bəyənməz o nazlı nigar.

Ey qoca könlüm, bil, vaxtı çatanda
Alma dərilməsə, çürümüş olar.

## SƏNTURUN MƏZARI

Bir məzar üstündə eşqin pərisi,
Şur ilə Mahura saxlardı matəm.
Dedim: "Həbib ölmüş, məzarı bumu?
Ki yazıq könlümə dolmuş dərdü qəm?"
Pəri dilə gəlib dedi: "Bu torpaq
Səntunin qəbridir, Həbiblə bahəm".

## MAARİFİMİZ

Nəyimiz var öyünməli, cəhalətdir maarifimiz,
Maarifin özünə də xəyanətdir maarifimiz.
Əcnəbilər qələmiylə yazılmışdır proqramı,
Tutuquşu dərsi verir, o sifətdir maarifimiz.
Ustalaşıb düzü əyri, əyrini düz tanıtmağa,
Yazıq millət, faciədir, müsibətdir maarifimiz.
Harda ki nur qapısı var, yeddi yerdən qıfıllayır,
Bir qaranlıq uçurumdur, bir zülmətdir maarifimiz.
Əcnəbinin tənburilə oynadığın yetər, bəsdir,
Oyan millət, öz gözünlə gör, qəflətdir maarifimiz.
Gözlərini aça bilsən bu ağır div yuxusundan,
Nalən çatar fələklərə, fəlakətdir maarifimiz.

Cavanlara nə bir sənət, nə də həyat dərsi verir,
Açır zillət qapısını, cəhalətdir maarifimiz.
Oğrulara şərik dövlət, doğruluqdan dərs öyrədir,
Başdan-başa quru sözdür, nəsihətdir maarifimiz.
Bu dövlətə qulluq etmək, məmləkətə xəyanətdir,
Xainliyə, satqınlığa dəlalətdir maarifimiz,
Ömrümüzün altı illik gül tacını yelə verən
Darülfünun nə öyrədir, səfalətdir maarifimiz.
Müdərrislər bilə-bilə təliminə yalan qatır,
Ona belə mənfəətdir, zəlalətdir maarifimiz.
O, "xəyanət bağçasından" gül dərsə də, susur yenə,
Nə eyləsin, əlacı yox, rəzalətdir maarifimiz.
Bikəs vətən, hünərsizlər, qeyrətsizlər əlindəsən,
Başdan-başa xəyanətdir, cəhalətdir maarifimiz.

## EŞQİN XUMARI

İki bölmüş məni hicran, iki dünya kimiyəm,
Yarı getmişsə yarımla, yarı qalmış məndə.
Cavanı aycamal eşqilə qoşulmuşdur ona,
Məni bivaxt qocaltmış qarı qalmış məndə.
Yaşılı öylə aparmış ki, özüylə o nigar,
Nə baxım güzgüyə, ancaq sarı qalmış məndə.
Aparıb gül-çiçəyi, baxmalı bir mənzərə yox,
Uca hicran dağıyam ki, qarı qalmış məndə.
O zərif çiyninə qonmuşdu göyərçin ruhum,
Hicranın bayquşu qalmış, sarı qalmış məndə.
Aparıbdır balım, qorxulu, pünhan vüsalın,
Sızlaşır boş pətək içrə, arı qalmış məndə.
Hər nəyim vardısa əldən gedib, artıq nə deyim,
Nə şikayət ki, bu röya varı qalmış məndə.
Od-alov saçdı məhəbbət, yığışıb getdi o yar,
Bu yamq cisminə baxma, nan qalmış məndə.
Aparıbdır dodağında o şirin şərqiləri,
Bu sınıq könlümə bənzər tarı qalmış məndə.
Bağını dərmiş, aparmış bu yazıq Şəhriyarın,
Acıdır, yığmayıb, həsrət barı qalmış məndə.

## MƏNİM EYBİM

Allahımdan gileyim var,
Nə nöqsandır xilqətimdən,
Nemət aşıb-daşan zaman,
Zövq almıram ləzzətindən.
Əldən gedən səadətçün
Baş açmıram həsrətindən.

## TƏBİN QUYUSU

Mənim təbim dərin quyu,
Qəzəllərim axar suyu.
Yanında dəftərim dolça,
Şəfa tapar cavan, qoca.
Tənabımdır yarın teli,
Onsuz susar şerin dili.

## ULAĞIN NEÇƏYƏ?

Daşımasan yükünü yadın bu xərabədə,
Soruşmazlar, ay gövhər satan, ulağın neçə?
Orda saxsı yüklə ki, hamı qaçsın dalınca,
Yalvarıb söyləsinlər, əmi, növrağın neçə?
Şəhriyarıyam eşqin, hərdəm bir cüvəllağı
Tacı başından qapıb: başın, papağın neçə?

## CAVANLIQ SƏRVƏTİ

Şikayət zəiflərə yaraşır ancaq, inan,
İnsan yoxsul görünür zəif olduğu zaman.
Varlı-karlı qocanın həyata rəğbəti az,
Gənclik qayğısızlığı ixtiyara yaraşmaz.
Cavansansa, deməli, sən də varlısan əlbət,
Varmı gənclikdən böyük, gənclikdən ulu sərvət?

## *SƏRBƏST ŞEİRLƏR*

### RƏSSAM

Əziz rəssam,
Uzaq üfüqlərdə bir xəyal,
Bürünüb buluddan süzülən
Ayın nuruna.
Qafın zirvəsidir,
Bir guşəyə çəkilib.
Salam verirəm mən ona.
Mən gecənin qoynunda
Qorxulu bir mağarayam.
Həm kölgəli,
Həm nurlu,
Həm vahiməli,
Həm də şən.
Sənin də üzün mənim kimi
Soyuq şölədir,
Ötüb keçən karvandan
Düşüb qalmısan, nədir?
Sən ey ötən qərinələrin
Qəhrəmanlıq varisi.
Bir səhərin alaqaranlığında
Nə onda məhəbbət görünür, nə ay.
Nə ağ deyir ona bir insan səsi
Nə qara.
Öz qəlbi ilə həsbhal edir bu ara.
Vicdanını oyat yuxudan nəvazişlə,
Bir vicdan ki,
Nəşəylə uyuyur hələ...
Götür o firçanı ki, əziz rəssam!
Hər tükü şair xəyalından toxunub.
Çünki sair xəyalı şeir olur,
Vicdanın xatirat heybəsinə sal əlini.

Ara-axtar
Yenə gəz təzədən, axtar.
Nə istəsən, orda var,
Bir zərif firça var onda.
Bir gözəl kirpiyidin kölgəsidir o da.
O kirpikdə buza dönmüş
Axan göz yaşı.
Qətlə yetmişdi
O dilbər gəlinin yoldaşı.
Öldürən kimdi?
Namus oğruları!
Bədnam etmək üçün günahsız nigarı.
İndi o məsum gözlər
Bir ömür giryan olub.
Çıraq olmaq idi ilk arzusu
Övladları yolunda.
Fəqət, buluda döndərdi o gözləri də xəyanət.
Əziz rəssam!
O vicdan heybəndə
Dərdli sinələrdən vərəqlər var.
Yadigar albomlardan əl çək,
O varaqları çıxart,
Bir rəssam dəftəri yarat.
Faciə ilə dolu hər varağı.
Taxtaya dönmüş bir sinə,
Qırşmış dəri,
Xətləri qabırğa sümükləri.
Bir sinə də çək,
Ancaq üstündə yaz,
Burada bir ciyər də varmış,
Birvaxt...
Əziz rəssam!
İndi o rəngləri gətir,
Biri zindan bucağından
Üfüqə baxan bir məhbusun ahıdır,
Bir parça işıq ver bu kölgəyə.
O gəncin ki,

Zorla yoldan tutulub
Zindanda ömrü talandı.
Qarnından qırmızı rəng yarandı.
Biri də,
Bir yetim üzündən uçan
Heç vaxt geri qayıtmayan
Çəhrayı rəngdir.
Biridə
Zəhərlə parçalanan ciyər.
Şeytana aldanan,
Mövhumata uyanın
Göy rəngidir.
Biri də,
Zindan şüşələri ardından
Cavanların gördüyü baharın
Bir az solğun göy rəngi.
Riyalardan uzaq,
Sənin vicdan heybənə biganə
Hər cür yaramaz rəngələrə dəyməz.
Fəqət sədaqət və məhəbbət rəmzi
Rəngləri ya özündən,
Ya da özgədən al.
Ona məzlum bəşərin göz yaşından
Bir-iki damla sal.
Qəlbindən, canından
Qaynayıb gələni qat ona.
Onda sənin bu rəngin
Gəlməz əsrimizin xoşuna.
Bilmirəm bəs nə ad verək rəngə...
Əziz rəssam!
İstərəm bu rənglə,
Kağızla, fırçanla
Bir əsər yaradasan vicdanla.
Qoy mən deyim, sən çək.
Çək zövq ilə, ilhamla,
Ürəyin istəyən tək.
Axı sən rəssamsan...

Nakamlıq istedadır
Sənə deyəcəyim,
İstərəm bir ay çəkəsən,
O, hilal vaxtından
Bədr olanadək
Çıxa bilməyib buluddan bir an.
İstərəm bir tablo çəkəsən,
Rəssamın sinəsində öldü,
Həyata gəlmədən.
Bir arzu çək!
Məhv etdilər onu
Doğulanadək.
Bir dağ laləsi çək!
Şəhla gözləriylə
Nə aynaya, nə suya baxa bildi.
Bir kəndli qızı çək!
Ayaqyalın, basaçıq.
Ömrünü səhralar taladı.
Günəş altında yanıb,
Lalə tək təndirlər qaladı.
Bir bulaq çək!
Bir ömür dağda
Qayalar arasında çırpındı,
O, heyata təşnə qaldı, həyat ona.
Səd çəkildi bu zümrüd gözlü
Şəlalənin yoluna.
Bir nalə çək!
Kimsə yetişmədi dadına.
Bir abidə çək!
Memar səy etdisə nə qədər
Axırda dağıdıb xaraba etdilər...
Əziz rəssam!
Bu tablo dünyaya dəyər,
Bir ilham, bir asudə vaxt ola əgər.
O əsər ki, əbədiyyətə qovuşar,
Ruhda və ürəkdə izi qalar.
Xəyalda yaranan hər tablo

Kətan üzərinə gələr sonradan.
Keşikçi şallağı altında
Can verən bir məhbusun
İman şöləsini çək!
Səmum küləyinə bənzər
İmansızların əzabına dözüb fəqət
Bir kəlmə yalan deməyən,
Ülvi məhəbbətli şəxsiyyət.
Kimsəyə düşmənlik etməyən,
Lakin dövlətlə döyüşən,
Qələbə kandarına düşən
Ulduzun işığının söndüyünü,
Dan yerindən söküldüyünü,
Günəşin doğmasından xəbər verən
O günəşə ki,
Əjdaha yuvasını xarab edib,
Bu qara ləkədən təmizləyəcək hər yeri.
Bəli, o günəşin şəfəqləri.
Əziz rəssam!
Bu tablo inan ki, çox vaxt aparmaz.
Rənglərlə çəkilər xətlərdəki hər rəmz.
Elə bir tablo ki,
Onu hər görən
Hərəkətə gələcək mütləq.
Bəlkə də dəyişəcək yerini,
İşıq əvəz edəcək səmtini.
Bir mələk surəti görünəcək
Divin pəncəsində.
Bir də qul satan,
Yusif onun qulu.
Qardaşları arxasında qalan
Xətər yolu.
Mehriban gözlərdən axan yaş,
Yanaqlarda donub,
Təsəllisi ancaq ah olub.
Üzündə həm məhəbbət var,
Həm itaət.

Atadan qəzəb, anadan şəfqət.
Ciyərinin qanıdır göz yaşı.
Ürək yanğısında acı bir nifrət,
Nifrət!
Dua cilvəsində oyan.
Məsiha simasıdır xaç zindanında.
Bir Rüstəm qəmi!
Söhrabın taleyi!
Həkim Sokrat şükürü!
Qərq olmuş nicat gəmisi!
Nuh peyğəmbər!
Qorxulu tufan səsi,
Müharibə dəhşəti?
Faşist cəhənnəmindən bir səhnə...
Bunları çək,
Demək istəyirəm sənə.
Daha heç nə!
Yox, bir də
Alında bir neçə sınıq xət,
Baxışlarda məğlub bir qüdrət.
Zamanın qıvrılmış ilanı,
Əsəblərin gərginliyi,
Bir də yadından çıxmasın ha.
Röyalardan yaranmış bir tablo.
Çəkib onu suya axıtmışlar...
Əziz rəssam!
Bu tablo yaransa əgər,
Zamanın muzeyinə verərlər.
Yadigar albomlarda qalar.
Sənət əsəri kimi yaşar.
İndi bu zülmətdə
Bü qədər küdurət var, yetər.
Birdir – görələr, ya görməyələr,
Bu tablodur,
Rəssamın yadigarı.
Heç kəsdən əvəz, ənam gözləmə.
Nə qəm, Nobel mükafatını

İstəyirlər versinlər hər kimə.
Fikr edələr,
Ya etməyələr,
Biz da varıq.
Bu tablonu biz yaratdıq,
Hər yurda su olsa əgər,
Ora Sərab deyərlər...
Əziz rəssam!
Şeir idealımız Hafizdən,
Gərək bir şeir tabloda yazasan.
Ancaq divandan köçürtmə ona.
Bir şeir ki, düşməyib
Heç bir divana.
Bir şeir ki,
Düşüncəyə sığmaz,
Bir şeir ki, şairlərin idealıdır -
Hafiz gizlədib bizdən
İllərdən bəri.
Bəlkə də cənnətdə yazıb
Hafizə şeri!
Orda ayirıdir şerin hər kəlməsi.
Qarışıb bir-birinə zir və zəbər.
Hər nöqtədə zamanın zəngi səslənər.
Orada qəlbə yatan sözlər
Zamanın qəlbinin döyüntüsüdür.
Yaradanın kəlamı,
Bəşər karvanının ahəngi,
Sirlərin açarı var.
Yoxdur məndə belə bir şeir,
Onu Xacə Hafizdən axtar,
O şeir belə deyəcək yəqin:
- Bu qəmli tablo
Qəm xəstəsindən,
Zamanın əzablarından,
Musiqi, şeir ve fırça dərmanından
İki min nüsxəyə
Bükülən dən sonra hələ,
Qalmış belə...

## MUMYALANMIŞ ADAM

Gözlərimi ovuşdururam hələ də,
Oyanmışam neçə əsrlik yuxudan.
Axtarıraın qədim, doğma dünyamı,
O gördüyüm daşlardan biri də yoxdur ki,
Hal-əhval tutam.
Yuxuluyammı, oyağammı, bilmirəm.
Gördüklərim həqiqətmi, röyamı?
Nə bir dost qalıb, nə bir tanışım.
Dərdimi kimə danışım, həsrətimi kimə danışım?
Mumyalanmış adamam, fəqət, diriyəm.
Gözlərim iki qara çuxura bənzəyir,
Bədənimdən gəlir məzar iyi.
Bəlkə də Misir ehramlarından durmuşam.
Yoxsa Buxt-ən-Nəsrəm,
Yoxsa fironlardan biriyəm.
Çürümüş libasımla
Əsrlərdən qalan bir mirasam.
Yeriyirəm soyuq və ağır addımlarla...
Dörd yanım pərişan çöhrələr...
Gəzirəm sərgərdan, mükəddər...
İtirmişəm gedəcəyim yolu da.
Keçirəm döngələrdən, küçələrdən;
Əziz bir məhləyə dönürəm,
Bəlkə o doğma mənzilimdə
Məndən bir xatirə qalıb.
Hanı o mənzilim, hanı o xatirəm?
Yol verin mənə!
Arzumu itirmişəm, eşqimi itirmişəm.
Onları gəzirəm.
Kölgələr də qaçır məndən;
Onlar dostlarımdır bəlkə də...
Qaranlığa qarışıb ərisə də özləri,
Orda-burda qalır tanış izləri.
Qulaqlarıma pıçıltı gəlir.

Yoxsa simasızlar bərkdən danışmazlar?
Yoxsa itibdir onların adları, qəbirləri?
Bəlkə də onlar bir anlığa
diriliblər mənimtək?
Bəlkə məhşər günüdür bu?
Mənim gördüyüm bu çirkli aləm
Daşqalaq olsun gərək.
Parlaq gövhər tapılmaz bu mədəndə.
Ata malı kimi bölüblər məni;
Yanaqlarımın qızartısı birindədir,
Gözlərimin işığı birində.
Biri çapıb bir yanımı aparıb,
Biri ürəyimi yerindən qoparıb.
Bəs sazım-çəngim kimdədir görən?
Bəlkə də bütün əzalarım yerindədir?
Axı bu qədər dərdlərimlə
Kimə lazımam mən?!
Qarşımdan bir kölgə keçdi.
Necə də oxşadı bir dostuma,
Boy-buxunu, yerişi eynən.
Bəs niyə belə soyuq ötüşdü?
"Dost, bir danış görüm?"
(Bu laldır, nədir?)
Birisi də bunu qarət edib, deyəsən.
Dağa bax, dilə gəlib,
Kimdən kiməsə danışır.
Yaxşı ki, mənimlə deyil,
Dili topuqçalır,
pəltəkdir elə bil.
"Dağ dili bilmirəm mən.
Sənə mütərcim gərək.
Şair də deyiləm mən.
Dərdini o adama danış ki,
Dağın da, şerin də dilini bilir".
Bir qıza rast gəldim.
Qara gözlərinə baxcaq,
On yeddi əsr qabaq

Qeysərin tabutunda gördüyüm gözəli xatırladım.
O gözəlin sürməsindən çəkmişdi bu qız da.
"Üzr istəyirəm, pərim!
Mənə səmalar darısqallıq edirkən,
Sənin də dar gözlərinə sığınaram.
Mən meşələri bəyənirəm,
Sənin bir tutam saçın nədir ki, əylənəm.
Dərd əlindən elə təşnəyəm ki,
Dənizlər də söndürə bilməz məni.
Öz yolunla get, pərim!
Quzularından muğayat ol!
Arx ensizdir, qaçarlar.
Sən nə bilirsən ki, dünyada nə var."
Bu çərxifələk
Oyunlarla dolu köhnə dağarcığını
Hər dəfə bir axmağın dalına çatır,
Yenə bir axmaq yük altındadır.
Bu yükü daşımışam mən də bir zaman.
Ozümü gülməkdən necə saxlayım?
O dağarcığm yükü
Pərişanlıq və qəlb ağrılarıdır.
Bu acı taleyə
Gülümmü, yoxsa ağlayım?!
Verdiklərini geri aldı bir-bir...
Bu dünya məni uşağa oxşatdı,
Qaqqa göstərdi, vermədi, aldatdı.
Xəstəlik verdi, dərman vermədi.
Əyləncə öyrətdi, əyləndirmədi.
Sonra da quraşdırdıqlarını açıb yığdı bir yerə.
Vurdu qoltuğuna.
"Bir daha qaytarmaram" deyib apardı.
(Daha nə deyəsən buna!)
"Dünya kişi deyil" - deyən qadınlar
Min yaşasınlar.
Dumanlı və qaranlıq bir çayxana
Qucaqlayıb səkilərin dizini.
Pəncərələri açıb taybatay,

Bir incə qəzəl, bir dərdli saz
məst edib bunları.
Divarlarındakı kaşılar da yuxudadır,
Fəqət göz vururlar qapının arxasından.
Bir məcnun söyüd də küçədə durub,
dalğın, pərişan...
Su həsrətilə əyilib arxa.
Bir dostum da qorxa-qorxa
Kölgəm olub məni izləyir.
Hərdən titrək səslə,
Hərdən də qəzəblə nə isə deyir.
Soruşuram: "Nə istəyirsən?"
O baxır mənə sərt-sərt.
Dönüb bir də baxır dərdli baxışla
Deyir:"Dirilt məni!"
Arzuya bax, aman Allah!
Qaçmaq, qaçmaq istəyirəm,
Uçmaq, uçmaq istəyirəm.
Dörd bir yanım bağlıdır, zindandır.
Nə qədər ki, ayağımın altında yer var,
Başımın üstündə səma.
Cahan həmin cahandır,
Dünya da həmin dünya.
Yoxdur nicat üçün bir yer.
Taleyimin qəzəbli qartalı-
Sakit gecənin qaranlığında,
səhərin alatoranında,
Sərt və ağır, dağların zirvələrinə bərkidilmiş
dumanlı bir körpüyə bənzər.
Ay da bu yerlərə baxıb yan keçər,
Ah... bu gözəllik diyarı, bu arzu dünyası!..
Ah... bu ümid cığırları!
Ah, bu vəhşi qayalar, bu iti qayalar,
Niyə yolumu bağlasın?!
Necə uçum, necə qalxım?
Bu çürümüş libasım
Qayalara ilişib qalacaq axı,

Tikə-tikcə olacaq axı.
O tikələrdən qanad düzəldərəm.
Taleyimin bağlarını açaram.
Ay işığı bu darısqal dərəyə düşəndə, uçaram.
Ucalaram dağların fövqünə....
Ucub bu yerlərdən gedərəm.
Uzaqlara...lap uzaqlara!

## DUNAY ÇAYININ BƏŞƏRİYYƏTƏ MÜRACİƏTİ

Baharda bulaqlar sevincdən
Xizəkçi zirəkliyi və oyunbazlığı ilə
Dağın döşündən aşağı sürüşürlər.
Oynaya, oxuya bir-birinin üstünə yuvarlanırlar
Ki, əzəmətli bir çay yaratsınlar.
Sanki dağın nəvə-nəticələridir.
Qocanın havada süzülən saçlarını hörüb
Çöllərin sinəsinə salırlar.
Həmin qayda ilə göy
Dunayın uçan dalğalarını da
Avropanın qucağına tökürlər.
Bu uca və ürəyəyatan dağların hörükləri
Əsrlərin və qərinələrin torpağından keçərək,
Dərya sevincli sinəsini
Təbiətin zəngin süfrəsitək sərmişdir.
Bu səxavətli qonaqlıq süfrəsindən
Bir dünya bəhrələnir.
Bu mütəhərrik güzgüyə bənzər dünya öz gərdişində
Kəhkəşandakı məiyyəti arasında şahlara bənzəyir.
Bütün gözəllikləri qucmaq istəyən
Dəryanın açılmış qollarına oxşayır.
Gecə, mavi səmanın gərdəyidir,
Əyilib galinə şirin öpüşlər səpir.
Çəmənə bənzər sinəsinə
Aydan iri, parlaq almaz parçası taxır,
ulduz güllərindən saçına
Gövhər sancaqları düzür.

Bu nazlı balıqların yatağı,
Yaxud, əbədiyyət məkanının köşəyi,
Gecələr musiqi və dəvə zəngləri ilə süslənən
Fikir bəşiyi, yuxu yurdudur.
Gecə ilə gündüz öz duyulmaz hərəkətlərilə
Sanki bu beşiyi tərpədirlər.
Şirin bir laylayla beşiyi yırğılayır,
Öz fotoaparatının şüşəsi ilə
Şəkil çəkməklə məşğuldur.
Bir kino pərdəsi kimi hərəkətdə olan dünyanın
Həm dili var, həm də dilçəyi.
Bütün ürəklər o üzün aynasında
Arzu və xəyal dünyasını görür.
Yer üzündə kəhkəşantək
Sarı və göy rəngli karvanlardan fərş döşənib.
Qayıqsürənlərin şam və çıraqları ilə
Daim axan ay və ulduzlarla
Sanki yer üzündə də nazlı ulduzlar
Mavi göyün ənginliyində
Əzəlin xəbərini əbədiyyətə aparırlar.
Sənətin dünya təbiətinə qovuşması
Çayın bətnindəki qüvvədəndir.
İsrafilin suru ilə Allah can verən kimi,
Maşınlara da elektrik ilə can verilib,
Ya da, bu ərşlə fərşin körpü ilə birləşməsidir.
"Dirilik suyu" əfsanəsindəki kimi
Sirli bir dünyaya körpü salmışdır.
Çaylardan yüksələn əbədiyyət nəğməsi
Təbiətin qulağında ilahi ərğənun səsidir.
Keçənlərdən gələcəyə
Əbədi ömr haqqında əfsanə söyləyir,
Ana doşündə eşidilən laylaydır o,
Gecələr ay işığında, ya qaranlıqda
Qəm yuxusuna gedənlərin əfsanə deyənidir.
Onun keçmişdə necə də məhzun görkəmi varmış,
Nə çox qəmü səhnələrin şahidi olmuşdur.
Sonuncu dünya müharibəsində-

Bu vəhşi mədəniyyətin ətəyində olan
Tarixin yüzlərlə qara bədnamlıq ləkəsi ki,
Ölən əsgərlərin qanı ilə yuyulub,
Onları Dunay həşrə qədər ağlasa da
Dünyanın üzündən yuya bilməyəcək.
Qulaq as gör, Dunay çayı
Fələklərin fəryadına, vicdanın nidasına bənzər
Sazının mizrabıyla bəşəriyyətə nə deyir:
Ey özünü "insan" adlandıran ikiayaqlı növ,
Adam da, div də, adamyeyən vəhşi heyvan da
Sənətin yüksəlişiylə mədəniyyətin zirvəsində,
Əxlaqın süqutu ilə vəhşiliyin dibindədir.
O yandan ərş mülkü və kosmosun qamarlanması,
Bu yandan gilyotin və qətl aləti!
O, ruzigarın gilyotini, bu raketlər,
Pərdənin dalında da namərdin soyuq müharibəsi!
Yırtıcılar öz həmnövlərinə hücum etmirlər...
Amma sən! Ya rəbbim, amma sən!..
İnsaf elə.
Yaralarından hələ də qan axan
Təkcə bu iki qanlı müharibədəki ölüm
Bəlkə də yöz milyon olub.
İsti müharibənin qırğını bəlkə
Soyuq müharibənin qırğını yanında bir heç olacaq.
Allahın lütfilə özünə gəl, ayıl!
Gəl, bu gün dünyanın ərazisini
Əhalinin nisbətinə görə bölüşdür.
Millətlərin hər nəfərinin üzünü güldür,
Hər kəsin səhmini öz əlinə tapşır.
Torpaq genişliyi, içki qabı və istiqlal payından
Azmkını artır, çoxa az ver.
Gərək bütün millətlər bərabər olsun,
Əlbəttə, xalqın sayına görə.
Həm də hamısı bir rejim və qanunun himayəsində olsun -
Nə o qədər ifrat olsun, nə bu qədər israf,
Nə bu kommunistlik olsun, nə də o müstəmləkəçilik.
Ayrıseçkiliyi kökündən qopar!

Keçmişdən ürəklərində kin saxlayan
O məzlum millət və xalqlarla
Bütün keçmişlərə görə üzrxahlıq elə,
Milləti narazı qoyma.
Qoyma xalqlar çerçəng olsunlar.
Öz böyüklüyün naminə əllərini ətəyindən üzmə.
Müharibə divanəsi öz qəbrini itirir.
Elm və mədəniyyətin doğurduğu bu təkəbbürdən
Bəşəriyyətin xeyrinə tərəf bir addım at,
Heç olmazsa bircə addım.
Dünyanın tutqun üzünü güldür.
Ayıq ol ki, atom açılarsa
Allahın vəd etdiyi cəhənnəm yaranar.
Qayıt və dünyanın cəhənnəmini cənnətə döndər.
Ehtiyatlı ol ki, pərdə dalında sirr var -
Qurani-kərimdə işarələr edilib:
Hər başda on min illik bir məhşər var,
Ölkələrdəki dəhşərli zəlzələlərlə,
Dərin, dibsiz yarğanlardan
Gurultu ilə axan torpaq
Qaynayıb, fəvvarətək tökülər,
Bütün dünya lavaya və qaynar suya dönər,
Birinci dövr başa çatıb və indi ruhlar
Bədən qəlbini tərk etməklə
Nurdan və atəşdən ibarət axirət dünyasında
Əməllərinə layiq mövqə tutmağa tələsiriər.
İki min ildən sonra dünya az-az
Soyuyub və dincliyə, inkişafa qabil olub.
Onda ruhların parlamasına imkan yaranıb.
İlk ruhlar cansızlar və bitkilərdə idi,
Sonra növbə heyvanlara və insanlara çatdı.
Birhüceyrəli heyvanın nütfəsindən
İnsanın yaranması dövrünədək
"Mən öz qəlbimlə onu canlandırdım"
Buna dörd min il vaxt sərf olundu.
Allahın xilqəti yaratdığı bu altı gün üçün
Altı min illik yetişmə dövrü lazım gəldi.

Allahın hər günü bizim min ilimizdir.
Sonrakı o biri dörd min il ki, qalır,
Cinin də, insanın da sınaq müddətidir.
Dostluğa əhd-peyman bağlayanlar
Allaha qovuşmaq istəyənlərdir.
Bu dövrdə ruhlar böyük məsuliyyət daşıyaraq,
Vəhdətin şərəfli paltarını geyinirlər.
Zülmkarlığa və cahilliyə qarşı
Ağılla peyman bağlamaq şərt qoyulur.
Yenidən Tanrı tərəfindən peyğəmbərlər gəlirlər,
Və o köhnə əhdi qulağa oxuyurlar.
Hər dəfə bir rüşeymin doğuluşu ilə
Bir işıqlı ruh da dünyaya gəlir,
Onun ölümü ilə təkrar geri dönür.
Bərzəx dünyası ilə bu dünya arasında
Bu hal yüz dəfə, ya bir qədər az-çox təkrar olunur.
Çox, ya az, irq, millət və din
Öz növbəsində yolunu başa çatdırmalıdır.
Yaxşı və pis əməllərin hekayətindən başqa
Qiyamətdə hamı bərabər olur.
O, dünyanın bütün zərrələrində əks olunub.
Xəbis ruhların çoxu xəbis adamlara qovuşur,
Xoşbəxt ruhlar da xoşbəxtlərə qovuşur.
Şübhəsiz, ziddiyyət donuna bürünmüş bir ruh da o cürdür.
Dənizdən bir nümunə:
Xəşayar şahın dövranı və Aten müharibəsi,
İskəndərin dövranı və Təxti-Cəmşid,
Və onların hər biri belə idi.
Zalımlığa adət etmiş cəmiyyət
Öz zülmündən intiqam da almışdır.
Özlərinin qabaqlar zülm etdikləri
Məzlumlar da yəqin həmin cür olublar.
Mənim əziz oxucum,
Bu hekayətdən özünə nəticə çıxart.
Tam küfr, ya tam imanlı bir ruh
(Rəhmliliyin lüzumu istisna olmaqla),

Bdən qəlibindən getdi, təzədən qayıtmaz.
Qiyamətin vədəsinə yüz il qalmış
Tam küfr yolu ilə gedınlər
Bərzəx dünyasının məhbusu olacaqlar.
Haqqın mübahisəsini axıra yetirmək üçün onlar
Bir daha bu dünyaya gələcəklər.
Bu zaman dünya cəmiyyətlə dolacaq,
Beləliklə fitnə-fəsad aşıb-daşacaq.
Və o axirəzzaman fiməsi də budur.
Buna görə mədəniyyət tarixi heç vaxt
Dörd min ildən artıq olmur.
Bu, çox qədimin əsərləri ilə gəlir və
Kifayət qədər qədim dövrlərə aiddir.
Adı mavi olan Dunay, bu haqda düşün,
Orada öz yatağına qərq olanın
Adını niyə Qara dəniz qoyublar?
Sən ona o qədər qara qanlar axıdırsan,
Daha bəs deyilmi?!

## RUBAİLƏR VƏ DÜBEYTİLƏR

İtibdir cavanlıq, ömür dostları
Hey onu gəzirlər tapsınlar barı.
Səbada od ilə sazı apardı,
Bitdi gül ömrünün qısa baharı.

Şikəstə bülbüləm - çəmənə laqeyd,
Bir xəlvət şamıyam - gələnə laqeyd,
Xalqa yad söyləmək insafdan deyil,
Xalq dostdur, söylənsin qoy mənə laqeyd.

Bu dünya bağından ehmal keç, ürək,
İnsafa arxalan, xoşhal keç, ürək,
Sıxılsan qonaq ol eşq meşəsində,
Sevdadan orada zövq al keç, ürək.

Xatirədən başqa dost yox həyatda,
Külək də tanımır bir kəs bu adda.
Möhnətlə, qocalıq olurkən abad,
Gənclik külə döndü Behcətabadda.

Birdir gülüşündə nəğmə ilə saz,
Mənim də naləmdə ney ilə niyaz,
Dilimdə səslənir Səba və Nima;
Qovuşub qəzələ yanğı ilə saz.

Göyərçin qanadlı, mən qanadsızam,
Onun dərdi ilə təkəm, yalqızam.
Səba pəncərədən baxsaydı əgər,
Görərdi nə gimə qalıbdır əyyam,

Gecikdi dərmanın könül, işin tərs,
Bu zəngin aləmdən tez doydun əbəs,
Qocaların qəlbi cavan qalırkən,
Sən niyə qocaldın gənc çağında bəs?

Mənə gərək deyil həyat şərbəti,
Nə də bir əbədi ömrün sərvəti,
Həbibin vəslinə yetişsəm, bir də
Düərəm gəncliyi, saf məhəbbəti,

Bu gecə yenə də eşqinlə məstəm,
Saqi, gəl vermə cam, əl saxla bır dəm,
O mələk çöhrəli girib yuxuma,
Hicrində ölmərəm, ölən deyiləm.

İçib arzu, xəyal alovlarını,
Sübh olcaq kəsirəm arx kənarını,
Reydən Nişabura əsərkən külək,
Müşk ətrindən duyur könül yarını.

Əvvəlki deyildir o sərv qəddin,
Can alan gözləri söylə, neylədin?

Hüsnün də itirib təravətini,
Mənim eşqim isə həmindir, həmin.

Hələ xatirəndən əl çəkməmişəm,
Gözünü andıqca hey artır nəşəm,
Əgər xəbər alsan halımı, canan,
Qəminlə can çəkmək olubdur paşam.

Yandırdı qəlbimi şam kimi o yar,
Qəmlərin dərmanı - gül dodağı var,
Bu gün qəm sirdaşı tapmadığımdan
Onun xəyalilə yar oldum naçar.

Bir gecə şəhərdən uzaq yataydım,
Məcnunla çöllərdə ülfət qataydım,
Ey gözüm, görəydin o Leylamızı,
Mən də bir xəyalən ona çataydım.

Dolu bir cam kimi dayanıb lalə,
Qəlbim qəm meyinə olub piyalə,
Nəsimdən dağılan pərişan teltək
Dalmışam kədərlə min bir xəyalə.

Şıltaqlıq eləyib hərdən haq-nahaq
Tez-tez üzr istərdi anadan uşaq,
Anası üstünə hirslənən zaman
Kimə sığınardı? Anaya ancaq.

Ömür kölgəydimi, zülmət əritdi?
Ya ki, bir gecəlik qonaqdı, getdi?
Qarışıq görünən yuxuydu bəlkə?
Bəlkə bir şimşəkdi - üfüqdə itdi?

İlahi, bir nur saç sən gözümüzə,
Səfa ver, saflıqla gül üzümüzə,
Doyduq bu zülmətdə ləkələnməkdən,
Parlayan bir günəş bağışla bizə.

Yoxdur vətənimdən başqa vətənim,
Orda da tapılmaz həmdəmim mənim.
Bəlkə də sirrimi qəbrə söyləyim,
Bir məhrəm kəsilsin mənə kəfənim.

Qəmliyəm, qəmxar yox, qəfəs də dardır,
Artığam, dünya da məndən bizardır.
Qala divarları kəsib arxamı,
Yarəb, qəfəs də dar, nəfəs də dardır.

Sel gəldi, dostları məndən qopardı,
Bahar büsatımı pozub apardı,
Gözüm üstlərində yaz bulududur,
Dürr tökər, sanmayın yağışla qardı.

Kəsdi ömrümüzü dövrün zəhəri,
Bir də acı dilin ölüm bəhəri,
Bədən bir zindandn, can qəfəsdədir,
Ölüm, gəl, qurtarsın həyatın şəri.

İnsana xoş gələr tərif olsa saf;
Xislətlər ölçüdür, vicdansa sərraf,
Varsa bu nemətin, şükr et, peyğəmbər:
"Dinin yarsıdır", demişdir, “insaf”.

Namus insan üçün oyuncaq deyil,
Bir çəmən gülödür – yəqin eylə, bil.
Qadın bir anadır bəşəriyyətə,
Önündə təzim et, ədəblə əyil.

Yaşamaq istəsək bir ömür əgər,
Onu da sərt ölüm kamına çəkər.
Bu yer də, o göy də dolanır bir cür,
Dəyişməz bu həyat heç zaman məgər?

Səri verdin aləmə ibrət, musiqi,
Yorardı insanı qəflət, musiqi,

Dinlərkən bu yorğun ürəklər səni,
Veirirsən onlara cənnət, musiqi.

Mələktək qazanıb səma, Şəhriyar,
İstər nadan ağzı yuma Şəhriyar,
Əbədi eşq ilə vurduqca qəlbi,
Yaşayar hər yerdə hüma Şəhriyar.

Əczaçı, məlumdur ki, dəva satır,
Xanəndə oxuyur, xoş səda satır.
Nəfəs almaq üçün bağa gedəndə,
Biri də biletlə boş hava satır.

## EYNŞTEYNƏ PEYĞAM

Eynşteyn,
Sənə yad adamdan odlu bir salam!
Əlbət ki, o yadı bağışlayarsan.
Ayıl bir gecədə, alatoranda,
Dəryalar keçərək, dağlar aşaraq,
Qırçın dalğaları yarıb-biçərək,
Səhər ulduzuna çatıb qoşaraq,
Sıxaraq köksünə gül şaxələrini,
(ö güllər Şirazın Sədiyyəsindən)
Qıvrım saçlarını dağıdıb gələn,
Şərqin nəsimidir, şərqin nəsimi!
Riyaziyyət Sultanı,
O şərq küləyi,
Bu uzun yollarda qovub səhəri,
Sənin əzəmətli gözə qəsrinin
Yanında haqlayıb sübhü açacaq.
Eynşteyn,
Ey böyuk, ey ulu düha!
Ona icazə ver hər şeydən qabaq
İpək saçlarını darasın bir an,

Bu Şərqin nəsimi öz əlləriylə,
Zərif şanə çəksin xəyallarına,
Açsın alnındakı qırışları da.
Bəlkə sənətkara, bəlkə sənətə
Elə nəvazişdir qalan dünyada.
Bu şərq küləyilə daban-dabana,
Bu uzun yollarda qovub səhəri,
Böyük Şərq şerinin dühası gəlir.
Başını söykəyib qoşa dizinə,
Fikir dəryasına qərq olub yenə,
Xəyallar taxtında əyləşmisən sən,
Diləkli gəlmişəm hüzuruna mən.
Qəlbimdə illərin min bir yarası,
Bu vaxtsız, gözlənməz gələn qonağa
Aç könül qapını,
Kim bilir bəlkə,
Elə dərdlərimin sənsən çarası.
Qəbul et şairi, qəbul et, ustad,
Əliboş gəlməmiş hüzuruna o,
Gəlib saf ürəklə, odlu ilhamla,
Xəyyamın, Hafizin öz kuzəsindən
Gəlmiş huzuruna bir dolu camla.
Qarşında hörmətlə diz çökərək, diz,
Sənə əhsən deyir, sənə mərhəba!
Elmin Allahısan, ey böyük düha!
Sənin tapıntınla, sənin dühanla
Doldurdu boşluğu nurun sürəti.
Zamansa qovuşdu əbədiyyətə.
Məkan məkansızdır,
Zaman zamansız.
Eynşteyn, mərhəba,
Eynşteyn, əhsən!
Sən elmi din ilə barışdırmısan.
Dedin: enerjidir maddə əzəldən.
Ürfan fəlsəfəsi tükü də seçir,
Bu ulu məktəbin şagirdiyəm mən.

Cism dünyasını ruh dünyasını
Dalğası sayıram, ancaq dalğası.
Maddədə əsalət, cəki görmürəm.
Sənə min bir əhsən, Fəqət min əfsus,
Hərif ilhamından, kəşfindən sənin
Bombalar düzəldir.
Dünya qopacaq,
Cahan çıxacaqdır öz məhvərindən.
Qarşında diz çöküb, yalvarıram mən.
Şairin gözündən yuxusu qaçmış,
Hərbin əjdahası, qorxunc, dəhşətli,
Cəhənnəm sayağı ağzını açmış.
Dünyanın axırı gəlib çatacaq,
Dolacaq həyatın son peymanəsi,
Qalxacaq göylərə ana fəryadı,
Tutacaq dünyanı "balam vay" səsi.
Köçəcək dünyadan rəhm, dəyanət,
Öləcək sədaqət, vfa, məhəbbət!
Dumana dönəcək insan ahları,
Bürünər zülmətə bütün kainat,
Yetər, sona yetər bu varlıq, həyat.
Ey ustad,
Arzusun eşit şairin!
Vicdan imperiyası eylə cahanı.
İşıqlı zəkanla, ulu dühanla.
Döndər sən behiştə, döndər dünyanı.
Qoy qəlbi, elmiylə fərqlənsin insan!
Qardaşlıq, sədaqət,
Bir də məhəbbət
Bayrağı altında birləşsin cahan!
Əlim ətəyinə ey böyük ustad,
Qəhər boğur məni, acı bir qəhər,
Nələr görməmişəm, dünyada nələr?
İnsan yarasına məlhəm et, məlhəm
Sən öz tapıntını, sən öz dühanı.

Bu daş ürəklərin, bu namərdlərin
Felindən xilas et, qoru dünyanı!
Nə milli fərq olsun,
Nə də irqi fərq.
Din də ayırmasın qoy millətləri,
Məhəbbət yaşatsın ulu bəşəri.
İnsan ayrılmasın insanlığından,
Bir bayraq altında birləşsin cahan.
Soruşmaq istərəm bir də ki, ustad:
Viran İran haqda eşitmisənmi?
Ora beşiyidir korifeylərin,
Orda doğulmuşdur Bu Əli Sina,
Görək dünya onu ulu dağ sana.
Mədəni vəhşilər tanısın onu,
Dünyanın ən böyük alim oğlunu.
Eynşteyn!
Bir az da irəli, ustad!
Elmin göylərində bir də qanad çal,
Ağıl dünyasında bir az da ucal,
Musanı, İsanı, Məhəmmədi də
Elə bir məqamda, bir zirvədə gör!
Sənin əlindədir qəlbin açarı,
Sənin əlindədir elmin açarı.
Bu eşqin, bu elmin, ağlın əlilə
Həll et, həll edilməz müəmmaları.
Köhnə qıfilları özün qırıb, at,
Cəhənnəm olmasın bəşərə həyat!
Bir az da irəli, ey böyük düha,
Çatarsan, bir az də qalxsan, Allaha.

## GECƏ GÜNƏŞİ

Yuxuda, ay cəmallım, - yatma dedi, - bu gecə,
Yatma, ta ki, gecənin günəşini görəsən.
Səhər nəql etdim ona yuxumu, - dedi, - get, get,
Elə məntək günəşi sən yuxunda görərsən.

## AYIN AYNASINDA

Gecələr aya baxıb, sevgilimi yad edirəm,
Ona əfsanə deyib, mən yenə fəryad edirəm.
Ola ki, aya, mənim nazlı nigarım baxacaq,
Bu xəyallara uyub, qəmli könül şad edirəm.

## HOQQA

Ey bafirın hoqqası altına düşən əbləh,
Bafırın xumarından niyə ibrət almadın?
Sən hoqqanı bafıra mindirəndə sevincək,
Onun min hoqqasını niyə yada-salmadın?

## *MÜLƏFƏRRİQƏLƏR*

### NAKAM ŞAİRƏ PƏRVİN ETİSAMİNİ YAD EDƏRKƏN

Pərvindir söz səmasında sönməz nurlu sitarə,
Bu ulduza aləm edir heyran-heyran nəzarə.
Ədəbiyyat cəbhəsində qələn, alsa kim ələ,
Çalışar ki, o Pərivinin sənətinə tuş gələ.
O, kəfənə bürünüb də olanda gözdən nihan,Məlum oldu,
ürəkləri alıb köçmüş dünyadan.
İlhamın öz gərdəyində gəlindi bu aypara,
Ulduzlardan gərdənbəndi, şəfəqlərdən zərxara.
Elə bakir gəlirdi o, doğulmuşdu pak nurdan,
Fələk onun dayəsiydi, beşiyisə - kəhkəşan.
Sonsuz, əngin bir fəzadır Pərvinin söz divanı,
Saya gəlməz ulduzları, bəzəmiş asimanı.
Hər birisi bir incidir, iki yüz gərdənbəndin,
Fələklərin qulağında zər sırğadır bu Pərvin.
Ərşin qüdsi ayətidir, əlçatmaz bir məqamdan,
Onu təfsir etmək üçün tapılmaz bir tərcüman.
Atasının dağı ilə alovlananda xirmən,
Pərvin o dəm qığılcımtək sıçradı o atəşdən.
Bülbüllərin naləsilə verəmmədi səs-səsə,
Gülüstandan çıxıb getdi, pay vermədi bir kəsə.
Əbədi bir həyat qurdu əsrlərlə dünyada,
Salacaqdır əsərləri onu həmişə yada.
Dərdə, qəmə çarə tapma mümkün isə_hər_zaman,
Təəssüf ki, bir ölümə çarə yoxdur, ah, aman!
Ey Şəhriyar, əl çək Pərvin atəşindən, yaxşı bil,
Bu oda can deyə bilməz, axı ürək daş deyil.

## BİLİK

İnsanlar biliklə hörmət qazanar,
Bunu heç bir zaman unutma, zinhar!
Bilməmək, bil günah sayılmaz müdam,
"Bilmhəm" deməkdən utanmaz adam.
Cəhli iqrar etmək səmimiyyətdir,
Haqqı danmaq isə alçaq sifətdir.
Düzlüyü özünə bir hünər bil sən,
Çəkinmə bilməyib üzr istəməkdən.
Ancaq avam ikən bəhs etsən, inan,
Dərhal bilinər ki, əsil avamsan.
Yalan zərər verər daim insana,
Yalançı bənzəyər məlun şeytana.
Günaha batarsan yalan deyərkən,
Hörmətdən düsərsən el içində sən.
İnsan hər bir şeyi bilə bilməz tam,
Bircə Allah bilər hər şeyi tamam.
Biliklə ucasan, bunu anla, qan!
Alim doğulmamış heç kəs anadan.
Bilməmək qədrini azaltmaz şəxsin,
Lakin öyrənməmək eyibdir, yəqin.
Əhrimən xisləti öyrənməməkdir,
Bu can düşmənini boğmaq gərəkdir.
Ar etmə biliyi əldə etməkdən,
Yoxsa ömür boyu boş qalar kəllən.
Öpməkçin müqəddəs bir mövqe varsa,
O da müəllimin əlidir, anla!

## BEHİŞT VƏ CƏHƏNNƏM

Cənnətdə vuruşdu Adəmlə Şeytan,
Allahın acığı tutduğu zaman,
Onları endirdi yerə haman dəm,
Dedi: buradadır cənnət, cəhənnəm.
Cənnətdir, olarsa sülh ilə səfa,
Dünya cəhənnəmdir, etsəniz dava.

Gör necə nadanıq, necə də aciz,
Şadlığı kədərə dəyişirik biz.
Məgər görməmişik cəngi-cahanı,
Od vurub yadırdı bütün dünyanı.
Yanğından otuz il keçsə də bu dəm,
Hələ də matəmə qərq olmuş aləm.
Bizə gah qəm verən, gah şadlıq verən –
Allah xatirinə çalışaq həmən.
Döndərək cənnətə bütün aləmi,
Olmasın hec kəsin kədəri, qəmi.

***

İsti qucağındır cənnətim, ana,
Ülfətim, şəfqətim, həsrətim ana.
Əlimdən alsa da ruzigar səni,
Gözlərim daima axtarar səni.

Şirin laylalarmın qulağımdadır,
Gözünün işığı çırağımdadır,
Əllərin beşiyi tərpədir, ana,
Dilinsə yalvarır göy asimana.
Axı bu gecəli-gündüzlü karvan,
Sənsən bu karvanın başında sarban.

Səsindir karvanın həzin ahəngi,
Laylayın olmuşdur dəvələr zəngi.
Yuxuda, xəyalda səninləyəm mən,
Sənin həsrətindir saçımdakı dən.

Laylayın ruhumda səslənir mənim,
Könlüm şəfqətinlə bəslənir mənim,
Daima duyuram qüdsiyyətini,
Uca xislətini, ülviyyətini.

Evdə nəyə baxsam nəzərdə sənsən,
Sənin varlığını unutmaram mən.
Vardır hər guşədə səndən nişanə,

Sən işıq saçırsan bu xanimanə.
Ananın qədrini bilərsə külfət,
O evdə qol-qanad açar məhəbbət
Analı evlərdə cənnət yaranar,
Anasız evlərdə həsrət yaranar.

Döşlərin bir şirin ceşmədir, ana,
Bütün həyatımı borcluyam sana.
Behişt nəğmələri sənin səsindir,
Ruhumu oxşayan pak nəfəsindir.
Ana, qüssələrin qüssəmi aldı,
Gözüm nağılların dalınca qaldı.
Sənin pənahında qaldıq bir zaman,
Qorxmadıq divlərdən, damdabacadan.
O doğma qucağın olduqca sipər,
Qorxuda bilmədi bizi ifritlər.
Ana qayğısını görmüşsə hər kəs,
Onu, mənim kimi, unuda bilməz.
Yetimlik titrətsə söyüdtək canı,
Yəqin ki, dərk etməz əsil ananı.
Bir şagird anadan yetim qalarsa,
Onun qaşqabağı açılmaz əsla,
Ananın südündən doymadan uşaq,
Yetimlik çəngində inləyər ancaq.
Ananın südüdür bizi güldürən,
Ananın südüdür bizə ruh verən.
Kimə ki anası şirin can olar
Həyatı boyunca mehriban olar
Ana sevgisini görməyən bir kəs,
Heç kəsi bəladan qurtara bilməz.
Hörmət pərdəsini yırtanlar yəqin,
Uşaqkən görməmiş ana ülfətin.
Anacan, biz çətin hala düşərkən,
Cənnətə döndərdin cəhənnəmi sən.
Ana, gülüşünlə üfüqlər gülər,
Səmadan elə bil şadlıq tökülər.
Sənin şadlığınla yox olar dərd, qəm,
Ağlasan matəmə bürünər aləm.

Ölüm aparsa da cismini, ana,
Sənsən həyat verən cisminlə cana.
Olmuş gül camalın mənə gülüstan,
Könlün qəm evində nurlu çırağsan.
Sənin göz yaşların səfamı almış,
Məni məhəbbətin oduna salmış.
Sınmış rübabımın sənsən fəğanı,
Sayəndə yaratdım mən bu divanı.
Sənə oxuyardım şerimi müdam,
Sən getdin, yüz qüssə qaldı natamam.
Həmişə ümidlə gözlərdin məni,
Mən isə ümidsiz gözlərəm səni.
Yadıma düşdükcə əzablı günlər,
Ürək kabab olur, odlanır ciyər.
Balalar yolunda keçdin canından,
Sən getdin, dağıldı sanki xaniman!
Ey ana, üzünü görmərəm daha,
Sən getdin, ümidim qaldı Allaha.
Sənin duan ilə yaşayıram mən,
Behiştlik olaram sən razı getsən.
Gözünlə baxsalar əgər dünyaya,
Heç kəsin qəlbində qalmaz kin, riya.
Allah rizasıyla baxır analar,
Ana sevgisində müqəddəs güc var.
Bir uşaq qanına qıysa bir barmaq,
Ana qarğışından cəza alacaq.
Xain çıxsa əgər bir qız, bir oğlan,
Qurtarmaz ananın ahü-vayından.
Ana hörmətini saxlamayan kəs
Ömrü boyu hörmət qazana bilməz.
Bəşərdə anaya ehtiram olsa,
Tökməz bir-birinin qanını əsla.
Dünyanı fəth etsə ana hörməti,
Yaradar dünyada əsil cənnəti.
Belə söyləmişdir böyük Məhəmməd:
"Ana ayağının altıdır Cənnət".

## BƏDBƏXTLİK

Gedir bədbəxtliyin ardınca bu avarə iranlı,
Qara bəxtini istiqbal edir biçarə iranlı.
Küçə, meydançada fal açdırır bədbəxt arvadlar,
Durub rəml atdırır rəmmalə, bəxti qarə iranlı.
Gəda divar küncündə elə cansız dayanmışdır,
Deyərsən ki, şəkil çəkmiş uçuq divarə iranlı.
Zülm qəsrində dustağəm, gözüm qan-yaş tökər daim,
Aman Allah, necə dözsün bu ahü-zarə İranlı.
Şınm açnnşdır alnında qoca vaxtda riya xətti,
Niyə möhtac o!ub ya reb, niye idbarə iranlı?
Dağılmışdtr könül mülkü, qəmin sultanı hökm eylər,
Gözəl Yusifini çəkmiş yenə bazarə iranlı.
Sən öz çiynində, öz azuqəni düşmənlərə çatdır,
Utanma əhl-əyalından, satıl əğyarə, iranlı!
Bizi qoymuş siyasətlər od ilə su arasında,
Nə vaxtdandır yad əllərdə çəkilmiş darə iranlı.
Elin amalını əks etməlidir məclisi-şura,
Cəhalət Kəbəsi məclis, dönüb zəvvarə iranlı.
Talanmış mərkəz əmrilə bizim ucqar vilayətlər,
Bizə yad olduğunca, doğmadır yadlara, iranlı.
Nədir atomlar əsrində cəhalət sehrinə düşmək?
İtirmiş ağlını vallah, açıq-aşkara iranlı.
Ümidin bar verər bəlkə, ümidsiz, Şəhriyar, olma!
Çıxar ağ günlərə bir gün, bu bəxti qarə iranlı.

## CAMAL VƏ KAMAL

Bizim ki, süfrəmizdə yavan çörək də yoxdur,
Toxa nə var, yoxsula quru əppək də yoxdur.
Bir ərizə yazaraq, iş istədim rəisdən,
Cavab verdi: iş yoxsa, işə istək də yoxdur.
Əgər pozun alisə, cibin xalisə sənin,
Mənim ki, ürəyimcə şalvar-pencək də yoxdur.
Səy ilə bu ölkədə işlər getmir irəli,
Bir tufan qoparmağa qızıl şimşək də yoxdur.

Dar gündə sevgilimin sözündən başa düşdüm,
Çörəksiz bir məkanda sevən ürək də yoxdur.
Acam bir diyarda ki, baha deyil çörəyi,
Neylərik qıtlıq olsa, arzu-dilək də yoxdur.
Qış günü pambıqdan ağ, üzüm kömürdən qara,
Ocaqda yandırmağa quru təzək də yoxdur.
Nə camaldan, nə də ki, kamaldan pay almışam,
Həsrətinə yanmağa bir şux mələk də yoxdur.
Şikayətçi dünyadan bir sənsənmi, Şəhriyar?
Çoxunun süfrəsində yavan çörək də yoxdur!

## TƏBRİZ ŞƏHƏRİ

*Təbriz şəhərinin dörd darvazası var. Hər darvazada iki üzlü bir tablo asılmış və tabloların hər iki üzündə Şəhriyarın bir beyti yazdmışdır.*

GİRİŞ: Təbrizdir, aləmə yayılmış səsi,
Şəmsin ana yurdu, Rumun kəbəsi

ÇIXIŞ: Kəbə havası var başında əgər,
Get, xeyir aparar burdan gedənlər.

GİRİŞ: Təbrizdir, tarixlər görmüş ixtiyar,
Onun dünya boyda əzəməti var.

ÇIXIŞ: Səfərin yaxınmı, səfərin uzaq,
Olsun saf ürəklər yoluna ortaq.

GİRİŞ: Təbriz, inqilablar ocağı Təbriz,
Aslanlar, şahinlər oylağı Təbriz.

ÇIXIŞ: Xoş getdin, müsafir, gözlərim üstə,
Məndən xeyir-dua yoluna istə!

GİRİŞ: Təbrizdir, qonağa qurban edər can,
Sürməsi qonağın yol qubarından.

ÇIXIŞ: Canan şəhərilə ülfət saxladın,
Yükü can telilə çəkib bağladın.

## TEHRAN VƏ TEHRANLI

*Bir azərbaycanlı əsgərin gileyi*

Sən ey münsif, özün söylə, bu iranlı
Nələr çəkmiş bu Tehrandan?
Nə möhnətlər görüb, ya rəb?
Fəlakətdir böyuklük eyləyə nadan.
Necə rəhbər çıxar səndən?
Əzəldən naşısan, naşı.
Deyirsən ki, yeyir rəştli balıq başı,
Bu Tus əhli özəldən kəlləxar olmuş.
Deyirsən ki, Qum əhli, İsfahan əhli
Betərdən də betər olmuş.
Cavan mərdanə-Azərbaycansa türkəxər olmuş.
Oda yandıldılar İranı,
Hey yelpik çalırdın sən,
Ayə, tehranlı, insaf et, də
Eşşək sənmisən, ya mən?

Sən əhli paytəxtsən,
Leyk, sənde tərbiyət yoxdur.
Mənim sən eybimə güldün,
Özündə mərifət yoxdur.
Səni vəsf etməyə mən neyləyim ki,
Bir cəhət yoxdur.
Mənə bu bəsdi ki, daim
Ayırdım dostu düşməndən.
Ayə, tehranlı, insaf et, de.
Eşşək sənmisən, ya mən?

Gedib çək nəşəni,
Sonra haray sal, eylə bədməstlik.
Sənə məxsusdu düşkünlük,
Bu ayrıseçkilik, tərslik.
Sənə layiqdi namərdlik,
Qatı düşmənçilik, sərtlik.
Mən aşkar, sən riyakar,
Basqa qiymət gözləmə məndən.
Ayə, tehranlı, insaf et, də,
Eşşək sənmisən, ya mən?

Kollec qurtarmısan,
Bəlkə sanırsan nurlu dünyasan?
Fəqət sən adidən adi,
Nə Farabi, nə Sinasan.
Özün öymək, fəqət başqasına
Yüz min yamanlar söyləmək asan.
Sən aldın parta ardında
Xəyanət dərsi düşməndən.
Ayə, tehranlı, insaf et, de
Eşşək sənmisən, ya mən?

Elə sandım mənimlə bu diyarda
Sən də həmdərdsən,
Səni mən mərd sandım,
Bilmədim ki, böylə namərdsən.
Bizə qarşı zülmkarsan,
Bəli, soyğunçusan, sərtsən.
Həmişə düşmənə dostsan,
Həmişə dostuna düşmən.
Ayə, tehranlı, insaf et, de
Eşşək sənmisən, ya mən?

Məni qafqazlı qardaşlar
Həmişə sənlədi "qardaş".
Min hörmət görmüşəm türkdən,

O olmuş qəlbimə sirdaş.
Fəqət Tehranə gəldim,
Gözlərim tökdü yenə qan-yaş.
Mənə düşmən kimi baxdın,
Nə yerdə olmuşam düşmən?
Ayə, tehranlı, insaf et, de
Eşşək sənmisən, ya mən?

Mən İranın yolunda baş qoyub,
Bu yolda can verdim.
Vətənpərvər mənəm, mən,
Mən bu yolda imtahan verdim.
Sənə hər yerdə, hər işdə
Bu ömrü ərməğan verdim.
Çölündən bir tikan dərdim,
Sənə bir asiman verdim,
Xeyanətdən, zülümdən özgə
Mən nə görmüşəm səndən?
Ayə, tehranlı, insaf et, de
Eşşək sənmisən, ya mən?

Çün ustadi-dəğəl aldı ələ
Bir gün məhək daşın,
Məni atdı, səni tutdu,
Xəyanət oldu sirdaşın.
O gündən getdi Tehran da,
Kərəc də, sağ ola başın,
Səni tək gördü meydanda,
Qımışdı əcnəbi düşmən,
Ayə, tehranlı, insaf et, de
Eşşək sənmisən, ya mən?

O gündən məmləkət döndü,
İbarət oldu Tehrandan.
Dağıldı yurdumuz,
Ağlar ürək cəmi-pərişandan.
Bu sərgərdan cəmiyyət

Səndən oldu dərbədər, giryan.
Vətəni satdın yada,
Düşmənlərə daim satıldın sən.
Ayə, tehranlı, insaf et, de
Eşşək sənmisən, ya mən?

Sənin düz yolların
Kindən, inaddan böylə kəc oldu.
Sənin fikrincə İran
Bircə Tehranla Kərəc oldu.
Sənin arzunla Azərbaycan
Üzvi-fələc oldu.
Fəqət bizdən sənə, ancaq
Sənə bizdən fərəc oldu.
Gülü sən xar gördün,
Gülşəni güxən.
Ayə, tehranlı, insaf et, de
Eşşək sənmisən, ya mən?

O vaxtacan ki, arxan
Od diyarı Azəristandı,
Hərasan olmadın bir kimsədən,
Düşmən hərasandı.
Niyə Lor, Kürd olub yağı,
Onlarla müşkül asandı.
Hanı o mərd Qaşqaylar,
Sənin zülmündən, artıq
Bir haraylar qaldı, bir haylar.
Necəsən, "pəhləvan", indi?
Nə ox qalmış, nə də cövşən,
Ayə, tehranlı insaf et, de,
Eşşək sənmisən, ya mən?

Daha buğda alammazsan
Nə Simnandan, nə Zəncandan.
Düyü Rəştdən, balıq Rəştdən,

Çay almazsan Lahicandan.
Bu qıtlıqdan, bu müşküldən,
Çətin ki, qurtarasan can.
Nə əkdinsə, onu dərdin,
Daha torban boşaldı
Buğdadan, dəndən.
Ayə, tehranlı, insaf et, de,
Eşşək sənmisən, ya mən?

## YETİM UŞAQ

Öz doğma diyarında çəkdin nələr, ey yetim,
Ayaqyalın, başaçıq, ac, dərbədər, ey yetim.
Axan göz yaşın kimi niyə qiymətsiz oldun,
Açılmamış qönçəsən, niyə gül kimi soldun?
Qəminlə ürəyimi gəl, dağlama, ey yetim,
Həsrətli göz yaşımsan, sən ağlama, ey yetim!

Bağbansız sütül ağac, yandım sənin halına,
Necə dözüm bu acı, dözülməz əhvalına?
Dinlədim ürəyinin kədər, qəm nəvasını,
Günahkar millətindir, sən çəkdin cəzasını.
Məktəb sənin dərdinə eylər əlac, ey yetim,
Ayaqyalın, başaçıq, ac, yalavac, ey yetim!

Ölkən düşünsə idi sənin səadətini,
Duya bilsəydi elmə tükənməz rəğbətini,
Əl açıb dilənməzdin, bu böyük hümmətinlə,
Yandırmazdın məni də kövrək təbiətinlə.
Öz doğma diyarında çəkdin nələr, ey yetim,
Ayaqyalın, başaçıq, ac, yalavac, ey yetim!

İstəyini ödədim, fəqət məlul, pərişan,
Mən küllün fikrindəyəm, sən cüzin hayındasan.

Sənə pul yox, tərbiyə, təlim, təhsil gərəkdir,
Sənisə düşündürən bircə günlük çörəkdir.
Məktəb sənin dərdinə eylər əlac, ey yetim,
Öz yurdunda dərbədər, ac, yalavac, ey yetim!

Sınıq sazdır ürəyin, dilə gəlsə danışar,
Bir qığılcım düşərsə, məşəl kimi alışar,
Millət qəflətdə yatır, xəyanətkardı dövlət,
Bircə nəzər yetirmə sənə, mənə hökumət.
Sən bu biganəlikdən çəkdin nələr, ey yetim,
Ayaqyalın, başaçıq, ac, yalavac, ey yetim!

Bu ölkədə rəhmlə ədalət də qalmamış,
Yetim-yesirə xalqda mərhəmət de qalmamış.
Mənimsədi qəyyumun sənin də var-yoxunu,
Belə gördüm dünyanı, belə gördüm çoxunu.
Öz doğma diyarında çəkdin nələr, ey yetim,
Ayaqyalın, başaçıq, ac, yalavac, ey yetim!

Dilini bağladılar, bir dərdin açılmadı,
Fitri istedadından qığılcım saçılmadı,
Ötdü bahar, ötdü yaz, açılmadı bir gülün,
Niyə basa çatmadı sənin təkamül yolun?
Məktəb sənin dərdinə eylər əlac, ey yetim!
Ayaqyalın, başaçıq, ac, yalavac, ey yetim!

## TİRYƏKİ TƏRK ETMƏK HƏBİ

Tiryəki tərk eyləmək həbini hazırlayıb,
Zəhərlə qarışdırıb, verdilər cəmaətə.
Ondan yaxşılaşmadı fəqət kimsənin hafı,
Cəmaəti saldılar daha ağır zillətə.
Bu həbləri atanlar can tapşırdı ordaca,
Xalqa qəsd eyləyənlər, görüm gəlsin lənətə.
İnsanların canına qəsd eyləyən zəhərə,
Ölüm həbi deyilsə, uyğundur həqiqətə.

## QUMARIN BƏLASI

Qumara qurşanma, ey cavan oğlan,
Qumar bir bəladır, başdan-binadan.
Öz cavan ömrünü eyləmə hədər,
Ora ixtiyarsız gedir gedənlər.
Tikandan gül bitər, görmüsən ancaq
Qumardan gül bitə bir gün, bir sayaq?
Qənilər görmüşəm, qəni necə də,
Gədaya dönmüşlər bircə gecədə.
Həyalı cavanlar tökər həyasın,
Səpər ayaqlara könül ziyasın.
Gecə gövhər sayan səhərə qədər,
Səhər gövhər kimi göz yaşı tökər.
İşıq gündüzünü vermə zülmətə,
Salma öz ömrünü min bir zillətə.
Adını, abrını gəl vermə bada,
Qumar evlər yıxmış, evlər dünyada!
Onun qurbanları saysız, hesabsız,
Qara torpaq örtür üstünü yalnız.
Qumarbaz nabələd oğruya bənzər,
Canı pul yolunda itirib gedər.
O, qurddur, içindən yeyər ağacı,
Polad iradədir onun əlacı.
Qumarda udmaq yox, odur, çox qabaq
Uduzmaq demişlər qumara ancaq.

## İŞBİLƏN

Sən bağban, fikrində ol, torpaq qayğı çəkəndir,
Bağban şoranlıqda da becərəndir, əkəndir.
Dağıdandır, pozandır bu dünyada ağılsız,
Müdrik dövlət başçısı kərpic-kərpic tikəndir.
Nə gözel söyləmişdir bu dünyada atalar:
Çörəyi çörəkçiyə ver, dərdini çəkəndir.

# ŞƏRHLƏR, COĞRAFİ VƏ ETNİK ADLAR

## ŞƏRHLƏR

### Heydərbabaya salam

*Şəhriyar "Heydərbabaya salam "poemasının birinci hissəsinə yazdığı müqəddimədən əlavə əsərin sonunda şərh və izah da yazmış, adları çəkilmiş şəxslərin, yerlərin və bir sıra məsələiərin mahiyyətini, söylənilən fikirlərin səbəbini aydınlaşdırmışdır. Şəhriyarın həmin şərh və izahlarının tərcüməsini də ixtisarla veririk. Bax: Divani-türki. "Sabah ", 1993.*

**Birinci bənd:** *Heydərbaba* Təbriz yaxınlığında dağ adıdır.

**İkinci bənd:** *"Novruzgülü"* və *"Qarçiçəyi"* ilkbaharda ərimәkdə olan qarın altından baş qaldıran iki gözəl çiçəyin adıdır; birisi bənövşəyi libas geymiş həyalı və utancaq gəlinə bənzər; ikincisi ağ geyinmiş şən və fərəhli aşiqi xatırladır.

**Səkkizinci bənd:** *Mirəjdər* - məşhur bir çavuşun adı.

*Aşıq Rüstəm* - şöhrətli bir çalıb-oxuyanın adı.

**Doqquzuncu bənd:** *Şəngülava* - öz gözəl bağ-bağçası ilə şöhrətlənən bir kəndin adı.

*Aşiq alması* - bir üzü sarı, bir üzü qırmızı olan dadlı-sulu alma növüdür.

**Onuncu bənd:** *"Quru göl"* - Tehrana gedən yolun kənarında Şibli dağının ətəyində yerləşən böyük bir gölməçədir ki, orada çoxlu vəhşi qaz, ördək və digər su quşları var. Yayda suyu sahildən çəkiləndə ona Quru göl deyirlər.

**İyirmi beşinci bənd:** Kənd toyunun müxtəlif mərasimlərindən biri də budur ki, aydınlıq əlaməti olsun deyə bir dəstə piltə, bir kasa islanmış həna siniyə qoyulur, bunu qonaqların içərisində gəzdirirlər.

Hərə bir piltə və hənadan bir qədər götürür, Öz imkanına görə yerinə pul qoyur. Toplanan məbləğ yengəyə və məşşatəyə verilir.

Kənd toyunun digər mərasimi də budur ki, gəlini ata mindirib bəy evinə gətirəndə kürəkən dama çıxıb, qabaqcadan çərtilmiş almanı var gücü ilə gəlinin ayağı altına vurur ki, yerə dəyib parçalansın. Toxluq əlaməti olan almanın parçalanması onu gösətərir ki, onlar bütün ömrü boyu heç vaxt bir-birlərindən ayrılmayacaqlar.

**İyirmi yeddinci bənd:** Kənd evlərində damın ortasında baca olur, bu da havanı dəyişmək, evə gün və işıq salmaq, həm də təndirin tüstüsünü xaric etmək üçündür. Bunlardan əlavə bir sıra digər işlər də bu bacaların vasitəsilə görülür ki, mən "Gecənin əfsanəsi" adlı şerimdə bu haqda geniş danışmışam. O cümlədən adaxlıbazlıq işində bu bacaların mühüm rolu vardır. Bir də ki, Novruz bayramı gecələri şal sallamaq mərasimi bu bacalar vasitəsilə aşağıda izah etdiyimiz kimi həyata keçirilir. İlin axır çərşənbəsindən sonra kəndin gəncləri və uşaqları özlərini tanıtdırmadan axşamçağı (şər qarışanda) "damlara gedib bayrmalıq tələb edirik" deyə, öz əlvan şallarını həmin bacalardan içəri sallayırlar. Ev sahibi öz zənni sayəsində şal sahibinin kim olduğunu güman edib, onun şəxsiyyətinə görə şalının ucuna bayramlıq bağlayır. O vaxtın bayramlığı güllü yun corablar, ipək dəsmallar, dodaq sazı, şirni xoruz, boyanmış yumurta, noğul, kişmiş, şirni və bu kimi şeylərdən ibarət idi. Bu həm də bayramda uşaqları, xüsusən, yoxsul uşaqlarını sevindirməkdən, qəlblərini almaqdan ötrü, kənd bayramının, el şənliyinin ən fərəhli və təntənəli mərasimlərindən biri idi.

**İyirmi səkkizinci bənd:** O ili mənim nənəm rəhmətə getmişdi. Buna görə biz bayram mərasimində iştirak etməməliydik, ancaq mən uşaq idim, başım çıxmırdı, şıltaqlıq edib, dava-dalaşla bir şal alıb, qonşumuz Qulam xalaoğlugilə qaçdım, dama çıxıb bacadan şalı salladım. Qulam xalaoğlunun anası rəhmətlik Fatma xala dərhal şalın mənimki olduğunu bilib, mərhum Xanım nənəmi yada salıb, ağlaya-ağlaya şalına bir cüt corab bağladı. Hələ də mələklərdən gözəl o kəndli qadının ilahi siması mənim gözlərim önündə unudulmaz bir lövhə kimi canlanır.

**İyirmi doqquzuncu bənd:** *Mirzəmməd* - Mirzə Məhəmməd deməkdir. Onun Heydərbaba dağının ətəyində gözəl və səfalı bir bağçası var idi. Mənə və yoldaşlarıma istədiyimiz vaxt oraya getməyə icazə və hər cür azadlıq vermişdi.

**Otuz birinci bənd:** Azərbaycanda bir ənənə olaraq il axır çərşənbə gecəsi su üzərindən atılıb bu sözləri oxuyurlar:

*Baxtım mənim, səid baxtım, bərəkəllah,*
*Ağ əllərə həna yaxdım, bərəkəllah,*
*Atılmatıl çərşənbə,*
*Baxtım açıl, çərşənbə!*

Tehranda isə su əvəzinə od üzərindən atlanıb, başqa bir şeir oxuyurlar...

**Otuz dördüncü bənd:** Kənd uşaqlarının əyləncələrindən biri də budur ki, axşamçağı naxır və sürü çöldən kəndə gələndə qoduqları naxırdan ayırıb geridə saxlayırlar. Naxır müəyyən bir məsafə uzaqlaşanda, onları minib çapırdılar; çavuşları yamsılayaraq hay-küy salıb oxuyurdular. Bəzən də heyvan sahibləri hadisədən xəbərdar olub etiraz edirdilər. Mühakimə başlanardı. Onda uşaqlar özlərini müdafiə etməli olardılar.

**Otuz yeddinci bənd:** *Şüca xalaoğlu* - igid və gözəl bir gənc idi. Bakı şəhərindən qayıdanda özü ilə çoxlu gözəl sovqatlar getirmişdi. Göyçək nişanlısı ilə toy etmək istəyirdi. Yaxşı da qarmon çalardı. Hər gün ikindi çağı damda büsat qurardı. Samovarı qaynardı, kəndin gənclərini başına toplayıb, deyib-gülərdi. Təəssüf ki, tale onun həyatını bir faciəli kinoya çevirdi. Bədbəxt, toy ərəfəsində yatalaq xəstəliyi tutub öldü.

**Otuz səkkizinci bənd:** *Nənəqız və Rəxşəndə* - mənim qohumlarımdan və uşaqlıq yoldaşlarımdan idilər.

**Otuz doqquzuncu bənd:** Novruz bayramı qabağı soyuqlar ötüb hava bir az qızışmağa başlayanda uşaqlar *"qar gülləsi"* oyunun oynamağa başlayırlar, gənclər də qar üstə kürəklə sürüşürdülər. Bunu bir nüv kəndin xizək idmanı adlandırmaq olar; o, xeyli məharət, bacarıq ve çeviklik tələb edir. Həm də oturub züyüldüyünə görə xizək oyunundan daha maraqlı və rahatdır.

**Qırxıncı bənd:** *Teşi* - otdöyən şəklində olan bir növ toxuculuq alətidir (iy) ki, nazik bir çubuq vasitəsilə kənd qadınları onu fırladıb, dizləri üzərində topladıqlan ağ yunu və ya pambığı əyiririlər. Bu bəndə buludlara bürünmüş günəş o teşiyə bənzədilmişdir.

**Qırx birinci bənd:** Qış günləri səhər tezdən bibim təndiri yandırıb, ev-eşiyi yığışdırıb, səhmana salıb, yenidən kürsünü qurardı. Bunun üçün qabaqcadan evdəkilərin kürsünün altından çıxıb başqa yerə getmələri tələb olunurdu. Ancaq bu yerdəyişmə biz tənbəllərin xeyrinə deyildi. Xüsusən bibimin qoca əri heç vəchlə isti kürsünün altından çıxıb yerini dəyişmək istəməzdi. Bacardığı qədər bu yan-o yan edərdi, yubandırardı. Həm də bibimdən qorxduğu üçün bir növ ehtiyatla onunla danışardı. Bibimin hirsli-hirsli dişlərini qıcaması, onların arasında gedən mübahisə və danışıqlar, doğrudan da bizim üçün çox maraqlı olardı.

**Qırx üçüncü bənd:** *Vərzəğan* - o vaxtlar meyvəsi bol olan bir kəndin adıdır. Oradan ətraf kəndələrə çoxlu meyvə aparılıb satılardı. Vərzəğandan gələn armudsatanların səsi uşaqların ruhunu oxşayardı. Müamilə də nəqd yox, əmtəə ilə olardı, hər kəs bir ovuc arpa-buğda verib, bir qədər armud alardı.

**Qırx dördüncü bənd:** *Mirzə Tağt Bağırzadə* - mənim bibim oğlu idi. Bir gecə onunla çaya gedib, aya baxdıq. Ay suda qərq olan bir adam kimi sanki qol-ayaq çalırdı. Təzəcə mənim şairlik zövqüm ilhama gəlmişdi ki, birdən çayın o tayında bir cüt şölə yanar çıraq kimi diqqətimizi cəlb etdi. Eyvay, qurddur, deyə qayıdıb qaçdıq, yol baş-yuxarı idi, birtəhər oranı dırmaşdıq, elə qorxmuşduq ki, artıq mənim ayaqlarım getmirdi. Yeriyə bilmirdim, çox zəhmətlə, saralıb əsə-əsə evə gəlib çıxdım. O gecə hələ yorğan altında da uzun müddət özümə gəlməmişdim.

**Qırxıncı bənd:** *Molla İbrahim* – mənim ustadımdır. O, həqiqətən, çox fazil bir kişidir. Mənim yadımda olan son 45 ildə məktəb açıb, tədris işi ilə məşğul olub, camaatın dadına çatmışdır. İndi də mahal əhli ona müraciət edir, ondan məsləhət alır. Hazırda bir çox şöhrətli adamlar vaxtilə onun tələbələri olmuşlar. Çoxlrı öz inkişaflarında ona borcludurlar. Kimsədən kömək gözləməz, son dərəcə izzəti-nəfslə, azadəliklə yaşayır. Kiçicik tarlasından əldə etdiyi məhsul onun yeganə gəlir mənbəyidir. Həyatmın bütün illərini ya öz tarlasında çalışıb, ailəsi üçün ruzi əldə etməklə, ya da ki, kənd uşaqlarını başına toplayıb, məktəbdə tədris işi ilə məşğuldur. Məktəblilərdən muzd və əmək haqqı almaz.

**Qırx səkkizinci bənd:** Ailəmiz Təbrizdə olduğu zaman böyük bibim hər ildə bir dəfə Təbrizə gələrdi. Rəhmətlik atam vəfat edib, ailə Tehrana köçdükdən sonra bibimin Təbrizə gəldiyini eşidəndə hamımız kədərlənib deyərdik: görəsən, yazıq bibimin əhvalı bizsiz necədir, harada qalır? Bu bənd məhz o hisslərə həsr olunmuşdur:

**Əlli birinci bənd:** *Qıpçaq* - dağətəyi kəndlərdən biridir. Uşaqlıqda əmioğlum Mahmud Nur Azəriə bir dəfə oraya qonaq getdik. Bir neçə gün qalıb, səyahətlə, at çapmaqla məşğul olduq.

**Əlli ikinci bənd:** *Qarakol* - Heydərbabanın böyründəki bir dərənin adıdır ki, Qayışqurşaq kəndi ilə mənim ata-baba yurdum olan Xoşginab kəndini birləşdirir.

**Əlli dördüncü bənd**: *Ağa Mir Qafar* - Xoşginabın görkəmli seyidlərindən idi ki, mərhum Mustəfiəlməmalikin dostu olan rəhmətlik Hacı Mir Şərifdən sonra Təbrizdə və Tehranda hamıdan artıq tanınmışdır. Xoşsurət, xoşsöhbət, səxavətli və şücaətli bir adam idi, Tündməzac olsa da, yeri gələndə həqiqət tərəfdarı olub, haqq üstdə əsib, haqsızı qılınc kimi kəsərdi. Onun zarafatları, məclislərdə söylədiyi incə, şirin sözləri və lətifələri onu bir sənətkar səviyyəsinə qaldırardı. Bu günün dili ilə desək, o, bir çox komik və əxlaqi pyeslərin həm müəllifi, həm də ifaçısı idi.

Rollarını çox yaxşı oynayardı. O olan məclisdə hamı gülməkdən az qala huşunu itirərdi. Məsələn, Nəsrəddin şah vəfat edəndə vəliəhdi Müzeffərəddin şah Təbrizdən Tehrana gedəndə çox məhzun va kədərli idi, göz yaşlarını saxlaya bilmirdi, saray xadimləri şahın kefini bir qədər açmaq üçtin Ağa Mir Qafara müraciət edirlər. O dərhal şahın, atının cilovundan yapışır, zarafata başlayır, iş o yerə çatır ki, şah gülməkdən qəşş edib az qala atdan yıxılacaqdı, fəryad edir ki, gəlin məni seyidin əlindən qurtarın.

Ozünün kiçik bir malikanəsi var idi, bundan gələn gəlirlə ailəsini dolandırırdı. Dövlətlilərdən aldığını da fəqirlərə paylardı. Onun sarayında o zamankı Xoşginabm kəndliləri də şal və tirmə arxalıq geyərdilər.

**Əlli beşinci bənd:** *Mərhum Mir Mustafa* dayı atamın dayısı idi. Uca boylu, iri gövdəli, enli, qalın saqqallı, məşhur rus yazıçısı və filosofu Tolstoyu xatırladan bir adam idi. Ruhu etibarilə də Firdovsiyə oxşayardı. Çox epik şerlər və qəhrəmanlıq dastanlarını əzbərdən bilirdi.

Yerində oxuyurdu, hətta onun adi danışığı belə bir təşbeh, istiarə və başqa-başqa oxşatmalar ilə dolu idi. Bəzən də maraqlı və gülməli danışardı. Məsələn, bir gün qadının uzun burnunu insanların gözünü nişan alan qoşa lüləyə bənzətdi. Şəhərdə o qədər şöhrət sahibi deyildi, ancaq kəndlərdə böyük şöhrətə malik adlı-sanlı şəxsiyyət idi.

**Əlli altıncı bənd:** *Məcdəssadat*- mərhum Ağa Mir Ətaullah rəşid və xoşəndam bir kişi idi. Hündür boya, cazibəli simaya, uca geniş alma, yanar yaşıl gözlərə malik idi. O da mərhum Ağa Mir Qafar kimi həmişə qaynayıb aşıb-daşardı, həm də çox zarafatcıl və məclis yaraşığı idi. Musiqini çox sevərdi. Uşaqlarını musiqi öyrənməyə təşviq edərdi. Qəhri mehrindən üstün idi. Hər halda Xoşginabın görkəmli şəxslərindən birisi idi.

**Əlli yeddinci bənd**: Mənim rəhmətlik atam *Hacı Mir Ağa Xoşginabi* xoş sifətli bir seyid idi ki, ilk baxışda onun zatən əsil-nəcabəti dərhal özünü göstərərdi. Qrta boylu, xoş sifətli, ağır təbiətli, şirin söhbətli, iti baxışlı və çox səxavətli idi.

Onun süfrəsi həmişə açıq olardı. Ailə üzvlərinin sayı 30-40 nəfərə çatardı. Onun qapısı istər kəndli olsun, istər şəhərli, hamınm üzünə açıq idi. Həddindən artıq şeri və musiqini sevəndi, hər cür hünəri, sənəti ürəkdən alqışlardı. Özü də gözəl xəttat idi. İri məşqi-xətdə mərhum Xoşnəvisbaşının, xırda yuzıda isə mərhum Əmir Nizam Kərrusinin tələbəsi olmuşdu. Adətən çox toxtaq, yumşaq, incə və mülayim məcaz bir adam idi. Lakin bəzən də şiddətli əsəbi olaraq, bərk qəzəblənərdi. Bu zaman tükləri biz kimi qalxıb, gözləri qızarardı.

Atam ixtisası olan hüquq elmində və məhkəmə işlərində çox bilikli və təcrübəli idi. Bir çox ixtilaf və hadisələrə barışıqla son qoyardı, haqsızları, nə qədər pullu və nüfuzlu olmalarına baxmayaraq rədd edər, haqlıları müdafiəyə qalxardı. Yoxsul və məzlum insanların dadına çatar, qayğısına qalardı, bəzən də öz cibindən onlara xərclik verib mənzil şəraiti yaradardı. Doğrudan da o bütün ömrünü məzlumların haqqını müdafiədə başa vurdu. Zahirdə hamı ilə uyuşar, qaynayıb-qarışardı, ancaq son dərəcə pak, insaflı və ədalətli şəxs idi. Sözü o vaxtkı alimlərin yanında çox mötəbər idi. Xoşginab seyidlərinin içərisində, zənnimcə, iki nəfəri: mərhum Hacı Mir Ələkbər Xoşginabi, bir də mənim atam çox yüksək səviyyədə durub, höyük şöhrət və şəxsiyyət sahibi idilər. Allah onların hər ikisinə rəhmət eləsin.

Atam dəfələrlə arzulardı ki, qədr gecəsi vəfat etsin. Belə də oldu 1313-cü (şəmsi) ilin ramazan ayının 23-də obaşdan səhər azanına yaxın qəfildən beyninə qan sızmadan üzügülər halda dünyadan getmişdir. Mən elə həmin gecə Xorasan yaylaqlarının birində idim. Yuxumda gördüm ki, atam Ayın üstündə dayanıb, Ayla birlikdə dövr edir. Ayın nuru onu sinəsinə qədər örtmüşdü. O elə qəhqəhə çəkib gülürdü ki, səsi üfüqlərə yayılırdı. Gözlərimi açanda qoca kənd müəzzini "Allahü-əkbər" deyə azan verməyə başladı. Mən pərişan halda fənəri yandırdım və Hafizin divanından fal açdım. O vaxta qədər diqqətimi cəlb etməyən qəzəlin ilk beyti belə idi:

*Yarın hicranı, fəraq gecələri sona çatdı.*
*Tale ulduzum, dövran başa çatdı.*

İki gündən sonra atamın vəfatı haqqında teleqram aldım.

**Əlli səkkizinci bənd:** *Ağa Mir Salehin* gözəl xətti və yazı üslubu vardı. O açıq qəlbli, nəcib bir insan idi. Danışanda elə həyəcan keçirirdi ki, tanış olmayan dinləyici onun özünü dəliliyə vurduğunu zənn edirdi.

Rəhmətlik *Ağa Mir Əziz* də cüssəli, enli kürəkli, yaraşıqlı bir kişi idi. O, kəndin toyunda-yasında dəstəbaşı olub, işlərin idarəsində özünün ləyaqət və bacarığını göstərirdi.

Mərhum *Ağa Mir Məmməd Ağa Mir Möhsün* oğlu atası kimi yaxşı at minib, sərrast tüfəng atardı. Onunla aralarında olan müəyyən bir, məsələdən danışanda özündən çıxardı, yoldaşları onun bu zəif tərəfindən yapışıb, bəzən də zarafatla ona sataşırdılar. Bu zaman onun, ağzı köpüklənə-köpüklənə danışması, hədə-qorxu gəlməsi çox, maraqlı olardı.

**Əlli doqquzuncu bənd:** Rəhmətlik *Ağa Mir Əbdülxalıq* mənim kiçik bibimin əri idi. Gəncliyində maraqlı işləri vardı. O cümlədən, qadınları yamsılayaraq üz-gözünü bəzərdi, qaşlarına vəsmə yaxıb gözünə sürmə çəkərdi, çarşaba bürünüb, divarın arxasından boylanar, gənclərə qaş-göz atardı. Onun bu hərəkəti mənim Xoşginabdi olduğum uşaqlıq dövrünün şirin xatiralərindən biri olduğuna görə nəzmə çəkdim.

*Şah Abbas durbini* – məşhur Cəmşidin Camı kimi camaat içərisində çox şöhrəti var. Cəmşidin Camı hər şeyi guya özündə əks etdirdiyi kimi, Şah Abbasın durbini də sanki hər şeyi göstərməyə qadir imiş. Onun haqqında bizim yerlərdə çoxlu şirin hekayətlər danışılır. Bu durbinin rolunu, Şah Abbasın ondan necə istifadə edib, nələr görüb-etməsini həvəslə xatırlyırlar.

**Altmışıncı bənd.** Mənim dörd bibim vardı, yaş etibarilə: *1) Xədicə Sultan, 2) Sitaiə, 3) Sara (Əmməcan), 4) Səyyarə (Xanım əmmə).*

**Altmış birinci bənd:** *Ağa Mir Heydər* - böyük bibimin əridir, səksən yaşlı, əldən düşmüş bir qoca hələ də zarafatlarından əl götürməmişdir. İndi də öz kinayəli və mənalı sözləri ilə hamının, diqqətini cəlb edir. Çox qonaqsevər, açıq süfrəli bir kişi idi, samovarı həmişə qaynardı, özü də həddindən artıq çay içərdi.

**Altmış ikinci bənd**: *Məlkamıd* - Mələk-əl-Mövt (Əzrail) sözünün təhrif olunmuş formasıdır. Kəndlərdə onu ölüyuyan yerinə işlədirlər.

**Altmış üçüncü bənd**: *1) Fizzə xanım* (dayım qızının adıdır) - Xoşginabın çox hörmətli qadınlarından birisidir.

*Ağa Mir Yəhya* - Mərhum Məcdəs-Sadatın qardaşı, çox səmimi və xoşqəlb insandır. Epik şerlərin gözəl ifaçısı idi. Atası kimi də "Şahnamə"ni çox yaxşı oxuyardı.

*Rüxsarə xanım* (atamın xalası qızı) - bacarıqlı və hörmətli bir qadın idi. Başqalarının təqlid edib yamsılamaqda səhnədəki qüdrətli artisti belə sanki üstələrdi.

*Ağa Seyid Yəhya* - Əmioğlumdur, çox təmiz və nəcib bir insan idi. Şəqaqilərlə qohum olduğuna görə son 30 ildə Qıpçaq kəndində yaşardı.

*Ağa Mir Cəfər* - Rəhmətlik Ağa Mir Qafarın böyük oğlu idi. Çox işgüzar, əməkçi və cəsarətli bir insan idi. Əli də çox ağır idi, kənddədki davalarda iştirak etsəyədi, onda, sözsüz, yaman bir hadisə üz verərdi.

**Altmış yeddinci bənd**: *Dam qaya* - Şəngülava və Güllücə kəndlərinin arasında dağın başında yüksəlib əyilən bir qayadır. Sanki təbiət oranı yayda, qışda çobanlar və səyyahlar üçün qardan, yağışdan özlərini qorumaqdan ötrü bir daldalanacaq düzəltmişdir. Uşaqlar da yay mövsümü bəzən oraya çıxıb, qayanın başından ətrafı seyrə dalar, o gözəl mənzərələrdən zövq alardılar.

**Yetmiş dördüncü bənd:** Əsərin bu bəndində Koroğlu dastanına işarə edilmişdir. Şair özünü Koroğlunun yerinə qoyub, hadisələr bitməzdən əvvəl yatmaq istəmədiyini söyləyir.

*"Koroğlu"* dastanı Azərbaycanın, bəlkə də bütün dünyanın ən məşhur dastanlarından biridir. Onun xülasəsi belədir: dastanın qəhrəmanı Koroğlu öz oğlu Eyvazı vuruş meydanına göndərir. Gün batır, qaş qaralır, ancaq Eyvaz geri qayıtmır. Bütün gecəni Koroğlunun intizar gözlərinə yuxu getmir. Qaranlıq gecədə onun gözləri gah zülmətlə, gah tufanla, gah də göydəki qara buludlarla əlləşib çarpışmaq istəyir. Göydə qatar-qatar düzülüb uçan durnalardan öz oğlunu xəbər alır. Sübhə qədər gözlərinə yuxu getmir. Dan yeri söküləndə məşhur Qıratını minib düşmən üstünə gedir, ona qələbə çahlır, əsir düşmüş Eyvazını azad edib gətirir. Eyvazm geri qayıtması dastanın sonudur.

## Şeirlər

*Çavuş* - Kərbəlaya gedən zəvvarı müşayiət edən bələdçi.

*Kədiklərin sazax çalan sazları.*

Qışda dağ aşırımalarındakı səsləri şair saz səsinə bənzədir.

*Zihəccəmiz məhərrəm olmaqdadır.*

Zihəccə islam hicri təqviminin 12-ci ayıdır. Bundan sonra gələn məhərrəm ayı şiələr üçün təziyə ayıdır. Misra toyun yasa çevrilməsini göstərir.

*Qız-gəlinin fındıqçası* - barmaqlara həna qoyulub bağlanmasına fındıqça deyilir.

*İlləl yəafirə və illəlsu və bəldətin leysə ləha ənisu.*

(Ərəb) mənası: Bu şəhərdə mənə ceyranlardan və dəvələrdən başqa dost yoxdur.

*"Aradanxır"* - uşaq oyunlarından biri.

*Kürsü tovu* - keçmiş zamanlarda evin ortasında qurulan kürsünün dövrəsi.

*Nəqşləri tərh etmək* - xəritə çəkmək, plan qurmaq.

*Xərməni saqqıza verdik, nəyaman çərçidi bu?*

Alverçinin bahaçılığına, müştərini aldatmasına işarədir. Şair, siyasətçiləri alvərçiyə, çərçiyə oxşadır.

*Baxmayıb gözyaşına ingilis əl qatdı bizə, Görürəm rus da Arazdan keçir İran apara.*

1941-ci ilin avqustunda ingilislərin cənubdan, Sovet qoşunlarının isə alman-faşist təhlükəsinə qarşı şimaldan İrana girməsinə işarədir.

*İqbal* - Məşhur Azərbaycan müğənnisi təbrizli Əbülhəsən xan İqbal Azər (1867-1967)

*Təb riştəsi* - tibb fakültəsi.

*Əl atmaq hacata* - silah götürmək.

*Pambıq atmaq* - yaprıxmış pambığı didib açmaq.

*Mazı-mata salmaq* - naz-qəmzə etmək, bir şeyi mətaha çevirmək.

*Büzüşüb bəy durmaq* - Bəy kimi büzülüb dimdik durmaq.

*Yengə-muşata* (məşşatə) - toy gecəsi gəlinə zinət verən, bəzəndirən və bakirəliyini təsdiq etmək üçün gedən qadınlara verilən adlar.

*Sərvan Şəhiri* – Şəhriyarın dostlarındandır.

*Bəhruz Dövlətabadi* - Şəhriyarın yaxın qohumlarından biridir.

*Lülələnməkdədi yer-göy neçə tumar sarıyanda*

Qədim zamanlarda saray şairləri şerlərini kağızlara yazıb onlan bir-birinə calayıb bükərdilər. Şair yeri-göyü beləcə qatlanıb lülələnmiş şeir bükülməsinə - tumara bənzədir.

*Qovutmac* - küncütün döyülüb doşabla qarışdırılmış forması.

*"Kəlilə-Dimnə"* - Qədim hindlilərin alleqorik rəvayətlərdən ibarət ibrətamiz kitabı. VI əsrdə fars, sonralar isə başqa dunya dillərinə də tərcümə olunub şöhrət qazanmışdır.

*Mehdiyə-maude-zühur* - Rəvayətə görə on ikinci imam Mehdinin vəd olunmuş zühuru.

*Həqqa-maşa* - tiryək çəkmək üçün istifadə olunan alətlər.

*Fitrət bayramı* - Orucluq bayramı, orucluq ayının son günü. "Əşiran " - Mahur dəstgahının bir guşəsi.

*"Hicaz"* -Muğamda "Şur" dəstgahında "Simayi-Şəms"dən sonra ifa olunan guşədir.

*Mahmud və Ayaz* - Səlcuq sultanı Mahmud Qəznəvi (998-1030) və onun qulu Ayaz nəzərdə tutulur. Onların bir-birinə olan məhəbbəti, hörməti Şərq ədəbiyyatında məşhurdur.

*Şəriəti* - İranın məşhur ictimai xadimi doktor Əli Şəriəti. Milliyyətcə türkdür.

*Seyidağa Fəxriyyə* - Cənubi Azərbaycanın məşhur komik gülüş ustalarından (aktyor) olub, Şəhriyarın dostu idi. 1972-ci ilin yayında avtomobil qəzası zamanı həlak olmuşdur.

*Professor Əliyev* - Rüstəm Əliyev. Azərbaycanın məşhur şərq-şünas alimi. Əməkdar elm xadimi.

*Setar* – Azərbaycanın simli qədim musiqi aləti. Ustad Şəhriyar gözəl setar çalırdı.

*Doktor Cavid* - Azərbaycanın maarifpərvər alimi. Azərbaycan dili qadağan edildiyi dövrdə şifahi xalq ədəbiyyatı nümunələrini çap etdirmiş, ana dilinin tədrisi sahəsində xeyli iş görmüşdür.

*Merac gecəsi* - dini rəvayətə görə Məhəmməd peyğəmbər gecə yarısı Qüdsdən Buraq adlı bir atla Allahın hüzuruna getmişdir. Həmin gecə merac gecəsi adlanır.

*Leylac* - Qumarbazların başçısı mənasındadır. Həm də rəvayətə görə tarixi şəxsiyyət olmuşdur.

*Tacbəxşin kamanı* – Şəhriyarın dostlarından olan Tacbəxş gözəl kamança çalandır. Şəhriyar ona bir neçə şeir həsr etmişdir. Bu şeir də onun kamanına yazılıb.

*Əfrasiyab* - Firdovsi "Şahnamə"sinin qəhrəmanlarından biri. Qədim Turan hökmdarlarından sayılır.

*Pirahən* - köynək (Yusifin köynəyinə işarədir).

*İyrəc* – İrəc Mirzə. Məşhur Cənubi Azərbaycan şairi. Bütün İran körpələrinin əzbər dediyi "Ana məhəbbəti" ("Mehri madər") şerinin müəllifi (1873-1926).

*Qəmər* - İranın məşhur müğənnilərindən biri.

*Şeyx Bəhayi* - Bütün insanları qardaşlığa, sülhə səsləyən bəhailik təriqətinin banisi Mirzə Hüseyn Əli.

*Behzad* - Kəmaləddin. XV-XVI əsrlər Təbriz miniatür rəssamı, (1450-1535).

*Şəbistan* - yataq otağı, şahların hərəmxanası, dərvişlərin ibadətlə məşğul olduqları və yatdıqları yer, hücrə.

*Müşiri* - Müasir İran şairlərindəndir. Şəhriyarın dostu.

*Şair Sayə* - Müasir İran şairlərindən olub, Şəhriyarın dostu idi.

*Nadirpur* - Müasir İran poeziyasının görkəmli nümayəndələrindən olub, Şəhriyarın dostu.

*Məftun* – Cənubi Azərbaycan şairi, Şəhriyarın dostu, ona "Eşqin sultanı" adlı şeir həsr etmiş Yədulla Əmini Məftun.

*Babakuhi Bakuvi* - Məhəmmədəli Abdulla oğlu. (948-1050). Azərbaycanın filosof şairi. İran, Ərəbistan, Hindistan və başqa ölkələri gəzmişdir. Əsərlərini ərəb və fars dillərində yazmışdır.

*Xosrov* - Sasani şahı II Xosrov Pərviz. (590-628). Şərqin bir sıra şairləri, o cümlədən Nizami Gəncəvi ona əsərlər həsr etmişlər.

*"Hərra" (Hiıra)* - Məkkə ilə Mədinə arasında bir dağın adıdır. Məhəmməd peyğəmbər bir müddət buradakı kahada qalmışdır.

*Kəlirnullah* - Hərfi mənası "Allahla danışan", deməkdir. Musa peyğəmbərə verilmiş ləqəbdir.

*"Tövrat"* - Yəhudilərin qədim dini kitabı.

*Keykavus* - İranın əfsanəvi şahlarından biri. Firdovsinin yazdığı "Şahnamə"nin əsas qəhrəmanlarındandır.

*"Həftcan"* - Firdovsinin "Şahnamə" əsərində pəhləvan Rüstəm Zalım döyüşə-döyüşə sındırdığı yeddi tilsim.

*Sunış* - Mələk Cəbrayılın adlarından biri.

*Rumlular Həbəşin qamnı töksə* - Klassik ədəbiyyatda rumlu ağlıq, həbəş qaralıq rəmzidir. Yəni gündüz gecəyə qalib gəlsə.

*Veys ilə Ramin* - Fəxrəddin Gürganinin (XII əsr fars şairi) "Vis və Ramin" əsərinin qəhrəmanları.

*Şuriyə* - Sasani şahı Xosrov Pərvizin oğlu.

*Təvaf*- Ziyarətə gələnlərin Kəbə daşı ətrafında dövrə vurması.

*Dara* - Əhəməni şahlarının (b.e.ə. 336-330) ən məşhurlarından biri. "III Dariyuş" adı ilə hökmranlıq etmiş bu padşah makedoniyalı İskəndər tərəfindən məğlub edilmişdir.

*Mərix* - Mars planeti.

*Çingiz* - Monqol-tatar imperiyasının banisi, məşhur sərkərdə (1162-1227), onun yaratdığı imperiya Avrasiya materikinin böyük bir hissəsini tuturdu.

*Yozdan* – Zərdüşt dinində tanrı.

*Söhrab* - Firdovsi "Şahnamə"sindəki qəhrəmanlardan biri.

*Rüstəm* - Firdovsi "Şahnamə"sinin qəhrəmanı. Qüdrətli pəhlivan.

*Həxaməniş şahları* - Əhəməni sülaləsinin hökmdarları. Eramızdan əvvəl 550-ci ilde Kuruşla başlanan bu sülalə e.ə. 331-ci ildə III Daranın ölümü ilə qurtarmışdır.

*Şapur* - Sasani şahı I Şapur (241-272) nəzərdə tutulur. Roma imperiyası ilə döyüşdə azəraycanlıların yardımı ilə qalib gəlmişdir.

*Qubad* - İran şahı, 488-531-ci illərdə hökmranlıq etmişdir.

*Firdovsi* (934-1024) - Böyük fars şairi. 30 il ərzində "Şahnamə" adlı nəhəng mənzum epopeya yazmışdır.

*Volter, Didro* - XVIII əsr fransız ensiklopedistləri.

*Saib* - Saib Təbrizi (1601-1676). XVII əsrin məşhur Azərbaycan şairi. Saib Hindistanda yaşadığı dövrdə ədəbi məktəb yaradıb.

*Ünsüri* - Əbülqasim Ünsüri, Həsən ibn Əhməd. (970, yaxud 980, Bəlx-1039). Qəznəvilər dövlətinin banisi Mahmud Qəznəvinin saray şairi. Məliküş-şüəra rütbəsi almış, böyük sərvət sahibi olmuşdur.

*Übeyd Zakani* (1366-1370) - Satirik yazıçı və şair. Bir sıra risalələrin, "Kitabi-dilguşa" adlı lətifələr toplusunun və lirik şerlərin müəllifi.

*Xızr* - Rəvayəta görə zülmətdə dirilik suyu içib əbədi həyat qazanmış peyğəmbər. Darda qalan adamlara kömək etməsi ilə məşhur olmuşdur.

*Hacı İsmayıl ağa Əmir Xizi* - Səttarxanın şəxsi katibi, bir sıra görkəmli xadimlərin, o cümlədən Şəhriyarın müəllimi. Məşrutə hərəkatının iştirakçısı və pedaqoq.

*"Kavə" toplusunun baş müvəkkil* - Berlində nəşr olunan bu jurnalın (1816-1921) baş müvəkkili-redaktoru Seyid Həsən Tağızadə. Məşhur jurnalist və siyasi xadim, Məclisin də sədri olub.

*Xəyyam* - Ömər Xəyyam Qiyasəddin Əbül-Fəth ibn İbrahim. (təxm. 1048-1022 sonra). İranın məşhur filosof şairi. Əsasən rübailəri ilə tanınmışdır.

*Napolyon (1769-1821)* - Məşhur fransız sərkərdəsi və imperatoru.

*Abbas Mirzə (1789-1833)* - İran Hərbi qüvvələrinin baş komandanı, Azərbaycan valisi, Fətəli şahın oğlu. Qardaşı oğlu Bəlimon Mirzənin xəyanəti nəticəsində Paskeviçə məğlub olmuş və alçaldıcı Türkmənçay müqaviləsini imzalamışdır.

*Ahuramazda* – Zərdüştlük dinində xeyir allahı.

*Əhrimən* - Zərdüştlük dinində şər allahı.

*Paulüs (Paulyüs)* - Böyük Vətən Müharibəsi dövründə Stalinqrada qədər gəlib çıxmış faşist ordusunun rəhbəri, feldmarşal. Döyüşdə məğlub olaraq sovet ordusuna əsir düşmüş, sonra azad edilərək qayıtmışdır.

*Eynşteyn (1879-1955)* - Məşhur fizik. Nisbilik nəzəriyyəsinin banisi. Şəhriyar bu böyük alimə məktub yazmışdır.

*Rumi* - Cəlaləddin Məhəmməd ibn Bəhaəddin (1297-1273) Rumi Konyada yaşamış məşhur türk şairi. Şəms Təbrizini özünə ustad və mürşid seçmişdi.

*Şəms* - Şəmsəddin Məhəmməd ibn Əli (1245-1272) Təbrizi. XIII əsr Azərbaycan alimi. Konyalı şair və alim Mollayi-Ruminin ustadı. Şəms sirli şəkildə yox olmuşdur.

## COĞRAFİ VƏ ETNİK ADLAR

Aysor - Assuriya, qədim Şərqin ən qüdrətli və yırtıcı imperiyası. 1000 ilə yaxın Yaxın və Orta Şərqi talamış və qorxu altında saxlamışdır. Eramızdan əvvəl 614-cü ildə azərbaycanlıların ordusu tərəfindən məğlub edilmiş və tənəzzülə uğramışdır.

Behcətabad - Tehranda bir məhəllənin adıdır. Şəhriyarın sevgilisi Sürəyya bu məhəllədən idi.

Bədəxşan - öz ləli ilə məşhur olan Orta Asiya vilayəti.

Bəndərpəhləvi - Xəzər dənizi sahilində İranın Liman şəhəri. İndiki adı Ənzəlidir.

Bərzəx - Dini əfsanəyə görə cənnətlə cəhənnəm arasındakı keçid.

Cabəlqa - Şərqdə yerləşən qədim əfsanəvi şəhər. Klassik Azərbaycan ədəbiyyatında Cabəlqa Şərqin, Cabəlta isə Qərbin son sərhədi kimi təsəvvür edilirdi.

Dəmavənd - Tehran yaxınlığında yerləşən dağın adıdır.

Elborz - (Əlbürz) Dəmavənd dağının ən yüksək zirvəsi.

Eynalı - Təbriz yaxınlığında dağdır.

Ərəs - Araz çayı.

Hillə - İpəyi ilə məşhur olan İran şəhəridir.

İskəndər Səddi - Rəvayətə görə makedoniyalı İskəndər Çində olarkən, şimaldan axıb gələn yırtıcı Yəcuc-Məcuc qəbilələrinin qarşısını almaq üçün Çin səddini çəkdirmişdir. Şair dağları İskəndər səddinə (Çin səddinə) bənzədir.

Kaşan - Mərkəzi İranda şəhər.

Kazbek - Qafqaz sıra dağlarında zirvələrin biri. 5033 metr hündürlüyü var.

Kərəc - Tehranın yaxınlığında yerləşən şəhər. Əhalisi əsasən türklərdən ibarətdir.

Qaflan - Cənubi Azərbaycanda dağ adı.

Qaşqaylar - İranın fars əyalətində yaşayan türk tayfalarından biri.

Lahıcan - İranın vilayət şəhəri. Çayı və sitrus bitkilərilə məşhurdur.

Lor - İranda yaşayan kiçik xalqlardan biri.

Mişov - Cənubi Azərbaycanda dağ.

Nəcd - Ərəbistan yarımadasının mərkəzində qədim əyalət.

Nişabur - İranın Xorasan əyalətində şəhər.

Pəsqələ - Tehranın Şimran kəndlərindən biridir.

Rəşt - İranda şəhər. Gilan əyalətinin mərkəzi.

Riza iqlimi - Xorasanda basdırılmış imam Rza qəbrinin ətrafı.

Sard – qədim Şərq xalqlarından biri.

Savalan - Cənubi Azərbaycanda və eləcə də bütün Azərbaycanda ən hündür dağdır. 4821 metr hündürlüyü var. Zirvəsi buz gölü ilə örtülmüşdür.

Sərab - Cənubi Azərbaycanda mahal və həmin mahalın mərkəzi şəhəri. Savalan dağının ətəklərində yerləşir.

Simnan - İranın Mazandaran əyalətində şəhər.

Şahgölü - Təbriz şəhərinin yaxınlığında süni göl.

Şimran - Tehranın şimalında, dağ ətəyində yerləşən məhəllə.

Tocriş - Tehranın Şimran kəndlərindən biridir.

Turi-Sina - Dini rəvayətə görə Musa peyğəmbər bu dağda Allahla danışmışdır.

Tus - İranın Xorasan əyalətində şəhər.

Zəncan – Cənubi Azərbaycanın şəhərlərindən biri. Pəhləvi səltənətinin şovinist siyasəti nəticəsində Azərbaycandan qoparılıb ayrı inzibati ərazi bölgüsünə salınmışdır.

Zindərud - İranda çay adıdır.

## LÜĞƏT

### -A-

Abəstən - hamilə
Abi-həyat – həyat suyu
Abi-zülal - dirilik suyu
Abpaş - su səpən
Abşar - şəlalə
Ac – cürbəcür bəzək şeylərinə, o cümlədən qədim İran şahlarının taxtına işlənən fil sümüyü.
Acalmaq - arıqlamaq
Apartaman - ayrıca binada yerləşən, hər cür şəraiti olan mənzil.
Ataq - üfüqlər

### -B-

Balu pər - qol-qanad
Bara - səhv
Barat - pul çəki
Beldar - yer belləyən
Bədəl - əvəz, əvəzçi
Bədəviyyət - vəhşilik, mədəniyyətsizlik
Bərbət - simli musiqi aləti, ud.
Bərə - bəhrə, məhsut
Bərqiz - işığınız, elektrikiniz
Bətdiyə - bəndləyə, düzəldə
Bibalü-pər - qol-qanadsız
Bisipər - zirehsiz, müdafiəsiz
Budarlamaq - vurmaq, döymək
Bünyad - əsas, dayaq
Büti-əyyar – kələkbaz büt, hiyləgər gözəl

### -C-

Caddə - şosse yolu.
Cağılmaq - kefinin açılması.
Calatmaq - boşaltmaq, axıtmaq.
Cavidan - əbədi, daimi
Cəbə - mücrü, qutu.

Cəhaz - cihaz, alət.

Cızlıq - cızdaq.
Colab - qul alverçisi.
Coşən - zireh
Cövcü - dodaqların ucu.
Culgə - yayla.
Cumalaşdıq - yığışdıq, toplaşdıq.
Cuyəndə yabəndə - axtaran tapar.

**-Ç-**

Çalı - çalır.
Çatı - yoğun ip, kəndir.
Çersi - tiryək hoqqası; zəif adam.
Çeşm-xunbar - qan-yaş tökən göz.
Çur - qırqovul.

**-D-**

Dair olmaq - qaydasına düşmək
Damən - ətək.
Deyləmlər - ağ qul
Dəfi-məlal - dərdi-kədəri uzaqlaşdırma, dəf etmə.
Dəğəl - qəlp, saxta.
Dəndan- diş.
Dərban - qapıçı
Dərbəçə - kiçik qapı
Dərgəhi - xudavənd-Allahın hüzuru.
Dəşti-Muğun - Muğan çölü.
Didar - görüş.
Dita - müdafiə, qorunma.
Dönərgə - üzüdönük, adamı yarı yolda qoyub qaçan.
Döşləmək - yemək, uşağın döş emməsinə də deyilir.
Döşürmək - dənləmək.
Duşizə - gənc qadın, qız.

**-E-**

Ehsas - hissiyat, hiss.
Etikaf - təklikdə yaşayan, guşənişin olma, yalqızlıqda həyat keçirmək (dini).
Etisab - tətil.

-Ə-

Əbqa - qorunma, saxlanma.

Əbrişəm - ipək.
Ədəs - mərcimək dənəsi; linza.
Əflak-fələklər
Əhli-kərəm - səxavet əhli.
Əhli-zöhd - pəhrizkar, ibadətlə məşğul olan.
Əhya – dirilmə, yeniləşmə, bərpa etmə.
Əhzan – hüznlər, kədərlər.
Əqiq - qiymətli qırmızı daş.
Ələm – dərd, kədər.
Əmmə - bibi
Ənbanə - torba.
Ənsab - qohum-əqraba.
Ənsar - tərəfdar; islam dininin təcis və intişanına xidmət etmiş Mədinə əhalisinə verilən ümumi ad, yaxın adam.
Ənvar - işıq.
Ərdəm - bacanq, istedad.
Ərqəvanlıq - qırmızılıq
Ərməğan - hədiyyə.
Ərşdən-tərşdən - yerdən-göydən, ən aşağıdan ən yuxarıyadək.
Ərus - gəlin
Ərziyab - qiymət qoyan, qiymətləndirən.
Ətənə - ətcəbala quş.
Əyab - qayıtma, geri dönmə.
Əyyar – hiyləgər, kələkbaz, avara, işi-peşəsi olmayan adam.
Əza - üzv, hissə.

**-F-**

Fatihə - Quranın ilk surəsi; başlanğıc, giriş, başlama.
Ferz - şahmatda vəzir fiquru.
Feyz - ləzzət, həzz.
Fəraq - ayrılıq.
Fəramuş - yaddan çıxarmaq, unutmaq.
Fərar - qoyub qaçmaq, atıb qaçmaq.
Fərzanə - alim, həkim, bilici.

Fəthülfütuh - qələbələrin qələbəsi, zəfərlərin zəfəri.
Fışqa - fit, fiştırıq.
Fövq - üst, yuxarı.
Fülus - xırda pul.
Füzəla – fəzillər, fəzilət sahibləri.

**-G-**

Gədik - dağ aşırımı.
Gərdun - dolanan, dönən; fələk, tale; göy, səma.
Girdəkan - qoz.
Giriban - yuxa.
Gülbəsər - gülü üstündə olan tər xiyar.
Gülçin - gül dərən; seçilmiş, seçmə, hər bir şeyin əlası.
Gürbə - pişik.
Güşvarə - sırğa.
Güzər - keçmə, yol getmə; əl çəkmə.

**-H-**

Hadi - yol göstərən.
Hal-qal - sufi istilahlandır.
Hamaş - yol yoldaşı.
Hampa – kənd varlısı (XIX əsrin sonu, XX əsrin əvvəllərinə aid istilah).
Havar - hay-haray, kömək.
Hayil - burada: qorxunc, nəhəng, azman.
Həkəm - hakim, münsif.
Həllənmək - həll olmaq.
Həmil – hamilə, boylu,
Həmlə - hücum.
Həmsər - yoldaş, həyat yoldası, arvad.
Həndil - maşınları öndən işə salan əyri açar (dəmir).
Hənindirmək – nəfəsdən salmaq, əldən salmaq.
Hənzəl - acı xiyar, it xiyarı.
Hərəc - qorxu, təzyiq.
Hərim - hərəm, gizli, toxunulmaz yer.
Həsbhal - kef-əhval bilmə, halından xəbər tutma.

Hətmən - hökmən
Hazyan - sayıqlama, mənasız, havayı sözlər.
Hicab - pərdə, örtük; utanma.
Hövlə - dəsmal.
Hövləsək - hövlnak
Hünərmənd və məcliskərm - hünərli, bacarıqlı və məclis qızışdıran.

**-X-**

Xanevadə -ailə.
Xare - qranit daş.
Xatəm - sonuncu; üzük.
Xeymə - çadır.
Xəffaş - yarasa.
Xəlfə - məclisdə başçılıq edən; keçmişdə molla məktəblərində müəllimin (mollanın) köməkçisi.
Xərdəl - xardal.
Xəs-çör - çöp, çırpı.
Xətminə getmək - sonuna yetmək, axıradək getmək.
Xizab - tünd qırmızı rəngli boyaq.
Xorata - boş danışıq, dedi-qodu.
Xum - küp; qədim Azərbaycan atəşpərəstlərinin içkisi.

**-İ-**

İcbar - məcburiyyət.
İctinab - saqınma, çökinmə.
İffət - namus, mənəvi təmizlik.
İxlas - rəxnə salma, pozma, xələl qatma.
İxlas - təmiz məhəbbət, sədaqət, ürəyi təmizlik, səmimiyyət.
İxtiyar - qoca.
İmamət - imamlıq etmə, məzhəb işlərində rəhbərlik etmə.
İnficar - partlayış.
İns - insan.
İntıha - sona çatma, axıra yetişmə, tükənmə, bitmə, axır, nəhayet.
İntixab - seçmək.

İntisab - nəsb etmə, birləşdirmə.
İnziva - guşənişinlik.
İstəxr - göl.
İstiqbal - gələcək, qarşılama, gələn adamın qarşısına çıxmaq.
İstir – istəyir.
İştibah - səhv, nöqsan, şübhə.
İştiyaq - arzu etmək, çox istəmək, həsrətində olmaq.

**-K-**

Kəc - əyri.
Kəftaş - ayaqqabı tikən.
Kəmər - bel.
Kəmin (e) - aciz, həqir; ən azı,
Kənkan - quyu qazan.
Kərdi - bostan, lək.
Kəsil - yorğun.
Kət - kənd.
Kəzmə - yaranın gözü, qaysağı.
Kişvər - ölkə.
Küfr - kafirlik, Allaha inanmamaq, dinsizlik, inamsızlıq, söyüş, asi olmaq,
Küpsədi - çırpdı.

**-Q-**

Qacıtmaq - qanırmaq.
Qadaş - qardaş
Qafil etmək - xəbərsiz saxlamaq.
Qafilə - karvan.
Qanalar - meynələrin söykəndiyi torpaq qalaqlan.
Qapsamaq - bürümək, götürmək, ələ keçirmək.
Qarındaş - bir ana bətnindən çıxan bacı-qardaşlara deyilir.
Bu söz tədricən qardaş şəklinə keçmişdir.
Qavırıx - qovuruq
Qazalaq - quş növlərindən biri
Qeybnüma - gizlin aləmləri göstərən
Qəhhar - qüdrətli, güclü; məcbur edən.

Qəhvarə - beşik.
Qəm - əsr.
Qəndil - çilçıraq; sünbül kimi sallanmış çiçək; alma növü.
Qəni - varlı, dövlətli.
Qərə qeyid - qara fikir, dərd.
Qəvi - böyük, nəhəng, qüvvətli.
Qəvza - dikəlt, qaldır.
Qəzal - ceyran.
Qəzov - qədər - tale, taleyin gərdişi.
Qıbrax - qıvraq, cəld, sağlam.
Qissə - hekayət, nağıl,
Qiyas - tutuşdurma, müqayisə; bənzətmə, ölçü.
Qov - qığılcım.
Quş - biyaban-qulyabanı.
Qürfə - eyvan.
Qüsur - burada qəsrlər.

**-L-**

Lamihalə - çarəsiz, istər - istəməz; şübhəsiz, labüd; heç olmasa.
Ləhzə - an, saniyə.

**-M-**

Mağıl - heç olmazsa.
Mah - ay.
Mahal - baş tutmayan, çətin.
Mar - ilan.
Matəmsəra - yasxana.
Mehrə gəlmək - məhəbbətə gəlmək, sevmək.
Mehri-çöhrə - üzün günəşi, gözəlin üzündə parlayan günəş.
Məbədi-tərsa - kilsə.
Məbhut - mat, heyran.
Məbus - göndərilmiş elci; xalq vəkili, deputat.
Məclisgərm - məclisqızışdıran.
Mədar - mərkəz, orbit; ox, mehvər; özül, təməl.
Məgəs - milçək.
Məhafili – gənn - qızğın keçən yığıncaq, məclis.

Məhcub - örtülü, utanan, utancaq.
Məhfil - yığıncaq yeri, toplanmış həyət; məclis.
Məhtab - ay işığı.
Məxrubə - xarab edilmiş, dağıdılmış, xaraba qalmış.
Məxzən - xəzinə.
Məqfur - bağışlanmış.
Məlul - qəmli.
Məncəlab - bataqlıq, çamır, çirkli su.
Məndil - süfrə, sovqat bağlısı, yaylıq.
Mərkəb - minik heyvanı, dəvə, gəmi.
Məşşaq - məşqçi.
Məzrəə - tarla, əkin.
Midad-kağızı - qələm, kağız.
Minbər - burada: çörək yığılan səki.
Misdaq - layiq, uyğun.
Mişkfəşan - müşksaçan, ətirsaçan.
Mötəmən - təmənna edən.
Mövc - dalğa.
Mövla - sahib, yiyə; cənab, ağa; hami, havadar.
Muşək - raket.
Mübhəm əsrar - gizli sirlər.
Müdam - daima, həmişə, arasıkəsilmədən.
Müdara - zahirdə dostluq göstərmə, üzə gülmə; dözmə, qatlaşma; yubanma.
Müdava - dərman vermək, müalicə.
Müdərris - mədrəsə müəllimi, din alimi.
Mühəyya - hazırlanmış, tədarük olunmuş, hazırlığı görülmüş, bərpa olunmuş.
Müjgan - kiprik.
Münacat - gizli söhbət, gizli müsahibə, söhbət; Allaha dua etmə; Allaha xitabən yazılmış klassik şeir forması.
Münadi - çağıran, səsləyən.
Münqələb – həyəcanlı, narahat.
Münzəvi - guşənişin, yalqız həyat keçirən.
Mürəttəb - tərtib olunmuş, sıralanmış; qaydaya, nizama salınmış; tərtibli, müntazəm.

Müsavi - bərabər.
Müstəcəb - istəyi yerinə yetirilən, xahişi qəbul olunan.
Müstəkbər - qürurlu, təkəbbürlü, lovğa.
Mütəcəddid - bərpa olunmuş, yenidən düzəldilmiş, təzələnmiş.
Müvafiqət - uyğunluq, münasiblik, ahəngdarlıq, uzlaşma.
Müvazib – səyü, çalışqan; səbatlıq; qeydəqalan, qayğıkeş; gözətçi, göz yetirən.
Müzməhi - məhv olmuş, yox olmuş.

**-N-**

Naqus - zəng.
Nar - od - alov.
Nari-cəhənnəra - cəhənnəm odu.
Navarın kisi - maqnitofonun düyməsi.
Nay - ney.
Neybət - iyrənc, çox pis, çirkin.
Neysan - şiddətlə yağan yağış, leysan.
Nəbuğ - dahi.
Nəfə - nəfəs
Nəhr - böyük çay.
Nəjad - irq, nəsil, övlad,
Nəqşə - plan, xəritə.
Nəqşf-nigar - bər-bəzək.
Nəssab – irsiyyət, öyrənən alim.
Nəva - səs, musiqi.
Nəvar - maqnitofon.
Nifrin - qarğış.
Nin - hin.
Növhə - yas məclislərində avazla oxunan şeir; Mərsiyə.
Nuri-övliya - müqəddəs insanın nuru.

**-O-**

Oqmaq - ovmaq.

**-Ö-**

Övbaş - əxlaqsız, xuliqan, pozğun adam, oğru.
Övsiyər - hövsələyir, andır, təmizləyir.

